*İnstitutun "Elmi əsərlər"i 1934-cü ildən nəşr edilməyə başlamışdır.*
*2024-cü ildə "Elmi əsərlər"in 90 illiyi tamam olur.*
*İnstitut üzrə 150 nömrəli əmri diqqət mərkəzinə gətiririk:*

*«Научные труды» института издаются с 1934 года.*
*В 2024 году исполнится 90-летие «Научных трудов».*
*Доводим до сведения приказ № 150 института:*

*"Scientific works" of the Institute have been published since 1934. In 2024, the 90th anniversary of "Scientific works" will be completed.*
*We bring to the attention Order No. 150 of the Institute:*

Приказ №150
От 17/I-34г.
Временно утвердить редакционной Коллегии Аз.НИИПП в составе ответ. редактора т. Мамедова Гулама /Директора Ин-та/ секретарь т. Малахальцева и членом т. Араслы.
тов. Малахальцеву 18/I к 1 часу дня представить план выпуска научных трудов Института.
Директор Ин-та:






















**ISSN 2409-8817**

**AZƏRBAYCAN RESPUBLİKASININ ELM VƏ TƏHSİL NAZİRLİYİ**
**AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL İNSTİTUTU**

# *ELMİ ƏSƏRLƏR*

## cild 90, № 3, 2023

# *НАУЧНЫЕ ТРУДЫ*

## том 90, № 3, 2023

# *SCIENTIFIC WORKS*

## volume 90, № 3, 2023

**“Elmi əsərlər” 1934-cü ildən çıxır**
**İldə 6 nömrə nəşr olunur**

**Redaksiyanın ünvanı**:
Bakı şəhəri, Zərifə Əliyeva küçəsi, 96
Tel: 493-96-21, 493-30-06
E-mail: a.abbasov@arti.edu.az
gulizade.gunel@mail.ru
http://www.arti.edu.az/az/

***ÜMÜMMİLLİ LİDER HEYDƏR ƏLİYEV – 100***
***ОБЩЕНАЦИОНАЛЬНЫЙ ЛИДЕР – 100 ГЕЙДАР АЛИЕВ***
***NATIONAL LEADER HEYDAR ALIYEV – 100***



*UOT 37.0*

***Akif Nurağa oğlu Abbasov***
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibi*
*https://orcid.org/0000-0002-9210-7141*

# ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEV AZƏRBAYCAN TƏHSİLİNİN İNKİŞAF ETDİRİLMƏSİNDƏ MÜƏLLİMİN ROLUNA DAİR

***Акиф Нурага оглу Аббасов***
*доктор педагогических наук, профессор, Заслуженный учитель*
*ученый секретарь Института Образования Азербайджанской Республики*

# ОБЩЕНАЦИОНАЛЬНЫЙ ЛИДЕР ГЕЙДАР АЛИЕВ О РОЛИ УЧИТЕЛЯ В РАЗВИТИИ АЗЕРБАЙДЖАНСКОГО ОБРАЗОВАНИЯ

***Akif Nuragha Abbasov***
*doctor of sciences in pedagogy, professor, Honored teacher*
*scientific secretary of the Institute of Education of the Republic of Azerbaijan*

# NATIONAL LEADER HEYDAR ALIYEV ON THE ROLE OF A TEACHER IN THE DEVELOPMENT OF AZERBAIJANIAN EDUCATION

**Xülasə.** Ümummilli Lider Heydər Əliyev müstəqil Azərbaycan Respublikasının ilk müəllimlər qurultayına təbrik məktubu göndərmişdir. Bununla yanaşı o, qurultayda iştirak etmiş, nitq söyləmişdir. Həmin nitqdə müstəqil respublikanın təhsil sisteminin təkmilləşdirilməsinin vacibliyini göstərmiş, təhsilin qarşısın-

da duran vəzifələrə aydınlıq gətirmişdir. Heydər Əliyev öz nitqində müəllimin cəmiyyətdə, gənc nəslin formalaşmasındakı roluna, müəllimin şəxsiyyətinə yüksək qiymət vermişdir. Ümummilli lider Heydər Əliyev, eyni zamanda, I sinfə 6 yaşdan getməyin zəruriliyini qeyd etmiş, Təhsil Şurasının yaradılması və onun tərkibində kimlərin olması məsələsinə də toxunmuşdur.

***Açar sözlər**: Ümummilli Lider, müəllimlər qurultayı, müstəqil Azərbaycan, nitq, təhsilin təkmilləşdirilməsi, müəllim şəxsiyyəti, cəmiyyətdə müəllimin rolu, Təhsil Şurası, uşaqların 6 yaşdan məktəbə getməsi*

**Резюме.** Общенациональный Лидер Гейдар Алиев направил поздравительное письмо первому съезду учителей независимой Азербайджанской Республики. Наряду с этим он принял участие в съезде и выступил с речью. В том выступлении он показал важность совершенствования системы образования независимой республики и разъяснил задачи, стоящие перед образованием. В своем выступлении Гейдар Алиев высоко оценил роль личности учителя в обществе и формировании молодого поколения. В то же время Общенациональный Лидер Гейдар Алиев отметил необходимость поступления детей в первый класс с 6 лет, а также коснулся вопроса создания Совета по Образованию и тех, кто должен входить в его состав.

***Ключевые слова**: Общенациональный Лидер, съезд учителей, независимый Азербайджан, выступление, совершенствование образования, личность учителя, роль учителя в обществе, Совета по Образованию, поступление детей в школу с 6 лет*

**Summary**. National Leader Heydar Aliyev sent a congratulatory letter to the first congress of teachers of the independent Azerbaijan Republic. Along with this, he took part in the congress and delivered a speech. In that speech, he showed the importance of improving the education system of the independent republic and explained the tasks facing education. In his speech, Heydar Aliyev highly appreciated the role of the teacher's personality in society and the formation of the younger generation. At the same time, National Leader Heydar Aliyev noted the need for children to enter the first grade from the age of 6, and also touched upon the issue of creating an Education Council and those who should be members of it.

***Key words**: National Leader, congress of teachers, independent Azerbaijan, speech, improvement of education, personality of a teacher, role of a teacher in society, Education Council, enrollment of children in school from the age of 6*

Heydər Əliyev Azərbaycan təhsilinin inkişaf etdirilməsinə, onun tarixinə, məktəbdə əsas sima olan müəllimin təhsildəki roluna və şəxsiyyətinə dair çoxsaylı fikirlər irəli sürmüşdür. Biz bu məqalədə Ulu Öndərin yalnız 1998-ci il sentyabrın 25-də Respublika Sarayında müstəqil respublikamızın ilk müəllimlər qurultayındakı nitqində söylədikləri fikirləri diqqət mərkəzinə gətirmək istəyirik.

Heydər Əliyev bu qurultayı təhsilimizin gələcəyi və ümumiyyətlə, Azərbaycanın gələcəyi üçün mühüm bir mərhələ hesab edirdi. O, müstəqil respublikamızın ilk müəllimlər qurultayının iştirakçısı olduğu üçün özünü xoşbəxt hiss edərək, sevincini salondakılarla bölüşmüşdür. Ümummilli Lider qurultay iştirakçılarına müraciətlə demişdir: “Azərbaycanda təhsilin qədim və zəngin tarixi vardır. Bu gün bu barədə məlumatlar verildi. Biz tarixin bütün mərhələlərində Azərbaycanda müəllimin, təhsilin rolunu qiymətləndiririk” [1, s.144 ].

Heydər Əliyev bütün varlığı ilə, keçdiyi həyat yolu ilə həmişə məktəbə, müəllimə borclu olduğunu; bütün həyatı boyu təhsil sistemi ilə bağlılığını bildirirdi. Eyni zamanda, bütün bunların heç də təsadüfi olmadığını qurultay nümayəndələrinin nəzərinə çatdırırdı. Ulu Öndərin dediklərindən təhsil işçiləri, təntənəli tədbir iştirakçıları öyrəndilər ki, Heydər Əliyev 1939-cu ildə Naxçıvanda Pedaqoji Texnikumu bitirsə də, müəllimlik etməyib. Həmin texnikum həmin dövrdə müəllim azlığına, ibtidai siniflərə, hətta orta məktəblərin 7-8-ci siniflərinə qədər dərs demək üçün müəllim kadrları hazırlayırmış. Heydər Əliyev də orta məktəbin 8-ci sinfini bitirdikdən sonra pedaqoji texnikuma daxil olubmuş. Məqsədi müəllim olmaq, müəllim işləmək və ailəsinə kömək etmək idi. Bu barədə qurultayda danışdı.

Ümummilli Lider onu böyük müəllim kimi dəyərləndirənlərin sözlərinə qüvvət verərək dedi: “Siz məni də müəllim hesab edirsiniz. Siz mənim təhsilimə əsaslanaraq bunu deyirsiniz. Mən pedaqoji texnikumu bitirəndən sonra Bakıda ali məktəbə qəbul olundum. Pedaqoji texnikumun sonuncu kursunda bizə pedaqoji təcrübə dərsi verirdilər. Biz həftədə 2-3 dəfə gedib məktəblərin 2-

ci, 3-cü, 4-cü siniflərində dərs deyirdik. Ona görə də mənim o vaxt bir az dərs vermək təcrübəm olubdur. O günlər mənim xatirimdədir. Xatirimdədir ki, nə qədər həyəcan keçirirdim. Əvvəlcə bizi o siniflərə aparırdılar, oturub baxırdıq ki, müəllimlər necə dərs verirlər. Bir müddət belə idi. Ondan sonra isə deyirdilər ki, gedib filan gün, filan sinifdə filan dərsi verməlisən. Nə qədər hazırlaşmaq lazım idi. Nə qədər hazırlaşsaydın da, 2-ci, 3-cü, 4-cü sinif uşaqları qarşısında böyük həyəcan keçirirdin. Mən həmin günləri indi də xatırlayıram" [1, s.145-146].

Ulu Öndər müəllim işləməsə də, əslində, özünün dediyi kimi, texnikumda təhsil alarkən pedaqoji təcrübə dövründə əlinə jurnal alıb sinfə girmiş, 2-ci, 3-cü, 4-cü sinif şagirdlərinə dərs demişdir.

Ümummilli Lider istər respublikamızda, istərsə də keçmiş ittifaqda yüksək vəzifələrdə çalışmış, Azərbaycana rəhbərlik etmiş, eyni zamanda, SSRİ dövlətinin rəhbərlərindən biri olmuşdu. Heydər Əliyev hansı vəzifədə işləməsindən asılı olmayaraq, həmişə məktəblərin inkişafına kömək göstərmiş, təhsilə, müəllimin şərəfli əməyinə yüksək qiymət vermişdir. Bu barədə müstəqil Azərbaycanın ilk müəllimlər qurultayında demişdir: "1969-cu ilə qədər bir çox dövlət işlərində işlədiyim zaman mən daim məktəbə, ali məktəblərə maraq göstərmişəm və onların fəaliyyətində müəyyən xidmətlərim olubdur. Ancaq mən 1969-cu ildə respublikanın rəhbəri seçiləndən sonrakı fəaliyyətimin, şübhəsiz ki, bütün sahələrini qiymətləndirərək, Azərbaycanda məktəbin, orta, ali təhsilin, texniki peşə təhsilinin inkişaf etməsini öz fəaliyyətimin əsas hissəsi hesab etmişəm, bununla ciddi məşğul olmuşam. Bu gün iftixar hissi keçirə bilərəm ki, o illər mən Azərbaycana rəhbərlik etdiyim zaman saysız-hesabsız məktəblər yaranıbdır, ali məktəblərin sayı, onların fakültələri, kafedraları artıbdır, yüksək səviyyəli müəllim kadrları, universitetlərdə dərs deyən alim kadrları hazırlanıbdır və bunların hamısında mənim xidmətlərim olubdur" [1, s.146].

Heydər Əliyev SSRİ Nazirlər Soveti sədrinin I müavini vəzifəsində çalışarkən bir çox istiqamətdə fəaliyyət göstərirdi. O, bir sıra nazirliklər (Ali Təhsil Nazirliyi, Maarif Nazirliyi və Texniki Peşə Təhsili Komitəsi) bilavasitə onun rəhbərliyi altında idi. Ulu Öndər təhsillə bilavasitə əlaqədar olan bu nazirliklərə 5 il rəhbərlik etmiş, onların fəaliyyətində, tədbirlərində, kollegiya iclaslarında iştirak etmiş, onların məruzələrini, hesabatlarını dinləmiş, nitq söyləmişdi.

Heydər Əliyevin qənaətincə, Sovetlər İttifaqı dövründə yaranmış təhsil sistemi bir çox üstünlüklərə malik olsa da, o sistem tam təkmil sistem deyildi, onu təkmilləşdirmək lazım gəlirdi.

Məlum olduğu kimi, Heydər Əliyev 1983-1984-cü illərdə SSRİ-də məktəb islahatı ilə bağlı komissiyanın sədri olmuşdu. O zaman məktəb islahatı hazırlandı, 1984-cü ildə SSRİ Ali Sovetinin sessiyasında islahatın müzakirəsi keçirildi. Ulu Öndər həmin sessiyada məktəb islahatına dair məruzə ilə çıxış etdi.

Məktəb islahatı ilə əlaqədar qanunlar, bir sıra qərarlar qəbul olundu.

Göründüyü kimi, Ümummilli Liderimiz təhsil və məktəb sisteminə istər gəncliyindən, istərsə də respublikamıza, eyni zamanda SSRİ-yə rəhbərliyi dövründən bələd idi.

1984-cü il məktəb islahatından danışarkən Heydər Əliyev qurultay nümayəndələrinə aşağıdakı məlumatı verdi: "Mən Məktəb İslahatı haqqında" qanun hazırlamışam, o da qəbul edilibdir. Doğrudur, 1985-ci ildə Qorbaçov Sovetlər İttifaqının başçısı seçiləndən sonra o illərdə görülmüş işlərə görə onda böyük bir qısqanclıq əmələ gəldi. Qorbaçov həm birinci qanunun, həm də məktəb islahatının həyata keçirilməsinə imkan vermədi, şərait yaratmadı. O özü hansısa yeni-yeni islahatlar irəli sürdü. Ancaq buna baxmayaraq, o qanunlar öz işini gördü. Məktəbin təkmilləşməsi sahəsində o illərdə bir çox işlər görüldü" [1, s.146].

Heydər Əliyev Azərbaycanda təhsilin, o cümlədən orta, texniki peşə, orta ixtisas və ali məktəblərin fəaliyyətinin yaxşılaşdırılması və təkmilləşdirilməsi istiqamətində ciddi tədbirlərin görülməsini zəruri hesab edirdi. Bildirirdi ki, ölkəmizdə məktəb, təhsil bundan sonra da onun diqqət mərkəzimdə dayanacaqdır.

Ulu Öndər respublikamızda yeni təhsil müəssisələrinin təmirini və tikilməsini vacib hesab edirdi. Ötən əsrin 90-cı illərində yenidən müstəqillik əldə etdik. Müstəqilliyin ilk illəri idi. Maddi çətinliklərimiz vardı. Məktəblərin tikilməsi və əsaslı təmirində problemlər vardı. Odur ki, Heydər Əliyev şirkətləri, iş adamlarını təhsilə vəsait sərf etməyə və təhsilin inkişafına

qoşulmağa çağırırdı: "Burada tamamilə düzgün fikir söyləndi ki, bizim iş adamları, ayrı-ayrı şirkətlər ya məktəb binası tikə, yaxud da mövcud məktəblərin təmirini öz üzərinə götürə bilərlər. Burada doğru deyildi, bəzi iş adamları məscid tikirlər, – o da lazımdır, mən bunu çox əhəmiyyətli hesab edirəm, – ancaq bir məscid tikəndə, bir dənə də məktəb binası tikmək lazımdır. Ona görə də mən burada deyilən fikirlərə şərik çıxaraq üzümü tuturam Azərbaycanda fəaliyyət göstərən iş adamlarına, şirkətlərə və müraciət edirəm ki, onlar bu sahədə təşəbbüs göstərsinlər. Bəyan edirəm ki, kim bu sahədə təşəbbüs göstərsə, hansısa bir məktəbi yaxşı təmir edib müasir vəziyyətə salmağı öz üzərinə götürsə, şübhəsiz ki, o, dövlət tərəfindən müəyyən qayğı altında olacaqdır" [1, s.149].

Ümummilli Liderin qurultaydakı nitqində bütün bu məsələlərlə diqqət mərkəzində dayandı.

Heydər Əliyev Müəllimlər Qurultayına bir gün qalmış, yəni 24 sentyabr 1998-ci ildə bu tədbirə məktub da ünvanlamışdı (*"Azərbaycan müəllimləri qurultayına"*). Məktub təbrik xarakterli idi, qurultayın keçirilməsi təqdir olunurdu. Təbrikdə müəllimin rolu xüsusilə dəyərləndirilirdi. Diqqət yetirək: "Azərbaycan müəllimlərinin cəmiyyətimizin həyatında oynadığı rol müstəsna əhəmiyyətə malikdir. Müəllimlik xalqımızın ən çox hörmət etdiyi, ən çox əziz tutduğu bir peşədir. Təsadüfi deyil ki, cəmiyyətimizin ən layiqli nümayəndələri sənətindən, işindən asılı olmayaraq müəllim adlandırılır. Tariximizin bütün dövrlərində bu ada məhəbbətlə yanaşılmış və onun daşıyıcılarına xüsusi ehtiram bəslənmiş, diqqət göstərilmişdir" [1, s.142].

Təbrikdə, eyni zamanda, qurultayın böyük əhəmiyyəti qeyd olunurdu. Fikir verək: "Sizin bu qurultayınız müstəqil respublikamızın ilk müəllimlər qurultayı olsa da, Azərbaycanda müəllimlər qurultaylarının ictimai-siyasi hadisə kimi tarixi qədim, əhəmiyyəti danılmazdır" [1, s.142].

Ulu Öndərin Müəllimlər qurultayındakı nitqində diqqətdə saxladığı məsələlərdən biri də müəllim şəxsiyyəti, müəllimin şərəfli peşəsi ilə bağlı idi. Bu xüsusda deyirdi: "Mən bəyan edirəm ki, bizim müstəqil respublikamızda, Azərbaycan cəmiyyətində müəllim bu gün də, gələcəkdə də ən hörmətli insan kimi qəbul edilməlidir və müəllimlik peşəsi ən yüksək qiymətə layiq olan peşədir. Həyatını müəllimliyə həsr edən insanlar həqiqətən fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda, qəhrəmanlıq göstərən insanlardır. Müəllimlik peşəsi asan peşə deyil. Bəziləri hesab edirlər ki, hər adam müəllim ola bilər. Bəzən olur ki, müəllimliyə layiq olmayan adam da müəllimlik edir" [1,s.147].

Heydər Əliyev öz işinə məsuliyyətlə yanaşan, şagirdlərin, tələbələrin təlim və tərbiyəsi ilə yaxından məşğul olan, öz vəzifəsinin öhdəsindən vicdanla gələn müəllimləri təqdir etməklə yanaşı, müəllimlərin cərgəsinə təsadüfən düşənləri də pisləyirdi. Onları nəzərdə tutaraq deyirdi: "Belə hallar bu gün də var, gələcəkdə də ola bilər. Ancaq Azərbaycan müəllimlərinin tam əksəriyyəti layiqli müəllimdir. Əgər bunlar belə olmasaydı, Azərbaycanın bugünkü elmi, iqtisadiyyatı, mədəniyyəti, yüksəlişi ola bilərdimi? Biz bunların hamısını məktəblərdən, universitetlərdən, müəllimlərdən, sizdən almışıq. Mən müəllimlərimi həmişə böyük hörmət və ehtiramla xatırlamışam. Əziz dostlar, siz fəxr etməlisiniz ki, müəllimsiniz və müəllimlik peşəsinə sadiqsiniz " [1, s.147].

Ulu Öndər qurultayda müəllim-təhsilalan münasibətinə də toxunmuşdur. O, müəllimin şagirdi öz övladı kimi sevməsini lazım bildiyi kimi, eyni zamanda, şagirdin öz müəlliminə hörmət etməsini, onun nüfuzunu qorumasını vacib hesab edirdi.

Ümummilli Liderin nitqindəki aşağıdakı sözlər diqqətimizi cəlb edir: "Biz müəllimi görəndə həmişə özümüzü yığışdırırdıq. Ona hörmət edirdik. Müəllimin hər sözünü qanun kimi qəbul edirdik. Şəxsən mənim həyatımda müəllim ən ali sima olmuşdur. Mənim çoxillik həyatımda, dünyanın çox mərhələlərini keçib gəldiyim həyatımda ən çox yadımda qalan, mənim üçün əziz olan müəllimlərdir. Mən onları bu gün də böyük minnətdarlıqla xatırlayıram. Hesab edirəm ki, mənim öz daxili istedadımla yanaşı, müəllimlərimin mənə verdikləri bilik, tərbiyə, müəllimlərimin mənə göstərdiyi yol bütün həyatımı həmişə uğurlu edibdir və bu gün də uğurlu edir " [1, s.147].

Çox qiymətli fikirlərdir.

Heydər Əliyev müəllim şəxsiyyətinə də böyük qiymət verirdi. Diqqət yetirək: "Mən hesab edirəm ki, insan cəmiyyətində ən yüksək yerdə mənəviyyat durur. Maddi vəziyyət, sərvət, bu və ya başqa şeylər xeyli aşağıda durur. Bununla onu demək istəmirəm ki, müəllimlər həmişə maddi çətinlik içərisində yaşamalıdırlar.

Yox, sadəcə, bu sözlərimlə mən özünü müəllimlik peşəsinə həsr edən insanın həmin peşəyə sadiqliyini sübut etmək istəyirəm. Ola bilər, o müəllimlər gedib başqa bir işlə məşğul olsaydılar, bir neçə qat artıq fayda götürə bilərdilər və maddi vəziyyətləri də yaxşı olardı. Ancaq onlar müəllimlik peşəsini seçiblər, siz müəllimlik peşəsini seçmisiniz. Buna görə də mən sizə "afərin!" deyirəm, sizin qarşınızda, müəllimin qarşısında baş əyirəm" [1, s.147].

Ulu Öndər övladlarının təlim-tərbiyəsinə qayğı ilə yanaşan valideynləri də hörmət və məhəbbətlə anırdı. Bu xüsusda demişdir: "Bu, məndə böyük qürur hissi doğurur ki, Azərbaycan vətəndaşları, azərbaycanlılar təhsilə nə qədər bağlıdırlar, övladlarını nə qədər təhsilləndirmək, maarifləndirmək istəyirlər" [1, s.149].

Ötən əsrin 90-cı illərində və ondan əvvəl də uşaqlar 7 yaşından məktəbə gedirdilər. Uşaqların 6 yaşından I sinfə getmək məsələsi gündəmdə idi, lakin bu proses ləng həyata keçirilirdi. Odur ki, Ulu Öndər Müəllimlər Qurultayında haqqında danışılan məsələyə öz münasibətini bildirdi. Fikir verək: "Burada məktəbə altı yaşından getmək məsələsi barədə də fikir söyləndi. Nə üçün bu, indiyə qədər müzakirə olunur? 1984-cü ildə "Məktəb islahatı haqqında" qanunda uşaqların 6 yaşından məktəbə getməsi məqbul hesab edilmişdi. Burada deyildi, doğrudan da bəzən heç altı yaşına çatmamış uşaqlar var ki, çox istedadlı, hazırlıqlıdırlar və onları məktəbə qəbul etmək lazımdır. Sizə öz təcrübəmdən deyə bilərəm. Mən özüm 6 yaşımda məktəbə getmişəm, – o vaxt hələ nə islahat, nə də qanun var idi, – məni məktəbə qəbul ediblər və on altı yaşımda məktəbi bitirmişəm. Oğlum isə məktəbə gedəndə hələ altı yaşı da tamam deyildi. Bunlar hamısı təkcə mənim yox, çox insanların övladlarının təcrübəsindən keçibdir və buna mane olmaq lazım deyildir [1, s.149].

Heydər Əliyevin öz nitqində diqqət yetirdiyi məsələlərdən biri də Təhsil Şurasının yaradılması məsələsinə aid idi. Təhsil Şurasının üzvlərinin kimlərdən ibarət olması barədə müxtəlif fikirlər səslənirdi. Şuranın tərkibində hökumət üzvlərinin və Prezident Aparatının bəzi məsul vəzifəli şəxslərinin, digər vəzifəli şəxslərin, həmçinin daxili işlər nazirinin, müdafiə nazirinin və baş prokurorun təmsil olmasını lazım bilirdilər.

Ulu Öndər məsələyə öz münasibətini tamam fərqli şəkildə və çox da düzgün olaraq bildirdi. Diqqət yetirək: "Təhsil Şurası ictimai təşkilatdır, müəllimlərin, təhsil işçilərinin təşkilatıdır. Ona görə də belə bir təşkilatda yalnız müəllimlər, bilavasitə təhsil sahəsində işləyənlər, bilavasitə təhsillə məşğul olanlar olmalıdırlar. Belə bir şuraya hökumət üzvlərini və Prezident Aparatının bir çox məsul vəzifəli şəxslərini, başqa vəzifəli şəxsləri, hətta daxili işlər nazirini, müdafiə nazirini və baş prokuroru salmaqla bu şuranın tamamilə mənasını dəyişirsiniz. Əksinə, mən hesab edirəm ki, bu şuranın müstəqil olması üçün orada dövlət nümayəndələri olmamalıdır. Gərək bu şura müstəqil olsun, ictimai təşkilat olsun, öz sözünü hökumətə, hakimiyyət orqanlarına desin və öz təkliflərini irəli sürsün. Şurada nazirlərin olması sizə lazım deyildir. Əminəm ki, bu şura formal bir təşkilat yox, işlək təşkilat olacaq və təhsilin, müəllimin, məktəbin problemlərini həll etmək üçün həmişə fəal olacaqdır. Azərbaycanın prezidenti kimi mənim tərəfimdən isə bu şura həmişə dəstək ala biləcəkdir" [1, s.150-151].

Yuxarıda diqqət mərkəzinə gətirdiklərimizdən görünür ki, Ümummilli Liderimiz Heydər Əliyevin müstəqil Azərbaycanımızın ilk müəllimlər qurultayında iştirakı və nitqi həm bu möhtəşəm tədbirə böyük önəm vermiş, həm də təhsilimizin qarşısında quran vəzifələri daha aydın işıqlandırmışdır.

**Problemin aktuallığı.** Məqalə Ümummilli Liderimiz Heydər Əliyevin anadan olmasının 100 illiyinə gözəl hədiyyə olacaqdır.

**Problemin yeniliyi.** Ulu Öndər Heydər Əliyevin Azərbaycan təhsilinin inkişaf etdirilməsində müəllimin roluna dair qiymətli fikirləri üzərində dayanılır.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gənc tədqiqatçılar, doktorant və dissertantlar, həmçinin magistrantlar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir: [46 cilddə] / H.Əliyev. – Bakı: Azərnəşr, – 2006. – 528 s.

**E-mail:** prof.akif@mail.ru

**Rəyçilər:** *ped.elm.dok., prof.* **İ.H. Cəbrayılov,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 17.04.2023.

*UOT 37.0*

***Hümeyir Hüseyn oğlu Əhmədov***
*pedaqogika elmləri doktoru, professor*
*Azərbaycan Respublikası Təhsil İnstitutu*
*https://orcid.org/ 0000-0003-0019-4266*

## HEYDƏR ƏLİYEV VƏ AZƏRBAYCAN TƏHSİLİ MÜSTƏQİLLİK DÖVRÜNDƏ

***Гумеир Гусейн оглу Ахмедов***
*доктор педагогических наук, профессор*
*Институт Образования Азербайджанской Республики*

## ГЕЙДАР АЛИЕВ И АЗЕРБАЙДЖАНСКОЕ ОБРАЗОВАНИЕ В ПЕРИОД НЕЗАВИСИМОСТИ

***Humeyir Huseyn Ahmadov***
*doctor of pedagogical sciences, professor*
*Institute of Education of the Azerbaijan Republic*

## HEYDAR ALIYEV AND AZERBAIJANIAN EDUCATION DURING INDEPENDENCE

**Xülasə.** Ümummilli Lider Heydər Əliyevin Azərbaycan rəhbərliyinə tarixi qayıdışından sonra elm və təhsilə göstərilən diqqət və qayğı elə ilk günlərdən hiss olunurdu. Ölkədə hazırlanan və həyata keçirilən strateji xətt təhsili milli tərəqqinin əsas gücünə çevirən amil oldu. Bu gün iftixarla demək olar ki, xalqımızı müstəqil inkişaf yoluna hazırlayan bütün sahələrdə olduğu kimi, milli təhsil sahəsində qazanılan böyük nailiyyətlərdə də Ümummilli Lider Heydər Əliyevin müstəsna xidmətləri var.
***Açar sözlər:*** *Ümummilli Lider, Heydər Əliyev, Azərbaycanın müstəqilliyi, təhsil, elm, gənc nəslin maariflənməsi*

**Резюме.** После исторического возвращения Общенационального Лидера Гейдара Алиева к руководству Азербайджаном внимание и забота, проявленные к науке и образованию, ощущались с первых же дней. Подготовленная и реализованная в стране стратегическая линия стала фактором, превратившим образование в главную силу национального прогресса. Сегодня мы можем с гордостью сказать, что Общенациональный Лидер Гейдар Алиев имеет исключительные заслуги и большие достижения как в области национального образования, так и во всех сферах, готовящих наш народ к пути самостоятельного развития.
***Ключевые слова:*** *Общенациональный Лидер, Гейдар Алиев, независимость Азербайджана, образование, наука, просвещение молодого поколения*

**Summary.** After the historic return of National Leader Heydar Aliyev to the leadership of Azerbaijan, the attention and care shown to science and education was felt from the very first days. The strategic line prepared and implemented in the country became the factor that turned education into the main force of national progress. Today, we can say with pride that National Leader Heydar Aliyev has exceptional merits in the great achievements in the field of national education, as in all areas that prepare our people for the path of independent development.
***Keywords:*** *National Leader, Heydar Aliyev, independence of Azerbaijan, education, science, education of the young generation*

Heydər Əliyevin müəyyən etdiyi bu ənənələr Azərbaycanın dövlət müstəqilliyinə qovuşması üçün bir növ təməl rolunu oynasa da, təəssüf ki, Azərbaycanın dövlət müstəqilliyinin

ilk illərində Ulu Öndərimiz Heydər Əliyevin hələ XX əsrin 70-80-ci illərində formalaşdırdığı bu zəngin intellektual potensialdan, insan kapitalından lazımınca istifadə edilmədi.

Bir-birini əvəzləyən müvəqqəti hakimiyyətlərin yarıtmaz siyasəti ucbatından ölkə həyatının digər əhəmiyyətli sahələri kimi Azərbaycan elmi-təhsili də böhranla qarşılaşdı, bu sahədə ağır tənəzzül dövrü başlandı, təhlükəli meyllər ortaya çıxdı, Azərbaycandan xaricə “beyin axımı” gücləndi, elm və təhsil sahəsində çalışanlar ölkədə ən çətin vəziyyətdə yaşayan və ən nüfuzsuz sosial kateqoriyalara çevrilərək xırda biznesin artan nüfuzu qarşısında miskin duruma düşdülər, Azərbaycan elmi, təhsili uğursuz eksperimentlərin meydanına çevrildi.

1999-cu ilin martında Heydər Əliyev təhsil sahəsində islahatlar üzrə Dövlət Komissiyasının iclasındakı yekun nitqində həmin dövrü xarakterizə edərək deyirdi: “...Təhsil sistemi elə bir sistemdir ki, burada heç bir inqilabi dəyişiklik ola bilməz. Ümumiyyətlə, bizim həyatımızın bütün sahələrində dəyişikliklər təkamül xarakteri daşıyır. Heç vaxt yol vermək olmaz ki, onillərlə yaranmış şeyi bir gündə vurub dağıdasan, ondan sonra heç bilmədiyin yeni bir qanun yaradasan”.

Ümummilli Liderimizin “Azərbaycan Respublikasında təhsil sahəsində islahatlar üzrə Dövlət Komissiyasının yaradılması haqqında” 30 mart 1998-ci ildə imzaladığı sərəncam, habelə 15 iyun 1999-cu il tarixdə təsdiqlədiyi “Azərbaycan Respublikasının təhsil sahəsində islahat Proqramı”nda təhsil sahəsində islahatların məhz tədricən, mərhələlərlə həyata keçirilməsi, Azərbaycanda təhsil standartlarının yeni dövrün şərtlərinə uyğunlaşdırılması prosesini təmin etdi. “Azərbaycan Respublikasında təhsil sahəsində islahatlar üzrə Dövlət Komissiyası haqqında” sərəncamda müstəqil Azərbaycanın təhsil sistemində beynəlxalq standartlara uyğun islahatların həyata keçirilməsi, təhsilin inkişafı və onun maddi-texniki bazasının möhkəmləndirilməsi, Avropa təhsil məkanına inteqrasiyanın təmin edilməsi kimi mühüm vəzifələr önə çəkilmişdir. “Azərbaycan Respublikasında Təhsil İslahatı Proqramı”nın əsas mahiyyətini isə təhsil sistemində islahatların təkamül yolu ilə, mərhələlərlə aparılması, tarixən formalaşmış zəngin, mütərəqqi ənənələrin, təcrübənin qorunub saxlanılması, dünya təhsil sisteminin Azərbaycanın milli xüsusiyyətləri ilə çuğlaşan prinsiplərinin tətbiqi məsələləri təşkil edirdi, islahat proqramının həyata keçirilməsi nəticəsində Azərbaycanda təhsilin məzmunu yeniləşdirilmiş, yeni proqramlar və dərsliklər hazırlanmış, ayrı-ayrı təhsil sahələri, fənlər üzrə standartların hazırlanması istiqamətində ciddi iş aparılmışdır.

Ali təhsil sahəsində yeniliklərdən biri də “Azərbaycan Respublikasında təhsil sisteminin təkmilləşdirilməsi haqqında” Azərbaycan Respublikası Prezidentinin 13 iyun 2000-ci il tarixli fərmanı ilə ölkənin 4 aparıcı ali məktəbinə – Bakı Dövlət Universiteti, Azərbaycan Dövlət Neft Akademiyası, Azərbaycan Tibb Universiteti və Azərbaycan Kənd Təsərrüfatı Akademiyasına maliyyə müstəqilliyi, bir neçə ali məktəbə isə “Universitet” statusunun verilməsindən ibarətdir.

Ulu öndər Heydər Əliyevin həyata keçirdiyi islahatlar sayəsində Azərbaycandakı əksər ali məktəblərin inkişafı təmin olunmuş, təhsil sahəsində beynəlxalq əlaqələr genişlənmişdir. Ulu öndərimizin bu sahəyə diqqət və qayğısının təzahürü kimi təhsilin inkişafına ayrılan büdcə vəsaitinin ardıcıl olaraq artması 1993-2001-ci illərdə təhsil işçilərinin əmək haqqını 9 dəfə artırmağa imkan vermişdir.

Ulu öndərimiz Heydər Əliyevin “Azərbaycan Respublikasında təhsil sisteminin təkmilləşdirilməsi haqqında” 13 iyun 2003-cü il tarixli fərmanı isə təhsil sisteminin əsaslı şəkildə təkmilləşdirilməsinə, idarəetmənin müasir prinsiplər üzrə təşkilinə, onun beynəlxalq standartlara uyğunlaşdırılmasına və dünya təhsil sisteminə inteqrasiyasına zəmin yaratmışdır. Bu fərmanla təhsil müəssisələrinin şəbəkəsi optimallaşdırılmış, daha bir neçə universitetə muxtariyyət statusu verilmiş, ölkəmizdə müəllim hazırlığının keyfiyyətinin yüksəldilməsi məqsədilə Azərbaycan Müəllimlər İnstitutu və onun 12 filialı yaradılmışdır. Eyni zamanda, yeni təhsil müəssisələri – Dənizçilik Akademiyası, Milli Təhlükəsizlik Akademiyası, Musiqi Akademiyası, Prezident yanında Dövlət İdarəçilik Akademiyası, Milli Konservatoriya və Aviasiya Akademiyası təsis edilmişdir.

Təhsilin ümumi keyfiyyətinə bilavasitə təsir edən mühüm amillərdən biri də orta ümumtəhsil məktəblərində maddi-texniki bazanın gücləndirilməsidir. Ulu öndərimizin 4 oktyabr 2002-ci il tarixli “Azərbaycan Respublikası ümumtəh-

sil məktəblərinin maddi-texniki bazasının möhkəmləndirilməsi haqqında" sərəncamı da məhz milli təhsil sisteminin inkişafında mühüm amil olan ümumtəhsil məktəbləri şəbəkəsinin genişləndirilməsinə və maddi-texniki bazanın möhkəmləndirilməsinə xidmət etmişdir. Sərəncama müvafiq olaraq Təhsil Nazirliyinin hazırladığı Azərbaycan Respublikasında yeni ümumtəhsil məktəblərinin əsaslı təmiri və müasir tədris avadanlıqları ilə təmin olunmasına dair proqram (2003-2007-ci illər) Prezidentin 17 fevral 2004-cü il tarixli sərəncamı ilə təsdiq olunmuşdur. Təsdiqlənmiş proqramda 2003-2007-ci illər ərzində respublika üzrə 44698 şagird yeri olan 149 məktəbin tikintisi, habelə 179 məktəbdə 212 əlavə sinif otağının inşası, 45 məktəbdə əsaslı təmirin aparılması nəzərdə tutulmuş və qarşıya qoyulmuş məqsədlər uğurla reallaşdırılmışdır.

Heydər Əliyevin hakimiyyətə qayıdışından sonra Azərbaycan elmi son illərin məhrumiyyətlərindən azad olaraq öz qəddini düzəltdi, uçurumdan geriyə doğru addımlayaraq özünü sahmana saldı, dirçəliş yoluna qədəm qoydu.

Heydər Əliyev ölkəmizdə elmin inkişafı, elmi-texniki potensialın qorunub saxlanılması, elm və təhsil sahəsində yüksək ixtisaslı kadrların hazırlanması, onlara qayğı göstərilməsi, cəmiyyətdə elmi işçilərin nüfuzunun artırılması sahəsində bir sıra mühüm qərarlar qəbul etmişdir.

30 mart 2001-ci il və 1 iyul 2002-ci il tarixli sərəncamlarla AMEA Rəyasət Heyəti və akademiyanın bütün işçilərinin əmək haqları bir neçə dəfə artırılmış, 2002-ci ilin 12 avqustunda AMEA-nın Naxçıvan bölməsinin yaradılması haqqında tarixi sərəncam imzalanmış, böyük öndərimizin sədrliyi ilə Naxçıvan Ali Məclisinin iclas zalında bu bölmənin yaradılmasına həsr olunmuş müşavirə keçirilmişdir.

Heydər Əliyevin sərhəd tanımayan geniş yaradıcılıq fəaliyyətində dilçilik məsələləri, ilk öncə ana dili, dil və dövlət, dil və mədəniyyət, dil və millət, dil və tarix, dil və ədəbiyyat, dil quruculuğu kimi önəmli sosiolinqvistik məsələlər də xüsusi yer tuturdu. Bütün böyük siyasi xadimlər kimi, Heydər Əliyev də öz xalqının, ölkəsinin iqtisadiyyatı, maddi rifah halının yaxşılaşması ilə bərabər, onun ümummədəni tərəqqisinin də qayğısına qalmış, yaşadığı ölkənin, mənsub olduğu xalqın dünyanın ən inkişaf etmiş ölkələri və xalqları səviyyəsinə yüksəlməsinə ciddi diqqət yetirmişdir. Ulu Öndərimiz Heydər Əliyevin ana dilinə böyük qayğısı, sədaqəti, dərin məhəbbəti onun yalnız əsl vətəndaşlıq, ana dilini sevmək, yüksək qürur hissləri ilə bağlı deyildi. Bu, eyni zamanda onun öz ana dilini dərindən bilmək, həmin dilin bütün daxili sirlərinə, gözəlliklərinə dərindən vaqif olmaq və onlardan məharətlə istifadə edə bilmək qabiliyyətindən və istedadından irəli gəlirdi. Azərbaycan dilinin dövlət dili kimi bərqərar olunması və inkişaf etməsinə xüsusi diqqət yetirən ümummilli liderimiz Heydər Əliyev 18 iyun 2001-ci ildə "Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında" fərman imzaladı. Fərmanda Azərbaycan dilinin keçdiyi tarixi inkişaf yolu, ədəbi dilimizin inkişaf mərhələləri, müstəqil Azərbaycan Respublikasında ən mühüm ünsiyyət vasitəsi olan dilimizin tətbiqi ilə əlaqədar qarşıda duran vəzifələrin həyata keçirilməsinin konkret müddətləri göstərilmişdir.

Həmin dövrdə AMEA-nın Rəyasət Heyəti bu fərmanın icrası haqqında qərar qəbul etdi. Bu qərarda fərmanın dövlət dilimizin inkişafı sahəsində müstəsna əhəmiyyəti qeyd edilmiş və Akademiyada dövlət dilinin və latın qrafikasının tətbiqi məqsədilə bir sıra tədbirlərin görülməsi nəzərdə tutulmuşdur. Bu tədbirlərin böyük bir qismi artıq həyata keçirilmişdir. Rəyasət Heyətinin 2001-ci il avqustun 22-də keçirilmiş iclasında Heydər Əliyevin "Azərbaycan əlifbası və Azərbaycan dili gününün təsis edilməsi haqqında" fərmanı və 13 avqust 2001-ci il tarixli bəyanatı ətraflı müzakirə edildi. Rəyasət Heyəti akademiyanın elmi müəssisələrində və təşkilatlarında ölkə başçısının fərmanı və bəyanatından irəli gələn tədbirlər planının həyata keçirilməsi haqqında qərar qəbul etdi və ölkə Prezidentinə müraciət ünvanlandı.

Böyük Öndərimiz öz çıxışlarında Azərbaycan gənclərinin mükəmməl təhsil alması zəruriliyini xüsusi diqqətə çatdırmışdır: "...Gənclərimiz təhsil almalıdırlar. Çünki ali təhsil olmasa, gənclərimizin istənilən gələcəyi də olmayacaqdır". Heydər Əliyev mənəvi tərbiyə məsələsini də Azərbaycan gəncliyi qarşısında dayanan mühüm prioritetlərdən hesab edirdi: "...Gənclərimizin qarşısında duran ən əsas məsələlərdən biri mənəvi tərbiyə məsələsidir. Bilirsiniz, indi maddi çətinlik, maddi ehtiyaclar, şübhəsiz ki, cəmiyyətdə cürbəcür mənfi halların meydana

gəlməsinə gətirib çıxarır. Ancaq gənclərimiz də bilməlidir, vətəndaşlarımız da bilməlidir ki, bu dövrün müvəqqəti çətinliklərinə dözmək lazımdır, mənəvi tərbiyəni daim aparmaq lazımdır və gənclərimizi yüksək mənəviyyat ruhunda tərbiyələndirmək lazımdır. Ümumbəşəri dəyərlər, Azərbaycan xalqının milli-mənəvi dəyərləri hər bir gənc tərəfindən mənimsənilməlidir. Mənəviyyat olmayan yerdə heç bir şey ola bilməz. Nə qədər var-dövlət olsa da, nə qədər sərvət olsa da, nə qədər zənginlik olsa da mənəviyyat olmayan yerdə heç bir uğur ola bilməz”.

Ümummilli Liderimiz gəncləri təhsilli, elmli və zəkalı görmək üçün onların xaricdə təhsil alması üçün hər cür imkanlarla təmin edirdi. Heydər Əliyevin Azərbaycan Müəllimlərinin XI qurultayında məktəb tikintisi, təmiri və təchizatına yardım göstərilməsi ilə bağlı çağırışı cəmiyyətdə böyük əks-səda, canlanma yaratdı. Məhz həmin müraciətdən sonra ölkədəki xarici təşkilatlar və səfirliklər də məktəb tikintisinə yardım etməyə səy göstərdilər. Heydər Əliyevin bu çağırışma ölkənin sahibkarları və xaricdə yaşayan imkanlı azərbaycanlılar da qoşuldu. Ölkəmizdə yeni məktəb binaları tikildi, məktəblər təmir edildi, ali təhsil müəssisələrinin maddi-texniki bazası yaxşılaşdırıldı. Ümummilli liderimizin qayğısı nəticəsində təhsil sistemində yaranmış güclü inkişaf tendensiyaları, yenilik və novatorluq dövrü başlandı. Təhsil sektoru üçün ayrılan büdcə vəsaitləri ildən-ilə artırıldı.

Azərbaycan şagirdlərinə ən böyük humanistliyi və qayğını da məhz Ümummilli Liderimiz Heydər Əliyev göstərmişdir. Böyük Öndərin göstərişi ilə ölkə əhalisinin 20 faizini təşkil edən ümumtəhsil məktəb şagirdlərinin dərsliklərlə təminatına dövlət hesabına mərhələlərlə keçirilməsi haqqında xüsusi sərəncam imzalanmışdır. Bundan başqa, Heydər Əliyevin xüsusi sərəncamı ilə təsdiq olunmuş “Yoxsulluğun azaldılması və iqtisadi inkişaf sahəsində dövlət proqramı”nda 2003-cü ildən başlayaraq, ümumtəhsil məktəblərinin X-XI sinif dərsliklərinin də tədricən pulsuz təminatına keçidi nəzərdə tutulmuşdur ki, 2005-ci ildən başlayaraq bu, artıq reallığa çevrildi.

Hər il test üsulu ilə yüksək bal toplayıb ali məktəblərə qəbul edilən tələbələr də Ümummilli Liderimiz Heydər Əliyevin diqqətindən kənarda qalmırdı. O, həmin tələbələr üçün xüsusi Prezident təqaüdünün, eləcə də istedadlı gənclər üçün fəxri təqaüdlərin, “Qızıl kitab”ın təsis olunmasını reallaşdırdı.

Azərbaycan müəlliminin yaşayış səviyyəsi və sosial qayğıları ümummilli liderimizin daim diqqət mərkəzində saxladığı məsələlərdən idi. O, daima müəllimlərin uca və müqəddəs peşə sahibləri olduqlarını söyləyir, cəmiyyəti onlara qarşı sayğılı olmağa çağırırdı. Heydər Əliyev müstəqil Azərbaycan dövlətinin gələcəyi baxımından gəncliyimizə olan yüksək inamını belə ifadə etmişdir: “...Mən əminəm ki, Azərbaycanın gələcəyini qoruyub saxlaya bilən gənc nəsillər yetişir. Ona görə də biz – yaşlı nəslin nümayəndələri arxayınıq ki, siz, əziz gənclər, müstəqil Azərbaycan Respublikasının nə qədər çətinliklə başa gəldiyini dərk edərək müstəqil Azərbaycan Respublikasının gələcəyini qoruyub saxlayacaqsınız. Mən buna əminəm”.

Azərbaycan gənclərinin forumlarında xalqımızın Ümummilli Lideri, gəncləri ölkəmizin uğur və problemlərini dərindən öyrənməyə çağırmışdır: “Biz əldə etdiyimiz nailiyyətləri qiymətləndirərək, eyni zamanda hələ həll olunmamış problemləri də yaxşı bilirik. Gənclər bunları – həm nailiyyətləri, həm də həll olunmamış problemləri bilməlidirlər. Gənclər hər şeyi bilməlidirlər. İndi biz müstəqil dövlətdə plüralizm, demokratiyanın inkişafı şəraitində yaşayırıq, hüquqi, demokratik, dünyəvi dövlət quruculuğu prosesini həyata keçiririk. Ona görə də Azərbaycanın hər bir vətəndaşı ölkəmizin həyatında gedən prosesləri bilməlidir və onlar bu proseslərdə fəal iştirak etməlidirlər. Gənclərin qarşısında dayanan vəzifələr birinci növbədə cəmiyyətdə öz yerini tutmaqdan, maariflənməkdən, təhsilini artırmaqdan, cəmiyyət üçün faydalı olmaqdan ibarətdir”.

**Nəticə.** Beləliklə, bu gün ölkəmizdə gənclər siyasəti gənclərin hərtərəfli inkişafını, onların cəmiyyət həyatında fəal iştirakını təmin etmək məqsədilə dövlət tərəfindən həyata keçirilən tədbirlər sistemidir. Bu siyasət çox geniş bir spektri – gənclərin təhsili, tərbiyəsi, sağlamlığı, intellektual və mənəvi inkişafı, asudə vaxtının təşkili, həyatın bütün sahələrində fəal iştirakı ilə bağlı məsələləri əhatə edir.

**Problemin aktuallığı.** Məqalə Ümummilli Liderimiz Heydər Əliyevin anadan olmasının 100 illiyinə mühüm töhfədir.

**Problemin yeniliyi.** Məqalə Ulu Öndər Heydər Əliyevin Azərbaycan təhsili, gənclər siyasəti və tərbiyə məsələsinə həsr edilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gənc tədqiqatçılar, doktorant və dissertantlar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**


1. Əhmədov H.H. Azərbaycan təhsilinin inkişaf strategiyası. Monoqrafiya / H.H.Əhmədov. – Bakı: Elm, 2010. – 800 s.
2. Qaralov, Z.İ. Əbədiyyətə gedən yollar / Z.İ.Qaralov. – Bakı: Elm, – 2005. – 575 s.
3. Qaralov, Z.İ. İdeologiya və mənəviyyat / Z.İ.Qaralov. – Bakı: Hüquq ədəbiyyatı, – 2008. – 483 s.
4. Qaralov, Z.İ. Heydər Əliyev elmi irsi (Nəzəriyyə və təcrübə): [II cilddə] / Z.İ.Qaralov. – Bakı: Şərq-Qərb, – c. 1. – 2013. – 304 s.
5. Qaralov, Z.İ. Heydər Əliyev elmi irsi (Nəzəriyyə və təcrübə): [II cilddə] / Z.İ.Qaralov. – Bakı: Şərq-Qərb, – c. 2. – 2013. – 308 s.
6. Qaralov, Z.İ. Heydər Əliyev-Milli ləyaqət ölçüsü / Z.İ.Qaralov. – Bakı: Təhsil, – 2015. – 405 s.
7. Mərdanov, M.C. Azərbaycan təhsil tarixi [IV cilddə] / M.C.Mərdanov. – Bakı: “Təhsil, – c.3. – 2011. – 671 s.


**E-mail**: humeyir@gmail.com
**Rəyçilər**: *ped.elm.dok., prof.* **A.N. Abbasov,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 17.04.2023

*UOT 37.0*

***Lalə Akif qızı Məmmədli***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı mütəxəssisi*
*https://orcid.org/ 0000-0003-0686-3627*

## ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEV FƏAL HƏYAT MÖVQEYİNİN FORMALAŞDIRILMASI HAQQINDA

***Лала Акиф гызы Мамедли***
*доктор философии по педагогике, ведущий специалист*
*Института Образования Азербайджанской Республики*

## ОБЩЕНАЦИОНАЛЬНЫЙ ЛИДЕР ГЕЙДАР АЛИЕВ О ФОРМИРОВАНИИ АКТИВНОЙ ЖИЗНЕННОЙ ПОЗИЦИИ

***Lala Akif Mammadly***
*doctor of philosophy in pedagogy*
*leading specialist at the Institute of Education of the Republic of Azerbaijan*

## NATIONAL LEADER HEYDAR ALIYEV ON THE FORMATION OF AN ACTIVE LIFE POSITION

**Xülasə.** Məktəbin mühüm vəzifələrindən biri hər bir şagirdin şəxsi inkişafı, onun fəal həyat mövqeyinə yiyələnməsi üçün zəruri şəraitin yaradılmasından ibarətdir. Məqalədə tələbələrin mənəvi tərbiyəsinə və onlarda fəal həyat mövqeyinin formalaşdırılması probleminə dair Ümummilli lider Heydər Əliyevin fikirləri öz əksini tapmışdır.

***Açar sözlər**: fəal mövqe, fəal həyat mövqeyi, mənəvi keyfiyyətlər, mənəvi keyfiyyətlərin tərbiyə olunması, fəal həyat mövqeyinin formalaşdırılması*

**Резюме**. Одной из важных задач школы является создание необходимых условий для личностного развития каждого ученика, приобретения им активной жизненной позиции. В статье отражены взгляды общенационального лидера Гейдара Алиева на нравственное воспитание студентов и проблему формирования у них активной жизненной позиции.

***Ключевые слова**: активная позиция, активная жизненная позиция, нравственные качества, воспитание нравственных качеств, формирование активной жизненной позиции*

**Summary.** One of the important tasks of the school is to create the necessary conditions for the personal development of each student, the acquisition of an active life position. The article reflects the views of the national leader Heydar Aliyev on the moral education of students and the problem of forming an active life position in them.

***Key words**: active position, active life position, moral qualities, upbringing of moral qualities, formation of an active life position*

Ümummilli lider Heydər Əliyev şəxsiyyətin – yaşından asılı olmayaraq, hər bir şəxsin müsbət və mənəvi keyfiyyətlərə yiyələnmələrinə, fəal həyat mövqeyi qazanmalarını məqsədəuyğun və vacib hesab edirdi. İnsan məhz yaxşı keyfiyyətləri özündə tərbiyə etməklə xeyirxah, doğrucul, humanist, ədalətli, işgüzar, zəhmətsevər, vətənpərvər, alicənab, namuslu, ismətli, vicdanlı, gözü-könlü tox, əlidüz, olur.

Şəxsiyyət fəal həyat mövqeyinə malik olmaqla cəmiyyətdə, ailədə sevilir, seçilir, təşəbbüskar, müstəqil, təşkilatçı, mübariz olur. Ulu

Öndər müxtəlif tədbirlərdə – zəhmətkeşlər, istehsalat və pedaqoji kollektivlər, tələbələr qarşısında, konfranslarda, Müəllimlərin qurultaylarındakı çıxışlarında insanların, gənc nəslin cəmiyyətə layiq vətəndaşlar kimi formalaşmasında fəal həyat mövqeyinə yiyələnməyin vacibliyini dönə-dönə diqqətə çatdırırdı. Ulu Öndərin çıxışları, nitqləri, bəyanatları, məktubları, müsahibələri bir araya gətirilərək onun əsərlərinin 46-cildliyində öz ifadəsini tapmışdır.

Heydər Əliyevin fəal həyat mövqeyinin formalaşdırılmasına, mənəvi tərbiyənin təcrübəsi və aktual problemlərinə dair fikirləri ilə daha ətraflı şəkildə 1979-cu ildə Bakı şəhərində keçirilmiş "Fəal həyat mövqeyinin formalaşdırılması: mənəvi tərbiyənin təcrübəsi və aktual problemləri" mövzusunda ümumittifaq elmi-praktik konfransındakı məruzəsində tanış olmaq mümkündür.

Ümummilli Liderin qənaətincə, "*Şəxsiyyətin əxlaqi keyfiyyətlərinin formalaşması onun hərtərəfli və ahəngdar inkişafının çox mühüm bir cəhətidir... Bizim mənəviyyatımız ictimai mənafe ilə şəxsi mənafeyi qırılmaz tellərlə bir-birini bağlayır, insana xalqın səadəti uğrunda mübarizədə fəal mövqe tutmağa kömək edir*" [1, s.14-15].

Ulu Öndər mənəvi tərbiyəni ideoloji işin tərkib hissəsi hesab edirdi. Bu fikirdə idi ki, mənəvi tərbiyə həyatın bütün sahələrinin inkişafına, ictimai istehsalın səmərəliliyinə öz təsirini göstərməlidir. Çalışmaq lazım idi ki, əmək, təhsil, asudə vaxt, ailə-məişət münasibətləri, həyatın bütün sahələri ideya məzmunu ilə zənginləşsin.

Ümummilli Lider fəal həyat mövqeyindən danışarkən, ilk növbədə həyat mövqeyinin mühüm komponenti olan "fəal mövqe" anlayışına aydınlıq gətirirdi. Bu xüsusda göstərirdi ki, "*fəal mövqe şəxsiyyətin əqidəsini, onun iradə zənginliyini, ideya-mənəvi düşüncələrini və keyfiyyətlərini ifadə edərək, insana yeni-yeni məsələləri irəli sürüb həll etməkdə, çətin şəraitdə özünü itirməməkdə, qətiyyətli hərəkət etməkdə, öz üzərinə məsuliyyət götürməkdə kömək edir. Fəal mövqe bəşəriyyətin hazırladığı bütün mənəvi sərvətlər ilə öz daxili aləmini daim zənginləşdirməyi tələb edir*" [1, s.15].

Ulu Öndər yalnız bundan sonra "fəal həyat mövqeyi" anlayışı üzərində dayanırdı. Bildirirdi ki, "Fəal həyat mövqeyi kütlələrin ideya-mənəvi tərbiyəsinin səmərəliliyinin ümumiləşdirici göstəricisidir, şəxsiyyətin mənəvi keyfiyyətlərini yoxlamaq üçün ən təsirli bir vasitədir. Belə bir mövqe ən yaxşı adamın keyfiyyətlərinin təzahürü deməkdir" [1, s.16].

Heydər Əliyev "Fəal həyat mövqeyinin formalaşdırılması: mənəvi tərbiyənin təcrübəsi və aktual problemləri" mövzusunda ümumittifaq elmi-praktik konfransındakı məruzəsində mənəvi tərbiyəyə də tərif vermişdir. Diqqət yetirək: "*Mənəvi tərbiyə əxlaqın bərqərar edilməsinə və onun antipodlarına qarşı barışmaz mübarizəyə yönəldilən ideoloji tədbirləri, təşkilati tədbirləri, ictimai və inzibati tədbirləri özündə birləşdirən bir prosesdir*" [1, s.21]. Tərifdən göründüyü kimi, Ulu Öndər mənəvi tərbiyə problemlərini təkcə təhsilalanlara deyil, eyni zamanda zəhmətkeşlərə, əmək kollektivlərində çalışanlara da şamil etmişdir.

Heydər Əliyev mənəvi tərbiyəni bir sistem kimi nəzərdən keçirir, onun əsas tərkib hissələrini müəyyənləşdirirdi. Həmin tərkib hissələrə aid idi:

*"– ictimai intizamın möhkəmləndirilməsi;*

*– mənəvi problemlərin həllinə bütün şüurlu vətəndaşların cəlb edilməsi;*

*– qarşıda duran vəzifələrin bütün kompleksinin həllində mənəvi cəhətlərin nəzərə alınması;*

*– iş nəticələrinə qiymət verilməsinə mənəvi meyarların daxil edilməsi;*

*– əmək fəaliyyətində və ictimai fəaliyyətdə maddi amillərlə mənəvi amillərin ahəngdar əlaqələndirilməsi;*

*– mənfi hallara qarşı ardıcıl mübarizə aparılması;*

*– tənqid və özünütənqidin genişləndirilməsi;*

*– mənəvi tərbiyədə kütləvi informasiya vasitələrindən fəal istifadə edilməsi və s."* [1, s.24-25].

Ümummilli Lider öz məruzəsində fəal həyat mövqeyinin formalaşdırılmasının əsas istiqamətlərinə və vasitələrinə də münasibət bildirmişdir.

Heydər Əliyevə görə, şəxsiyyətin fəal mövqeyi bütün həyat sahələrində – əmək sahəsində, siyasi, mənəvi sahədə, ailə-məişət sahəsində özünü göstərir. Unu Öndər böyüyən nəsildə fəal həyat mövqeyinin formalaşdırılmasında məktəbin, təhsil ocaqlarının roluna yüksək qiymət verirdi. Göstərirdi ki, *gəncləri əməli işə, sözün geniş mənasında, həyata hazırlamaq üçün tədris prosesinin mənəvi tərbiyə ilə get-gedə daha dolğun şəkildə əlaqələndirmək lazımdır. Bu isə gənclərə "Kim olmalı?" sualına cavab verməkdə, hətta daha əhəmiyyətli olan başqa bir*

*suala "Nə cür adam olmalı?" sualına cavab tapmaqda kömək etmək deməkdir* [1, s. 36]. Lakin məktəb həyatında yol verilən nöqsanları qeyd etmək də unudulmurdu. Ümummilli Lider deyirdi: "Təəssüf ki, məktəb özünüidarəsi, şagirdlərin ictimai-siyasi və əmək tərbiyəsi imkanlarından hələ də zəif istifadə edilir. Məktəb uşaqlara müstəqilliyi, öz üzərinə məsuliyyət götürmək, öz qərarını müdafiə etmək bacarığını yenə əvvəlki kimi az və səthi öyrədir" [1, s.36].

Heydər Əliyev təhsilaalanların mənəvi tərbiyəsində, onlarda fəal həyat mövqeyinin formalaşdırılmasında müəllimin roluna yüksək dəyər verirdi. Müəllimlərə uşaqlar və gənclər üçün mənəvi saflıq və işə sədaqətli münasibət nümunəsi kimi yanaşırdı.

Ümummilli Lider şəxsiyyətin mənəvi simasının formalaşdırılmasında mədəniyyətin və elmin rolunu xüsusilə qeyd edirdi.

Ulu Öndərin İnsan mənəviyyatı, şəxsiyyətin fəal həyat, fəal vətəndaşlıq mövqeyi ilə bağlı saysız-hesabsız faydalı fikirləri vardır. Onlardan bəzilərini diqqət mərkəzinə gətirmək istəyirəm:

*Hər bir insan həyatda öz yerini tapmalıdır. Amma öz yerini, özünə məxsus olan yerini tapmalıdır.

*Rəhbərlik etmək, yəni adamları öyrətmək və tərbiyələndirmək üçün gərək mənəvi haqqın olsun.

*Yol – iqtisadiyyat, mədəniyyət, bir sözlə, "həyat" deməkdir!

*Kim ki biliyindən, bacarığından artıq iddialıdır, o, həmişə məğlub olur".

*Kiməsə qarşı ədalətsizlik edilibsə, bu ədalətsizliyin qarşısını ədalətlə almaq lazımdır. Amma ədalətsizliyə qarşı daha böyük bir cinayət törətmək ədalətsizlikdən də betərdir.

*İnsan mənəviyyat üçün yaşamalıdır. Mənəviyyatını qoruyan, yaşadan insan əbədi olacaqdır.

*Yüksək mədəniyyətə malik olan xalq həmişə irəli gedəcək, həmişə yaşayacaq, həmişə inkişaf edəcəkdir.

*Həqiqi mənəviyyatı milyonlara, milyardlara da almaq mümkün deyildir. Amma milyonları, milyardları olan mənəviyyatsız adamlar cəmiyyətdə heç bir şeydirlər.

*Sənətdə hər kəsin öz yeri var. Heç kəs kiminsə yerini almır.

*Həyatda şərəflə şərəfsizliyi, şəxsi rifahla ictimai borcu, tamahkarlıqla vicdanlılığı hər bir kəs özü seçir və s.

**Problemin aktuallığı.** Ulu Öndər Heydər Əliyevin təhsilalanların mənəvi tərbiyəsinə və onlarda fəal həyat mövqeyinin formalaşdırılmasının vacibliyinə dair fikirləri aktuallığı ilə seçilir.

**Problemin elmi yeniliyi.** Fəal həyat mövqeyinin formalaşdırılması ilə bağlı Ümummilli Lider Heydər Əliyevin fikirləri diqqət mərkəzinə gətirilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**


1. "Fəal həyat mövqeyinin formalaşdırılması: mənəvi tərbiyənin təcrübəsi və aktual problemləri" mövzusunda 1979-cu il aprelin 25-27-də Bakıda keçirilmiş ümumittifaq elmi-praktik konfransında Heydər Əliyevin məruzəsi. – Bakı: Azərnəşr, – 1979. – 62 s.
2. Abbasov, A.N. Pedaqogika nəzəriyyəsi və tarixi: Ali təhsil müəssisələri üçün dərslik. / Abbasov A.N., Məmmədli L.A., Əmirəliyeva İ.B. – Bakı: Mütərcim, – 2022.


**E-mail**: lale23@mail.ru

**Rəyçilər**: *ped.elm.dok., prof.* **H.H. Əhmədov**,
*ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva**
**Redaksiyaya daxil olub:** 03.04.2023

*UOT 37.0*

***Emilya Rafiq qızı Hüseynova***
*pedaqogika üzrə fəlsəfə doktoru,*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti*

# ULU ÖNDƏR HEYDƏR ƏLİYEVİN HƏYATI, FƏALİYYƏTİ VƏ QİYMƏTLİ FİKİRLƏRİ MƏKTƏBLİLƏRDƏ FƏAL VƏTƏNDAŞLIQ MÖVQEYİ TƏRBİYƏLƏNDİRMƏYİN VASİTƏSİ KİMİ

***Эмилия Рафиг гызы Гусейнова,***
*доктор философии по педагогике, доцент*
*Азербайджанского Государственного Педагогического Университета*

# ЖИЗНЬ, ДЕЯТЕЛЬНОСТЬ И ЦЕННЫЕ ИДЕИ ВЕЛИКОГО ЛИДЕРА ГЕЙДАРА АЛИЕВА КАК СРЕДСТВО ВОСПИТАНИЯ АКТИВНОЙ ГРАЖДАНСКОЙ ПОЗИЦИИ ШКОЛЬНИКОВ

***Emilya Rafig Huseynova,***
*doctor of philosophy in pedagogy, assistant professor at*
*Azerbaijan State Pedagogical University*

# LIFE, ACTIVITIES AND VALUABLE IDEAS OF GREAT LEADER HEYDAR ALIYEV AS A MEANS OF EDUCATION OF SCHOOLCHILDREN'S ACTIVE CIVIC STAND

**Xülasə**. Məktəblilərdə fəal vətəndaşlıq mövqeyinin formalaşdırılmasında Ümummilli lider Heydər Əliyevin həyat və fəaliyyəti, qiymətli fikirləri mühüm rol oynayır. Məktəblilər Ulu Öndərin həyat və fəaliyyəti, qiymətli fikirləri ilə tanış olduqdan sonra onlarda fəal vətəndaşlıq mövqeyi təşəkkül tapmağa başlayır. Məqalədə, eyni zamanda, azərbaycançılıq ideologiyasından danışılır. Məqalədə Heydər Əliyev azərbaycançılıq ideologiyasının yaradıcısı kimi nəzərdən keçirilir.
***Açar sözlər**: Ümummilli Lider, azərbaycançılıq, azərbaycançılıq ideologiyası, vətəndaşlıq, vətəndaşlıq mövqeyi, fəal vətəndaş, fəal vətəndaşlıq mövqeyi*

**Резюме.** Жизнь и деятельность общенационального лидера Гейдара Алиева, его ценные идеи играют важную роль в формировании активной гражданской позиции у школьников. После знакомства школьников с жизнью и деятельностью Великого Вождя, а также с его ценными идеями у них начинает формироваться активная гражданская позиция. В статье также говорится об идеологии азербайджанства. В статье Гейдар Алиев рассматривается как создатель азербайджанской идеологии.
***Ключевые слова**: Общенациональный Лидер, азербайджанство, идеология азербайджанства, гражданство, гражданская позиция, активный гражданин, активная гражданская позиция*

**Summary**. The life and work of the national leader Heydar Aliyev, his valuable ideas play an important role in the formation of an active civic position among schoolchildren. After schoolchildren get acquainted with the life and work of the Great Leader, as well as with his valuable ideas, they begin to form an active civic position. The article also talks about the ideology of azerbaijanism. In the article, Heydar Aliyev is considered as the creator of the Azerbaijani ideology.
***Key words**: national leader, azerbaijanism, ideology of Azerbaijanism, citizenship, civic position, active citizen, active civic position*

Böyüməkdə olan nəsildə fəal vətəndaşlıq mövqeyinin tərbiyələndirilməsi ümumtəhsil məktəbinin ümdə vəzifələrindən biridir. Fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması üçün

təhsil müəssisələri müxtəlif vasitələrdən istifadə edir. Ən mühüm vasitələrdən biri, fikrimizcə, şagirdlərin Ümummilli lider Heydər Əliyev nümunəsində tərbiyə olunmasıdır. Daha dəqiq və konkret ifadə etsək, Ulu Öndərin həyat və fəaliyyəti, qiymətli fikirləri ən səmərəli vasitə kimi özünü göstərir.

Xalqımızın müasir tarixinin böyük bir hissəsi Ümummilli liderimiz Heydər Əliyevin adı və səmərəli fəaliyyəti ilə sıx surətdə bağlıdır. Ulu Öndər bütün şüurlu həyatını Azərbaycanımızın və xalqımızın inkişafına və tərəqqisinə həsr etmişdir.

Bildiyimiz kimi, ölkəmizin müstəqilliyinin möhkəmlənməsində, beynəlxalq aləmdə möhtəşəm nüfuz qazanmasında Ulu Öndərin böyük xidmətləri olmuşdur. Heydər Əliyev məhz fəal vətəndaşlıq mövqeyinə malik olmaqla ölkəmizin daxili və xarici siyasətində uğurlar qazanmış, böhranlar dövründə respublikamızda sabitlik yaratmışdır.

Bu böyük tarixi şəxsiyyət həm də ona görə sevilir və dərin hörmət sahibidir ki, mükəmməl, müstəqil demokratik dövlət quruculuğu konsepsiyasını işləyib hazırlayaraq reallaşdırmışdır. Ona görə də dövlət xadimləri, siyasətçilər Heydər Əliyevi iyirminci yüzillikdə Azərbaycan siyasətinin ən parlaq siması və XXI əsrin müstəqillik kursunun memarı hesab edirlər.

Heydər Əliyev ikinci dəfə hakimiyyətə gələn kimi, hər şeydən əvvəl ordu quruculuğuna başladı. Ermənistanla müharibə şəraitində olduğumuz, torpaqlarımızın işğal altında olduğu bir dövrdə güclü orduya malik olmalı idik.

Onun rəhbərliyi ilə ölkəmizin Əsas Qanunu – Konstitusiyası yeni redaksiyada meydana gəldi.

Ümummilli Lider ölkəmizin iqtisadi inkişafına imkan verən iri həcmli xarici sərmayələrin cəlb edilməsinə nail oldu. Bu, milyonlarla azərbaycanlının maddi rifah halını yaxşılaşdırdı və respublikamızın XXI əsrə müasir dövlət kimi daxil olmasına imkan verdi. O, eyni zamanda, ölkəmizin xarici siyasətini diqqət mərkəzində saxlayır, uzaqgörən diplomat, müdrik dövlət xadimi kimi beynəlxalq aləmdə uğurlu addımlar atırdı.

Ulu Öndər Azərbaycan təhsilinin təkmilləşdirilməsinə, dünya təhsil sisteminə inteqrasiya olunmasına da qayğı ilə yanaşırdı. Bu xüsusda o deyirdi: “Mən 1969-cu ildə respublikanın rəhbəri seçiləndən sonrakı fəaliyyətimin, şübhəsiz ki, bütün sahələrini qiymətləndirərək, Azərbaycanda məktəbin, orta, ali təhsilin, texniki peşə təhsilinin inkişaf etməsini öz fəaliyyətimin əsas hissəsi hesab etmişəm, bununla ciddi məşğul olmuşam”, hər bir şəxsin elmi biliklərə, geniş dünyagörüşünə, dərin savada, yüksək vətənpərvərlik hissinə və mədəniyyətə malik olmasını, həmin sahələrdə məqsədyönlü işlərin görülməsini təhsil müəssisələrinin üzərinə mühüm vəzifə kimi qoyurdu. Heydər Əliyev təhsildə cəmiyyətdə şərəfli yeri olan müəllim amilinə diqqəti yönəldir, müəllim şəxsiyyətini, onun şəxsi və peşə keyfiyyətlərini pedaqoji prosesin səmərəli qurulmasında əhəmiyyətli hesab edirdi. Ulu Öndərin sözləridir: “Hər bir vicdanlı adam, Vətəninə, xalqına bağlı olan hər bir adam, qədirbilən adam müəllimini həmişə qəlbində saxlayır, onu daim hörmətlə yad edir. Müəllim adı şərəfli addır, müəllim adı yüksək addır. İndi biz nə qədər çətin bir dövrdə yaşasaq da, müəllim adını daha yüksəklərə qaldırmalıyıq” [1, s.116].

Ümummilli Lider müəllimlərə həmişə hörmət bəsləmiş, cəmiyyətin həyatında müəllimin roluna yüksək qiymət vermişdir. Onun nöqteyi-nəzərincə, “sənə dərs deyən, uşaq vaxtlarından, gənclik çağlarından səni tərbiyə edən müəllimləri unutmaq olmaz. ...Müəllim olmasa, heç birimiz cəmiyyətdə indi tutduğumuz yeri tuta bilməzdik və bugünkü kimi fəaliyyət göstərə bilməzdik” [2, s.94].

Azərbaycançılığın tarixi Azərbaycan xalqının tarixi qədər qədimdir. Respublikamızda bir çox millətlər yaşayıb fəaliyyət göstərirlər. Onların bir yumruq kimi birləşməsi son dərəcə vacibdir. Ölkəmizin dayaqlarının möhkəm olmasında azərbaycançılığın rolu böyükdür. Bu bir həqiqətdir ki, hər hansı bir dövlətin uzunömürlü olması, ilk növbədə, ölkə ərazisində yaşayan xalqları öz ətrafında birləşdirən və möhkəm bünövrə əsasında qurulan siyasi ideologiyadan xeyli dərəcədə asılıdır. Məhz buna görə də Ümummilli Lider azərbaycançılıq ideyasını möhkəm müdafiə edirdi. O, müasir azərbaycançılıq ideologiyanın yaradıcısı idi. Heydər Əliyev azərbaycançılıq ideologiyasını milli ideologiya səviyyəsinə yüksəltmişdir. Bu ideologiya bu günün özündə də həmin yüksəkliyi fəth edir.

Azərbaycançılıq dedikdə, vahid, müstəqil və bölünməz Vətən, birlik və həmrəylik, dünyada öz milli “mən”i ilə diqqət mərkəzində olmaq

anlaşılmalıdır. Dünyada yaşayan 60 milyonluq Azərbaycan xalqının bu məfkurəyə, bu ideyaya əsaslanaraq bir araya gəlməsi milli birlik və həmrəyliyin bərqərar olmasında son dərəcə zəruri şərtdir.

Ümummilli lider Heydər Əliyev deyirdi: “Müstəqil Azərbaycan dövlətinin əsas ideyası azərbaycançılıqdır. Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir. Mən ömrümün bundan sonrakı hissəsini yalnız Azərbaycan Respublikasının müstəqil dövlət kimi inkişaf etməsinə həsr edəcəyəm. ...Mən həmişə fəxr etmişəm, bu gün də fəxr edirəm ki, mən azərbaycanlıyam”.

Heydər Əliyevin 2001-ci ilin noyabrında Bakıda Dünya Azərbaycanlılarının I qurultayında bəyan etdiyi tezislər əslində azərbaycançılıq məfkurəsinin, Azərbaycan təəssübkeşliyinin əsas ideyalarını ifadə edir. Fikir verək: “Biz istəyirik ki, müxtəlif ölkələrdə yaşayan azərbaycanlılar həmin ölkələrin vətəndaşı kimi, istədikləri kimi yaşasınlar. Ancaq heç vaxt öz milli köklərini, milli mənsubiyyətlərini itirməsinlər. Bizim hamımızı birləşdirən, həmrəy edən azərbaycançılıq ideyasıdır. Azərbaycançılıq öz milli mənsubiyyətini, milli-mənəvi dəyərlərini qoruyub saxlamaq, eyni zamanda, onların ümumbəşəri dəyərlərlə sintezindən, inteqrasiyasından bəhrələnmək deməkdir. Hər bir insan üçün milli mənsubiyyəti onun qürur mənbəyidir. Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir və biz azərbaycançılığı yaşatmalıyıq” [3].

Hazırda Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev bünövrəsi dünya şöhrətli Ümummilli liderimiz Heydər Əliyev tərəfindən qoyulmuş azərbaycançılıq məfkurəsinin ümummilli ideologiya kimi möhkəmlənməsi istiqamətində məqsədyönlü, sistemli və uğurlu fəaliyyət göstərir.

Müxtəlif fənlər üzrə məşğələlərdə, sinifdənxaric və auditoriyadankənar tədbirlərdə şagirdlərdə (tələbələrdə) fəal vətəndaşlıq mövqeyi formalaşdırılarkən Heydər Əliyevin həyat və fəaliyyətindən, qiymətli fikirlərindən mühüm vasitə kimi istifadə etmək lazımdır.

**Problemin aktuallığı**. X-XI sinif şagirdlərində fəal vətəndaşlıq mövqeyinin formalaşdırılmasında bir sıra mənbələrə müraciət edilir. Ümummilli lider Heydər Əliyevin həyat və fəaliyyəti barədə şagirdlərə məlumat verilməsi məktəblilərə fəal vətəndaşlıq mövqeyi qazandırmağın mühüm mənbəyi ola bilər.

**Problemin elmi yeniliyi.** Ulu öndər Heydər Əliyevin həyat və fəaliyyəti X-XI sinif şagirdlərində fəal vətəndaşlıq mövqeyi formalaşdırmaqda mənbə rolunu oynayır.

**Problemin praktik əhəmiyyəti**. Məqalə tədqiqatlar aparan gənc tədqiqatçılar, doktorant və dissertantlar, müəllimlər üçün faydalı ola bilər.

**Ədəbiyyat:**

1. Bakı şəhərinin təhsil işçiləri ilə görüşdə giriş sözü. 31 avqust 1994-cü il. bax: Heydər Əliyev. Müstəqilliyimiz əbədidir. 2-ci kitab. Buraxılışına məsul R. Mehdiyev, H. Orucov. – Bakı: Azərnəşr, – 1997.
2. Təhsil işçilərinin bir qrupu ilə görüşdə giriş və yekun sözü. Prezident sarayı 12 fevral 1995-ci il.
3. http://sia.az/az/news/economy/373888-ulu-onder-heyder-eliyev-azerbaycanciliq-mefkuresini-milli-ideologiya-seviyyesine-yukseldib
4. Azərbaycan Prezidenti Heydər Əliyevin bəyanatı. 13.08.2001. http://azertag.az/xeber/AZARBAYCAN_PREZIDENTI_HEYDAR_ALIYEVIN_BAYANATI816078
5. “Dünya azərbaycanlılarının qurultayının çağırılması haqqında” Azərbaycan Respublikası Prezidentinin 24 dekabr 1992-ci il tarixli, 255 №-li Sərəncamı.

**E-mail**: emilya.huseynova95@gmail.com
**Rəyçilər:** *ped.elm.dok., prof.* **A.N. Abbasov,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 17.04.2023

*UOT 37.0*

***Ramiz Cəlal oğlu Əliyev***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin Təhsil menecmenti kafedrasının dosenti*
*https://orcid.org/0009-0000-2707-1018*

# ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN İRSİ VƏ GƏNCLƏRİN MƏNƏVİ TƏRBİYƏSİ

***Рамиз Джалал оглы Алиев***
*доктор философии по педагогике*
*доцент кафедры управления образованием*
*Азербайджанского Государственного Педагогического Университета*

# НАСЛЕДИЕ ОБЩЕНАЦИОНАЛЬНОГО ЛИДЕРА ГЕЙДАРА АЛИЕВА И НРАВСТВЕННОЕ ВОСПИТАНИЕ МОЛОДЕЖИ

***Ramiz Jalal Aliyev***
*doctor of philosophy in pedagogy, associate professor of*
*department of Education management at*
*Azerbaijan State Pedagogical University*

# THE LEGACY OF NATİONAL LEADER HEYDAR ALİYEV AND MORAL UPBRINGING OF YOUNG PEOPLE

**Xülasə.** Məqalədə deyilir ki, ümummilli lider Heydər Əliyevin zəngin yaradıcılıq irsi, şəxsi nümunəsi, dövlətçilik fəaliyyəti və siyasi görüşləri gənc nəslin təhsil-tərbiyə işinin səmərəli təşkili üçün ən dəyərli mənbədir. Səbəb odur ki, Azərbaycan Respublikası gənclərinin vətəndaşlıq dərsləri, şəxsiyyət tamlığı nümunəsi olan bu irsin hərtərəfli öyrənilməsi nəticəsində müstəqil və yaradıcı düşüncə tərzinə sahib olan ölkə vətəndaşlarının milli müstəqillik uğrunda cəsarətli mübarizəsinin şahidi olmaq və onun nailiyyətlərini görmək olar. Ulu Öndər Heydər Əliyevin irsində böyüyən nəslin fiziki, mənəvi, ruhi və əqli tərbiyə məsələləri, o cümlədən milli vətənpərvərlik, sədaqətlilik, dini tərbiyə məsələləri də məqalədə geniş yer tutur və əhəmiyyətliliyi ilə diqqəti cəlb edir.
***Açar sözlər:*** *millət, təhsil, inkişaf, Heydər Əliyev siyasəti, böyük öndər, dahi, dəyərli şəxsiyyət, müasir, xilaskar, mənəvi*

**Резюме.** В статье отмечается, что богатое творческое наследие общенационального лидера Гейдара Алиева, личный пример, государственная деятельность и политические встречи являются ценнейшим источником для эффективной организации воспитания и обучения подрастающего поколения. Причина в том, что в результате всестороннего изучения этого наследия, являющегося образцом уроков гражданственности и цельности личности молодежи Азербайджанской Республики, можно стать свидетелем мужественной борьбы за национальную независимость и увидеть ее достижения гражданами страны, обладающими независимым и творческим образом мышления. В статье важное место занимают вопросы физического, духовного, умственного и нравственного воспитания подрастающего поколения в наследии великого лидера Гейдара Алиева, в том числе вопросы национального патриотизма, верности, религиозного воспитания.
***Ключевые слова:*** *нация, образование, развитие, политика Гейдара Алиева, великий лидер, гений, ценная личность, современный, спаситель, нравственный*

**Summary.** The article says that national leader Heydar Aliyev's rich creative heritage, personal example, statesmanship and political meetings are the most valuable source for the effective organization of education and training of the young generation. The reason is that as a result of the comprehensive study of

this heritage, which is an example of citizenship lessons and completeness of identity of the youth of the Republic of Azerbaijan, one can witness the brave struggle for national independence and see its achievements by the citizens of the country who have an independent and creative way of thinking. The issues of physical, spiritual, mental and mental education of the generation growing up in the legacy of the Great Leader Heydar Aliyev, including issues of national patriotism, loyalty, and religious education, occupy a large place in the article and attract attention with their importance.

***Key words:*** *nation, education, development, Heydar Aliyev's policy, great leader, genius, valuable, personality, modern, savior, moral*

Ümummilli lider Heydər Əliyevin zəngin yaradıcılıq irsi, şəxsi nümunəsi, dövlətçilik fəaliyyəti və siyasi görüşləri gənc nəslin təhsil-tərbiyəsi işinin səmərəli təşkili üçün ən dəyərli mənbədir. Şübhəsiz ki, Azərbaycan Respublikası gənclərin vətəndaşlıq dərsləri, şəxsiyyət tamlığı nümunəsi olan bu irsin hərtərəfli öyrənilməsi nəticəsində müstəqil və yaradıcı düşüncə tərzinə sahib olan Azərbaycan vətəndaşlarının milli müstəqillik uğrunda cəsarətli mübarizəsinin şahidi olmaq və onun nailiyyətlərini görmək olar.

Respublikamızın milli tərbiyə konsepsiyası Heydər Əliyev ideyalarından mənəvi güc almış və yaranmışdır. Ümummilli Liderin baxışları, nitqləri və məruzələrində irəli sürülən tərbiyəvi cəhətdən qiymətli fikirlər tərbiyə işinin həm məzmununu, həm də praktik fəaliyyətdə həyata keçirilmə yollarını əsaslandırır; gənclərin milli-mənəvi tərbiyə işinin elmi-nəzəri məsələlərini aşkara çıxarır.

Ümummilli Lider Respublikamızın gənclərinin müstəqil dövlət sahibi, öz taleyinin sahibi olmaq hissini, yaşayaraq sahiblik, sahibkarlıq bacarıqlarına yiyələnməsini irəli sürür. Sahibi olduğu torpağın yeraltı, yerüstü sərvətlərinin, Vətən deyilən müqəddəs varlığın insanlıqda uca tutulan şərəfin, namus və qeyrətin daşıyıcısı olan və bu sahibkarlığı mənəviyyatına hopduran insanın şəxsiyyətli, azadlıqsevər, cəsarətli, mərd olacağına şübhə yoxdur. Respublikamızın bu günü və sabahı belə insanların yetişdirilməsini tələb edir. Bu baxımdan "hər bir Azərbaycan gənci öz həyat yolunu müstəqil Azərbaycan Respublikasının yaşamasına və əbədi olmasına həsr etməkdən ibarət olmaqdır. Ümumilikdə, milli tərbiyə işinin məzmunu, ilk növbədə, gənclərin dövlətçilik, müstəqillik, azadlıqsevərlik, onların qorunması uğrunda mübarizlik ruhunda tərbiyəsindən ibarət olmalıdır. Öhdəsinə düşən borcun dərk edilməsi və bunun üçün məsuliyyət hissi daşımaq artıq bir şəxsiyyət olaraq onun yetkinlik əlamətidir. Bu proses isə birdənbirə mexaniki olaraq yaranmır. Erkən yaşlardan başlayaraq tərbiyə işi pedaqoji metodik və psixoloji əsaslarla elə düzgün qurulmalıdır ki, hər bir böyüyən uşaqda yetkinləşmə getsin. Əgər tərbiyəvi işin məqsədi aydın müəyyənləşdirilərsə, ona nail olmaq yolları düzgün tapılarsa, heç şübhəsiz, nəzərdə tutulan nəticəni almaq olar. Amma tərbiyəçinin özünün də borc və məsuliyyət hissini nümunə olacaq səviyyədə daşıması tələb olunur. Azərbaycanın dövlət müstəqilliyinin, Azərbaycan xalqının azadlığının daimi qorunmasına cəhd hissinin formalaşdırılması, Heydər Əliyev təhlilinə görə bir neçə komponenti özündə əks etdirir. Birinci komponent Azərbaycan qanunlarının aliliyini təmin etmək, insanların hüquqlarını, azadlıqlarını qorumaq istəyidir. Hər bir gənc bu istəyi yerinə yetirmək üçün hazırlaşdırılmalı və onun daşıyıcısı olmağı bacarmalıdır. Məhz bu amilin düzgün həlli üçün hüquq tərbiyəsi daha da genişləndirilməli, onlara Azərbaycan Respublikasının qanunları mahiyyətcə dəqiq öyrədilməlidir. İkinci komponent Azərbaycanın ərazi bütövlüyünü təmin etmək, qoruyub saxlamaqdır. Üçüncü komponent Azərbaycanın müstəqilliyini təmin edən ordusunun varlığıdır. Dördüncü komponent Azərbaycanda yüksək təhsil sistemi, ümumtəhsil sisteminin mövcudluğudur. Beşinci komponent gənclərin yüksək mənəviyyat ruhunda tərbiyələndirilməsidir. Bu cəhətdən:

a) ümumbəşəri dəyərlər, Azərbaycan xalqının milli-mənəvi dəyərləri hər bir gənc tərəfindən mənimsənilməlidir;

b) gənclərimiz milli ruhda tərbiyə olunmallıdır, milli-mənəvi dəyərlərimiz əsasında tərbiyələnməlidir; gənclərimiz tariximizi, dilimizi, milli ənənələrimizi, milli dəyərlərimizi yaxşı bilməlidir.

Ümummilli Liderimiz daim qətiyyətlə bildirirdi ki, mənəviyyat olmayan yerdə heç bir şey ola bilməz... Bu gün mənəvi tərbiyə bəlkə də keçmiş illərdən daha çox vacibdir.

Heydər Əliyev irsində vətən sevgisi, xalq, millət sevgisi, dil sevgisi, din sevgisi, milli ənənələrə bağlılıq xüsusi yer tutur. Dahi şəxsiyyət bunları insan üçün mənəvi əsas kimi təqdim edir və mənəvi keyfiyyətlərə sahib olmayanların müstəqil Azərbaycanın inkişafında lazımi qədər iştirak edə bilməyəcəyi qənaətindədir. Məhz buradan da milli tərbiyə işinin məzmununda vətənə, millətə, dilə, dinə, ənənəyə və s. məhəbbət hissinin formalaşdırılmasının əhəmiyyətli yer tutması və bunun formal deyil, real olaraq həyata keçirilməsinin vacibliyi səciyyələnir.

Heydər Əliyev irsində sədaqətlilik – insanın insana, insanın vətəninə, xalqına, dövlətinə sədaqət hissi xüsusi yer tutur. Yeniyetmə və gənclərin sədaqət hissinə yiyələnməsinin əxlaqi borcun yerinə yetirilməsində mühüm rol oynadığını qeyd edən Ulu Öndər vətənə sədaqətli xidmətin onun müstəqilliyini qoruyub saxlamaq kimi mühüm bir vəzifə olduğunu bildirir. Gənclərimizi ən sədaqətli insanlar olaraq görmək istəyir.

Ümummilli Liderimizin irsində tərbiyəvi iş vasitə, tərbiyəlilik səviyyəsi nəticə kimi çıxış edir. Gənclərin vəzifələrindən danışarkən tərbiyəvi işin nəticələri nəzərdə tutulur, eyni zamanda, nəzərdə tutulan tərbiyəvi işlərin məzmunu müəyyənləşdirilir.

Ulu Öndər Azərbaycan gəncləri gününə həsr edilmiş bədii-idman bayramındakı nitqində demişdir: "Sizin ən ümdə vəzifəniz vətənə, ölkəmizə, doğma torpağımıza daim sədaqətli olmaqdır... Hər bir gənc bunu heç vaxt unutmamalıdır. Nə olursa-olsun vətənə, xalqına, ölkəsinə, dövlətinə sədaqət hər bir gənci daim yaşadacaq və ona cəmiyyətdə özünə layiq, özü istədiyi yeri tapmağa real zəmin yaradacaqdır... İnsan öz evini, övladlarını, ata-anasını, öz əmlakını, öz əşyasını qoruduğu kimi, hər bir gənc, hər bir azərbaycanlı, Azərbaycanın hər bir vətəndaşı da eyni zamanda, öz doğma Azərbaycan torpağını, Azərbaycan Respublikasını qorumalı, göz bəbəyi kimi saxlamalıdır".

Heydər Əliyevin şəxsi nümunəsi xalqına, elinə, dostlarına, vətəninə, dövlətinə əsl sədaqətlilik örnəyidir. Ulu Öndərin irsi öyrədir ki, böyüyən nəslin mənəvi tərbiyəsində sədaqət hissinə yiyələnmə aparıcılıq təşkil etməlidir, irsindəki təqdimata görə sədaqətlilik Azərbaycanın milli ordusunda, silahlı qüvvələrində xidmət etmək əzmini formalaşdırır, milli iftixar duyumunu, milli mənlik şüurunu yüksəldir; onu şəxsiyyət kimi bütövləşdirir, bitkinləşdirir. Sədaqət hissini uca tutan insan öz ailəsinə, yaşadığı torpağa, elə, mənsub olduğu millətə, dövlətə, ölkəyə, ana dilinə, bağlı olduğu dinə, milli ənənələrinə elə bağlanır ki, onu heç vəchlə, heç bir təsirlə amal və əqidəsindən döndərmək olmur.

Ulu Öndərin tərbiyəyə aid fikirləri sırasında ömürdən keçən hər bir andan təhsillənmək, inkişaf etmək, təkmilləşmək, peşəyə yiyələnmək üçün olduqca səmərəli istifadə etmək ideyası da mütərəqqi xarakterlidir. O, gənclərə tövsiyə edərək deyir: "Gənclik dövründən səmərəli istifadə edin, yaxşı təhsil alın, özünüzü həyata yaxşı hazırlayın. Gənclik illəri sonra ələ düşməyən illərdir, yaş artdıqca insan bu illəri həmişə böyük həvəslə xatırlayır... Gələcəkdə özünüzü qınamamaq üçün, gəncliyinizdə nəyisə etmədiyinizə görə heyfslənməməyiniz üçün mən sizə məsləhət edirəm: gənclik günlərindən, aylarından səmərəli istifadə edin, boş yerə vaxt sərf etməyin, yaxşı oxuyun, yaxşı təhsil alın. Özünüzü həyata, əmək fəaliyyətinə, gələcəyə yaxşı hazırlayın"...

Bu deyilənlərə necə nail olmaq olar? Zəkayla, ağılla. Elə bu amillərə əsaslanan Ulu Öndər zəkaya, ağıl tərbiyəsinə xüsusi diqqət yetirir və qarşıya qoyulan vasitələri ağılla, zəka ilə həyata keçirməyin faydalı olacağı qənaətini bildirir.

Ümummilli Lider Heydər Əliyevin irsində böyüyən nəslin fiziki, mənəvi, ruhi və əqli tərbiyəsi məsələləri də geniş yer tutur. Sirr deyil ki, Azərbaycan Respublikasının milli tərbiyə konsepsiyasında bu amillər öz əksini tapmışdır. Həmçinin qeyd etmək lazımdır ki, ruhi tərbiyə məsələsi sovet dövrü pedaqogikasında diqqətdən kənarda qalan məsələlərdən biri hesab olunurdu. Narahatlıq doğuran odur ki, dövrümüzün pedaqoqları hələ də ruhi tərbiyənin vacibliyinə diqqət yetirməmişlər. Lakin Heydər Əliyev, ilk dəfə olaraq, elmi uzaqgörənliklə milli tərbiyənin məzmununa gənc nəslin ruhi tərbiyəsini daxil etmişdir. O, eyni zamanda milli vətənpərvərlik anlayışını da ilk dəfə işlətmiş və onun məzmununu müəyyənləşdirmişdir.

Qeyd etməliyik ki, sağlamlıq, gümrahlıq, fiziki kamillik insanın həyatında, fəaliyyətində əhəmiyyətli rola malikdir. Milli tərbiyənin əsas istiqamətlərindən olan bu sahəyə Ulu Öndərin xüsusi diqqət yetirməsi mübarizələrdə dəyanətli, döyüşlərdə cəsur, cəmiyyətin fiziki sağlamlığının

daşıyıcısı ola bilən insanlar yetişdirilməsi amalından irəli gəlir. Bədən tərbiyəsi və idman fiziki tərbiyə və fiziki mədəniyyətin aşılanmasında əsas vasitədir. Möhtəşəm idman öz qalib nümayəndələri ilə ölkəsini şöhrətləndirir. Ümummilli Liderin fiziki tərbiyədə mühüm vasitə olan bədən tərbiyəsi və idmana xüsusi diqqət və qayğı ilə yanaşmasının yalnız iqtisadi, sosial, mədəni-mənəvi deyil, həm də böyük ictimai-siyasi əhəmiyyəti vardır. Heydər Əliyev hər kəsə çatdırır ki, səmərəli işləmək, xalqa, ölkəyə xidmət etmək üçün Azərbaycanda hər bir gənc sağlam olsun.

Ümummilli Lider, təsadüfi deyil ki, insanın mənəvi sağlamlığı məsələsinə də ayrıca diqqət yetirir. İnsana fiziki sağlamlıq nə qədər vacibdirsə, mənəvi sağlamlıq da bir o qədər vacibdir. Çünki insanda sağlam mənəviyyat olmasa, əxlaqi-ictimai münasibətləri cəmiyyətə faydalılıq səviyyəsində qurmaq olmaz. Sağlam mənəviyyat düzlük, həqiqətpərəstlik, vətənsevərlik, milli təəssübkeşlik, halallıq və s. mənəvi keyfiyyətlər zəminində formalaşır.

Gənclərimizin milli ruhda, milli-mənəvi dəyərlər əsasında tərbiyələnməsini vacib hesab edən Ulu Öndər bildirir ki, gənclərimiz bizim tariximizi yaxşı bilməlidirlər, tariximizi yaxşı bilməyən gənc vətənpərvər ola bilməz.

Ulu Öndərin hər bir gəncdə azərbaycançılıq hissinin formalaşdırılması ideyası yaranacaq tərbiyə konsepsiyasının əsas ideyalarından biri olmalıdır. Yaşadığı ölkədən, vətəndaşı olduğu dövlətdən asılı olmayaraq harada azərbaycanlı varsa, onda azərbaycançılıq hissi özünü göstərməlidir. Bu hiss Azərbaycan sevgisindən, Ana Vətən məhəbbətindən təzahür edir.

Ümummilli Lider Heydər Əliyev tərbiyə prosesində dini dəyərlərdən bəhrələnərək ruhi inkişafa qovuşmağı, əməldə, davranışda islam dininin tələblərinə uyğun olaraq hərəkət etmək vərdişlərinə yiyələnməyi yüksək qiymətləndirmişdir. O bildirirdi ki, islam dininin Azərbaycan xalqına bəxş etdiyi mənəvi dəyərlər bizim üçün əzizdir, gənclərimizin bu gün də, gələcəkdə də tərbiyəsi və ümumi inkişafı üçün çox faydalıdır.

Ümummilli Lider Heydər Əliyevin yaradıcılıq irsinə bir daha müraciət edərək bir məqalə hazırlamaq məqsədilə onun tərbiyəyə, o cümlədən mənəvi tərbiyəyə aid fikirlərindəki bəzi məqamları təhlilə cəlb etdik. O məqamlar ki, müasir Azərbaycan gənclərinin inkişafında və formalaşmağında yeni mərhələ təşkil edir. Bu irs elmi-nəzəri ideyalarla tamamlanmışdır və praktik tərbiyə irsində, cəmiyyət üçün hərtərəfli inkişaf etmiş şəxsiyyət və vətəndaş hazırlığında uğurlu nəticələrə nail olmağın ən mühüm mənbəyidir.

**Problemin aktuallığı.** Ümummilli Lider Heydər Əliyevin Azərbaycan gənclərinin mənəvi tərbiyə məsələləri ilə bağlı fikirləri daim aktual və əhəmiyyətlidir. Çünki o fikirlər pedaqoji elmimizin ən mühüm mənbəyidir.

**Problemin elmi yeniliyi.** Ümummilli Lider Heydər Əliyevin gənclərin mənəvi tərbiyəsinə verdiyi dəyər elmi-nəzəri cəhətdən əsaslandırılmışdır.

**Problemin praktik əhəmiyyəti**. Məqalədə Ulu Öndər Heydər Əliyevin gənclərin mənəvi tərbiyə məsələləri ilə bağlı fikirləri gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. Xudiyev N. Heydər Əliyev və Azərbaycan dili. – Bakı, – 1997.
2. Əliyev M. Heydər Əliyev elm təhsil və mədəniyyətin himayədarı. – Bakı: “Xalq qəzeti”, – 2010, 16 may, – s.4.
3. Qaralov Z. Heydər Əliyevin elmi irsi. – Bakı: Şərq-Qərb, –2013, – 304s.
4. Mirzəzadə R. Azərbaycanın dünyaya saydıran insan. – Bakı, –1998.
5. Mərdanov M. Heydər Əliyevin həyat dərsləri. –Bakı, – 2012.
6. Baxşəliyev F. Heydər Əliyev və Azərbaycan təhsilində aparılan islahatlar. – Bakı, – 2011.

**E-mail:** shliyeva817@gmail.com
**Rəyçilər:** *ped.elm.dok., prof.* **R.L. Hüseynzadə**
*ped.ü.fəls.dok., prof*. **M.A. İsmixanov**
**Redaksiyaya daxil olub:** 19.04.2023

*UOT 37.0*

***Xatirə Zakir qızı Qocayeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*
*https://orcid.org/0009-0000-7849-7393*

## ÜMUMİLLİ LİDER HEYDƏR ƏLİYEV – AZƏRBAYCANI DÜNYAYA TANIDAN ŞƏXSİYYƏT

***Хатира Закир гызы Годжаева***
*старший преподаватель Азербайджанского Государственного Педагогического Университета*

## ГЕЙДАР АЛИЕВ – ЛИЧНОСТЬ ПРОСЛАВИВШИЙ АЗЕРБАЙДЖАН НА ВЕСЬ МИР

***Khatira Zakir Gojayeva***
*senior lecturer at Azerbaijan State Pedagogical University*

## HEYDAR ALIYEV – THE PERSON WHO MADE GLORIOUS AZERBAIJAN TO THE WHOLE WORLD

**Xülasə.** Ümummilli Lider Heydər Əliyev tarixin tək-tək yetirə bildiyi dahilərdən idi. Tanrı Ulu Öndər Heydər Əliyevə möhkəm iradə və idrak, tükənməz dövlətçilik istedadı, siyasi bacarıq bəxş etmişdir. Məqalədə deyilir ki, Ümummilli Lider Heydər Əliyevin Azərbaycanda demokratiyanın yaradılmasında əvəzsiz rolu olub və bu gün Azərbaycan demokratik irsinə arxalanaraq bütün dünyada ölkənin imicini qazanıb. Azərbaycan XXI əsr də zəngin enerji ehtiyatının sahibi kimi tarixə düşməsi Azərbaycan xalqı üçün əvəzsiz xidmətdir.
***Açar sözlər:*** *dövlət, xalq, siyasət, neft strategiyası, iqtisadi islahat*

**Резюме.** Общенациональный лидер Гейдар Алиев был одним из гениев, которых история не часто дарит миру. Бог дал Великому Лидеру Гейдару Алиеву сильную волю и познание, неиссякаемый талант государственного деятеля, политическое мастерство. В статье повествуется о том, что Гейдар Алиева сыграл неоценимую роль в восстановлении демократии в Азербайджане и на сегодняшний день наша страна, опираясь на демократическое наследие, завоевала престиж и статус во всем мире. Для азербайджанского народа неоценимая заслуга Великого Лидера заключается в том, что, благодаря ему Азербайджан в XXI веке вошел в историю как обладатель богатого энергетического запаса.
***Ключевые слова:*** *государство, народ, политика, нефтяная стратегия, экономическая реформа*

**Summary**. National leader Heydar Aliyev was one of the geniuses that history does not often give to the world. God gave the great leader Heydar Aliyev a strong will and understanding, an inexhaustible talent as a statesman, and political skill. The article tells that Heydar Aliyeva played an invaluable role in the restoration of democracy in Azerbaijan and today our country, relying on its democratic heritage, has gained prestige and status throughout the world. For the Azerbaijani people, the invaluable merit of the Great Leader lies in the fact that, thanks to him, Azerbaijan in the 21st century went down in history as the owner of a rich energy reserve.
***Key words:*** *the state, nation, policy, the oil strategy, the economic reform*

*"Xalq mənə ümid bəsləyir, mən də bu ümidi doğrultmaq üçün ömrümün qalan hissəsini də xalqıma bağışlayaram və həyatımı xalqıma qurban verməyə hazıram"*

***Heydər Əliyev***

Tarix güclü şəxsiyyətləri sevir. O şəxsiyyətləri ki, onlar öz xalqını yüksəkliklərə qaldırır və gözəl gələcəyə aparır. O şəxsiyyətləri ki, onlar böhranlı hallarda meydana çıxır və millətin

hərc-mərclik girdabına yuvarlanmasının, araya ədavət toxumunun səpilməsinin qarşısını alır. O adamları ki, onların zəkası, ağlı, düşüncəsi, cəsarəti qarşısında baş əyirik. O adamları ki, onlar həyatlarını şərəf və ləyaqət ideallarına həsr edir. O adamları ki, gələcək nəsillər naminə qurub yaradır və milli dövlətçilik binasının özülünü qoyur. Tarix beləlırinin əməlləri, fəaliyyəti ilə yaranır [5, s.23].

Dövlət o zaman məhvə yuvarlanır ki, onun gələcək taleyi barədə fikirlər, ideyalar tükənir. Müstəqil dövlətimiz bu yükdən birdəfəlik xilas edilib. Çünki Azərbaycanın gələcək taleyi üçün nəinki fikirlər, ideyalar mövcuddur, həm də ölkənin sabit, iqtisadi, siyasi, sosial yüksəlişini, onun dünyaya inteqrasiyasını təmin edən strateji xətt, prinsiplər mövcuddur.

Bizlərə mürəkkəb, çətin dövrdə və eyni zamanda, müstəqil Azərbaycanın gözəl bir dövründə – qüdrətlənmək dövründə yaşamaq nəsib olmuşdur. Azərbaycan dövlətinin özülü elə möhkəm qoyulmuşdur ki, onun üzərində tikilən möhtəşəm bina daim var olacaqdır.

1969-cu ilin yayında Azərbaycanın rəhbərliyinə siyasət aləmi üçün hələ cavan, işgüzar, məqsədyönlü bir insan gəldi. Onun iradəli xarakterində, iş üslubunda hər cür ətalətə, fəaliyyətsizliyə, köhnəliyə, mühafizəkarlığa qarşı nadir hallarda təsadüf edilən dözümsüzlüklə, köhnəlmiş forma və strukturların yeniləşdirilməsində, müasirləşdirilməsində işgüzar tutarlılıq, dəqiq qənaətkarlıq keyfiyyətləri harmonik şəkildə uyuşurdu. Bu adam Heydər Əliyev idi. Bu vaxtadək o, Dövlət Təhlükəsizlik Komitəsinə general rütbəsində başçılıq edərək böyük ciddi idarəçilik məktəbi keçmişdi.

Ümummilli lider Heydər Əliyevin qarşısında hələ bu vaxtacan onun sələflərinin heç birinin bacarmadığı misli görünməmiş vəzifələr dururdu: respublikanın iqtisadiyyatını əsaslı şəkildə dəyişmək, üstəgəl onu imperiyanın xammal istehsalçısından qabaqcıl, müasir texnika və texnologiya ilə təchiz olunmuş sənaye bazasına çevirmək, monokultura xarakteri ilə fərqlənən kənd təsərrüfatını qaldırmaq, dünyanın ən gözəl və abad şəhəri simasının Bakının özünə qaytarmaq, Azərbaycan kəndini dirçəltmək, Azərbaycan əhalisinin sosial, mədəni və təhsil səviyyəsini qaldırmaq, onun xaricdə yaşayan həmvətənlərlə əlaqəsini möhkəmləndirmək.

Azərbaycan üçün strateji əhəmiyyət kəsb edən bütün bunlar və xeyli digər məsələlər müvəffəqiyyətlə həyata keçirildi. Heydər Əliyevin nəhəng fəaliyyəti nəticəsində Azərbaycanın sənaye profili kökündən dəyişdi, bütün infrastrukturu islah edildi, kənd təsərrüfatı modernləşdirildi, respublikanın qədim paytaxtı intibah dövrü keçirdi.

Heydər Əliyev Azərbaycanın keçmişi, bu günü və gələcək taleyi ilə sıx bağlıdır. Heydər Əliyev və Azərbaycan ayrılmazdır [2, s.37].

Xalqımızın Heydər Əliyev kimi qüdrətli şəxsiyyəti olmasaydı, müstəqilliyimizi qoruyub saxlaya biləcəyikmi? Heydər Əliyev yenidən hakimiyyətə qayıtmasaydı, Azərbaycan və Azərbaycan xalqının başına nələr gələrdi? Heydər Əliyevsiz dünya ictimaiyyəti Azərbaycan həqiqətlərini indiki şəkildə bilərdimi? Əlbəttə, çoxlu sayda belə suallar qoymaq və onlara daha düzgün və ədalətli olan yalnız bir cavab vermək olar: yaxşı ki, Azərbaycanın, Azərbaycan xalqının Heydər Əliyev kimi lideri olub! Azərbaycan xalqı xoşbəxtdir ki, onun Heydər Əliyev kimi müdrik rəhbəri, vətənpərvər, qəhrəman oğlu olub!

Ulu Öndər Heydər Əliyev dühası özünə çox böyük və əhatəli münasibət tələb edir. Bu mövzuda saatlarla söhbət etmək olar. Çünki deməyə kifayət qədər söz və fikir var. Hər şeydən əvvəl Heydər Əliyev Azərbaycanın tarixinə ikinci qayıdışı ilə xilaskar dövlət başçısı kimi daxil olub. Bu haqda danışmazdan əvvəl yəqin ki, 90-cı illərin əvvəllərində Azərbaycanda cərəyan edən prosesləri yada salmalıyıq. Azərbaycanın düşdüyü vəziyyəti xatırlamalıyıq. Azərbaycanın daxilindən parçalanması təhlükəsinin real parametrlər aldığı vaxtda Heydər Əliyev Bakıya dəvət edildi. Onun gəlişi ilə bütün bu təhlükəli proseslərin – vətəndaş müharibəsinin, daxilən parçalanmanın, Azərbaycanın bir dövlət kimi yer üzündən silinməsinin qarşısı alındı və bu zəmində Azərbaycanın sonrakı iqtisadi dirçəlişi üçün, sosial və diplomatik sahədə irəliləyişlərin əldə olunması üçün bünövrə yarandı. XX əsrin bütöv bir qərinəsində Azərbaycana rəhbərlik edən, daha doğrusu, onu inkişaf edən ölkələr sırasına çıxaran, xalqın özünüdərkində əvəzsiz xidmətlər göstərən, müstəqillik əldə etdikdən sonra isə demokratik dövlət quran möhtərəm Heydər Əliyevin bənzərsizliyi siyasət və dövlət xadimləri tərəfindən təsdiqlənmişdir. Buna görə mən Heydər Əliyevi xilaskar dövlət başçısı he-

sab edirəm. Azərbaycanı XX əsrdən XXI əsrə bir dövlət kimi, möhkəm bünövrə üzrə qurulmuş dövlətçilik əsasları etibarlı zəminə söykənən ölkə kimi çıxarıb. Heydər Əliyev demişdir: "XX əsrdə Azərbaycan xalqının ən böyük nailiyyəti, şübhəsiz ki, müstəqil Azərbaycan dövlətinin yaradılmasıdır".

Təbii ki, Ümummilli Lider Heydər Əliyevin fəaliyyəti təkcə sabitliyin bərpa olunması ilə kifayətlənmir. Heydər Əliyev Azərbaycanda demokratiyanın bərqərar olması istiqamətində çox böyük işlər görüb və biz bu gün Azərbaycanın bütün dünyada demokratik dəyərlərə söykənən bir ölkə imici qazanmasının şahidi oluruq. Bunun Heydər Əliyevin həm də daxildə yeritdiyi siyasətlə əlaqəli olduğunu deməliyik. Heydər Əliyev Azərbaycanda çox geniş miqyaslı iqtisadi islahatlar həyata keçirib və bunun müxtəlif şaxələri öz bəhrəsini verməkdədir. İlk növbədə, Azərbaycanda neft strategiyasının işlənib hazırlanması və həyata keçirilməsi istiqamətində Prezidentin fəaliyyətini qeyd etmək lazımdır. Azərbaycan artıq XXI əsrə dünyanın ən zəngin enerji ehtiyatlarına malik ölkə kimi daxil olub və təbii ki, bu, Heydər Əliyevin mükəmməl neft strategiyası ilə bağlıdır. Bu strategiyanın bu günə qədər həyata keçirilməsində görülən işlər, əldə edilən nailiyyətlər ümid etməyə əsas verir ki, Azərbaycan XXI əsrin onilliklərində dünyanın ən zəngin, firavan ölkəsinə çevriləcək.

Ümummilli Lider Heydər Əliyev tarixin tək-tək yetirə bildiyi dahilərdən idi. Tanrı Ulu Öndər Heydər Əliyevə möhkəm iradə və idrak, tükənməz dövlətçilik istedadı, siyasi bacarıq bəxş etmişdir.

Həyatı və fəaliyyəti Azərbaycan xalqının gözləri qarşısında keçən Heydər Əlirza oğlu Əliyevin dünyaya gəlişi ilə gedişini bir zamanla ölçülməyən bir era və epoxa adlandıranlar səhv etmirlər.

Ümummilli Lider Heydər Əliyev şəxsiyyəti və onun həyatı elə mənalı, elə fəlsəfi, elə müqəddəs məktəbdir ki, bu məktəbin dirilik, ədəbiyyat, saflıq, paklıq və halallıq kimi insani keyfiyyətlərdən gələcək nəsillər bəhrələnəcək və milli təntənəyə dərin bir inamla bağlanacaqdır.

**Problemin aktuallığı və praktik əhəmiyyəti.** Ümummilli Lider Heydər Əliyev strategiyası Prezident İlham Əliyev tərəfindən dönmədən, ardıcıllıqla, yeni dünya nizamına uyğun formada həyata keçirilir. Dövlət başçısı Azərbaycanın ən böyük milli neməti olan Heydər Əliyev dühasından, onun ölçüyəgəlməz siyasi və dövlətçilik təcrübəsindən qədərincə bəhrələnərək Azərbaycanı dünya üçün yenidən açır.

**Problemin elmi yeniliyi**. Bu məktəbin layiqli davamçısı, ömrü boyu Heydər Əliyev irsindən bəhrələnmiş İlham Əliyev bu gün Heydər Əliyevin siyasi kursunu davam etdirir.

**Ədəbiyyat:**


1. Mustafayev R. Azərbaycan dövlətçiliyi. – Bakı, 1995.
2. Mirzəzadə R. Azərbaycanı dünyaya saydıran insan. – Bakı, 1998.
3. Şükürov S., Səfərov M. Millət atası. – Bakı, 2000.
4. Mirzəyev R. Heydər Əliyev Azərbaycanın müasir neft emalı sənayesinin yaradıcısıdır. – Bakı, 2001.
5. Hüseynzadə İ. Müstəqil Azərbaycan Respublikasının möhkəm təməli. U Dirçəliş XXI əsr, 2002, № 54


**E-mail:** qocayeva_xatire@mail.ru
**Rəyçilər:** *ped.elm.dok., prof.* **F.A. Rüstəmov**
*ped.ü.fəls.dok*. **M.T. Əliyeva**
**Redaksiyaya daxil olub:** 28.04.2023

*UOT 37.0*

***Инара Самидали гызы Джафарова***
*преподаватель Азербайджанского Государственного Педагогического Колледжа при Азербайджанском Государственном Педагогическом Университете*
*https://orcid.org/0009-0002-3276-1341*

# РОЛЬ ЛИЧНОСТИ ГЕЙДАРА АЛИЕВА В ВОСПИТАНИИ СОВРЕМЕННОЙ МОЛОДЕЖИ АЗЕРБАЙДЖАНА

***İnarə Səmidəli qızı Cəfərova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin müəllimi*

## MÜASİR AZƏRBAYCAN GƏNCLƏRİNİN TƏRBİYƏSİNDƏ HEYDƏR ƏLİYEV ŞƏXSİYYƏTİNİN ROLU

***Inara Samidali Jafarova***
*teacher at the Azerbaijan State Pedagogical College of the Azerbaijan State Pedagogical University*

## THE ROLE OF HEYDAR ALIYEV'S PERSONALITY IN THE UPBRINGING OF MODERN YOUTH IN AZERBAIJAN

**Xülasə.** Məqalədə Azərbaycan xalqının dahi lideri Heydər Əliyev və onun gənclərin təfəkkürünün tərbiyəsindəki rolundan bəhs edir. Gənclərə, onların milli ruhunun inkişafı və idrakının formalaşmasında Ulu Öndərin müstəsna rolu xüsusi yer tutur. Müasir Azərbaycan gəncləri üçün Heydər Əliyevin siyasi irsinin davam etdirilməsi ən aktual məsələlərdəndir.
***Açar sözlər:*** *dahi lider, milli ideologiya, dövlətçilik, dəyərlər, gənclik, inkişaf*

**Резюме.** В статье повествуется о Гейдаре Алиеве, гениальном Лидере азербайджанского народа, и его заслугах в формировании мышления молодежи. Исключительная роль принадлежит Великому Лидеру в развитии национального духа и формировании их у молодежи. Для молодежи современного Азербайджана продолжение политического наследия Гейдара Алиева является одним из самых актуальных вопросов.
***Ключевые слова:*** *великий лидер, национальная идеология, государственность, ценности, молодежь, развитие*

**Summary.** The article tells about Heydar Aliyev, the brilliant leader of the Azerbaijani people, and his role in the education of modern youth. The exceptional role of the Great Leader in the development of the national spirit and the formation of cognitive thinking among young people occupies a special place. For the youth of modern Azerbaijan, the continuation of the political legacy of Heydar Aliyev is one of the most pressing issues.
***Key words:*** *great leader, national ideology, statehood, values, youth, development of cognitive thinking*

В истории каждого народа были и будут рождаться гении. Азербайджанский народ славится своими богатыми культурными и художественными памятниками, подземными и наземными ресурсами, а также гениями, выступавшими во всех сферах жизни. Одним из таких гениев является Великий лидер Гейдар Алиев, оставивший своими благими делами неизгладимый след и бессмертные идеи в истории азербайджанского народа. Гейдар Алирза оглы Алиев стал восходящим солнцем для азербайджанского народа, символом бессмертия, который будет жить вечно благодаря своей деятельности и беспримерному служению своему народу.

Гейдар Алиев, с самого начала своей политической деятельности работавший на благо и свободу азербайджанского народа, не

довольствовался этим, он не жалел сил, чтобы достойно представлять свой народ на мировой арене. Наряду со своей политической деятельностью Гейдар Алиев принимал непосредственное участие в общественной жизни народа, постоянно общался с ним и доказал, что он отец народа, вышедший из народа.

Гениальный лидер всей своей деятельностью, сыграл важную роль в воспитании подрастающей молодежи Азербайджана. Все его выступления призывали молодежь к светлому будущему Азербайджана и имели большое значение в правильном развитии и формировании молодого поколения. Результатом того является сегодняшнее развитие нашей страны и конечно же историческая победа в 44 дневной Отечественной войне над врагом. Великий лидер предвидел эту победу. Гейдар Алиев говорил, что «без Шуши нет Карабаха, а без Карабаха нет Азербайджана».

Гейдар Алиев придавал большое значение воспитанию личности. Вопросы личности и ее всестороннего развития всегда были в центре внимания Великого Вождя, неоднократно отмечалось, что фундамент и будущее государства строится на молодежи. «Личность взращивается временем... Но и личность характеризует ее, выражая важнейшие черты эпохи и времени» [2]. Одной из величайших заслуг Гейдара Алиева в жизни азербайджанской молодежи является создание концепции национальной идеологии [6]. Что такое понятие национальной идеологии и в чем ее сущность? Понятие национальной идеологии – это, прежде всего, возвращение к истокам. Это занимает одно из важнейших мест в воспитании мышления молодежи. «Говоря о понятии национальной идеологии, необходимо воспитывать молодежь прежде всего в духе верности принципам независимости Азербайджана» [3]. Концепция национальной идеологии, заложенная Гейдаром Алиевым, состоит из четырех основных направлений.

1. Государственность; 2. Азербайджанство; 3. Национальные нравственные ценности; 4. Общечеловеческие ценности.

«Первое направление моей концепции национальной идеологии – государственность. Принцип государственности, законности должен быть для всех нас превыше всего» [4]. Идея преданности призывает нашу молодежь прежде всего к защите принципов государственности, к служению ценностям, которые делают государство государством. Служение государству, соблюдение его законов и защита интересов государства должны быть главной целью нашей новой мыслящей молодежи. Независимость людей начинается с существования государства, которое им принадлежит. Гениальный лидер также призывает молодежь поддерживать идеи государственности и государство. Идея азербайджанства занимает особое место в концепции национальной идеологии. Таким образом, гениальный лидер всегда подчеркивал, что самое драгоценное, что у нас есть – это наша родина Азербайджан. Для азербайджанца жизнь начинается в Азербайджане. «Азербайджанский народ! Где бы вы ни находились, в какой бы стране вы ни жили, вы должны думать только об Азербайджане, о независимости Азербайджана, территориальной целостности, о настоящем и будущем азербайджанского народа» [6]. Национальные нравственные ценности, защита этих ценностей были для Гейдара Алиева особенно важным вопросом и составляли одно из основных направлений концепции национальной идеологии. Национальное самосознание, защита ценностей отражены практически во всех выступлениях Великого Вождя. «Наш гражданский долг состоит в том, чтобы быть верными нашим национальным и нравственным ценностям, нашей родной земле, нашему родному языку, нашей великой и богатой истории, нашему народу» [6]. Эти мудрые мысли своей глубиной призывают нашу молодежь к новому мышлению и к поддержке нашей национальной идеологии.

Одной из основных идей концепции национальной идеологии является защита и продвижение общечеловеческих ценностей. Ни одна нация не может достаточно развиваться в своих ограниченных рамках и влиться в мировую цивилизацию. Блестящий лидер, заявивший о важности усвоения молодежью общечеловеческих идей для лучшего развития и становления, говорил: «Единство и синтез общечеловеческих ценностей и

национально-духовных ценностей – настоящее и будущее нашего народа» [4].

Великий лидер, также советовал молодежи любить природу и беречь ее как зеницу ока. Его мудрые мысли по этому поводу являются очень важной школой для молодежи. Каждый молодой человек, ознакомившийся с идеями гениального вождя о природе, получил настоящее экологическое воспитание. Защита наших подземных и наземных ресурсов и их передача будущим поколениям также были в центре внимания Гейдара Алиева. Он отмечает, что урожай народа, богатство земли принадлежит всем, и заявляет, что эти ресурсы следует использовать ровно столько, сколько необходимо. Азербайджан останется Родиной только в том случае, если мы ее защитим. Наша молодежь следуя идеям великого лидера и в настоящее время продолжают борьбу. Сегодня мирная акция протеста азербайджанских экоактивистов и молодых волонтеров на дороге Лачин-Ханкенди с требованием прекратить незаконную эксплуатацию месторождений полезных ископаемых на территории Азербайджана и получить разрешение на проведение мониторинга на месторождениях «Гызылбулаг» и «Демирли» может быть примером. Требования участников экоакции остаются неизменными. Они держат в руках плакаты на азербайджанском, русском и английском языках с призывами остановить незаконную эксплуатацию месторождений полезных ископаемых в Карабахе и скандируют лозунги: «Азербайджанский народ защитит свое богатство!», «Азербайджан не дремлет, стоит на страже своих ресурсов!», «Азербайджан един и отстаивает свое богатство!», «Остановить экотеррор!» Вот таким хотел видеть молодежь современного Азербайджана.

Гейдар Алиев также был проповедником современности. Он предлагает нашей молодежи постоянно учиться новому и пользоваться инновациями. «Инновации могут развиваться только в борьбе со старым» [4]. Великий лидер считал важным внедрять не все виды инноваций, а только те, которые представляют ценность для людей и обусловливают их развитие. В целом, Гейдар Алиев стал школой для молодежи. Гениальный лидер, явившийся основой формирования нового мышления, воспитания и национального мировоззрения молодежи, оставил после себя богатое наследие. Миллионы молодых людей Азербайджана хранят его в своих сердцах. Гейдар Алиев является воспитателем нового мышления и бессмертным идеалом азербайджанского народа.

**Актуальность проблема.** Защита наших подземных и наземных ресурсов и их передача будущим поколениям всегда находились в центре внимания Гейдара Алиева. Наша молодежь следуя идеям великого лидера и в настоящее время продолжают борьбу. Сегодня происходит мирная акция протеста азербайджанских экоактивистов и молодых волонтеров на дороге Лачин-Ханкенди с требованием прекратить незаконную эксплуатацию месторождений полезных ископаемых на территории Азербайджана.

**Новизна статьи проблема.** Гениальный лидер всей своей деятельностью, сыграл важную роль в воспитании подрастающей молодежи Азербайджана. Все его выступления призывали молодежь к светлому будущему Азербайджана.

**Практическая значимость проблема.** Великий лидер, также советовал молодежи любить природу и беречь ее как зеницу ока. Его мудрые мысли по этому поводу являются очень важной школой для молодежи. Каждый молодой человек, ознакомившийся с идеями гениального вождя о природе, получил настоящее экологическое воспитание.

**Литература:**

1. Азербайджанское образование в годы независимости. – Баку: Чашиоглу, – 2003.
2. Гейдар Алиев. Мудрые мысли. Июнь 1993 г. – октябрь 1998 г., первая книга. – Баку, – 2008.
3. Гейдар Алиев. Мудрые мысли. Октябрь 1998 г. – октябрь 2003 г. Вторая книга. – Баку, – 2009.
4. Гейдар Алиев. Образование – будущее нации. – Баку: Просвещение, – 2002.
5. Сеидов М., Рзаев М. Гений, опередивший время. – Баку: Вектор, – 2008.

**E-mail:** inara-asadova@mail.ru
**Рецензенты:** *док.филос. по пед., доц.* **Б.О. Ибадова**
*док.филос.по пед.* **И.Б. Амиралиева**
**Redaksiyaya daxil olub:** 14.04.2023

# *AKADEMİK ZƏRİFƏ ƏZİZ QIZI ƏLİYEVA – 100*
# *АКАДЕМИК ЗАРИФА АЗИЗ ГЫЗЫ АЛИЕВА – 100*
# *ACADEMICIAN ZARIFA AZIZ ALIYEVA – 100*



*UOT 37.0*

**_Billurə Zahid qızı Vəliyeva_**
*Bakı şəhəri Nərimanov rayonu 212 nömrəli tam orta məktəbin təsviri incəsənət müəllimi*

## QAYĞIKEŞ ANA, VƏFALI HƏYAT YOLDAŞI, AKADEMİK

**_Биллура Захид гызы Валиева_**
*учитель изобразительного искусства полной средней школы № 212*
*Наримановского района города Баку*

## ЗАБОТЛИВАЯ МАТЬ, ВЕРНАЯ СПУТНИЦА ЖИЗНИ, АКАДЕМИК

**_Billura Zahid Valiyeva_**
*teacher of fine arts of complete secondary school No. 212*
*of the Narimanov district of Baku city*

## CARING MOTHER, FAITHFUL COMPANION OF LIFE, ACADEMICIAN

**Xülasə.** Məqalədə Azərbaycanda oftalmologiya elminin inkişafında xüsusi xidmətləri olmuş akademik Zərifə Əziz qızı Əliyevanın fəaliyyətindən, uğurlarından danışılır. O nəinki görkəmli alim, eyni zamanda qayğıkeş ana və vəfalı həyat yoldaşı kimi diqqətə çatdırılır. Zərifə Əliyeva elmi işlə yanaşı müxtəlif göz xəstəliklərinin müalicəsi və profilaktikası ilə ciddi şəkildə məşğul olmuşdur.

**_Açar sözlər:_** *oftalmologiya, oftalmologiya elmi, oftalmologiya elminin yaradıcılarından biri, traxoma, qayğıkeş ana, vəfalı həyat yoldaşı*

**Резюме.** В статье рассказывается о деятельности и успехах академика Зарифы Азиз гызы Алиевой, имевшей особые заслуги в развитии офтальмологической науки в Азербайджане. Она известна не только как выдающийся ученый, но и как заботливая мать и верная спутница жизни. Поми-

мо научной работы, госпожа Зарифа серьезно занималась лечением и профилактикой различных заболеваний глаз.

***Ключевые слова:*** *офтальмология, офтальмологическая наука, один из основоположников офтальмологической науки, трахома, заботливая мать, верная спутница жизни*

**Summary**. The article tells about the activities and successes of academician Zarifa Aziz Aliyeva, who had special merits in the development of ophthalmological science in Azerbaijan. She is known not only as an outstanding scientist, but also as a caring mother and faithful wife.In addition to scientific work, Zarifa Aliyeva was seriously involved in the treatment and prevention of various eye diseases.

***Key words:*** *ophthalmology, ophthalmological science, one of the founders of ophthalmological science, trachoma, caring mother, faithful wife*

2023-cü il may ayının 10-da böyük tarixi şəxsiyyət, Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyi qeyd edilir. Bu il, eyni zamanda, gözəl insan, qayğıkeş ana, görkəmli alim, Ulu Öndərin ömür-gün yoldaşı Zərifə Əziz qızı Əliyevanın da anadan olmasının 100 illiyi tamam olur.

Bu iki tarixi şəxsiyyət Azərbaycanımıza İlham Əliyev kimi gözəl bir insanı, xalqımızın sevimlisini, dünya azərbaycanlılarının liderini, peşəkar siyasətçini, Heydər Əliyevin demokratik, hüquqi, eyni zamanda dünyəvi dövlətçilik siyasətini uğurla davam etdirən ölkə Prezidentini bəxş etmişlər.

Zərifə Əziz qızı Əliyeva görkəmli dövlət və ictimai xadimi, cərrah-onkoloq Əziz Əliyevi ailəsində doğulmuşdu. Əziz Əliyev həkim olmaqla yanaşı müxtəlif məsul vəzifələrdə işləmişdi. Azərbaycan Respublikası Nazirlər Soveti sədrinin birinci müavini, Dağıstan Vilayət Partiya Komitəsinin birinci katibi, Azərbaycan Respublikası Xalq Səhiyyə Komissarı, respublika Ali Soveti Rəyasət Heyətinin katibi, Azərbaycan Dövlət Tibb İnstitutunun və Azərbaycan Klinik İnstitutunun rektoru vəzifələrində çalışmışdır.

Naxçıvan Muxtar Respublikasının Şərur rayonunun Şahtaxtlı kəndində dünyaya göz açan Zərifə xanım Azərbaycan Dövlət Tibb İnstitutunun müalicə-profilaktika fakültəsini əla qiymətlərlə bitirmişdir (1947). O, XX əsr Azərbaycan Oftalmologiya məktəbinin yaradıcılarından biri, elmlər doktoru, professor, Əməkdar elm xadimi, Milli Elmlər Akademiyasının həqiqi üzvü idi. Moskva Mərkəzi Həkimləri Təkmilləşdirmə İnstitutunda oftalmologiya ixtisası üzrə xüsusi kurs keçmişdi (1948).

Zərifə xanım Əliyeva Azərbaycan Elmi-Tədqiqat Oftalmologiya İnstitutunda elmi işçi (1949-1950), Əziz Əliyev adına Azərbaycan Həkimləri Təkmilləşdirmə İnstitutunda göz xəstəlikləri kafedrasının dosenti (1969-cu ildən), professoru, görmə orqanlarının peşə patologiyası laboratoriyasının müdiri, oftalmologiya kafedrasının müdiri (1982-1985) vəzifələrində uğurla fəaliyyət göstərmişdir.

Zərifə xanım müxtəlif göz xəstəliklərinin müalicəsi və profilaktikası ilə ciddi şəkildə məşğul olurdu. Ölkəmizdə oftalmologiya elminin inkişafında akademik Zərifə xanım Əliyeva xüsusi rol oynamışdır. O, elmi fəaliyyətinin ilk illərini traxoma infeksiya xəstəliyinin müalicəsinə ayırmışdı. Qarşısına qoyduğu məqsəd belə idi: respublikamızda traxomanın kökünün kəsilməsinə nail olmaq!

Zərifə xanım traxomanın müalicəsində və onun ağırlaşdırdığı hallarda nisbətən təsirli vasitələrin aşkarlanmasına, yeni antibiotikdən – aintomisindən faydalanmağa diqqət yetirirdi. Bu, təsadüfi deyildi. Sintomoisin geniş antibakterial spektrlərlə bərabər, antixlamedik fəallıq daşıyırdı. Z.Ə.Əliyeva Azərbaycanın şəhər, rayon və kəndlərinə gedir, xəstəliyin başvermə səbəblərini öyrənir, kompleks halda müalicə-profilaktik tədbirlər görürdü. Traxoma xəstəliyi uşaq evlərində yaşayan balacalar arasında da geniş yayılmışdı. Zərifə xanım onlara da baş çəkir, kimsəsiz uşaqlardan əlindən gələn köməyi əsirgəmirdi.

1949-cu ildə Azərbaycan Elmi-Tədqiqat Göz Xəstəlikləri İnstitutunda elmi işçi kimi işə başlayan Zərifə xanım 1950-ci ildə aspiranturaya qəbul edilmişdi.

1960-cı ildə "Traxomanın digər terapiya üsulları ilə birlikdə sintomisinlə müalicəsi" mövzusunda namizədlik dissertasiyası, bir müddət sonra "Azərbaycanın bir sıra kimya müəssisələri işçilərinin görmə orqanının vəziyyəti" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdi.

Zərifə xanım dünya təcrübəsində ilk sıralarda dayanan peşə, o cümlədən kimya və elektron sənayelərində peşə fəaliyyəti ilə əlaqədar

göz xəstəliklərinin tədqiqi, öyrənilməsi, profilaktikası və müalicəsi sahəsində səmərəli fəaliyyət göstərirdi. O, oftalmologiyanın müasir problemlərinə aid bir sıra diqqətəlayiq kitabların ("İridodiaqnostikanın əsasları", "Terapevtik oftalmolofiya") müəlliflərindən biri, 12 dərslik və dərs vəsaitinin ("Herpetik göz xəstəliyi", "Ağır virus konyuktivləri" və s.), monoqrafiyanın (o cümlədən "Göz sulanmasının fiziologiyası", "Şin istehsalında gözün peşə patologiyası", "Göz sulanmasının müasir cərrahiyyə üsulları ilə müalicəsi", "Xroniki yod intoksikasyası ilə bağlı oftalmologiya", "Yod sənayesində gözün peşə xəstəliyinin profikastikası" və s. monoqrafiyalarının) müəllifidir. Həmin əsərlər nəinki respublikamızda, həmçinin onun hüdudlarından kənarda böyük şöhrət tapdı.

Zərifə xanım ümumilikdə 150-dən artıq elmi əsərin, 1 ixtira və 12 səmərələşdirici təklifin müəllifi idi.

Zərifə Əziz qızı Əliyeva görmə orqanının peşə patologiyası ilə bağlı apardığı elmi araşdırmalara görə oftalmologiya sahəsində yüksək mükafata – SSRİ Tibb Elmləri Akademiyasının həqiqi üzvü M.İ. Averbax adına mükafatla təltif olunmuşdur (1981). Bu, Zərifə xanımın SSRİ miqyasında oftalmologiyanın inkişafında nail olduğu uğura görə verilən mükafat idi. Zərifə xanım həmin mükafatı alan ilk qadın idi.

Zərifə xanım Əliyeva qayğıkeş ana, çox yaxşı həyat yoldaşı idi. Ümummilli Lider Heydər Əliyev vəfalı həyat yoldaşından danışarkən deyirdi: "Zərifə xanım mənə xoşbəxtlik bəxş etmişdi. ...Ailəmin yaşaması, bu günlərə çatması, övladlarımın tərbiyəsi üçün və həyatımda onun əvəzsiz rolu üçün mən bu gün Zərifə xanımın məzarı qarşısında baş əyirəm. Onu bir dəqiqə belə unutmuram və unutmayacağam. Mənim övladlarım da bu əhval-ruhiyyədədirlər. Onlar bu əhval-ruhiyyə ilə tərbiyələniblər, formalaşıblar. ...Zərifə xanım mənim həyatımı xoşbəxt edib, mənə gözəl övladlar bəxş edib. Zərifə xanım kimi həyat yoldaşım olduğuna və o, ailəmdə çox yüksək mənəvi mühit yaratdığına görə mən xoşbəxt olmuşam. Həyatımın bütün dövrlərində işlə məşğul olduğuma görə ailə məsələlərinə fikir verməyə vaxtım olmayıb. Bunların hamısı Zərifə xanımın üzərinə düşüb və o da bu vəzifəni şərəflə, sədaqətlə, çox böyük məharətlə yerinə yetirib [1].

Görkəmli alimin xatirəsi həmişə uca tutulur, Fəxri Xiyabandakı abidəsi həmişə gülə--çiçəyə qərq olur. Bakı şəhərindəki Göz Xəstəlikləri İnstitutu, Milli Oftalmologiya Mərkəzi, Göz Klinikası, Yasamal rayonu ərazisində fəaliyyət göstərən lisey, Naxçıvan Şəhər Poliklinikası Zərifə xanımın adını daşıyır. Bakıda və Naxçıvanda adına küçələr var. Bakının Binəqədi rayonu ərazisində bu gözəl insanın adına park salınmışdır.

Çox təəssüf ki, qayğıkeş ana, sədaqətli ömür-gün yoldaşı, tanınmış alim Zərifə Əliyeva dünyasını tez dəyişdi. Cəmi 62 il yaşadı. 1985-ci il aprelin 15-də vəfat etdi.

Akademik Zərifə Əziz qızı Əliyevanın əsərləri hazırda oftalmoloqların stolüstü kitablarıdır. Həmin əsərlərdən faydalanırlar.

Qayğıkeş ana, vəfalı həyat yoldaşı, görkəmli alim Zərifə xanım həmişə hörmətlə anılır. Həmişə də yaddaşlarda yaşayacaq, hörmət və ehtiramla anılacaq!!!

**Problemin aktuallığı**. Mənalı həyat sürmüş, özünün fəaliyyəti ilə xalqa, cəmiyyətə fayda gətirmiş, elmin inkişafına öz töhfəsini vermiş insanları xatırlamaq, həmişə olduğu kimi, hazırda da aktuallıq daşıyır.

**Problemin elmi yeniliyi.** Ölkəmizdə akademik Zərifə Əziz qızı Əliyevanın anadan olmasının 100 illik yubileyi qeyd olunur. Məqalə bu münasibətlə yazılmışdır və onun oftalmologiya elminin inkişafındakı xidmətləri yada salınır. Zərifə xanım, eyni zamanda, qayğıkeş ana və vəfalı həyat yoldaşı kimi nəzərdən keçirilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat**:

1. Zərifə xanım mənə xoşbəxtlik bəxş etmişdi http://anl.az/el/emb/ZE/Z.E.haqqinda-fikirler.html
2. http://eye.gov.az/?smode=content&item=Akademik_Zerife_Eliyeva

**E-mail**: vbillure@mail.ru
**E-mail**: veliyevabillure@gmail.com
**Rəyçilər**: *ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 28.04.2023

## *ÜMUMPEDAQOJİ PROBLEMLƏR*
## *ОБЩЕПЕДАГОГИЧЕСКИЕ ПРОБЛЕМЫ*
## *GENERAL PEDAGOGICAL PROBLEMS*

*UOT 371*

***Müdafiə Cəmil oğlu Mahmudov***
*pedaqogika üzrə elmlər doktoru, professor*
*Azərbaycan Texniki Universiteti*
*https://orcid.org/0000-0003-1161-1416*

***Aytən Rəhman qızı Məmmədli***
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*Azərbaycan Texniki Universiteti*
*https://orcid.org/0009-0009-7627-1361*

# QLOBALLAŞMA VƏ MODERNLƏŞMƏ PROSESİ, YENİ KADR HAZIRLIĞI

***Мудафиа Джамиль оглы Махмудов***
*доктор педагогических наук, профессор*
*Азербайджанский Технический Университет*

***Айтен Рахман гызы Мамедли***
*диссертант по программе доктора философии*
*Азербайджанский Технический Университета*

# ПРОЦЕСС ГЛОБАЛИЗАЦИИ И МОДЕРНИЗАЦИИ, ПОДГОТОВКА НОВЫХ КАДРОВ

***Mudafia Jamil Mahmudov***
*doctor of pedagogical sciences, professor*
*Azerbaijan Technical University*

***Aitan Rahman Mammadli***
*doctorial student in the proqram of doctor of philosophy*
*Azerbaijan Technical University*

# THE PROCESS OF GLOBALİZATİON AND MODERNİZATİON, NEW STAFF PREPARATİON

**Xülasə.** Məqalədə indiki dövrdə ölkəmizin təhsil sistemində həyata keçirilən inteqrasiya, qloballaşma və yeni kadr hazırlığı prosesi öz əksini tapmışdır. Qloballaşma, modernləşmə prosesi yeni məktəb, yeni təhsil, yeni insan problemlərini önə çəkdi və ölkəmiz üçün yeni nəsil kadrların hazırlanmasını qarşıya qoydu. Bu isə müasir dövrün tələb etdiyi yeni tip cəmiyyətin qurulması deməkdir.

***Açar sözlər:*** *inteqrasiya, modernləşmə, yeni kadr hazırlığı, pillə, səviyyə, ixtisas, təkmilləşdirmə*

**Резюме.** В статье отражены процессы интеграции, глобализации и подготовки новых кадров в системе образования нашей страны в настоящее время. Процесс глобализации и модернизации выдвинул на первый план новую школу, новое образование, новые человеческие проблемы и поставил

задачу подготовки нового поколения кадров для нашей страны. А это означает построение нового типа общества, необходимого современному периоду.

***Ключевые слова:*** *интеграция, модернизация, подготовка новых кадров, ступень, уровень, специализация, совершенствование*

**Summary.** The article reflects the processes of integration, globalization and training of new personnel in the education system of our country at the present time. The process of globalization and modernization brought to the fore a new school, a new education, new human problems and set the task of training a new generation of personnel for our country. And this means building a new type of society that is necessary for the modern period.

***Key words:*** *integration, modernization, training of new personnel, level, qualification, improvement*

Dünyanın yeni kəşfindən sonra XVI-XVIII əsrlərdə cəmiyyətdə iqtisadi, siyasi, sosial-mədəni dəyişikliklər baş verdi. Bu proses isə özünü ənənəvi cəmiyyətdən müasir cəmiyyətə keçid kimi əks etdirdi və bu dövrlər sənayenin inkişafına və onun modernləşməsinə səbəb oldu. Yəni dövrün tələblərinə, normalara, texnoloji proseslərə uyğunlaşmaq zərurəti yarandı, ölkələr arasında inteqrasiya və qloballaşmanın həyata keçirilməsi başlandı.

1970-2003-cü il tarixlərində ölkəmizdə Ümummilli liderimiz Heydər Əliyevin islahatları milli xüsusiyyətlərimizi saxlamaqla ölkəmizin modernləşmə prosesində iştirakında mühüm əhəmiyyət kəsb etdi. Qloballaşma, modernləşmə prosesi yeni məktəb, yeni təhsil, yeni insan problemlərini önə çəkdi və ölkəmiz üçün yeni nəsil kadrların hazırlanmasını qarşıya qoydu. Bu isə sosial-iqtisadi şəraitin tələb etdiyi yeni tip cəmiyyətin qurulması demək idi. Buna görə də ali təhsil müəssisələrində həyata keçirilən islahatlar inteqrasiya və modernləşmə yolunu seçdi. XX əsrin sonu və XXI əsrin əvvəllərində qarşıya qoyulan aktual problemlərdən biri də sosial-iqtisadi şəraitin tələb etdiyi yeni, rəqabət qabiliyyətli mütəxəssislərin hazırlanması oldu. Bu isə qarşıya belə bir mühüm vəzifə qoydu ki, təhsil siyasəti elə qurulmalıdır ki, hazırlanan mütəxəssislər müasir tələblərə uyğun olsun.

*Ölkəmizin Prezidenti İlham Əliyev demişdir: "Azərbaycanın təhsil tarixi hər birimizin fəxr etdiyi nailiyyətlərlə zəngindir. Azərbaycan müəllimləri bütün tarix boyu təhsildə daim varisliklə novatorluğun, ənənə ilə islahatın vəhdətini öz fəaliyyətində əks etdirmişdir. Bu gün qədəm qoyduğumuz informasiya cəmiyyəti və biliklərə əsaslanan yeni tipli iqtisadiyyatın formalaşması, qloballaşma çağırışları bütün dünya təhsil sistemi qarşısında yeni vəzifələr qoyur. "Təhsil əsri" adı qazanmış XXI əsr Azərbaycan təhsilinin də yeniləşməsini və müasirləşməsini tələb edir. Əminəm ki, Azərbaycan müəllimləri fəaliyyətlərini bu tələblərə uyğun daha da təkmilləşdirərək müstəqil Azərbaycan Respublikasının çiçəklənməsinə xidmət edən gənc nəslin yetişdirilməsi işinə öz töhfələrini verəcəklər".*

Ümummilli Lider Heydər Əliyev SSRİ dövründə, hələ 1970-ci illərdə insan həyatında informasiya texnologiyasının inkişafının mühüm dəyişikliklərə səbəb olacağını görmüş və onun təməlini qoymuşdur. O, 1993-cü ildə ikinci dəfə hakimiyyətə qayıtdıqdan sonra, bütün sahələrdə olduğu kimi, həm də ali təhsillə bağlı belə bir mühüm bir qərar verdi ki, Azərbaycanın ali təhsil müəssisələrinə dövlət hesabına qəbulla yanaşı, ödənişli əsaslarla tələbə qəbulu aparılsın. Bu qərar təhsil tarixində yadda qalan, əhəmiyyət kəsb edən sənəd oldu.

Əsası Ulu Öndər Heydər Əliyev tərəfindən qoyulmuş siyasi və iqtisadi kurs Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilir. Hazırda bir çox sahələr üzrə Azərbaycan dünyanın qabaqcıl ölkəsinə çevrilmiş və lider ölkələr sırasına daxil edilmişdir.

Ulu Öndər Heydər Əliyevin təhsil siyasətini uğurla həyata keçirən möhtərəm Prezidentimizin diqqəti sayəsində əsaslı islahatlar həyata keçirilir və bütün istiqamətlər üzrə Dövlət Proqramları yerinə yetirilir. Bunlardan "Azərbaycan Respublikasının ali təhsil müəssisələrinin Avropa ali təhsil məkanına inteqrasiyası", 2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı", 2009-2013-cü illərdə Azərbaycan Respublikasının ali təhsil sistemində islahatlar üzrə Dövlət Proqramı", "Təhsil sisteminin informasiyalaşdırılması Proqramı (2008-2012-ci illər)", "Elmin inkişafı

üzrə Milli Strategiyanın həyata keçirilməsi ilə bağlı Dövlət Proqramı (2009-2015-ci illər), "2018-2024-cü illərdə Azərbaycan Respublikasında sağlamlıq imkanları məhdud şəxslər üçün inklüziv təhsilin inkişafı üzrə Dövlət Proqramı", "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" və s. misal göstərə bilərik.

"Təhsil əsri" elan edilən XXI əsrdə yüksək intellektə malik insan kapitalının formalaşması və iqtisadiyyatın qurulması ilə bağlı ölkəmizin Prezidenti cənab İlham Əliyev demişdir: "Biz maddi dəyərlərimizi, iqtisadi potensialımızı insan kapitalına çevirməliyik".

Təhsil sahəsində qəbul edilən dövlət proqramları göstərir ki, təhsilin bütün sahələrində islahatlar elə aparılmalıdır ki, kadr hazırlığı indiki dövrün tələblərinə uyğun olsun. Yəni müstəqil ölkəmiz üçün yeni nəsil kadr hazırlığı həyata keçirilsin. Bu istiqamətdə əsas rolu ali təhsil və orta ixtisas müəssisələri oynayır.

Qeyd edək ki, ölkəmizdə real və açıq şəkildə ali və orta ixtisas təhsilinin inkişafının həyata keçirilməsi ilə bağlı ciddi şəkildə işlər aparılır. Bu halda meydana çıxan çətinliklər və nöqsanlar vaxtlı-vaxtında araşdırılarsa, onda ali və orta ixtisas məktəblərində təhsilin keyfiyyəti də yüksəlmiş olar. Bu isə aparılan islahatların daha da təkmilləşdirilməsinə səbəb olar.

Qeyd edək ki, ABŞ, Yaponiya, Cənubi Koreya, Finlandiya və digər inkişaf etmiş ölkələrdə inkişafa təsir edən amillər içərisində təhsilin rolu hiss olunacaq dərəcədə yüksəkdir. Ölkəmizin bu ölkələrin qabaqcıl təcrübəsindən istifadə etməsi sahəsində son illər xeyli müsbət addımlar atılmış, işlər görülmüşdür. Lakin bunlarla yanaşı, ali və orta ixtisas təhsil sistemində aparılan islahatlar və modernləşmələr prosesində meydana çıxan bir sıra çətinliklər və ziddiyyətlər də özünü əks etdirir. Təhsilin bütün pillələrində inkişaf fəaliyyətini dərindən tədqiq etdikdə aydın olur ki, indiki dövrün tələblərinə cavab verən kadrların heç də hamısı bu tələblərə cavab verə biləcək səviyyədə deyildir.

"Avropa Birliyi"nə üzv ölkələrdə təhsilin inkişafına dair əməli proqramda deyilir ki, Avropa pedaqoji təhsil sistemi çağdaş cəmiyyətin ixtisaslı kadrlara olan tələbatını ödəməlidir. Belə bir perspektivə görə inteqrasiya olunan ölkə özündə aşağıdakı komponentləri birləşdirməlidir: müəllimləri seçmə sistemi; baza təhsilin sertifikasiyası; müəllimlərin peşə üzrə fasiləsiz təhsilinin inkişafı; müəllimlərin peşə üzrə ixtisaslarını artırma imkanları və s. göstərilən bu problemlərin hər biri dövlət və hökumətimizin diqqətində olmaqla mütəmadi olaraq öz həllini tapır. Möhtərəm Prezidentimiz İlham Əliyevin qayğısı və yaxından dəstəyi ilə təhsilin yenidən təşkili və qurulması həyata keçirilir. Lakin onu da qeyd edək ki, ali və orta ixtisas təhsilli müəssisələrinin əksəriyyətində professor-müəllim heyətinin hazırlığı və təkmilləşdirilməsi hələ də öz real həllini tapmayıb və onlar da bəzən formal xarakter daşıyır. Ali və orta ixtisas təhsil müəssisələrində tədris mərkəzlərinin yaradılmasına böyük ehtiyac vardır. Məlum olduğu kimi, əldə olunan biliklər dəyişilir, tez bir zamanda öz əhəmiyyətini itirir, təhsilin paradiqması ona uyğun dəyişilir və buna görə də insanların əldə etdiyi ali təhsil bilikləri də dəyişilir. Bu isə, öz növbəsində, mütəxəssislərin ixtisasını artırmasını və təkmilləşdirilməsini tələb edir.

Müəllimlərimizin əksəriyyəti öz vəzifələrini ləyaqətlə yerinə yetirərək təhsil sahəsində aparılan islahatların tərəfdarıdırlar. Lakin bu da sirr deyil ki, onların bir qismi yenilikləri qəbul etmir (və ya edə bilmirlər) öz narazılıqlarını bildirirlər. Onlar keçmiş SSRİ dövründəki metodlarla işləyir və onlardan istifadə edirlər. Sual olunur: nə üçün? Çünki faktlar göstərir ki, yaşlı müəllimlərin əksəriyyəti həyata keçirilən yenilik və modernləşmələri qəbul edə bilmirlər və yenini öyrənmələri üçün qüvvələri, bilikləri kifayət etmir. Bu cür müəllimlər distant təhsili, ABŞ, Qərbi Avropa və s. ölkələrə inteqrasiya olmağımızı sadəcə moda (dəb) kimi qəbul edirlər. Eyni zamanda, bu modanı (dəbi) qorxulu hadisə kimi qəbul edir və epidemiya ilə müqayisə edərək onun yayılmasına qarşı çıxırlar. Müasir inkişaf tendensiyaları göstərir ki, informasiya çoxluğunun müəllimin şərhi ilə çatdırılması köhnəlmiş və auditoriya-dərs sistemi müasir tələblərə cavab vermir, tələbələrin məktəbdə təhsil almaq motivasiyası, müəllimlərin isə marağı kütləvi şəkildə yox olur. Müşahidələr göstərir ki, orta məktəb məzunlarının ali və orta ixtisas məktəblərinə qəbulun qiymətləndirmə prinsipi də tamam dəyişilməlidir. Sual olunur: əgər Avropa

və mütərəqqi ölkələrin ali məktəblərinə inteqrasiyadan danışırıqsa, onda nə üçün onların imtahan qəbul mexanizmini tətbiq etmirik?

Ölkəmizin təhsil sistemindəki islahatlar təkamül yolu ilə həyata keçirilir və əldə olunan bütün nailiyyətlər və məlumatlar ictimaiyyətə çatdırılır. Lakin ictimaiyyətə məlum olan elə faktlar olur ki, bunlar təhsil sistemindəki islahatların üzərinə kölgə salır. Qeyd edək ki, bir sıra təhsil müəssisələrində səriştəsiz, təkəbbürlü, qohumbazlıq və dostbazlığa üstünlük verən, dövlət və hökumət qanunlarına riayət etməyən aşağı səviyyəli rəhbər işçilər də vardır. Bu cür şəxslər həm də ətrafında olan savadlı, vəzifəsinə ləyaqətlə qulluq edən perspektivli kadrları kənarlaşdırmaqla öz primitiv idarəçilik metodlarını davam etdirirlər. Məgər bu situasiyaları müvafiq qurumların rəhbərləri, nəzarət edən şəxslər görmürlərmi? Ölkə Prezidenti telekanalların birində çıxış edərkən belə bir ifadə işlətdi: "Kim hansı rəhbər işə təyin edilirsə, elə bilir ora onun atasının, babasınındır". 18.01.2022-ci ildə isə çıxışında isə qeyd etdi ki, "İctimaiyyət kömək etməlidir, lazımi məlumatları çatdırmalıdır".

Bununla bağlı bir hadisəni qeyd etmək yerinə düşər. Görkəmli pedaqoq-alim və tanınmış ictimai-siyasi xadim Zahid Qaralovun 80 illiyi ilə əlaqədar "Müdrik müəllimimiz" kitabının 19-cu səhifəsində Z.İ. Qaralov yazır: "Texniki-peşə təhsili sistemində də çox eybəcərliklər kök salmışdı. Bunu Heydər Əliyev hiss etmişdi. Güclü komissiya yaratdı və sistemi hərtərəfli yoxlatdı. Məni həmin komissiyaya təyin etmişdilər. Bu müəssisə rəhbərinin elə gizli kanalları, Moskvada və Bakıda rəhbər işçilərlə elə əlaqələri var idi ki, ona "diş batıran" yox idi. 16 il sədr olduğu müddətdə bir dəfə də texniki-peşə təhsili sistemində yoxlama aparılmamışdı. Biz iki aya qədər gərgin və çətin şəraitdə işlədik. 42 səhifəlik arayışı MK-yə təqdim etdik. Əvvəlcə elm və təhsil müəssisələri şöbəsinin məsul işçiləri arayışla tanış oldular. Bir sıra kəskin faktların, hətta cinayət xarakterli bəzi məlumatların arayışdan çıxarılmasını bildirdilər. Mən səbəbini soruşanda dedilər: "Heydər Əliyevə bu məlumat çatanda bizdən soruşmayacaq ki, bəs siz hara baxırdınız?"

Bəli, indi də elə rəhbər işçilər var ki, müəssisə rəhbərlərindən bildikləri dəqiq məlumatları möhtərəm Prezidentimizə çatdırmırlar, hətta onları müdafiə edənlər də var, lakin bütün ziyalılar əmindir ki, son zamanlarda təsadüfi vəzifəyə qoyulmuş səriştəsiz, təhsildə islahatın həyata tətbiqini bilməyən, qanunun aliliyinə riayət etməyən kadrların sonu olmalıdır, yəni*: "44 günə erməni işğalçılarına qalib gələn, monolit ordu yaradan möhtərəm Prezidentimiz tərəfindən tez bir müddətdə təhsil müəssisələrində, əsasən bəzi ali texniki məktəblərdə idarəçiliyi bilməyən, dövlət və hökumət qanunlarına riayət etməyən və hegemonluqla fəaliyyətdə olan rəhbərlərə son qoyulacaq".*

Dövlət və hökumət rəhbərliyi və tanınmış alimlər tərəfindən həmişə belə çıxışlar olur: "Təhsil sisteminin Azərbaycanın şərait və ənənələrinin xüsusiyyətlərini nəzərə alaraq daim təkmilləşməyə ehtiyacı var". Bu ehtiyacın ödənilməsinin xalqımızın gələcəyinin təmin olunması ilə sıx bağlı olması, yəqin ki, heç kəsə sirr deyildir. Azərbaycanın gələcəyi istedadlı şagirdlərdən və tələbələrdən çox asılıdır. Ulu öndərimiz Heydər Əliyev deyirdi: "Təhsil millətin gələcəyidir", "Dünyada müəllimdən yüksək ad tanımıram". Aparılan islahatlar ictimaiyyətdə bir qrup köhnəpərəst və yeniliyi qəbul etməyən şəxslər tərəfindən narazılıqlara səbəb olur. Yeri gəlmişkən, belə bir hadisəni qeyd edək: 1901-ci ildə Rusiya Maarif naziri N.P. Baqolepova öz çıxışında demişdir: "Mən hesab edirəm ki, təhsil sisteminin bütün sahələrində günün tələblərinə uyğun təkmilləşdirmə və yeniləşmə olmalıdır. Mən bu fikirdəyəm ki, keçidi çox ehtiyat və ardıcıllıqla keçmək lazımdır", – və hesab edirdi ki, bütün sosial dəyişikliklər inqilab yolu ilə deyil, təkamül yolu ilə həyata keçməlidir. Bu deyilənlər terrorçu P.V. Karpoviçə xoş gəlmir və o, nazirə qəsd edir.

Sual meydana çıxır: bəs bizim ölkədə terrorçu P.V. Karpoviçi əvəz edən kimdir? Mənə görə onlar neqativ əməllərinə görə təhsil ocaqlarından kənarlaşanlar, çürük regionçuluqla məşğul olanlar, öz vəzifələri ilə məşğul olmayan bir qrup saxta siyasətçilər və başqaları. Və ya əksinə: təhsil sistemində yeniliyi qəbul edə bilməyən, köhnə metodlarla işləyən rəhbər işçilər və müəllimlər.

Hazırda bəzi ali və orta ixtisas təhsili məktəblərində əsas problemlərdən biri pedaqoji kadrların çatışmazlığıdır. Nə qədər ki, gec deyil, müəllim qıtlığının aradan qaldırılması üçün

əsaslandırılmış qərarların verilməsinin vaxtıdır. Bir sıra fənlər qeyri-ixtisas müəllimləri tərəfindən tədris olunur. Yaşlı müəllimlərin işdən ayrılması və bir sıra müəllimlərin başqa iş yerlərinə getməsi ilə əlaqədar olaraq fənlər başqa ixtisaslı müəllimlərə verilir, belə halda isə təlim və təhsilin keyfiyyətindən danışmaq olmaz. Məhz buna görə də professor-müəllim kadrlarının seçilib yerləşdirilməsi istiqamətində ciddi addımların atılması zəruridir.

Ali və orta ixtisas texniki məktəblərində ən ciddi problemlərdən biri də müəllim hazırlığı ilə bağlıdır. Bu da sirr deyildir ki, uzun onilliklərdir ki, bu problemə diqqət yetirilmir. Ali texniki məktəblərdə nüfuz qazanmış bacarıqlı müəllimlərlə yanaşı, müəllimlik peşəsini sevməyən, ixtisasını bilməyən, bu peşəyə təsadüfən gələn müəllimlərin sayı olduqca çoxdur. Bunun da təhsilin keyfiyyətinə misilsiz ziyan vurduğu aydındır. Hər bir elmi dərəcə almış şəxs müəllim peşəsinə yiyələnə bilməz. Müəllimlik xüsusi bilik, bacarıq, həvəs və pedaqoji peşəkarlıq, səriştəlilik tələb edən peşədir.

Ali və orta ixtisas məktəblərində əsas problemlərdən biri də müəllim hazırlığı kurikulumu ilə bağlıdır. Bu müəssisələrdə aparılan müəllim hazırlığının məzmununda ciddi keyfiyyət dəyişikləri özünü əks etdirməlidir. Hazırkı tədris planı və proqramları elə tərtib olunmuşdur ki, tələbələr əsasən nəzəri məlumatlar qazanır, tətbiqi məsələlərin həllinə az diqqət verilir. Müşahidələrdən aydın olur ki, bəzi ali və orta ixtisas təhsili məktəblərində professor-müəllim heyətinin əksəriyyəti pedaqoji-psixoloji məsələləri, yeni təlim texnologiyaları və metodları, lazımi pedaqoji anlayışların mahiyyəti haqqında məlumatlara malik deyillər. Buna görə də müəllim hazırlığı kurikulumu sisteminin təkmilləş-dirilməsinin və bilik səviyyələrinin yüksəldilməsi ilə bağlı tədbirlərin həyata keçməsi zəruridir.

Belə bir nəticəyə gəlmək olur ki, indiki dövrdə müəllimlərin malik olduğu pedaqoji təhsil onların sonrakı fəaliyyətləri üçün kifayət deyil, ona görə də pedaqoji təhsilə fasiləsiz proses kimi baxılmalıdır. Bu baxımdan Ali və orta ixtisas təhsili məktəblərində meydana çıxan problem və nöqsanların aktual olanlarından aşağıdakıları göstərmək olar: müəllimin sosial statusunun aşağı düşməsi; müəllim hazırlığı kurikulumunun olmaması; elmi metodiki əsasların işlənilməməsi; pedaqoji kadr hazırlığının keyfiyyətinin yüksəldilməsi üçün səmərəli mexanizmin olmaması; ali, orta ixtisas təhsili, diplomdansonrakı və əlavə pedaqoji təhsil müəssisələrində təhsilin varislik prinsipinə uyğun forma və üsulları mexanizminin pozulması; müəllim hazırlığı kurikulumunun səmərəli idarə edilməməsi; fasiləsiz müəllim hazırlığının alternativ modellərindən, distant təhsildən istifadə edilməməsi; fundamental və tətbiqi tədqiqatların aparılmasının, elmi istiqamətlərin inkişaf etdirilməsinin stimullaşdırılması və dəstəklənməsinin aşağı səviyyədə olması; təhsil sistemində informasiya mühitinin lazımi səviyyədə inkişaf etməməsi; texniki təhsil müəssisələrində peşəyönümü üzrə işlərin aparılmaması və bunun üçün lazımi mexanizmin olmaması və s.

Bəzi ali və orta ixtisas təhsili məktəblərində əsas diqqət biznesə ayrılıb, müəllimlərin reytinqi isə get-gedə aşağı düşür. Unudulmamalıdır ki, bizneslə məşğul olan şəxsləri də yetişdirənlər müəllimlərdir.

Müşahidələr göstərir ki, bəzi ali və orta ixtisas təhsili texniki məktəblərində dəqiq fundamental fənləri tədris edən professor-müəllimlərin əksəriyyətinin təlim və tərbiyənin prinsip və metodlarından bilikləri kifayət dərəcədə deyil. Tədris prosesinin müasir tələblərə uyğun qurulması, yeni texnologiyaların və yeni ixtisaslar üzrə pedaqoji innovasiyaların hazırlanması hələ də öz həllini tapmayıb, texniki fənləri tədris edən professor-müəllimlərin əksəriyyətinin pedaqogika və psixologiya elmindən anlayışları qaneedici deyil. Təəssüf ki, bu cür kadrlar müəyyən məsuliyyətli vəzifələrə rəhbərlik edirlər ki, bu halda da təlim və təhsilin keyfiyyətinin yüksəldilməsindən danışmaq olmaz. Qeyd edilənlərlə yanaşı göstərmək lazımdır ki, nüfuzlu müəllimlərin cəmiyyətdə yerini və rolunu unutmaq olmaz. Aparılan islahatların ilk növbədə keyfiyyətli təhsillə nəticələnməsi məhz müəllimlə bağlıdır.

Dünya təcrübəsinə əsaslanaraq qeyd edə bilərik ki, ali və orta ixtisas təhsili müəssisələrində kurikulumların hazırlanması haqqında heç bir irəliləyiş yoxdur. Kurikulum konseptual sənəddir. Burda müasir tələblərə uyğun kurikulumlarda ali texniki məktəb məzunlarının əldə etdiyi bilik, bacarıq və vərdişlər müəyyən edilir və onların reallaşmasında qarşıya qoyulan məqsədlər və ona çatmağın yolları müəyyənləşdirilir.

Təhsilin bütün pillələrində yeni informasiya texnologiyalarının tətbiqi ilə müasir tələblərə uyğun təlimin nəticələrinin yaxşılaşdırılması probleminin həlli üçün müəllim təhsilalanların bilik səviyyəsinə görə yeni təlim metodlarından istifadə etməlidir. Fənlərin tədrisi metodikasının əsas vəzifələrindən biri də təfəkkürün inkişafı üçün xarakterik olan, yeniliklərə yol açan idrak fəaliyyətinin formalaşdırılması və inkişaf etdirilməsidir. Təlimin nəticələrinin yaxşılaşdırılmasında kim, nəyi və necə öyrədir kimi mühüm problem özünü əks etdirməlidir.

Təhsil sahəsində aparılan islahatlar müəllim hazırlığının da kökündən dəyişilməsini qarşıya qoydu, bu isə müasir dövrdə cəmiyyətin inkişafının ən mühüm problemlərindən biridir. Azərbaycanın gələcəyi ölkəmizin şagird və tələbələrindən asılıdır, buna görə də ölkəmizin təhsil sistemində aparılan islahatlar bu ideyada əksini tapmalıdır.

Hazırda müəllimlərin qarşısına yeni tələblər qoyulur və onlar öz vəzifələrini yeni müasir tələblər səviyyəsində qurmaq üçün kurikulumda, pedaqogika sahəsində, elektron resurslarının inkişafında və s. baş verən yenilikləri ardıcıl olaraq öyrənməlidir. İstər nəzəriyyə və istərsə də praktik istiqamətlərdə həyata keçirilən inteqrasiyanın reallaşdırılması müəllimlik peşəsinin daim təkmilləşdirilməsini tələb edir.

*Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev demişdir: "Azərbaycan uğurla inkişaf edən ölkədir. Son illər ərzində biz bütün istiqamətlər üzrə böyük nailiyyətlərə imza atmışıq. Elə etməliyik ki, bu inkişaf dayanıqlı olsun. Buna nail olmaq üçün isə, əlbəttə ki, insanlar hazırlıqlı, gənclər bilikli olmalıdırlar. Əgər inkişaf etmiş ölkələrin tarixinə və bu gününə baxsaq görərik ki, o ölkələrdə təhsil, texnologiya, elm inkişaf edir. Biz də bu yolla gedirik. Azərbaycanda gənc nəslin bilikli, savadlı olması ölkəmizi gücləndirir. Çünki iqtisadiyyatda, sənayedə, bütün sahələrdə çox gözəl mütəxəssislər lazımdır. Ölkəmizin çox uğurlu inkişaf dinamikası var. Kadr hazırlığı, mütəxəssislər, peşəkarlar, əlbəttə ki, bu dinamikaya əlavə güc verəcək. Ona görə təhsilin keyfiyyəti ilə bağlı çox önəmli addımlar atılır, islahatlar aparılır".*

**Problemin aktuallığı.** XX əsrin sonu və XXI əsrin əvvəllərində dünya təhsil sistemində olduğu kimi ölkəmizin təhsil sistemində qloballaşma və modernləşmə prosesi, yeni kadr hazırlığı problemlərinin həlli məsələsi ön cərgəyə keçdi. Bu məqsədlə baxılan problemin həlli metodları pedaqogika elmini yeni ideyalarla zənginləşdirir. Buna görə də qloballaşma, modernləşmə prosesi və müasir dövrdə yeni kadr hazırlığı öz aktuallığını əks etdirir.

**Problemin yeniliyi.** Qloballaşma, modernləşmə və müasir dövrdə kadr hazırlığına dair aparılan metodlar diqqət mərkəzinə gətirilir.

**Problemin praktik əhəmiyyəti**. Aparılan tədqiqat işi ölkəmizin təhsil sistemində həyata keçirilən islahatları nəzərdə tutur və bu tədqiqat işi müəllimlərə, magistrlərə, doktorantlara və s. kömək edəcəkdir. Aparılan tədqiqat işi tədris prosesində öz əhəmiyyətini və rolunu əks etdirəcəkdir.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. – Bakı, – 2013.
2. Лиферон А.П. Интеграция мирового образования – реальность третьего тысячилетия. – М.: Педагогика, –1977.
3. Mərdanov M. Azərbaycan təhsili yeni inkişaf mərhələsində. – Bakı: Çaşıoğlu, – 2009.
4. Mahmudov M.C. XXI əsr və təhsil: Problemlər, perspektivlər və meyllər. Naxçıvan Müəllimlər İnstitutu. – Naxçıvan: Məktəb, – 2007, № 2, – s.17-27.
5. Махмудов М. Система образования в Азербайджане и во всем мире. АзТУ, – Баку, – 2006.



**E-mail:** maxmudov45@mail.ru
aytenmemmedli408@gmail.com



**Rəyçilər:** *ped.elm.dok., prof.* **M.İ. İlyasov,**
*ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva**
**Redaksiyaya daxil olub:** 31.03.2023

*UOT 371*

***Sevinc Sərdar qızı Əliyeva***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Bakı Dövlət Universiteti*
*https://orcid.org/0000-0003-1158-8834*

# EPİSTEMOLOJİ İNTERDİSİPLİNARLIQ

***Севиндж Сардар гызы Алиева***
*доктор философии по педагогике, доцент*
*Бакинский Государственный Университет*

# ЭПИСТЕМОЛОГИЧЕСКАЯ МЕЖДИСЦИПЛИНАРНОСТЬ

***Sevinj Sardar Aliyeva***
*doctor of philosophy in pedagogy, associate professor*
*Baku State University*

# EPISTEMOLOGICAL INTERDISCIPLINARY

**Xülasə**. Məqalədə koqnitiv mexanizmlər, yaxud epistemoloji əsaslar haqqında az biliyə malik olmağımız səbəbindən yaranan boşluğu aradan qaldırmaq məqsədilə, interdisiplinar təhsilin və tədrisin əsas, polimorf aspekti kimi interdisiplinar inteqrasiyadan başlayaraq, tədricən interdisiplinar idrakın epistemoloji əsaslarının yaradılmasına doğru hərəkət etməyin zəruriliyi vurğulanır. Daha sonra epistemoloji yanaşmadan irəli gələn təlimatların nəticələri interdisiplinar tədris prosesinə uyğunlaşdırılması, interdisiplinar tədris-təlim üçün məhsuldar epistemioloji çərçivə barədə məlumat verilmişdir.
***Açar sözlər:*** *epistemoloji interdisiplinarlıq, sintez, konstruktivizm, yaradıcılıq, tədris*

**Резюме**. В статье подчеркивается необходимость постепенного движения к созданию гносеологических основ междисциплинарного познания, начиная с междисциплинарной интеграции как основного, полиморфного аспекта междисциплинарного образования и обучения, с целью устранения пробела, образовавшегося из-за недостаточного знания когнитивных механизмов или эпистемологических основ. Впоследствии выводы руководящих принципов, вытекающие из гносеологического подхода, приведены в соответствие с междисциплинарным учебным процессом, дана информация о продуктивной гносеологической структуре междисциплинарного преподавания-обучения.
***Ключевые слова:*** *гносеологический междисциплинарность, синтез, конструктивизм, творчество, обучение*

**Summary**. The article emphasizes the need to gradually move towards the creation of the epistemological foundations of interdisciplinary cognition, starting from interdisciplinary integration as the main, polymorphic aspect of interdisciplinary education and teaching, in order to eliminate the gap formed due to the lack of knowledge about cognitive mechanisms or epistemological foundations. Further, the results of the instructions arising from the epistemological approach were informed about the adaptation to the interdisciplinary learning process, the productive epistemological framework for interdisciplinary teaching-learning.
***Key words:*** *epistemological interdisciplinarity, synthesis, constructivism, creativity, teaching*

İnsanların dinamik bilik cəmiyyətlərində məlumatlı və hərtərəfli həyata hazırlanması sintez edən idrakların yetişdirilməsini tələb edir. Biz mədəni və təbii sağqalma problemlərini həll etmək məqsədilə insanların geniş və müxtəlif mənbələrdən olan biliklərini vahid bir bilik daxilində birləşdirmə bacarığını inkişaf etdirməliyik [1]. Sintez insanın əsas bacarığıdır. Bu bacarıq hələ lap erkən yaşlardan, uşaqlar simvolik oyun oynayarkən, bədii kompozisiyalar yaradar-

kən, yaxud yeni oyunun qaydalarını öyrənərkən özünü büruzə verir. Biz analogiyalar, zəngin vizual təsəvvürlər və sadə sistemlərin mövcud olduğu cəmiyyətlərdə iştirak etməklə, müəyyən mənada sintez etməyi kifayət qədər tez öyrənirik. Lakin interdisiplinar sintez yeknəsəq koqnitiv tələblər və düşünülmüş təlimat tələb edir. Bu, daha yaxşı dərketmə axtarışında bilik və idrak üsullarının iki, yaxud daha çox disiplin daxildə birləşməsini nəzərdə tutur. Biz bu bacarığı universitet tələbələri və kollec gəncləri arasında inkişaf etdirmək istəyiriksə, insanların bədii əsər yaratmaq məqsədilə tədqiqatın müxtəlif formalarının inteqrasiya edilməsini necə öyrəndiyinin anlanması, çoxüzlü fenomenin izahı, yeni texnologiyanın yaradılması, yaxud sabit mühit həllinin təklif edilməsi böyük əhəmiyyət kəsb edir. Hazırkı alt-fəsil aşağıdakı məsələləri nəzərdən keçirir: interdisiplinar inteqrasiya üçün mərkəzi koqnitiv proseslər hansılardır? Hansı “bilik” növü incəsənətdə, məsələn, tarixi abidələrdə, balıq ovu üçün ehtiyatın azalmasında, yaxud davamlı inkişaf siyasətində özünü büruzə verir? İnteqrativ idrakın bu cür formasının nisbi uğurunu hansı əsasla fərqləndirə bilərik? Və sonda, interdisiplinar inteqrasiyanın güclü formalarının inkişafı üçün təlimatı necə hazırlaya bilərik? İnterdisiplinar inteqrasiyanın səciyyələndirilməsi geniş və hərtərəfli intellektual yanaşma ilə mürəkkəbləşir [2, s.201]. İncəsənətdə inteqrasiya qısamüddətli məxariclər şəraitində təbii ehtiyatların qorunması məqsədilə cəmiyyəti hərəkət etdirən şərtlərin izahında maraqlı olan iqtisadçı-ekoloqların inteqrasiyasından çox fərqlənir. Bu iş cəmiyyətın sosial birliyi, etibar, ünsiyyət və sosial öhdəliklər səviyyələri, o cümlədən bioloji ekosistemlərin xassələri kimi amilləri şərtləndirən səbəbin mürəkkəb izahı daxilində birləşdirir [3, s.57-71.]. Sosioloqlar, antropoloqlar və bioloqlar tərəfindən tədqiq edilən ayrı-ayrı amillərin inteqrasiyası izahedici gücü maksimallaşdırmaq məqsədilə bir-birini tamamlayır. Bu nümunə inteqrasiya edilən məqsəd, məzmunlar, məlumat növləri, nəzəriyyələr və yanaşmalar və inteqrasiyaya cəlb edilmiş əsas koqnitiv proseslər baxımından incəsənətdən fərqlənir.

Bu gün interdisiplinar iddialar universitetlərin missiyalarında bütün dünyada açıq-aşkar ifadə edilmişdir. Biz keyfiyyətli təlimatlar hazırlamaq, tələbələrdən bu institusional aspektləri yerinə yetirmək istəyiriksə, insanların sintez etməyi öyrənmələrinin dərk edilməsini zəruri hal kimi qəbul etməliyik. Sintezlər bir-birindən fərqləndiyindən, sintez etməyin epistemioloji əsaslarını öyrənmək işi interdisiplinar sintezin özünəməxsus, ümumi xüsusiyyətlərinə, həmçinin yanaşı gedən meyarlarına diqqət etməyi tələb edir.

*İnterdisiplinarlıq üçün praqmatik konstruktiv epistemioloji çərçivə.* İnterdisiplinar tədris üçün məhsuldar epistemioloji çərçivə aşağıdakılardan ibarətdir:

– birincisi, epistemioloji struktur disiplinar anlayışların çoxsaylı bacarıq formalarının nəzərə alınması üzrə plüralistik olmalı və fərqli intellektual gündəlikləri əhatə etməlidir;

– ikincisi, o, interdisiplinar tədris hadisəsinə uyğun olmalı, interdisiplinar inteqrasiya proseslərini işıqlandırmalıdır;

– üçüncüsü, nəzəriyyə biliyin sadədən daha mükəmməl şərtlərə doğru irəliləməsini izah etməli və təhsilin əhəmiyyətli dinamikasını işıqlandırmalıdır;

– nəhayət, bilik keyfiyyətinin təmin edilməsini təklif etməlidir: interdisiplinar səylərdə etibarlı və müvafiq tətbiqetmə standartlarını təklif etməklə xəta ehtimalını azaldan epistemioloji mexanizmi qurulmalıdır.

*İnterdisiplinar tədrisin dinamik təsvirinə doğru.* İnterdisiplinar tədrisin epistemiologiyası üçün yuxarıda göstərilən meyarlar birbaşa olaraq praqmatik konstruktivizmə işarə edir. Praqmatik konstruktivizm interdisiplinar tədrisin epistemioloji əsasları kimi təklif edilir. Filosoflar Nelson Goodman və Katerin Elginin əsərlərinə əsaslanaraq, bu yanaşma məqsədli, plüralistik və müvəqqəti interdisiplinar tədrisin səciyyələndirilməsi üçün müvafiq çərçivə təklif edir [4]. İnterdisiplinar tədris konstruktivist-praqmatik epistemiologiyaya aiddir. Bu epistemiologiya mövcud disiplinar təsəvvürlər vasitəsilə insanların dünyanı, özlərini və digərlərini daha yaxşı anlamalarını aydınlaşdırır. Konstuktivist epistemioloji struktur iddia edir ki, tədqiqat və idrakın məqsədi anlama prosesinin irəlilədilməsidir. Tədqiqat sorğusu həqiqət axtarışında heç də təsviri biliklərin toplanması deyil. Əksinə, sorğu öz predmetinin geniş, dərin və nəzərdən keçirilə bilən anlanmasını tələb edir. Konstruktiv interdisiplinar tədris bilik, mənanın yaradıl-

ması və öyrənmə haqqında aşağıdakı beş prinsiplə təsvir edilə bilər.

Biliklər ətraf mühitlə qarşılıqlı əlaqə vasitəsilə qurulur. Tələbələr qəbul edən və interpretasiya edəndirlər. Onlar əqli modelləri yaradan koqnitiv, interpretasiya hərəkətləri vasitəsilə fiziki aləm barədə öz şəxsi təsəvvürlərini yaradırlar. Bu dərk etmə prosesi yeni ideya və hadisələrin artıq yaradılmış mövcud fərziyyələrlə uyğunlaşdırılmasını ehtiva edir. Tələbə tərəfindən yaradılmış bilik təkcə ideyalardan (məzmundan) deyil, həm də əldə edildiyi kontekst haqqında biliklərdən, dərk edənin həmin mühitdə nə etməsindən ibarətdir. Dərk (idrak) edənin həmin mühitdən nə əldə etmək niyyətlərini ehtiva edir. Beləliklə, insanları daha aşağı səviyyəli həyat formalarından fərqləndirən cəhət intensiallıqdan (məqsədli həyat və davranışdan) və bu intensiallığı təşkil edən niyyətlərin məcmusundan ibarət qabiliyyətlərə və səriştələrə aiddir. Reallıq (dünyadan aldığımız hisslər və duyğulardır) dərkedənin ağlındadır. Yuxarıda təsvir edilən mənanın yaradılması prosesi idrak üçün xarici, fiziki, unikal dünyanın dərk edilməsini yaradır. Bu təsvir dünya haqqında təsəvvürlərin unikal kombinasiyasını yaratmış öyrəncinin unikal təcrübəsinə əsaslanır. Bu o demək deyil ki, biz öz reallığımızı digərləri ilə bölüşə bilmərik. Əlbəttə, bu o demək deyil ki, biliklər sadəcə fiziki dünyada mövcud olan və əldə ediləcək yaxud ötürülən xarici varlıqlardır.

Biliklər müvafiq kontekstlərdə möhkəmlənir və indekslənir. İdeyalarımız və əldə etdiyimiz bacarıqlar qismən onların əldə edildiyi yaxud tətbiq edildiyi situasiyadan yaxud kontekstdən asılıdır. Yəni, biliklərin əldə edilməsinin konteksti dərk edən tərəfindən ideyanın izah edilməsi yaxud ideyadan məna çıxarmaq məqsədilə istifadə edilən biliyin bir hissəsidir. Bu o deməkdir ki, mücərrəd qayda və qanunlar istənilən kontekstdən təcrid edildikdə, heç bir məna kəsb etmir. Bacarıqlar barədə həqiqətən anladığımız bu bacarıqların tətbiqidir. Biz bu tətbiqləri hekayələr (narrativlər) kimi saxlayırıq və həmin hekayələr insanlar arasında əsas ünsiyyət və mənanın yaradılması vasitəsinə çevrilir. Konstruktivizmə əsasən, bacarıqlar ilkin və ardıcıl olaraq məntiqli kontekstlərdən əldə edildiyi halda daha məntiqli olur. İdeyalar tətbiq edilənədək, onlar heç bir məna kəsb etməyəcək. Faktların sadə tədrisi və kontekstualizasiyasız konsepsiyaların izahı bu ideyaları mövcud olduğu situasiyanın xüsusiyyətləri ilə uyğunlaşdırmağa imkan vermir [5, s. 63-80].

Konstuktivist epistemioloji struktur iddia edir ki, tədqiqat və idrakın məqsədi anlama prosesinin irəlilədilməsidir. Tədqiqat sorğusu həqiqət axtarışında heç də təsviri biliklərin toplanması deyil. Əksinə, sorğu öz predmetinin geniş, dərin və nəzərdən keçirilə bilən anlanmasını tələb edir. Konstruktiv interdisiplinar tədris biliyin, mənanın yaradılması və öyrənmə haqqında prinsipləri təsvir edir.

Yaradıcılığa bu cür təbiiləşdirilmiş yanaşma interdisiplinarlıqda ən azı dörd nəticə ehtiva edir. Birincisi, yaradıcılıq hər yerdə olduğundan, o, kreativ fənlərin (memarlıq, təsviri və icrayi (perfomans) incəsənət, dizayn) qeyri-kreativ fənlərdən (sənətkarlıq, mühəndislik, tarix) fərqləndirilməsi üçün meyar ola bilməz. Bu nəticə fənlər klasteri (incəsənət, elm), o cümlədən ixtisaslaşdırılmış fənlər (sənaye dizaynı, kimyəvi mühəndislik) üçün doğrudur.

İkincisi, yaradıcılığı fənlərin fərqləndirilməsi meyarı kimi aradan qaldırılması fənlərin fərqləndirilməsi üçün daha uyğun olan meyarlara işarə edir. Ontologiya yaxud epistemiologiyadan daha çox tarix və təcrübə fənlər üçün daha ciddi identifikasiya şərtləri tələb edir. Universitetlərin cari fənlərə verdikləri mövqe və imtiyazlar nəsə daş üzərində yazılmayıb, istənilən ifadələrdə və fikirlərdə tapıla bilənlərə analoji olaraq instrumentalizmin əlavə məhsuludur.

Üçüncüsü, yaradıcılıq hərtərəfli olduğundan, onun interdisiplinar fikir və təcrübədə mövcudluğunu gözləmək üçün bütün əsaslar var. Bu səbəbdən də nə intersdisiplinarlığı yaradıcılığın çatışmazlığı kimi göstərməyə, nə də onun bu vaxta kimi unikal naməlum incəsənət formasına malik olduğu üçün tərifləməyə heç bir əsas yoxdur.

Dördüncüsü, fənlərin ifadələr və baxışların tarixi trayektoriyalarını əks etdirən artefaktlar kimi anlanması, həmçinin disiplinar yaradıcılıq üçün əsas yaradır. Bütün səmərli kreativ səyləri ilə birlikdə, interdisiplinar yaradıcılıq təcrübə və yaxşı idarəçilik tələb edir. Fənlərin "silos saxlama anbarı" modelindən imtina edildikdə, interdisiplinarlıq, üsul və idarəçiliyin yeni formalarının yaradılması üçün güclü namizə-

də çevrilir. Bu, yaradıcılıq və interdisiplinarlığın ilkin anlaşılması üçün fundamental əsasdır.

**Problemin aktuallığı.** İnterdisiplinar strategiya və fenomeni fənlərin təkamülündə yeni mərhələ kimi qiymətləndirilir. Odur ki, məqalədə interdisiplinar elmi yanaşma paradiqmasının nüvəsini təşkil edən epistemologiyaların və perspektivlərin tədqiqi aktualdır.

**Problemin elmi yeniliyi.** interdisiplinarlıq kateqoriyasının pedaqoji, fəlsəfi və didaktik sistemlərdə yeri və funksiyaları, təhsil fenomeni və strategiyası kimi elementləri, funksiyaları, onun epistemoloji modelinin xüsusiyyətləri kompleks təhlil edilmişdir.

**Problemin praktik əhəmiyyəti**. Məqalədə göstərilən praktik təkliflərin əhəmiyyəti böyükdür, ondan ibarətdir ki, həmin təkliflər interdisiplinar ali təhsil onun epistemoloji-didaktik tədqiqatı kontekstindən qaynaqlanır. Ali təhsil prosesində tədris və təlimin nəzəriyyəsi və praktikası arasında ziddiyyətlərin həlli yönündə tədqiqat işinın potensialını həmin praktik məqsədlərin və təkliflərin reallaşmasında görürük.

**Ədəbiyyat:**


1. Gardner, H. The Development and Education of the Mind / The Selected Works of Howard Gardner. E-Book Published 15 May, – London, – 2006. – 280 p.
2. Frodeman R. The Oxford Handbook of Interdisciplinarity. – Oxford; New York: Oxford University Press, – 2010. – 580 p.
3. Kraft, S. Interdisciplinarity and the canon of art history // Issues in Integrative Studies, – 1989. №7, –57-71 p.
4. Goodman, N. Reconceptions in philosophy and other arts and sciences /N. Goodman, C. Z. Elgin. – Indianapolis, IN: Hackett Publishing Co, – 1988.
5. Wilson, B.G. Reflections on Constructivism and Instructional Design / ed. C.R. Dills, A.J. Romoszowski // Instructional Development Paradigms. Englewood Cliffs NJ: Educational Technology Publications, –1997, –63-80 p.


**E-mail:** sevinc-aliyeva-66@mail.ru

**Rəyçilər:** *ped.elm.dok., prof.* **A.N. Abbasov,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 11. 04. 2023

*UOT 159.9*

***Novruz İsa oğlu Musayev***
*pedaqogika elmləri doktoru, professor*
*Azərbaycan Tibb Universiteti*
*https://orcid.org/0009-0002-7824-821X*

***Elşad Novruz oğlu Musayev***
*respublika xəstəxanasının şöbə müdiri*
*https://orcid.org/0009-0005-9641-8683*

***Afət Cəlal qızı Məmmədzadə***
*Gəncə Dövlət Universitetinin müəllimi*

# TƏLİM DƏRK OLUNMUŞ GERÇƏKLİKLƏRİ BÖYÜYƏN NƏSLƏ ÖTÜRƏN İDRAKİ PROSES KİMİ

***Новруз Иса оглу Мусаев***
*доктор педагогических наук, профессор*
*Азербайджанский Медицинский Университет*

***Эльшад Новруз оглу Мусаев***
*заведующий отделением Республиканской больницы*

***Афет Джалал гызы Мамедзаде,***
*преподаватель Гянджинского Государственного Университета*

# ОБУЧЕНИЕ КАК ПОЗНАВАТЕЛЬНЫЙ ПРОЦЕСС ПЕРЕДАЮЩИЙ ПОДРАСТАЮЩЕМУ ПОКОЛЕНИЮ ОСМЫСЛЕННЫЕ РЕАЛИИ

***Nowruz Isa Musayev***
*doctor of pedagogical sciences, professor*
*Azerbaijan Medical University*

***Elshad Novruz Musaev***
*head of the department of the Republican hospital*

***Afat Jalal's Mamedzade***
*teacher at Ganja State University*

# EDUCATION AS A COGNITIVE PROCESS THAT CONVEYS MEANINGFUL REALITIES TO THE YOUNGER GENERATION

**Xülasə.** Məqalədə orta ümumi təhsil məktəblərində və ali təhsil müəssisələrində yerinə yetirilən məşğələ dərslərinin ümumi vəziyyəti, icra mexanizmləri və icranın fizioloji qanunauyğunluqları araşdırılmışdır. Qeyd edilmişdir ki, maddi aləm həqiqətlərinin elm adamları tərəfindən kəşfi və öyrədənlər tərəfindən böyü-

yən nəsillərə çatdırılması tədrici xarakter daşıyır, eyni mexanizmlərlə icra olunur və mərhələli şəkildə həyata keçirilir.

***Açar sözlər:*** *materiya, hərəkət, təhsil, elm, idrak, məsələ həlli, qanun*

**Резюме.** В статье исследовано общее состояние учебных занятий, проводимых в средних общеобразовательных школах и высших учебных заведениях, механизмы проведения и физиологические закономерности проведения. Отмечено, что открытие учеными истин материального мира и донесение их учителями до подрастающих поколений носит постепенный характер, осуществляется по одним и тем же механизмам и происходит поэтапно.

***Ключевые слова:*** *материя, движение, образование, наука, познание, решение задач, право*

**Summary.** In the article, the general condition of training classes performed in secondary general education schools and higher education institutions, implementation mechanisms and physiological regularities of implementation were investigated. It has been noted that the discovery of the truths of the material world by scientists and the delivery of them by teachers to the growing generations is gradual in nature, carried out by the same mechanisms and carried out step by step.

***Key words:*** *matter, motion, education, science, cognition, problem solving, law*

Hər bir ölkədə insanların həyat tərzinin yaxşılaşdırılması, sənayenin, kənd təsərrüfatının inkişafı, hərbi qüdrətinin səviyyəsi, həmin ölkənin elmi potensialının inkişafından, xüsusilə də dəqiq elmlərin inkişaf səviyyəsindən asılıdır. B. Napaleonun: “Hər bir ölkədə riyaziyyat elminin gücü ilə dövlətin gücü bir-birinə paraleldir” və M.V. Lomonosovun: “Fizika elminin sağ əli kimyadır, riyaziyyat isə onun gözüdür” kəlamları dəqiq elmlərə verilən qiymətin bariz göstəricisidir. Ona görə də hər bir ölkənin əldə etdiyi nailiyyətlər dəqiq elmlərin – xüsusilə də riyaziyyat, fizika, kimya, və s. tədrisi keyfiyyətinin səviyyəsindən, bu elm sahələrinin mükəmməl öyrədilməsindən, təhsilalanların bu sahələri dərindən qavramasından asılıdır. Akademik B.A. Sadovniçiy yazırdı: “İnsan təbiət elmlərinin cəmiyyətin gündəlik həyatında və onun dünyasının formalaşmasında oynadığı rolun mənasını bilmirsə, o, cəmiyyətin həyatında məntiqlə düşünərək iştirak edə bilməz”. Nobel mükafatı laureatı Kapitsa:“ Hər bir millətin faciəsi təbiət elmlərinə marağın azaldığı gündən başlayır,” – demişdir. Məhz bu səbəbdən də orta ümumtəhsil məktəblərinin başlanğıc siniflərindən və ali təhsil müəssisələrinin birinci kursundan başlayaraq göstərilən elm sahələrinin lazımı səviyyədə mənimsənilməsinə xüsusi diqqət yetirilməli və dərindən öyrədilməlidir.

Təlim prosesi müxtəlif üsullarla: mühazirə, laboratoriya məşğələləri, seminarlar, məsələ həlli və s. formalarda həyata keçirilir. Orta ümumtəhsil məktəblərində auditoriya şəraitində tədris edilən məşğələ dərslərindən ən az dərs yükü (dərs saatı) məsələ həlli dərsinə ayrılır və ya çox vaxt, ümumiyyətlə, heç ayrılmır. Ali təhsil müəssisələrində isə, auditoriya şəraitində yerinə yetirilən məşğələ dərslərinə ayrılan dərs yükü saatlarından (məşğələ dərslərindən) məsələ həlli dərsinə təxminən 15% dərs yükü ayrılır, ya da heç ayrılmır. Bütün bunlar onunla izah olunur ki, ya bu dərsi aparan müəllimlər özləri məsələ həlli dərsini zəif bilirlər, ya da ümumiyyətlə bilmirlər. Lakin, qeyd etmək lazımdır ki, müxtəlif növ məşğələ dərsləri içərisində ən vacibi öyrənənlərin zehni qabiliyyətini, əqli inkişafını, riyazi təfəkkürünü daha çox inkişaf etdirən məhz məsələ həlli dərsidir. Ona görə də məşğələ formasında həyata keçirilən dərslər içərisində məsələ həlli dərsinin dərs yükünü lazımı səviyyədə artırmalı və təhsilalanların bu dərs növünü dərindən mənimsəmələri təmin edilməli, onun tədrisinin yüksək səviyyədə yerinə yetirilməsinin qayğısına qalınmalı və bu sahənin keyfiyyətli təlimi təmin edilməlidir. Belə yanaşma həm təhsil müəssisələrində həyata keçirilən dərs prosesində (auditoriya şəraitində), həm də ev tapşırıqlarında nəzərə alınmalıdır.

Bütün başqa elm sahələrinin tədrisində olduğu kimi, fizikanın təlimində də (öyrənmə və öyrədilməsində) müxtəlif üsullarından istifadə edilir və bu üsulların əsasında nəzəriyyə ilə təcrübənin vəhdəti durur. Bu üsullar, canlı müşahidə və abstrakt düşüncədən başlayıb, təcrübədə qurtarır. Müşahidələr əsasında nəzəriyyələr qurulur, qanunlar və hipotezlər formalaşdırılır, onlar təcrübədə yoxlanılır və yekun yanaşma müəyyən edilir. Beləliklə, təcrübə nəzəriyyənin

meyarıdır və onu yoxlamağa və dəqiqləşdirməyə imkan verir.

Fizika elmi materiyanı, onun müxtəlif formalarını, onda mövcud olan obyektiv reallıqları öyrənir. Təbiətdə, bizi əhatə edən məkanda, bizim ətrafımızda mövcud olanların hamısı, bizim özümüz və bizim hiss üzvlərimiz vasitəsilə qavranılan nə varsa, hamısı materiyadır. Materiyada mövcud olan varlıqların hər biri mütləq şəkildə ancaq onların özlərinə məxsus xassələrə və müəyyən formalara malikdir. Materiyanın bütün formaları öz xassələrini dəyişə və biri-birinə çevrilə bilirlər. Lakin materiyanın formalarının hamısına məxsus olan, bizim şüurumuzdan kənarda və ondan asılı olmayan obyektiv reallığa malik olması xassəsi, həmişə dəyişməz qalır.

İnsanlar materiyanı, materiyada mövcud olanları, onda baş verən qanunauyğunluqları, dəyişmələri öyrənir və onunla qarşılıqlı əlaqədə öz varlığını təmin edir. İ. M. Seçenovun dediyi kimi: "Orqanizm onun varlığını təmin edən xarici mühitsiz mövcud ola bilməz". Materiya hərəkətsiz, dəyişmələrsiz mövcud ola bilməz. Hərəkət dedikdə sadəcə olaraq mexaniki yerdəyişmə başa düşülmür. Hərəkət ən ümumi mənada kainatda baş verən bütün dəyişmələri və prosesləri, ən sadə yerdəyişmədən tutmuş və düşüncə tərzində qurtaran nə varsa hamısını əhatə edən anlayışları özündə birləşdirir. Materiyanın müxtəlif formaları və çoxlu hərəkət növləri vardır. F. Engelsə görə, bu hərəkətlər aşağıdakı beş əsas növə: mexaniki, fiziki, kimyəvi, bioloji və sosioloji növlərə bölünür.

Materiyanın varlığının (mövcudluğunun) təminatçısı, onun ayrılmaz hissəsi olan hərəkət anlayışı kainatda baş verən bütün yerdəyişmələri, keyfiyyət dəyişmələrini, inkişafı, qarşılıqlı təsir və qarşılıqlı əlaqələr anlayışlarının hamısını özündə birləşdirən geniş anlayışdır. Engelsin təbirincə desək, hərəkət anlayışı kainatda baş verən ən sadə yerdəyişmədən başlayıb və mürəkkəb düşüncə tərzində qurtaran bütün dəyişiklik və proseslərin hamısını özündə birləşdirir. Hərəkətin göstərilən: mexaniki, fiziki, kimyəvi, bioloji və sosial növləri həm cansız təbiətdəki, həm canlı aləmdəki (hərəkətin bioloji forması) və həm də insanların cəmiyyətdəki həyat tərzini əhatə edir. Materiyanın bütün bu hərəkət formaları qarşılıqlı əlaqədədir və daim biri o birisinə çevrilir, lakin hər biri özünün xüsusi keyfiyyətinə malikdir. Bu hərəkət növlərinin hər biri materiyanın müəyyən bir inkişaf etapını (pilləsini) xarakterizə edir. Ona görə də bu hərəkət növlərindən birini o birisinə, xüsusilə də yüksək hərəkət növünü aşağı hərəkət növünə gətirmək (əvəz etmək) olmaz. Hər bir yüksək hərəkət növü özünə məxsus mürəkkəb qanunauyğunluğa malikdir. Müxtəlif elm sahələri ayrı-ayrı hərəkət növlərini öyrənir, o cümlədən fizika elmi də göstərilən hərəkət növlərindən mexaniki və fiziki hərəkət növlərini öyrənir.

Materiyanın hərəkətinin mövcudluğu və onun hərəkətverici qüvvəsi, materiyanın özündə, öz daxilində təsir göstərən və materiyanın konkret formaları arasında mövcud olan qarşılıqlı təsirlərdir. Bu vaxt materiyanın konkret formaları arasında mövcud olan və bilavasitə onların arasında fəaliyyət göstərən daxili qarşılıqlı təsirlər əsas rol oynayır.

Təbiətdə baş verən bütün dəyişmələri, qanunauyğunluqları müəyyən etmək – öyrənmək üçün əsas vasitə müşahidə və təcrübi məşğələlərdir. Bilavasitə müşahidə aparmaq çox sadə öyrənmə üsulu olub, hər hansı hadisənin (fiziki prosesin) xüsusi yanaşma ilə hazırlanmış (düzəldilmiş) sürəti (modeli) üzərində həyata keçirilir. Lakin bu öyrənmə üsulu çox vaxt müxtəlif hadisələr arasındakı münasibətləri (əlaqələri) dəqiq müəyyən etməyə imkan vermir. Belə hallarda tədqiqatçılar təcrübəyə (eksperimentə) müraciət etməli olurlar. Təcrübi məşğələnin əsas üstünlüyü öyrəniləcək hadisəni (prosesi) sadələşdirməyə, hadisədə (prosesdə) ən əsas əlamətlərin (vacib anlayışların, elementlərin) seçilib saxlanılmasına, bu və ya başqa sadələşdirilmiş şəraitdə öyrənilməsinə, analiz edilməsinə imkan yaratmasıdır. Bir sıra müşahidələrin tutuşdurulması və analiz edilməsi, öyrənilən prosesin müxtəlif əlamətləri arasında xüsusi əlaqələrin yaradılmasına imkan verir. Öyrənmə (qavrama) əməliyyatının sonrakı mərhələsi, müəyyən edilmiş xüsusi əlaqələrin fiziki qanun şəklində ümumiləşdirilməsidir. Fiziki qanunların analizi, bu və ya başqa hipotezlərin və ya nəzəriyyələrin irəli sürülməsinə və ya müəyyən ümumi qanunauyğunluqların kəşf edilməsinə imkan verir.

Materiyanın müxtəlif formaları qarşılıqlı əlaqəli və qarşılıqlı asılıdırlar. Təlim prosesində öyrənənlər müəyyən edirlər ki, bütün hərəkət formaları bir-biri ilə sıx əlaqəlidir. Yeni, daha

mürəkkəb hərəkət formaları sadə (aşağı) hərəkət formaları əsasında meydana gəlir və onları əhatə edir. Hərəkət formalarının hər birinin öz xüsusi, yalnız özlərinə məxsus qanunauyğunluqları var. Hərəkətin mexaniki və fiziki formaları maddi aləmin bütün formalarında özünü göstərir. Fizikanın maddi aləmin bütün başqa elm sahələrinə geniş nüfuz etməsinin, onların inkişafına təkan verməsinin səbəbi də məhz bundadır. Hərəkətin aşağı formasının qanunauyğunluqları daha yüksək hərəkət formasının mahiyyətini əhatə edir. Yəni yüksək hərəkət formasının qanunauyğunluqları aşağı hərəkət formasının qanunauyğunluqlarından ibarət olmur. Məsələn, canlı orqanizmdə fizioloji proseslər üzrə qanunlar, heç də mexaniki və fiziki qanunların təkrarı və yaxud bu və ya digər formada dəyişdirilmiş, ümumiləşdirilmiş formasından ibarət hesab edilməməlidir. Məsələn, mürəkkəb fizioloji proses olan qan dövranı öz əsasına görə fiziki prosesdir, belə ki, mayenin axını ilə əlaqədardır (hidrodinamika), damar boyunca elastiki rəqslərin və dalğaların yayılması baş verir (rəqslər və dalğalar), ürək mexaniki iş görür (mexanika), biopotensialın əmələ gəlməsi baş verir (elektrik hadisəsi) və s.. Bunun kimi də fizioloji proses olan tənəffüs (nəfəs alma) prosesində baş verən mexaniki və fiziki proseslər heç də tənəffüs prosesinin mahiyyətini əhatə etmir. Çünki söhbət bir molekulun hərəkətindən gedirsə, bu, mexaniki hərəkətə aiddir. Əgər molekullar yığımının hərəkəti nəzərdən keçirilirsə, burada mexaniki hərəkətdən söhbət gedə bilməz. Tənəffüs prosesi canlı orqanizmin fəaliyyəti nəticəsində orqanizmdə baş verən mürəkkəb fizioloji prosesdir, qazın hərəkəti ilə bağlıdır (aerodinamika), istilikvermə ilə əlaqədardır (termodinamika), buxarlanma ilə bağlıdır (faza keçidləri) və i. a..

İstər maddi aləmdə mövcud olan gerçəkliklərin (qanunların, qanunauyğunluqların) aşkar edilməsi (kəşfi), istərsə də bu kəşflərin (aşkar edilənlərin) gələcək nəsillərə (öyrənənlərə) çatdırılması (öyrədilməsi) eyni fizioloji qanunauyğunluqlarla həyata keçirilir. Təlim dərk edilmiş obyektiv reallıqları (kəşf edilmiş qanunları, qanunauyğunluqları) böyüyən nəsillərə çatdırmaq və onları inkişaf etdirmək prosesidir. Obyektiv reallığın insan şüurunda əks etdirilməsi – inikası müxtəlif üsul və vasitələrdən istifadə etməklə məqsədyönlü şəkildə aparılır. Bu prosesdə elm və təhsil adamlarının, müəllimlərin, alimlərin öyrəndikləri elmi həqiqətlər və kəşflər böyüyən nəsillərə ötürülür. Öyrədilmə, dərk etdirilmə əlaqəli və mərhələli şəkildə aparılır, tədrici xarakter daşıyır, öyrədənlər və öyrənənlərin qarşılıqlı fəaliyyəti əsasında müxtəlif formalarla: mühazirə, təcrübi məşğələ, laboratoriya işləri, məsələ həlli və s. üsullarla yerinə yetirilir.

Dərk olunma prosesi müxtəlif formalarda ola bilər. Materiya haqqında dərk olunmuş (qavranılmış) bilikləri (həqiqətləri) heç vaxt bitkin saymaq olmaz. Bütün dərk edilən biliklər nisbidir. Bu onunla əlaqədardır ki, təbiət daim dəyişməkdədir (hərəkətdədir). Ona görə də, təbiətdə baş verən dəyişmələr nəticəsində əvvəllər dərk edilmiş biliklərdə, həqiqətlərdə, proseslərdə mütləq kənara çıxmalar müşahidə olunur. Bu səbəbdən də təbiət gerçəklikləri həqiqi, obyektiv, elm gerçəklikləri isə nisbi, subyektiv xarakter daşıyır. Buradan aydın olur ki, təbiət gerçəkliklərinin daha obyektiv və həqiqətə uyğun qavranılması üçün, təlim prosesinin düzgün qurulması, təlim üsullarının düzgün seçilməsi, öyrənənlərə daha dolğun çatdırılması böyük əhəmiyyət daşıyır. Müəllimlərin, metodistlərin, tərbiyəçilərin və ümumiyyətlə, bu sahədəki iş adamlarının düzgün fəaliyyəti böyük rol oynayır. Təlim prosesində çalışan iş adamlarının vəzifəsi dərketmə üsullarını düzgün seçmək, onlar arasındakı əlaqələri üzə çıxarıb, təlim prosesində nəzərə almaqdan ibarətdir.

Dərk olunmuş gerçəklikləri (elmi həqiqətləri) böyüyən nəsillərə öyrətmək (dərk etdirmək), öyrədənlə öyrənən arasında əvvəlcədən qurulan qarşılıqlı fəaliyyət prosesidir. İdrak da maddi aləm həqiqətlərinin kəşfi, bu həqiqətlərin böyüyən nəsillərə ötürülməsi prosesidir. Bu səbəbdən idrakla təlim arasında ciddi əlaqələr var, hər ikisi dərketmə prosesidir. Dərketmə prosesi obyektiv aləmdəki mahiyyətə doğru irəliləmə, aşağı səviyyəli biliklərdən daha yüksək səviyyəli biliklər aləminə yaxınlaşmaq prosesidir. Deməli, təlim prosesində idrak nəzəriyyəsindən geniş istifadə etməklə, elmi bilikləri gənc nəsillərə mükəmməl mənimsətmək olar.

İnsanlar materiya (aləm) haqqındakı ilkin (başlanğıc) biliklərini hissi idrak – duyğular, qavrayışlar, təsəvvürlər vasitəsilə dərk edir. Deməli, öyrənmənin başlanğıc mərhələsində

hissi idrak daha aktiv iştirak edir. Qavramanın sonrakı (yuxarı) mərhələsində rasional idrak (təfəkkür, anlayış, nəzəriyyə və bunların tətbiqi) daha aktiv iştirak edir.

İnsan beynində şüurun yaranma mexanizmi aşağıdakı sxem üzrə gedir:




Materiyanın varlıq formaları tədricən dərk olunur. Bəşəriyyətə bu formaların yalnız bəzi xassələri və dəyişmə xüsusiyyətləri məlumdur. İnsanların hiss orqanlarını texniki vasitələrlə silahlandırmaq yolu ilə, bəzi makroskopik və həm də mikroskopik aləmlərin sirlərinin öyrənilməsini genişləndirmək, sürətləndirmək və daha incəliklərini dərk etdirmək olar.

İnsan idrakının inkişaf prosesinin istiqaməti belədir: **duyğular → qavrayışlar → təsəvvürlər → anlayışlar → mühakimələr → əqli nəticələr → (qanun, nəzəriyyə, müddəa, prinsip, model və s.).**

Hissi idrakdan nəzəri (mücərrəd) təfəkkürə keçid, yalnız cisim və hadisələr arasındakı daxili əlaqələri dərk etdikdə baş verə bilər.




Dərk edilmiş obyektiv reallıqların (materiya həqiqətlərinin) böyüyən nəsillərə çatdırılması və onların inkişaf etdirilməsi prosesi mərkəzi sinir sisteminin reflektor fəaliyyəti ilə həyata keçirilir. İ.P. Pavlov bununla əlaqədar olaraq yazmışdır: "Mürəkkəb orqanizmin həyatında refleks ən vacib və tez-tez baş verən prosesdir. Refleks orqanizmdə hər hansı fəaliyyətin: əzələnin yığılmasının və ya boşalmasının, damarların yığılması və genişlənməsi və s. baş verməsidir". Refleks – xarici və ya daxili mühitin qanunauyğun dəyişməsinə orqanizmin cavab reaksiyasıdır.

Mərkəzi sinir sisteminin vəzifəsi, ətraf mühit amillərinin-qıcıqlandırıcıların (isti, soyuq, iy, dad, fiziki zərbə, günəş şuası və s) təsiri ilə bütöv orqanizmdə (bütün orqan və toxumalarda) mövcud olan reseptorların qıcıqlanması zamanı əmələ gələn və afferent sinir telləri vasitəsilə yayılan mərkəzəqaçma impulsları selini qəbul etmək, onların analiz və sintezini həyata keçirmək, sintez nəticəsində alınan yekun nəticələri (qıcıq sellərini) efferent sinir telləri vasitəsilə ətraf (periferik) orqanlara ötürüb, onlarda qıcıqlanma (oyanma) yaratmaq və ya onlarda mövcud olan qıcıqlanmanın tonusunu qoruyub saxlamaqdır. Mərkəzi sinir sistemi, orqanizmlərin ətraf mühit amillərinə fərdi uyğunlaşmasını, onda mövcud olan bütün sistemlərin, orqan və toxumaların ən təkmilləşmiş (yetkin) uyğunlaşmasını və birləşməsini təmin edir.

Materiyada mövcud olan obyektiv reallıqların, qanun və qanunauyğunluqların, baş verən hadisələrin dərk edilməsinin əsasını, reflektor fəaliyyət təşkil edir. Reflektor fəaliyyətin quruluş əsasını xarici mühit amillərinin resrptorlarda yaratdığı qıcıq selinin sinir telləri vasitəsilə keçdiyi yol təşkil edir. Bu yol *reflektor qövs* adını daşıyır. Onun tərkibinə daxildir: 1) ətraf mühitdən daxil olan qıcıqlanmanı qəbul edən reseptorlar; 2) qıcıqlanma selini mərkəzi neyronlar sisteminə aparan afferent sinir telləri; 3) impulsları effektor neyronlara ötürən (verən) neyron və sinapslar; 4) neyronlarda meydana gəlmiş impulsları mərkəzi sinir sistemindən ətraflara (periferiyaya) aparan (ötürən) efferent sinir telləri; 5) refleks nəticəsində baş verən fəaliyyəti dəyişən, daxil olan göstərişi yerinə yetirən (icra edən) orqandır. (Şəkil 1.)

Beləliklə, yuxarıda deyilənləri nəzərə alsaq, təbiətdə mövcud olan gerçəklikləri öyrənənlərə çatdırmaq (mənimsətmək) üçün: cisim və hadisələr üzərində təhsil alanların (öyrənənlərin) **Şəkil 1**

müxtəlif formalarda müşahidələrini təşkil etmək, onların diqqətini hadisələrin gedişinə yönəldib, onlarda hissi idrak yaratmaq, müvafiq tutuşdurmalar, fərqləndirmələr aparmaqla, onların beynində mücərrəd təfəkkürlər yaratmaq və onların beynində ideyalar formalaşdırmaq lazımdır. Bütün nəticələri yekunlaşdırıb təcrübədə yoxlamaq və öyrənənlərin fəaliyyətini istehsalata cəlb etmək lazımdır. Nəticədə öyrənənlər müəyyən edirlər ki, materiyanın bütün formaları və hərəkət növləri bir-biri ilə sıx əlaqədardır. Daha mürəkkəb formalar sadə formalar əsasında meydana gəlir və onu əhatə edir. Hərəkət formalarının hər birinin öz xüsusi, yalnız özünə məxsus olan inkişaf qanunauyğunluqları var. Hərəkətin mexaniki və fiziki formaları maddi aləmin bütün başqa sahələrinə daxildir. Bu formalar bütün başqa formalarda – kimyəvi, bioloji və ictimai formalarda mövcuddur və onlarda iştirak edir. Məsələn, fizikanın qanun və qanunauyğunluqları tibb elminin müxtəlif sahələrində: hərəkət-dayaq sistemində, qan dövranı, tənəffüs sistemi, görmə və eşitmə proseslərində və s. sahələrində elmi həqiqətlərin kəşfində və onların öyrədilməsində geniş tətbiq sahəsi tapmışdır. Fizikanın başqa elmlərə geniş şəkildə nüfuz etməsinin, onların inkişafına təkan verməsinin başlıca səbəbi də məhz budur.

Fizika elminin tədrisində qeyd etdiyimiz ardıcıllığa riayət olunarsa, öyrənənlər belə bir həqiqəti dərk edəcəklər ki, hərəkətin aşağı formalarının qanunauyğunluqları, onun əsasında yaranmış daha yüksək hərəkət formalarının mahiyyətini əhatə edir. Yəni yüksək hərəkət formalarının qanunauyğunluqları aşağı hərəkət formalarının qanunauyğunluqlarından ibarət olmur. Məsələn, bioloji hərəkət forması olan qan dövranı və ya tənəffüs prosesinin qanunları heç də mexaniki və ya fiziki hərəkət formalarının dəyişdirilmiş, ümumiləşdirilmiş formasından ibarət hesab edilməməlidir. Çünki bioloji hərəkət formalarının özünə məxsus daha mürəkkəb qanunauyğunluqları (qan dövranı, tənəffüz sistemi qanunları, mərkəzi sinir sisteminin qanunları və s.) vardır.

**Problemin aktuallığı.** Məqalə obyektiv reallığı dərk etmənin və bunun əsasında tərbiyələnmənin və inkişaf etmənin müasir problemlərinə həsr edilmişdir.

**Problemin elmi yeniliyi.** Məqalədə göstərilir ki, təlim prosesində obyektiv reallığın dərk olunması, idraki proses olmaqla materiyanın ayrılmaz hissəsi olan hərəkət, dəyişmə prosesi ilə həyata keçirilir. Müəyyən edilmişdir ki, həm təlim prosesi, həm də idrak prosesi materiyadakı obyektiv varlıqları öyrənənlərə çatdırmaq məqsədi daşıyır. Məqalədə, həmçinin obyektiv reallıqların təhsil alanlara çatdırılmasının müasir yanaşmaları göstərilmişdir.

**Problemin təcrübi əhəmiyyəti.** Məqalədə materiyanın kəşf edilmiş obyektiv reallıqlarının öyrənənlərə çatdırılmasının müasir yanaşmaları araşdırılmış, onların öyrənənlər tərəfindən dərk olunması və inkişaf etdirilməsi yolları göstərilmişdir.

**Ədəbiyyat:**

1. Musayev, N.İ. Tibbi və bioloji fizikanın ixtisas fənləri ilə əlaqəli tədrisinin elmi metodiki əsasları. Monoqrafiya / N.İ. Musayev. – Bakı: Hüquq ədəbiyyatı, – 2010. – 509 s.
2. Ремизов, А.Н. Медицинская и биологическая физика. / А.Н. Ремизов. – Москва: «Высшая школа», – 1987. – 640 с.
3. Бабский, Е.Б. и др. Физиология человека. – Москва: Медицина, – 1966. – 656 с.
4. Qaralov, Z.İ. Fizika qanunlarının tədrisi. / Z.İ. Qaralov. – Bakı: Elm, – 1997, – 320 s.

**E-mail**: fizikaelmi@qmail.com
afet.memmedzade@bk.ru
**Rəyçilər:** *biol.ü.fəls.dok.* **Q.M. Əliyev,**
*ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva**
**Redaksiyaya daxil olub:** 17.04.2023

*UOT 159.9*

***Məhərrəm Sabir oğlu Əliyev***
*psixologiya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Ümumi psixologiya kafedrasının dosenti*
*https://orcid.org/0000-0002-3762-8745*

***Vüqar İlqar oğlu Əsgərov***
*Azərbaycan Dövlət Pedaqoji Universitet*
*https://orcid.org/0009-0005-7569-3192*

## PSİXOLOJİ XİDMƏT MÜASİR TƏHSİLİN İNKİŞAFININ RESURSU KİMİ

***Магеррам Сабир оглы Алиев***
*доктор философии по психологии, доцент кафедры общей психологии*
*Азербайджанского Государственного Педагогического Университета*

***Вугар Ильгар оглы Аскеров***
*Азербайджанский Государственный Педагогический Университет*

## ПСИХОЛОГИЧЕСКАЯ СЛУЖБА КАК РЕСУРС РАЗВИТИЯ СОВРЕМЕННОГО ОБРАЗОВАНИЯ

***Maharram Sabir Aliyev***
*doctor of philosophy in psychology ,*
*associate professor of the departament of General psychology*
*Azerbaijan State Pedagogical University*

***Vugar Ilgar Askerov***
*Azerbaijan State Pedagogical University*

## PSYCHOLOGICAL SERVICE AS A RESOURCE FOR THE DEVELOPMENT OF MODERN EDUCATION

**Xülasə.** Elmi məqalədə göstərilir ki, resurs yanaşma psixoloji xidmətin fəaliyyətinin və müasir təhsilin səmərəli inkişafının təmin edilməsində, onun rolunun öyrənilməsində yeni və çox məhsuldar tədqiqat istiqamətidir.

Məqalədə müəllif tərəfindən psixoloji xidmətin effektivliyini əhəmiyyətli dərəcədə azaldan amillər ardıcıllıqla şərh edilmişdir. Həmçinin elmi məqalədə təhsildə psixoloji xidmətin aspektləri müəllif tərəfindən araşdırılmış və onların elmi izahı verilmişdir.

***Açar sözlər:*** *psixoloji xidmət, resurs yanaşma, davranış, psixoloji sağlamlıq, aspektlər*

**Резюме.** В научной статье показано, что ресурсный подход является новым и весьма продуктивным направлением исследований в обеспечении функционирования психологической службы и эффективного развития современного образования, изучения его роли. В статье факторы, существенно снижающие эффективность психологических служб, трактуются автором последовательно. Также в научной статье автором исследованы аспекты психологической службы в образовании и дано их научное объяснение.

***Ключевые слова:*** *психологическая служба, ресурсный подход, поведение, психологическое здоровье, аспекты*

**Summary.** The scientific article shows that the resource approach is a new and very productive line of research in ensuring the functioning of the psychological service and the effective development of modern education, studying its role.

In the article, the factors that significantly reduce the effectiveness of psychological services are interpreted by the author consistently. Also in the scientific article, the author investigated the aspects of psychological service in education and gave their scientific explanation

***Key words:*** *psychological service, resource approach, behavior, psychological health, aspects*

Psixoloji xidmət elmi psixologiyanın mühüm sahəsidir. Praktik psixologiya insanın psixoloji sağlamlığının qorunmasına, normal sosial-psixoloji inkişafına, tərbiyəsinə və özünütərbiyəsinə, yüksək keyfiyyətli təhsil almasına yönəldilir. Bu sahədə qarşıya qoyulan məqsəd göstərilən sahələr üzrə müsbət nəticələrin əldə edilməsindən ibarətdir.

Bunun üçün psixoloji xidmətin müxtəlif sahələrində aparılan işlərin əlaqələndirilməsi, münasib tədbirlərin həyata keçirilməsi vacib şərtdir. Təhsil sistemində psixoloji xidmət cəmiyyətin inkişafının müasir mərhələsində və perspektivdə ən zəruri komponentlərdən birini təşkil edir. Təhsil sistemində psixoloji xidmətin tətbiqinin məqsədəuyğunluğu uşaqların fərdi xüsusiyyətlərinin, həyata yaradıcı münasibətlərinin inkişaf etdirilməsi tələbatları ilə müəyyən edilir.

Psixoloji xidmətin fəaliyyəti təhsildə şagirdlərin inkişaf və təlim səviyyələrinə, həyat və sağlamlığının ümumbəşəri dəyərlərinin prioritetlərinə, şəxsiyyətin sərbəst inkişafına, təhsil sahəsində dövlət siyasətinin əsas prinsiplərinin həyata keçirilməsinə yönəldilmişdir. Bunlar təhsildə psixoloji xidmətinin əsas vəzifələrini: uşağın yaşını, psixofizioloji və cinsi xüsusiyyətlərini, davranışının xüsusiyyətlərini, motivlərini, qabiliyyətlərini nəzərə almaqla onun intellektual və əxlaqi inkişafının səmərəli təmin edilməsini, şəxsi, mədəni və peşəkar inkişaf xətlərinin təhsil məkanına inteqrasiyasını, uşağın təhsili, inkişafı və tərbiyəsi problemlərinin həllində iştirakını müəyyən edir.

Resurs yanaşma psixoloji xidmətin fəaliyyətinin və müasir təhsilin səmərəli inkişafının təmin edilməsində, onun rolunun öyrənilməsində yeni və çox məhsuldar tədqiqat istiqamətidir. O, xidməti resurslar sistemi kimi uşaqların inkişafı və tərbiyəsinin, yaradıcılıq imkanlarının üzə çıxarılmasını, eləcə də təhsil prosesinin bütün iştirakçılarının yaradıcı enerjisini real potensial kimi qiymətləndirməyə imkan verir.

Hazırda psixoloji xidmət təhsilin inkişafı problemlərinin həlli üçün lazımi potensiala malikdir. Pedaqoq və psixoloqların peşə fəaliyyətinin məzmunu, əsasən, müasir təhsilin prioritet vəzifələrinə cavab verir və onun inkişafı üçün ən vacib resurs hesab edilə bilər.

Psixoloji xidmətin effektivliyini əhəmiyyətli dərəcədə azaldan amillərə: uşağın pulsuz, əlverişli, yüksək keyfiyyətli psixoloji yardım almaq hüququnu təmin edən qanunvericilik bazasının olmaması, təhsil müəssisələrində yardım, müəllim-psixoloqun işinin qeyri-qənaətbəxş maddi-texniki təminatı, uşağın problemlərinin həllində qarşılıqlı əlaqənin aşağı səviyyəsi, psixoloji müayinənin, monitorinqin olmaması və s. aid edilir.

Onun imkanları və resursları təhsil prosesinin bütün subyektlərinin müsbət qarşılıqlı əlaqəsi və inkişafı, psixoloji iqlimin formalaşması üçün əsas ola bilər. Müasir təhsilin inkişafının, onun əsas məqsədinə – ölkənin gənc nəslin təhsil və tərbiyəsi sisteminin müasirləşdirilməsinə nail olunmasının mənbəyi məhz psixoloji xidmətin resurslarıdır. Xidməti bir resurs kimi başa düşmək və müəyyən etmək onun özünün malik olduğu və bu və ya digər sahələrdə yaranan çətin vəziyyətlərin öhdəsindən uğurla gəlməyə geniş imkanlar açır.

Təhsildə psixoloji xidmət onun dörd komponentinin və ya aspektlərinin – elmi, tətbiqi, praktiki və təşkilati aspektlərinin vəhdətini təmsil edən ayrılmaz bir sahədir. Aspektlərin hər birinin özünəməxsus vəzifələri vardır. Onları nəzərdən keçirək:

*Elmi aspekt* təhsilin praktik psixologiyasının metodologiyası və nəzəriyyəsi problemlərinə dair elmi tədqiqatların aparılmasını nəzərdə tutur. Buraya psixi inkişafın yaşa bağlı qanunauyğunluqlarının fərdi təzahürləri, şəxsiyyətin formalaşması şərtləri, inkişaf psixologiyasında yeni elmi-praktik istiqamət, məktəbəqədər və məktəb yaşlarında psixoloji sağlamlıqda fərdilik aiddir.

Bu aspekt psixodiaqnostik, psixokorreksiya, psixoprofilaktik və inkişaf proqramlarının, müasir təhsilin konkret şəraitində psixoloji biliklərin peşəkar tətbiqinin yolları, vasitələri və metodlarının elmi əsaslandırılmasını və işlənib hazırlanmasını nəzərdə tutur. Bu aspektdə psixoloji biliklərin tətbiqi üsulları nəinki müəyyən psixoloji mexanizmləri və ya qanunauyğunluq-

ları aşkara çıxarır, həm də konkret uşağın şəxsiyyətinin inteqral formalaşması kontekstində bu mexanizmlərin və qanunauyğunluqların inkişafı üçün psixoloji şəraiti müəyyən edir. Bu tədqiqatları həyata keçirən tədqiqatçı praktik psixoloqa diqqət yetirir.

*Tətbiqi aspekt* pedaqoqlar tərəfindən psixoloji biliklərdən istifadəni nəzərdə tutur. Bu istiqamətə müstəqil şəkildə və ya psixoloqlarla əməkdaşlıq edərək kurikulumun və planların hazırlanmasında, dərsliklərin yaradılmasında, didaktik, elmi biliklərin işlənib hazırlanmasında psixoloji məlumatlardan istifadə edən müəllimlərə, metodistlərə metodik materialların, təlim və təhsil proqramlarının hazırlanmasında kömək etmək aiddir.

Bu aspekt elmi mütəxəssislər və praktik işçilərlə əlaqəli şəraitdə elmi-nəzəri məsələlərin təcrübəyə tətbiqini müəyyənləşdirir. Nəzəri-psixoloji biliklərin tərbiyə və təlim proqramlarında, pedaqoji və metodik tədbirlərdə, tədris prosesində yer tapmasına, bu əsasda didaktik və metodik materialların işlənməsinə xidmət edir. Elmi biliklərin, tədqiqat nəticələrinin tərbiyə və təhsil prosesinə inteqrasiyasını demokratik prinsiplərlə tənzimləyir, təhsil prosesi iştirakçılarının hüquq və vəzifələrinə hörmət göstərir.

*Psixoloji xidmətin praktiki aspekti* birbaşa uşaq bağçalarının, məktəblərin və digər təhsil müəssisələrinin praktik psixoloqları tərəfindən təmin edilir, onların vəzifəsi müəyyən konkret problemləri həll etmək üçün uşaqlar, qruplar və siniflər, tərbiyəçilər, müəllimlər, valideynlər ilə işləməkdir. Bu aspekt yeni metodlardan, psixoloji qanunauyğunluqlardan müəllimlərin peşəkarcasına bacarıqla istifadə etmələrini praktik baxımdan istiqamətləndirir.

Praktik psixoloq öz fəaliyyətində normativ sənədlərə, ixtisas biliyinə, psixodiaqnostikanın nəticələrinə əsaslanır. Praktik psixoloq təhsil prosesi iştirakçılarına fərdi qaydada yanaşır, bunun üçün şərait yaradır, onların qabiliyyətlərini, intellektual inkişaf səviyyəsini təyin edir, yarana biləcək pozuntuların səbəblərini müəyyənləşdirir, pedaqoji-psixoloji korreksiya üsullarını aşkara çıxarır.

*Təşkilati aspektə* həm maddi, həm də təşkilati məsələlər üzrə psixoloji xidmətin qarşılıqlı əlaqəsi, praktiki psixoloqların peşəkar fəaliyyətinə və inkişafına nəzarəti təmin edən psixoloji xidmətin səmərəli strukturunun yaradılması daxildir. Tətbiqi, praktiki və təşkilati aspektlərin inkişafı tamamilə bu xidmətin əsas nəzəri əsasını müəyyən edən elmi aspektdən asılıdır. Məhz bunun əsasında psixoloji xidmət konsepsiyası yaradılır və ona uyğun model qurulur.

Təhsildə psixoloji xidmətin əsas məqsədi məktəbəqədər və məktəb yaşlı uşaqların psixoloji sağlamlığını təmin etməkdən ibarətdir. Bir sıra psixoloji əsərlərdə psixi sağlamlıq rahatlıq və narahatlıq təcrübəsi ilə əlaqələndirilir. Psixoloji diskomfort uşağın ehtiyaclarından yaranan məyusluğu nəticəsində yaranır, məhrumiyyətlərə səbəb olur. Bir və ya bir neçə uşağın ehtiyaclarının məyusluğu psixosomatik mənşəli müxtəlif xəstəliklərin (bronxial astma, qusma tutmaları, baş ağrıları və s.), məktəb nevrozlarının əsasını təşkil edir.

Psixi sağlamlığın əsasını ontogenezin bütün mərhələlərində uşağın tam psixi inkişafı təşkil edir. Təhsildə psixoloji xidmətin əsas məqsədi psixoloji və pedaqoji şəraitin yaradılması və məktəbəqədər, məktəb yaşlı uşaqların psixoloji sağlamlığını təmin etməkdir.

Təhsildə psixoloji xidmətin fəaliyyətində üç istiqaməti ayırd edirlər: *elmi, aktual və perspektiv.*

*Elmi istiqamət* təhsil sistemində nəzəri cəhətdən əsaslandırılmış psixoloji xidmət konsepsiyasının yaradıllmasını, təlim və tərbiyə müəssisələrində psixoloqun funksiyalarının və mövqeyinin müəyyən edilməsini, praktik psixoloqun iş texnologiyasını və zəruri avadanlıqlar kompleksinin işlənib hazırlanmasını nəzərdə tutur. Bu texnologiya şəxsiyyətin inkişafı və formalaşmasında elmi tədqiqatlar əsasmda əldə edilmiş təlim və tərbiyə göstəricilərinə əsaslanmalıdır.

*Aktual istiqamət* uşaqların tərbiyəsi və təhsilində, davranışlarında, ünsiyyətində, şəxsiyyətin formalaşmasında çətinliklərlə bağlı mühüm problemlərin həllinə yönəldilmişdir. Hazırda uşaq bağçalarında, məktəblərdə, liseylərdə, internat məktəblərində və digər təhsil müəssisələrində belə problemlər çoxdur, ona görə də uşaqlara, tərbiyəçilərə, müəllimlərə, valideynlərə konkret köməklik göstərilməsi bu gün psixoloji xidmətin mühüm vəzifəsidir.

*Perspektivli istiqamət* hər bir uşağın fərdiliyini inkişaf etdirməyə yönəldilmişdir. Fərdilik fərdin bütün xassələrində və münasibətlərində

bütövlükdə götürülən psixoloji unikallığıdır. Bu istiqamət hər bir uşağın şəxsiyyətinin inkişafı üçün imkanların zənginliyi haqqında nəzəri müddəanı həyata keçirir. Burada psixoloqun diqqət mərkəzində hər bir şəxsin qabiliyyətinin inkişafı üçün psixoloji şəraitin təhlili dayanır. Təbii ki, uşaqların qabiliyyətlərinin inkişaf səviyyəsi və məzmun spesifikliyi, eləcə də psixoloqun müəllim və valideynlərlə birlikdə hər bir uşaqla bağlı həll edəcəyi vəzifələr də fərqli olacaqdır.

Hər iki sahə bir-biri ilə sıx bağlıdır. Praktik psixoloq uzunmüddətli problemləri həll edərək ehtiyacı olan uşaqlara, pedaqoqlara, müəllimlərə və valideynlərə gündəlik konkret yardım göstərir. Təhsildə psixoloji xidmət şəhər, rayon, bir sözlə bütün ölkə miqyasında vahid sistem kimi yaradılır. Bu sistemdəki hər bir keçidin öz dəqiq müəyyən edilmiş funksiyaları vardır.

Ən ümumi formada struktura üç əlaqə daxildir: *təhsil müəssisəsində praktik psixoloq (və ya psixoloqlar qrupu), rayon psixoloji xidmət idarəsi və psixoloji xidmət mərkəzi.*

*Praktik uşaq psixoloqu* təhsil müəssisələrində – uşaq bağçasında, orta məktəbdə, gimnaziyada, uşaq evində bütün təhsil müddəti ərzində onlara fərdi yanaşma üçün uşaqların psixoloji tədqiqatını aparır, tam təhsilini təmin edir. Hər bir uşağın psixi inkişafında pozuntuların erkən aşkarlanması, aradan qaldırılması, eləcə də uşaqların uğursuzluğunun və intizamsızlığının qarşısının alınması praktik psixoloqun mühüm vəzifəsidir. O, təhsil işçilərinə, müəllimlərə, valideynlərə təhsil və tərbiyə problemləri ilə bağlı məsləhətlər verir, onların psixoloji biliklərinin artırılmasına kömək edir, bir mütəxəssis kimi müəllimlərin problemlərinin həllinə çalışır.

*Təhsildə psixoloji xidmət mərkəzi* təhsil müəssisələrində, psixoloji kabinetlərdə çalışan psixoloqların və bütün psixoloji xidmətlərin mütəxəssislərinin fəaliyyətini idarə edən baş təşkilatdır. Mərkəz bu xidmətlərin elmi, metodiki və elmi-təşkilati təminatına, orada çalışan psixoloqların peşəkarlıq səviyyəsinə cavabdehdir. Valideynlər, müəllimlər psixoloji xidmət mərkəzinə müraciət edə bilirlər.

**Problemin aktuallığı.** Elmi məqalədə resurs yanaşma psixoloji xidmətin fəaliyyətinin və müasir təhsilin səmərəli inkişafının təmin edilməsində, onun rolunun öyrənilməsində yeni və çox məhsuldar tədqiqat istiqaməti kimi araşdırılmışdır. O, xidməti resurslar sistemi kimi uşaqların tərbiyəsinin, yaradıcılıq imkanlarının üzə çıxarılmasına imkan verir.

**Problemin elmi yeniliyi.** Elmi məqalədə distant təhsil və ondan istifadə imkanları ardıcıllıqla araşdırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərinin müəllimləri, tələbələr, magistrantlar və doktorantlar istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Çələbiyev, N.Z. Psixodiaqnostika məsələləri / N.Z. Çələbiyev. – Bakı: ADPU, 2003.
2. Çələbiyev, N.Z. Təhsil sistemində psixoloji xidmət (nəzəriyyə və təcrübə): Dərs vəsaiti. I hissə / N.Z. Çələbiyev. – Bakı, 2008.
3. Əmrahlı, L.Ş. Psixoloji xidmətin əsasları. I kitab / L.Ş. Əmrahlı. – Bakı: MBM, 2006
4. Zeynalabdinova, Ə.X. Məktəbdə psixoloji xidmətin praktik məsələləri / Ə.X. Zeynalabdinova. – Bakı, 2003

**E-mail:** vuqaraskerov99@gmail.com
**Rəyçilər:** *psixol.ü.fəl.dok., dos.* **N.T. Rzayeva,**
*psixol.ü.fəl.dok.* **R. Mirzəyev**
**Redaksiyaya daxil olub:** 28.04.2023

*UOT 159.9*

***İradə Böyükağa qızı Əmirəliyeva***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı elmi işçisi*
*https://orcid.org/0000-0002-3319-7466*

# TƏHSİLALANLARDA TƏNQİDİ TƏFƏKKÜRÜ İNKİŞAF ETDİRMƏYİN VACİBLİYİ

***Ирада Боюкага гызы Амиралиева***
*доктор философии по педагогике, ведущий научный сотрудник*
*Института Образования Азербайджанской Республики*

# ВАЖНОСТЬ РАЗВИТИЯ КРИТИЧЕСКОГО МЫШЛЕНИЯ У ОБУЧАЕМЫХ

***Irada Boyukagha Amiraliyeva***
*doctor of philosophy in pedagogy, leading scientific worker*
*at the Institute of Education of the Republic of Azerbaijan*

# THE IMPORTANCE OF DEVELOPING CRITICAL THINKING IN STUDENTS

**Xülasə.** İdraki əhəmiyyəti baxımından təfəkkürün növləri fərqlidir. Formasına görə təfəkkürün əyani-əməli, əyani-obrazlı, mücərrəd-məntiqi: xarakterinə görə – praktik və nəzəri; genişlənməsinə görə – diskursiv və intuitiv; yeniliyinə görə – produktiv və reproduktiv növləri vardır. Həmin növlər sırasında tənqidi təfəkkür özünəməxsus yer tutur. Tənqidi təfəkkür yeniyetməlik dövründə inkişaf etməyə başlayır. Məqalədə təhsilalanlarda tənqidi təfəkkürün inkişaf etdirilməsinin vacibliyindən danışılır.
***Açar sözlər:*** *təfəkkür, təfəkkürün növləri, tənqidi təfəkkür, təhsilalanlar, tənqidi təfəkkürün inkişaf etdirilməsi*

**Резюме.** Существуют различные типы мышления с точки зрения познавательной важности. Наглядно-практическое, наглядно-образное, абстрактно-логическое мышление по форме: практическое и теоретическое по характеру; по расширению – дискурсивный и интуитивный; по новизне – есть продуктивные и репродуктивные типы. Среди этих типов критическое мышление занимает особое место. Критическое мышление начинает развиваться в подростковом возрасте. В статье говорится о важности развития критического мышления у обучаемых.
***Ключевые слова:*** *мышление, виды мышления, критическое мышление, обучающиеся, развитие критического мышления*

**Summary.** There are different types of thinking in terms of cognitive importance. Visual-practical, visual-figurative, abstract-logical thinking in form: practical and theoretical in nature; by extension – discursive and intuitive; by novelty – there are productive and reproductive types. Among these types, critical thinking occupies a special place. Critical thinking begins to develop during adolescence. The article talks about the importance of developing critical thinking in schoolchildren.
***Key words:*** *thinking, types of thinking, critical thinking, students, development of critical thinking*

Son zamanlar bəzi peşələr avtomatlaşdırılır, qeyri-adi analitik və insanlarla ünsiyyət bacarıqları ön plana çıxarılır. İşəgötürənlər ixtisaslı mütəxəssislər seçimində maraqlıdırlar. Onlar işçilərindən yalnız müvafiq biliklər deyil, eyni zamanda ünsiyyət və əməkdaşlıq bacarıqları, həmçinin bilikləri seçmək, mənimsəmək, həmin biliklərdən faydalanmaq bacarığı tələb edirlər. Beləliklə, ali təhsil müəssisələrini bitirənlərə tələblər dəyişir. Yalnız fənn üzrə xüsusi bacarıqların mənimsənilməsindən universal səriştələrin inkişaf etdirilməsinə keçid başlıca tələb olur. Belə şəraitdə düşüncə, xüsusən də tənqidi düşünmə çox zəruri yer tutur.

Qabaqcıl ali təhsil müəssisələri tələbələrində tənqidi təfəkkürün inkişaf etdirilməsi qayğısına qalır. Nəticədə tənqidi təfəkkür əmək bazarında ali təhsilini başa vuranların çox mühüm keyfiyyətlərindən biri kimi nəzərdən keçirilir.

İdraki əhəmiyyəti baxımından təfəkkürün növləri fərqlidir. Formasına görə təfəkkürün əyani-əməli, əyani-obrazlı, mücərrəd-məntiqi: xarakterinə görə – praktik və nəzəri; genişlənməsinə görə – diskursiv və intuitiv; yeniliyinə görə – produktiv və reproduktiv növləri vardır.

Həmin növlər sırasında tənqidi təfəkkür özünəməxsus yer tutur.

İnternet və sosial media ən çox faydalandığımız məlumat mənbələridir. Ona görə də məlumat mənbələrində natamam və ya qeyri-dəqiq məlumatların olmasına yol verilməməlidir. Tənqidi düşüncə həm də insanın öz karyerasında, şəxsi və ictimai həyatında qərar verməsi üçün lazımlı və zəruridir

Tədqiqatlardan görünür ki, tənqidi düşünən şəxslər daha düzgün və əlverişli qərarlar qəbul edə bilirlər. Bundan başqa, onlar daha az qərəzli davranırlar və evristik düşüncəyə meylli olurlar.

Tədqiqatların nəticələrinə görə, tənqidi təfəkkür yeniyetməlik dövründə inkişaf etməyə başlayır və 25 ildən sonra maksimum dəyərinə çatır ki, bu da, söz yox ki, müvafiq bacarığın toplanmış təcrübədən asılı olması ilə bağlıdır.

Ali məktəb tələbələrində tənqidi təfəkkürün formalaşmasına diqqət təkcə təhsil sisteminin özündə deyil, eyni zamanda biznes və qeyri-kommersiya sektorunda mövcuddur. Heç də təsadüfi sayılmır ki, xarici ölkələrin bir çox qurumları, tutaq ki, Strateji Təşəbbüslər Agentliyi kimi nüfuzlu təşkilatlar təfəkkürün inkişafı üçün proqramlar hazırlayıb həyata keçirirlər.

Tənqidi təfəkkürün inkişafına hansı şərtlərin səbəb olduğunu bilmək lazımdır. Təlim prosesinin optimallaşdırılması, səmərəliliyinin yüksəldiləsi üçün təhsilalanlarda təfəkkürün tənqidiliyini inkişaf etdirmək məqsədəuyğundur. Tənqidi ağıla malik təhsilalanlar düşüncə tərzinə görə digərlərindən seçilir, duyub qavradıqları proseslər arasındakı uyğunsuzluğu asanlıqla görməyi bacarır və bununla öz fikirlərini əsaslandıra bilirlər..

Tənqidi təfəkkür, bu və ya digər şəxsin, ilk növbədə öz haqlılığına şübhə etməsidir. Bu insanlar başa düşürlər ki, diskussiya hökmən, qeydsiz-şərtsiz öz fikrini müdafiə etməyə doğru yönəlmir, ağıllı kompromis, ahəngdarlıq kimi özünü göstərir.

Tənqidi təfəkkürün inkişaf istiqamətlərini müəyyənləşdirməklə təhsilalanlarda təhliletmə, nəzərdə tutmaq, əlaqələndirmə, qarşılaşdırma, uyğunlaşdırma kimi bacarıqların inkişafına nail olunur. Lakin bununla iş bitmir. Eyni zamanda təlim tapşırıqlarına müxtəlif yanaşmanı, o cümlədən yaradıcı yanaşmanı da formalaşdırmaq olur.

Ağıllı insanlar bu və ya digər qərarı verməzdən əvvəl, necə deyərlər, "yüz ölçüb bir biçirlər". Başqa sözlə, tələsmirlər. Düşünürlər. Öz qənaətlərini tənqidi təfəkkür süzgəcindən keçirirlər. Bir məsələ də diqqət mərkəzində dayanmalıdır. Anlamaq, qəbul etmək lazımdır ki, tənqidi təfəkkür heç də hər şeyi şübhə altına alan və heç nəyə inanmayan lüzumsuz vərdiş də deyildir.

Tənqidi təfəkkürün əhəmiyyəti nəzərə alınaraq, ingilisdilli ölkələrin bir çox çoxunun ali təhsil müəssisələrində o, bir fənn kimi tədris edilir. Həmin fənn üzrə məşğələlərdə tələbə gənclərə dərslikdəki mətnləri oxumağı, metodik şübhələr irəli sürməyi, istər başqalarının, istərsə də özünün arqumentlərində zəif yerləri müəyyənləşdirməyi, anlayışlarla işləməyi, öz fikir və mülahizələrini aydın və əsaslı ifadə etməyi öyrədirlər. Düzgün suallar verməyi bacarmaq da əsas məqamlardandır.

Başqa şəxslərin düşündüklərinə və fikirlərinə düzgün qiymət vermək, öz mövqeyini sübut və dəlilərlə əsaslandıra bilmək üçün informasiya ilə davranmaq qaydaları da məşğələlərdə nəzərdən keçirilir.

Alimlərin qənaətincə, tənqidi təfəkkür formal məntiqə, arqumentləşdirmə nəzəriyyə və praktikasına, ritorika və epistomologiyaya istinadən həyata keçirilir.

S. Məmmədova tənqidi təfəkkür üçün səciyyəvi olan 8 təlim refleksiyasını diqqət mərkəzinə gətirir. Onları nəzərdən keçirək: "1. Bu gün səni nə təəccübləndirdi və nə üçün təəccübləndirdi? 2. Bu gün öyrəndiyin ən vacib şey nədir və niyə belə düşünürsən? 3. Nəyi daha çox öyrənmək istəyirsən və niyə? 4. Nə vaxt daha yaradıcı olduğunu düşünürsən və niyə? 5. Bu gün səni nə maraqlandırdı? Maraqlandığın zaman öyrənmə prosesi səndə hansı hissləri yaradır? 6. Bu gün ən yaxşı olduğunu düşündüyün an hansı idi və niyə? 7. Təsəvvür et

ki, eyni şeyi öyrənirik və sən öyrənmə üçün başqa bir şeyi seçə bilərsən. Bu, nə olardı və niyə? 8. Bildiklərinizlə nə edə bilərsiniz və ya etməlisiniz?" [1].

N. Qocabəyli tənqidi təfəkkürün başlıca məsələləri barədə aydın təsəvvürə malik olmaq üçün aşağıdakı nümunəyə müraciət etmişdir: **"**İnternetdə hansısa xarici ölkə nazirinin velosipedli fotosu peyda olur. Yazılır ki, o hər gün işə velosipedlə gedib-gəlir. İlk baxışda burada təəccüblü heç nə yoxdur, ancaq "obıvatel" dərhal düşünür: bəs bizdə? Ağıllı, informasiyalı, siyasi texnologiyalardan anlayan adam isə bilir ki, belə şeyləri dünyanın hər yerində təşkil və nümayiş etdirmək mümkündür. Bunun adına "populizm" deyilir. Görürsünüzmü, ortaya iki fərqli təfəkkür, iki yanaşma çıxır; biri müxalif təfəkkürdür, digəri tənqidi təfəkkür. Müxalif təfəkkür elə başa düşür ki, nazirlər velosiped sürsə, hər şey düzələcək. Ancaq məsələnin içini, kökünü bilən tənqidi təfəkkür mahiyyətə varır. Ancaq burada müxalif təfəkkürün cığal mahiyyəti də istisna deyil. Bu gün "şəfaverici" bilərziklər satan alverçilərdən tutmuş, ictimai dəstəyə ehtiyacı olan vicdansız siyasətçilərə qədər çoxları insanların inamından sui-istifadə etməyə çalışırlar. Odur ki, hər birimiz bizi əhatə edən informasiyanı imkanlarımız daxilində süzgəcdən keçirməyə, həqiqəti yalan və yanlışdan ayırmağa çalışmalıyıq" (2).

Tənqidi təfəkkürün imkanlarından faydalanmaqla təhsilalanlar təlim tapşırıqlarını daha məqsədəuyğun olaraq anlayır, öz qənaətlərinə tənqidi münasibət göstərərək, şüurlarında özünəməxsus şəkildə təhlil aparır, düşünür-daşınır, biliklərə yaradıcı yanaşma bacarıqlarına malik olurlar.

**Problemin aktuallığı.** Təhsilalanlarda tənqidi təfəkkürün inkişaf etdirilməsi aktual və az tədqiq olunan bir problemdir.

**Problemin yeniliyi**. Təhsilalanlarda tənqidi təfəkkürün inkişaf etdirilməsinin vacibliyi diqqət mərkəzinə gətirilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə psixologiya, o cümlədən təfəkkürlə bağlı tədqiqat aparan magistrant və doktorantlar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**


1. S. Məmmədova. Tənqidi təfəkkür üçün 8 təlim refleksiyası. https://wabisabilearning.com/blogs/critical-thinking/8-learning-reflections-critical-thinking
2. https://www.aznews.az/news/writers/238862.html


**E-mail**: amiraliyeva_i@mail.ru

**Rəyçilər:** *ped.elm.dok., prof.* **A.N. Abbasov,**
*biol.ü.fəls.dok*. **Q.M. Əliyev**
**Redaksiyaya daxil olub:** 17.04.2023

UOT 159.9

**Gülnarə Həmzəbəyovna Əlixanova**
psixologiya üzrə fəlsəfə doktoru
Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi
https://orcid.org/0000-0002-5241-0250

# MƏKTƏB TƏLİMİNİN ŞAGİRDDƏ ÖZÜNÜQİYMƏTLƏNDİRMƏNİN İNKİŞAFINA PSİXOLOJİ TƏSİRİ

**Гюльнара Гамзабековна Алиханова**
доктор философии по психологии
старший преподаватель
Азербайджанского Государственного Педагогического Университета

# ПСИХОЛОГИЧЕСКОЕ ВЛИЯНИЕ ШКОЛЬНОГО ОБУЧЕНИЯ НА РАЗВИТИЕ САМООЦЕНКИ У УЧАЩИХСЯ

**Gulnara Hamzabaynovna Alikhanova**
doctor of philosophy in psychology
senior lecturer at
Azerbaijan State Pedagogical University

# THE PSYCHOLOGICAL IMPACT OF SCHOOLING ON THE DEVELOPMENT OF SELF-ESTEEM IN STUDENTS

**Xülasə.** Məqalədə uşağın özünüqiymətləndirməsi, onun məktəb uğurunun müvəffəqiyyətində müstəsna əhəmiyyət kəsb etməsi problemi açıqlanır. Çətinliklərin aradan qaldırılması, uşağın öz həyat tərzi və münasibətlərində dəyişiklik etməsi işində ilk məktəb müəllimlərinin qarşısında çox mühüm vəzifələr durur. Uşağın özünüqiymətləndirməsi onun məktəb uğurunun müvəffəqiyyətində təzahür edir və şagirdin müvəffəqiyyət səviyyəsi onun özünüqiymətləndirməsində əks olunur. Son nəticədə şagirddə pozitiv “mən” konsepsiyasının inkişaf etdirilməsinin əsas məqsədi, uşağa özünə dəstək, daxili motivasiya və rəğbətləndirmə mənbəyinin təzahürü üçün köməklik etməkdə ifadə olunur. Məqalədə müəllimin qayğıkeş yanaşması bu problemin asanlıqla həll olunmasına müvafiq imkanlar yaratması məsələləri də müəyyənləşdirilir.

***Açar sözlər:*** *özünüqiymətləndirmə, koqnitiv komponentlər, emosional komponentlər, pozitiv “mən” obrazı, korreksiya, özünüdərk*

**Резюме.** В статье раскрывается проблема того, что самооценка ребенка чрезвычайно важна в успешности его школьной успеваемости. Перед учителями начальных классов стоят очень важные задачи по преодолению трудностей, изменению образа жизни и мировоззрения ребенка. Самооценка ребенка отражается в успешности его школьных достижений, а уровень успешности учащегося – в его самооценке. В конечном счете, основная цель развития положительной концепции «Я» у учащегося выражается в том, чтобы помочь ребенку проявить источник самоподдержки, внутренней мотивации и сочувствия. В статье заботливый подход учителя создает соответствующие возможности для легкого решения данной проблемы.

***Ключевые слова:*** *самооценка, когнитивные компоненты, эмоциональные компоненты, образ положительного «Я», коррекция, самосознание*

**Summary.** The article explains the problem that the child's self-esteem is extremely important in the success of his school success. Early school teachers face very important tasks in overcoming difficulties, changing the child's lifestyle and attitudes. A child's self-esteem is reflected in the success of his school success, and the student's level of success is reflected in his self-esteem. Ultimately, the main goal of

developing a positive "I" concept in the student is expressed in helping the child to manifest a source of self-support, internal motivation and sympathy. In the article, the teacher's caring approach creates appropriate opportunities to easily solve this problem

***Key words:*** *self-evaluation, cognitive components, emotional components, positive "I" image, correction, self-awareness*

Uşaqlıq dövrü insanın şəxsiyyət kimi təşəkkülünün, sosial dəyərləri mənimsəməsinin məhsuldar dövrüdür. Uşaqda özünün dəyərliliyi haqda təsəvvürlər hələ məktəbə daxil olanadək təşəkkül tapır, özündə məktəb həyatı və tədrislə bağlı bir sıra gözləmələr əmələ gətirir. Həmin gözləmələr uşağın ya müvəffəqiyyətinin inkişafına təsir edir, ya da ona tədris fəaliyyətində müvəffəqiyyətlə irəliləmək imkanı vermir. Uşağın özünüqiymətləndirməsinə ziyan gətirməyən, onun şəxsi dəyərləndirmə duyğularını aşılayan müəllim, uşağa özü haqda müsbət təsəvvürləri formalaşdırmağa köməklik göstərə bilir.

Uşağın özü haqqında şəxsi fikirlərinin xarakteri onun öz qabiliyyətinə az və ya çox inamından, nəticəni uğur və ya uğursuzluq kimi dərk etməsindən, buraxılmış səhvlərə düzgün münasibətindən, işin dərəcəsinə uyğun olaraq vəzifə seçimindən asılıdır. Onun çətinliyi uşaq üçün mümkündür. Bununla belə, özünəinamı zəif olan uşaqlar, demək olar ki, hər bir işdə keçilməz maneələr görməyə meyllidirlər. Onlarda narahatlıq həddən yüksək olur, məktəb həyatına pis uyğunlaşırlar, həmyaşıdları ilə çətin anlaşırlar, dərsi stresli vəziyyətdə oxuyurlar. Uşaqda məktəbə getməzdən əvvəl təhsil dəyərləri haqqında formalaşan fikirlər onun təhsil və məktəblə bağlı bir sıra gözləntilərinə səbəb olur. Həmin gözləntilər uşağa ya uğura doğru irəliləməyə kömək edir, ya da ona təhsil fəaliyyətində uğurla irəliləmək imkanı vermir.

Şagirdlərdə özünüqiymətləndirmə problemi və onun nəzəri aspektləri U. Ceyms, C. Kuli, C. Mid, E. Erikson, K. Rocers, B.G. Ananyev, I.S. Kon, M.I. Lisina, A.I. Lipkina, V.V. Stolin, E.V. Şoroxova, Ə.Ə. Əlizadə, Ə.Ə. Qədirov, M.Ə. Həmzəyev, R.İ. Əliyev və başqaları tərəfindən əsaslı tədqiq edilmişdir. L.İ. Bojoviç, L.S. Vıqotski, M. ILisina və K.D. Uşinskiyə görə, öyrənmə fəaliyyəti məhz ibtidai məktəb yaşında mənimsənilir, zehni funksiyaların ixtiyariliyi formalaşır, hərəkətlər daxili planla əlaqəli olur, düşüncə, özünüidarə və özünüqiymətləndirmə təzahür edir.

Uşağın məktəb təlimi prosesində müvəffəqiyyət və ya müvəffəqiyyətsizliyi nə cür dərk etməsi pedaqoji prosesin gedişində özünü təzahür etdirir. B.Q. Ananyev məktəblinin nailiyyətlərinin üç əsas səviyyəsini ayırd edir:

I səviyyə uşağın bütün fənlər üzrə yüksək uğuru ilə xarakterizə olunur; II səviyyəyə təhsil vəzifələrini qənaətbəxş şəkildə yerinə yetirən məktəblilərin əsas hissəsi daxildir; III səviyyəyə təhsil tapşırıqlarını yerinə yetirməyən, fənlərdən uğursuz olan məktəblilər aid edilir.

A.A. Реана görə, praktiki olaraq hər hansı bir təlim situasiyasında şagirdin fənn müəllimləri, yaşıdları və valideynləri tərəfindən qiymətləndirmə elementləri mövcuddur. Bəzən o özü də fəaliyyətini qiymətləndirə bilir. Hər bir məktəbli adətən öz nisbi bilik səviyyəsini qəti surətdə bilir, çünki orta məktəbdə müqayisə xarakterli qiymətləndirici mühakimələr üstünlük təşkil edir. Ənənəvi məktəb təlimi sistemində məktəbli qabiliyyətlərinin müəyyənləşdirilməsində yeganə əsas olmasa da vahid özül intellektin verbal təzahürüdür. Uşağın digər bütün bacarıq və qabiliyyətləri bu qiymətləndirmə sistemində sıxışdırılmış olur. Ona görə də verbal intellekt planında yüksək nəticələrə malik olmayan uşaqların çoxu heç nəyə qadir olmadıqlarını hiss edirlər və bu hiss onları faktiki olaraq bütün təlim prosesində uğursuzluğa məhkum edir və uşağın “Mən” obrazının formalaşmasına və onun özünə münasibətinə həddən çox neqativ təsir göstərir. Ənənəvi məktəb təlimi təcrübəsində müvəffəqiyyətlilik uşaqların rəqabət mübarizəsinin predmetinə çevrilir və eyni zamanda, uşağın uğursuzluq qorxusu müəllimlər tərəfindən öyrənmə motivasiyasının əsas vasitəsi kimi istifadə olunur. Ona görə də bəzən məktəblinin II sinifdən VII sinfədək intervalda orta özünüqiymətləndirməsi tədricən və durmadan aşağı düşür.

Pis oxuyan şagirdlərlə mütəmadi olaraq özünüqiymətləndirmədə müvəffəqiyyətin aşağı düşməsinə təsirini azaldan müxtəlif vasitələrdən istifadəyə ehtiyac olur, bəzən qaydaları pozma da bu cür vasitələrdən ola bilər. Buna görə də təlimə yüksək qabiliyyət təzahür etdirməyən məktəbli-

lərdə hər hansı şəxsiyyət qiymətləndirilməsinin mükəmməl müvəffəqiyyət qiyməti – yüksək dəyərlilik əsas faktor kimi hesab edilmir.

Bir qrup tədqiqatçı alim tərəfindən uşağın özünüqavrayışının fərqini və onların ətrafdakılarla münasibətlərini nə cür qavraması problemi tədqiq edilmişdir. "Fəaliyyətdə olan sifətlər" adlandırılan tədqiqat prosesinin iştirakçıları eyni cür nümunəvi xüsusiyyətləri mənimsəyən, lakin müxtəlif müvəffəqiyyətlərə malik olan məktəblilərdən ibarət idi. Tədqiqat nəticəsində müəyyənləşdirilmişdir ki, pis oxuyan uşaqlarda qeyri-adekvat hisslər daha yaxşı inkişaf etmişdir. Ümumilikdə isə onlar ətraflarındakı yaşlılar və yaşıdları ilə pis davranırlar nümayiş etdirsələr də belə hesab edirlər ki, ətrafdakılar onlarla çox pis davranırlar. Müəyyən qabiliyyətlərə malik olan, lakin pis oxuyan şagirdlər özlərinin təlim müvəffəqiyyəti ilə seçilən yaşıdlarından emosional müntəzəmliliyinə, eləcə də özünüqavrayışa və başqalarını qavramasına görə əhəmiyyətli dərəcədə fərqlənirlər.

Məktəbdə pis oxuyan qabiliyyətli uşaqlar, ümumilikdə digər pis oxuyan uşaqlara nisbətən, özlərinə qarşı daha artıq neqativ hisslər keçirirlər. Pis oxuyan şagirdlər günah, ətrafdakılardan təcridolunma və qəbuledilməmə kimi hisslər keçirirlər, onları digərlərindən davranışın müdafiə tipləri: güzəştə getmək, meyllik, özünü ifadə etmək çətinliyi və sairə fərqləndirir. Bu məqsədlə Ananyev B.Q. 1933-cü ildə məktəb şagirdləri arasında "Kim özünü hansı fənn üzrə zəif hesab edir?" mövzusunda eksperimental sorğu aparmışdır. Aparılan sorğunun nəticəsi olaraq uşağın konkret fənn üzrə müvəffəqiyyətinin özünüqiymətləndirməsi ilə pedaqoji qiymətləndirmə arasında üç cür tip münasibət müəyyənləşdirilmişdir:

I tip – mənfi pedaqoji qiymətləndirmə ilə özünüqiymətləndirmənin üst-üstə düşməsi;

II tip – özünüqiymətləndirmədə olan müvəffəqiyyətsizliyin rüblük pedaqoji qiymətləndirmədə təzahürü;

III tip – pedaqoji qiymətləndirmədə müvəffəqiyyətsizliyin özünüqiymətləndirmədə bu təlimatlara riayət etməməsi ilə əlaqədar olması.

Psixoloji ədəbiyyatın təhlilinə görə, aşağı özünüqiymətləndirmə uşağı öz nailiyyətlərinin təzahüründən fəal qaçmağa məcbur edir, çünki özünə hörmətlə bir araya sığmayan fəaliyyəti onda gərginlik və narahatlıq hissləri əmələ gətirir**.** Çox vaxt adekvat hissiyyatın pozulması məktəbə yaxşı hazırlaşmış uşaqlarda baş verir. Yaxşı hazırlıq aşağı siniflərdə, praktiki olaraq az və ya heç bir səy göstərmədən uğurla oxumağa imkan verir. Asan uğurlar fonunda onlarda daim təriflənmələrə vərdiş möhkəmlənir, iddianın yüksək səviyyəsi və yüksək özünüqiymətləndirmə inkişaf edir. Yuxarı siniflərə keçərkən tədris materialının mürəkkəbliyi artdıqca əmək bacarıqlarına malik olmayan bu şagirdlər yoldaşlarına münasibətdə öz üstünlüyünü itirir. Bunun nəticəsində isə onlarda özünüqiymətləndirmə kəskin şəkildə aşağı düşə bilir.

Şagirdin özü haqqında təsəvvürləri onun müəllimlərdən, valideynlərdən aldığı qiymətləndirmələr və təhsilin nəticələrinə reaksiyalar əsasında da formalaşır. Məktəblinin özünüqiymətləndirməsi əsasən məktəb jurnalında qeyd olunmuş qiymətlərdən də çox asılıdır. Müəllimlərin böyük əksəriyyəti hesab edir ki, ibtidai sinif şagirdləri həmişə öz qiymətləri ilə razılaşırlar, ona görə də onları nadir hallarda təhlil edirlər. Şagirdə öz fikrini müdafiə etmə imkanı yaradan və uşağın mühakimələrini nəzakətlə istiqamətləndirən müəllim bununla onda özünəhörmətin formalaşmasına kömək edir. Jurnala qeyd olunan qiymətləndirmə təkcə yekun nəticəni deyil, həm də məktəblinin uğurlarının töhfəsini kimi nəzərə alınmalıdır.

Uşaqda özünəinamın azalmasının qarşısını almaq üçün zəif oxuyan şagirdlərə daha kiçik uşaqlara qarşı müəllim rolunu həvalə etmək məqsədəuyğun hesab edilir. Bu zaman şagirddə şəxsi biliklərində olan boşluğu doldurmaq tələbatı təzahür edir və bu fəaliyyətdəki uğur uşağın özünə hörmətinin normallaşmasına təsir göstərir.

A.I. Lipkina öz tədqiqatlarında uşaqda özünəinamın formalaşması üçün onun imkanlarına uyğun daxili münasibətləri inkişaf etdirmək üçün müvafiq iddialar təklif edir. Bu hasiletmənin mexanizmi öz uğur və uğursuzluqlarının sağlam təhlilidir. Uğurları sadəcə təsadüflərlə izah etmək olmaz – bu uğurların mənşəyi aydınlaşdırılmalıdır. Uğursuzluğun səbəbləri də araşdırılmalı və gələcəkdə nəzərə alınmalıdır. Müasir proqramlarda şagirdin təlimdəki zəif inkişafını korrektə etmək üçün intellektual komponentlərə üstünlük verilməlidir. Bir çox məktəb korreksiya proqramlarının uğursuzluğunun mümkün səbəbi "mən" anlayışının "mühafizə-

karlığının" düzgün qiymətləndirilməməsidir. Müəllim uşaqda özünə hörmətin aşağı düşməsinin qarşısını almaqda böyük rol oynayır. Əgər o, şagirdi dəstəkləyərək qeyri-müəyyən mənfi mühakimələrdən qaçarsa, uşağa öz fikrini müdafiə etmək imkanı verəcəkdir. Bu mərhələdə uşağın özünüqiymətləndirməsində emosional və koqnitiv qarşılıqlı təsir komponentləri birmənalı deyildir. Koqnitiv komponentin daha yüksək inkişaf səviyyəsi ya adekvat yüksək, ya da açıqcasına azaldılmış özünüqiymətləndirmə, uşağın özünün təmin olunmamasının ifadəsi ilə əlaqəlidir. Təlimdəki çətinliklərdən, müəllim və valideynlərin tənqidlərindən asılı olaraq məktəblilərdə öz gücünə inamsızlıq, frustrasiya vəziyyəti, təlimə marağın itməsi, "məktəb nevrozlarının" meydana gəlməsi halları baş verir. Bütün bunların baş verməməsi üçün müəllimin bu cəhətləri çox ciddi şəkildə nəzərə alması daha önəmlidir.

**Problemin aktuallığı.** Məktəb təliminin şagirddə özünüqiymətləndirmənin inkişafına psixoloji təsiri xüsusiyyətlərinin əsas təzahürlərini müəyyənləşdirmək, müasir psixologiyanın elmi-nəzəri tələbləri səviyyəsində həmin problemlərin təhlilini verməkdən ibarətdir.

**Problemin elmi yeniliyi.** Məktəb təliminin şagirddə özünüqiymətləndirmənin inkişafına psixoloji təsiri probleminin təhlili, yeniyetmələrin özünü dərk etməsinə, özünün müsbət xüsusiyyətlərilə yanaşı nöqsan və çatışmazlıqlarına da yaxından bələd olmağa köməklik göstərmək yollarını müəyyənləşdirməkdən ibarətdir.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** Məqalədən elmi yaradıcılıq işində bu mövzu ilə maraqlananlar, eləcə də ali və orta ixtisas məktəblərinin tələbə və magistrləri, psixoloq və pedaqoqlar istifadə edə bilər.

**Ədəbiyyat:**


1. Bayramov, Ə.S. Psixologiya. / Ə.S., Bayramov, Ə.Ə. Əlizadə. – Bakı: "ÇİNAR_ÇAP", 2002. – 623 s.
2. Qədirov, Ə.Ə. Yaş psixologiyası. / Ə.Ə. Qədirov. – Bakı: Maarif, 2002. – 386 s.
3. Əlizadə, Ə.Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. / Ə.Ə. Əlizadə. – Bakı: Pedaqogika, 2004. – 432 s.
4. Əlizadə, Ə.Ə., Əlizadə H.Ə. Pedaqoji psixologiya. I kitab. / Əlizadə Ə.Ə., Əlizadə H.Ə. – Bakı: ADPU, 2010. – 319 s.
5. Əliyev, R.İ. Tərbiyə psixologiyası. / R.İ. Əliyev. – Bakı: Nurlan, 2006. – 210 s.
6. Гуревич, П.С. Психология и педагогика: Учебник / П.С. Гуревич. – Москва: Юрайт, 2013. – 479 с.
7. Реан, А.А. Детская психология. / А.А. Реан. СПб: Прайм – ЕВРОЗНАК, 2008. – 350 с.
8. Хилько, М.Е. Возрастная психология. / М.Е. Хилько. – Москва: Юрайт, 2013. – 200 с.


**E-mail:** gulnare.alixanova@mail.ru

**Rəyçilər:** *psixol.elm.dok., prof*. **R.İ. Əliyev,**
*ped.ü.fəls.dok., dos.* **Q.V. Rəhimova**
**Redaksiyaya daxil olub:** 28.03.2023

*UOT 159.9*

***Səbinə Hikmət qızı Əlizadə***
*psixologiya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti*
*https://orcid.org/0000-0002-0717-7197*

***İlahə Etibar qızı Səfərova***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# YENİYETMƏLƏRDƏ DESTRUKTİV DAVRANIŞIN PSİXOLOJİ XÜSUSİYYƏTLƏRİ

***Сабина Хикмет гызы Ализаде***
*доктор философии по психологии, доцент*
*Азербайджанского Государственного Педагогического Университета*

***Илаха Этибар гызы Сафарова***
*Азербайджанский Государственный Педагогический Университет*

# ПСИХОЛОГИЧЕСКИЕ ОСОБЕННОСТИ ДЕСТРУКТИВНОГО ПОВЕДЕНИЯ У ПОДРОСТКОВ

***Sabina Hikmet Alizade***
*doctor of philosophy in psychology, associate professor at*
*Azerbaijan State Pedagogical University*

***Ilaha Etibar Safarova***
*Azerbaijan State Pedagogical University*

# PSYCHOLOGICAL CHARACTERISTICS OF DESTRUCTIVE BEHAVIOR OF TEENAGERS

**Xülasə.** Elmi məqalədə yeniyetmələrin destruktiv davranışının psixoloji xüsusiyyətləri ardıcıllıqla araşdırılmışdır. Məqalədə oğlan və qızlarda destruktiv davranış mexanizmlərinin formalaşmasının müxtəlifliyi müqayisəli şəkildə təhlil edilmişdir. Müəllif tərəfindən yeniyetmələrin destruktiv davranışının mənbələrinin sistemli şəkildə elmi izahı verilmişdir. Müəllifin fikrincə, destruktiv davranışlı yeniyetmələrin əksəriyyətində qeyri-adekvat özünüqiymətləndirmə, aqressivlik, iradəsizlik daha çox özünü təzahür etdirir.
***Açar sözlər:*** *destruktiv davranış, özünüqiymətləndirmə, aqressivlik, antisosial davranış, sosial mövqe, impulsivlik*

**Резюме.** В научной статье последовательно исследованы психологические особенности деструктивного поведения подростков. В статье сравнивается разнообразие формирования механизмов деструктивного поведения у юношей и девушек. Автор дал системное научное объяснение источников деструктивного поведения подростков. По мнению автора, у большинства подростков с деструктивным поведением отмечается неадекватная самооценка, агрессивность, отсутствие силы воли.
***Ключевые слова:*** *деструктивное поведение, самооценка, агрессивность, асоциальное поведение, социальная позиция, импульсивность*

**Summary.** In the scientific article, the psychological characteristics of the destructive behavior of teenagers were examined in sequence. The article compares the diversity of the formation of destructive behavior mechanisms in boys and girls. The author gave a systematic scientific explanation of the sources of

destructive behavior of teenagers. In the opinion of the author, most of the adolescents with destructive behavior have inadequate self-esteem, aggressiveness, lack of willpower.

***Key words:*** *destructive behavior, self-esteem, aggressiveness, antisocial behavior, social position, impulsivity*

Elmi-metodik ədəbiyyatda cəmiyyətdə məqbul olan sosial normalardan və davranışlardan kənara çıxma mənasını verən müxtəlif terminlər var. Psixologiyada deviant və destruktiv davranış terminləri tez-tez bir-birini əvəz edir. Onların əsas fərqi ondan ibarətdir ki, normadan kənara çıxan istənilən davranış deviant, mövcud norma və qaydaların məhv edilməsinə yönəlmiş davranış isə destruktiv (dağıdıcı) hesab olunur. Bu davranışların hər ikisi yeniyetməlik dövründə çox yayılmışdır.

Tədqiqatçı alim L.Q.Qrebenşikovanın fikrincə, destruktiv davranış subyektin dünyaya və ya özünə olan aktiv münasibətinin spesifik formasıdır, onun əsas məzmunu mövcud obyektlərin və sistemlərin məhv edilməsidir, istənilən şəraitdə dağıdıcı olaraq qalır [1]. Z.K. Davletbaeva qeyd edir ki, destruktiv davranış özündə aqressivliyi, amoralıığı, cinayətkarlığı, kriminal davranışı özündə cəmləşdirən antisosial davranışdır [2]. N.V. Saviskaya cinayətkar davranışın baş verməsi üçün aşağıdakı amilləri müəyyən edir ki, buraya aiddir: akademik uğursuzluq, emosional yetkinlik, hiperaktivlik, ünsiyyət pozuntusu, təklik, pis vərdişlər, sosial bacarıqsızlıq [4, s. 91].

Destruktiv davranışlı yeniyetmələrin əsas psixoloji xüsusiyyətləri onların qeyri-adekvat davranışlarında, aqressiyada və münaqişədə özünü göstərən xüsusiyyətlərdir. Bundan əlavə, destruktiv davranışlı yeniyetmələr emosional-iradi sferada artan narahatçılıqları, dəyər sisteminin, məqsəd və həyatın mənası sahəsində pozuntu olması kimi xüsusiyyətləri ilə xarakterizə olunurlar.

Bir qayda olaraq onlar impulsiv, əsəbi, aqressiv, konfliktli olurlar ki, bu da onların başqaları ilə ünsiyyətini çətinləşdirir və tərbiyəsində əhəmiyyətli çətinliklər yaradır. Buna əsaslanaraq deyə bilərik ki, destruktiv davranışlı yeniyetmələr aqressiv hərəkətlərə, eləcə də hüquqa zidd hərəkətlərə daha çox meylli olmaları ilə xarakterizə olunurlar.

Destruktiv davranışın öyrənilməsi probleminin mühüm cəhəti onun yaş həddi məsələsidir. Davranış normalarının insan tərəfindən mənimsənilməsi prosesi onun inkişafının müxtəlif mərhələləri üçün spesifikdir. Məlumdur ki, müəyyən qaydaları pozmaq üçün, ilk növbədə, onlar mənimsənilməli, norma kimi tanınmalıdır. Normadan sapma haqqında yalnız o hallarda danışa bilərik ki, bir insanın davranışı fərdin sosiallaşmasının yaş normalarına uyğun gəlmir.

Destruktiv və ya deviant davranışın inkişafında yeniyetməlik artan risk dövrü hesab olunur. Bu da *birincisi,* keçid dövrünün çətinlikləri, *ikincisi,* yeniyetmənin sosial mövqeyinin qeyri-müəyyənliyi, *üçüncüsü,* sosial nəzarət mexanizmlərinin yenidən qurulması (uşaqların xarici normalara uyğunluq və itaətkarlığa əsaslanan nəzarət formaları artır, iş və şüurlu nizam-intizam və özünənəzarəti əhatə edən böyüklərin üsulları hələ inkişaf etməmiş və möhkəmlənməmişdir), *dördüncü,* xarakter əlamətlərinin olması ilə bağlıdır.

Destruktiv davranış fərdin sosial deadaptasiyasının təzahürüdür. Qeyd etmək lazımdır ki, sosial deadaptasiya geri dönə bilən prosesdir. Təhsilin vəzifəsi yalnız hər bir yeniyetmənin psixososial inkişafındakı pozuntuların qarşısını almaq deyil, həm də adaptasiyada çətinlik çəkən yeniyetmələrin yenidən sosiallaşmasını və sosial reabilitasiyası prosesini təşkil etməkdir.

Yenidən sosiallaşma, bir qayda olaraq, adaptasiyada çətinlik çəkən yeniyetmələrin sosial vəziyyətinin, itirilmiş və ya formalaşmamış sosial bacarıqlarının bərpası, həmçinin yeni müsbət yönümlü münasibətlərə və pedaqoji mütəşəkkil mühitin fəaliyyətinə daxil olmaq yolu ilə onların sosial münasibətlərin yenidən istiqamətləndirilməsinin sosial-pedaqoji prosesi kimi başa düşülür. Deviant və ya destruktiv davranış aşağıdakı müxtəlif hüquq pozuntularında: 1/ antiintizam (dərslərə gəlməmək, nizam-intizamın pozulması və s.); 2/ bütün növ sosial patologiyalar və ya destruktiv davranış formaları ilə təmsil olunan asosial: alkoqolizm, narkomaniya və maddə asılılığı, fahişəlik, avaraçılıq və diləncilik, suisidal davranış və s. hallarda özünü göstərir.

Yeniyetməlik yaş dövründə fərdin öz müqəddəratını təyin etməsi baş verir, onun ya konstruktiv, ya da destruktiv davranışa meylliliyi məhz bu dövrdə özünü göstərməyə başlayır. Bir gənc xarici və ya daxili davranış pozuntusunu

fəal şəkildə nümayiş etdirirsə, bu, daha çox valideynlərinin və ya həmyaşıdlarının diqqətini özünə cəlb etmək üsuludur. Belə olan halda ona maksimum valideyn diqqəti, sevgi və qayğı göstərsəniz, ixtisaslı mütəxəssisin köməyi ilə ona psixoloji problemləri başa düşməyə kömək etsəniz yeniyetməni destruktiv davranışdan xilas etmək mümkündür. Lakin çox vaxt yeniyetmələr destruktiv davranışlarını açıq şəkildə nümayiş etdirməyə meylli deyillər, bunu başqalarından, ilk növbədə isə valideynlərindən gizlədirlər.

Bir sıra hallarda uşaq və idman meydançalarında, parklarda və digər istirahət yerlərində uşaqlar. özlərini çox pis aparırlar. Böyük qruplarda toplaşan gənclər (çox vaxt alkoqolun təsiri altında) skamyaları zədələyir, taxta konstruksiyaların üzərində bıçaqla yazılar həkk edir, evlərin divarlarını boya ilə yazırlar. Bu cür hərəkətlər məhv olmaq üçün patoloji ehtirasın xarakterik əlamətləridir. Vaxtında tədbirlər görülməzsə, zaman keçdikcə o daha da güclənəcək və nəticədə şəxsiyyətin dönməz şəkildə deqradasiyası prosesinə gətirib çıxara bilər. Yeniyetmələrin destruktiv davranışının mənbələri arasında aşağıdakıları fərqləndirirlər:

1. *Yeniyetmə və məktəb müəllimləri arasında ahəngdar münasibətlərin olmaması.* Ümumi akademik iş yükü şəraitində o, məktəbə münasibətdə tabeli bir vəzifəyə yerləşdirildi. Yeniyetmə çox böyük zehni və fiziki yüklənmə yaşayarkən özünü daima buna məcbur hiss edir. Bu halda destruktiv davranış məktəbdən gələn dözülməz tələblərə etiraz formalarından biri kimi çıxış edir. Adətən bu müəyyən edilmiş qaydaların pozulması ilə ifadə olunur ki, buraya: uniforma geyməkdən imtina, dərsə gəlməmək və və gecikmək, müəllimlərə qarşı kobudluq və s. halları aid edilir.

2. *Ailədə tərbiyə prosesinə yanlış yanaşma*. Belə yanaşma ailədə valideynlər tərəfindən bir yeniyetməyə yalnız həyatının problemli anlarında diqqət yetirdikdə baş verir. Yeniyetmə tərbiyəli olanda ona lazımi diqqət və maraq göstərmirlər. Nəticədə yeniyetmə özünü tənha, lazımsız hiss edir və diqqəti özünə cəlb etmək üçün süni şəkildə problemlər yaradır, destruktiv davranış nümayiş etdirir.

3. *Yetkin şəxsin yeniyetməni öz iradəsinə tamamilə tabe etmək cəhdi*. Bəzən müəllimlər və valideynlər ən yaxşı niyyətlə hərəkət edərək yeniyetmənin təşəbbüs- karlığının və müstəqilliyinin təzahürünü tamamilə boğurlar. Daha təcrübəli və yaşlı bir insan kimi onun üçün hər şeyi sözün əsl mənasında həll edir, fərdiliyinin tam inkişafına mane olurlar. Şəxsiyyəti sıxışdırmaq cəhdi ilə təhsil və tərbiyənin belə avtoritar xarakter daşıması münaqişəli vəziyyətlərə gətirib çıxarır. Yeniyetmə böyüklərin tam nəzarətinə müqavimət göstərməyə başlayır ki, bu da onun destruktiv (dağıdıcı) davranışına səbəb olur. Müasir cəmiyyətdə baş verən neqativ proseslərlə əlaqədar olaraq gənc nəsil ciddi dəyişikliklərə məruz qalır, dəyər oriyentasiyasının deformasiyası müşahidə olunur. Yeniyetmələr böhran vəziyyətlərini kəskin şəkildə yaşayırlar ki, bu da onların destruktiv davranışlarında özünü aydın göstərir. Qeyd etmək lazımdır ki, destruktiv davranışa meylli yeniyetmələrin xüsusiyyətlərinin müəyyən edilməsi problemi bu gün aktual mövzulardandır.

Psixoloji ədəbiyyatların təhlili şəxsiyyətin formalaşması şərtlərinin kəskin şəkildə dəyişdiyini, bu yaş dövründə yeniyetmənin özünə, dünyaya və ətrafdakı insanlara özünəməxsus şəxsi münasibətlərinin formalaşdığını müəyyən etməyə imkan verdi. Yeniyetməlik uşaqlıq və yetkinlik arasında keçid mərhələsidir. Bu dövr bir sıra xüsusiyyətlərlə: sosial problemlərə marağın artması, şəxsiyyətlərarası ünsiyyətə ehtiyacın olması və s. ilə xarakterizə olunur.

Bu cür hərəkətlərə E.V. Zmanovskaya aqressiv, riskli və asosial təzahürləri aid edir ki, bu da öz növbəsində yeniyetmənin mənəvi və əxlaqi inkişafına, eləcə də onun gələcək sosial statusuna təhlükə yaradır [3]. Çox vaxt yeniyetmələr həmyaşıdlarına və ya digər insanlara, özlərinə, maddi şeylərə münasibətdə destruktiv hərəkətlər edirlər. Belə hallar sosial normaların, qaydaların, şəxsi təhlükəsizliyin pozulması kimi xarakterizə olunur, yəni yeniyetmələr özlərinə və əşyalara qarşı aqressiyadan istifadə edirlər. Aqressiv antisosial davranış ümumilikdə cəmiyyətin sabit mənfi münasibətinə səbəb olur ki, bu da insanla onun ətrafı arasında konstruktiv əlaqələrin qurulmasına ciddi maneədir.

Oğlanların və qızların özünümüşahidə, özünüqiymətləndirmə, özünü təkmilləşdirmə və özünütəsdiqetmə ehtiyacı öz güclü və zəif tərəflərini təhlil etmək üçün mənəvi ehtiyaclardan, həmçinin öz həyatlarında nəyin doğru və nəyin

yanlış olduğunu anlamaq istəyindən irəli gəlir. Özünə maraq fərdin keyfiyyətlərinin üzə çıxdığı fəaliyyət ehtiyaclarından yaranır. Yeniyetmə oğlanlarda destruktiv davranış özünü idarəetmənin inkişafının ləngiməsi və əxlaqi dəyərlərin formalaşmasının çətinliyi ilə əlaqədar formalaşır.

Destruktiv davranışın inkişafına təsir edən ilk səbəb güclü iradəli xarakter xüsusiyyətlərinin nəzərə çarpan inkişafıdır, məsələn, məqsədə çatmaqda əzmkarlıq, maneələri və çətinlikləri dəf etmək bacarığı. Yeniyetmə təkcə fərdi iradi hərəkətlərə deyil, həm də iradi fəaliyyətə qadirdir. O, tez-tez qarşısına məqsədlər qoyur, onların həyata keçirilməsini planlaşdırır.

**Lakin iradəsizlik,** xüsusən də bir fəaliyyət növündə əzmkarlıq göstərən yeniyetmənin digər növlərdə göstərməməsinə təsir göstərir. Yeniyetməlik yaş dövrü müəyyən impulsivlik ilə xarakterizə olunur. Bəzən impulsiv hərəkətlərdən sonra onlar artıq bunun əksini etməli olduqlarını başa düşürlər. Yeniyetmənin başqa adamlarla münasibətinin mənfi və ya müsbət təcrübəsi onun şəxsi özünə münasibətinin formalaşmasına təsir göstərə bilər. Buna görə də, yeniyetməlik dövrünün fərqləndirici xüsusiyyətlərinə özünü böyüklər mövqeyində görmək istəyi, özünəinamlı olmaq və müstəqil hiss etmək, daha çox fəallıq göstərmək, valideynlərlə münasibətlərin çətinləşməsi və s. daxildir.

Başqa bir səbəb emosional sferada xarici mənfi xarakter dəyişikliklərin təzahürüdür. Maraqlar və təcrübələrlə bağlı həssaslıq, utancaqlıq, lovğalıq hisslərinin inkişafı baş verir. Valideynlərlə münasibətdə daha çox tənqid etiraz xarakteri alır. Digər səbəb isə cəmiyyətə aid hisslərin olmamasıdır. Məlumdur ki, bəzi yeniyetmələrin qeyri-qanuni fəaliyyətə başlaması onların bu və ya digər vəziyyətdə təsadüfən təmasda olduqları kriminal aləmin nümayəndələri tərəfindən qorxudulması ilə bağlıdır.

Destruktiv davranışlı yeniyetmələrin əksəriyyətində qeyri-adekvat özünü- qiymətləndirmə aşkar edilir. Yeniyetmə üçün əhəmiyyətli və ya əhəmiyyətsiz bir fəaliyyət sahədə aşağı səviyyədə özünüqiymətləndirmə fərqləndirilməlidir. Məlumdur ki, yeniyetməlik dövründə həmyaşıdlarla ünsiyyət mühüm rol oynayır.

Ona görə də bir qrup həmyaşıdın yeniyetmədən imtina etməsi onun üçün əsl faciəyə çevrilir. Bu yeniyetmənin özünüqiymətləndirməsinin aşağı olmasına, bəzən də müxtəlif komplekslərə çevrilməsinə səbəb ola bilər. Bir yeniyetmə idmanda uğursuzluğa ciddi yanaşmasa narahat olmaya bilər. Bu uğursuzluqlar onun heysiyyətinin adekvatlıq səviyyəsinə əhəmiyyətli dərəcədə təsir göstərə bilməz. Destruktiv davranışlı yeniyetmələrdə isə bir qayda olaraq, əlverişsiz təhsil şəraiti nəticəsində qeyri-adekvat, kəskin hisslər, qorxaqlıq, etibarsızlıq və öz mövqeyindən narazılığa səbəb olan əhəmiyyətsiz bir özünə hörmət formalaşır.

Qeyri-adekvat həyəcan hissi mənfi keyfiyyətlərin formalaşmasına səbəb olur. Şəxsiyyət və qabiliyyətlərini mənfi qiymətləndirməməsi üçün yeniyetmə üçün yalan danışmağa başlayır. Sosial problemlər aqressiv davranışı, affektiv həyəcanları olan yeniyetmələrdə də yaranır. Yeniyetmənin tutduğu passiv mövqe onun çatışmazlıqlarına qarşı passiv münasibətə gətirib çıxarır. Bu münasibət həm yeniyetmənin özünə, həm də ətrafındakılara mənfi təsir göstərir. Yeniyetmə çatışmazlıqlarını dərk etməyə, onları düzəltməyə səy göstərmir, qabiliyyətlərini qiymətləndirməkdə çətinlik çəkir, davranışını təhlil edə və uğursuzluqlarının əsl səbəblərini müəyyən edə bilmir. Problemləri həll etmək üçün onlar destruktiv davranışın sosial passiv formasından (təcrid, ünsiyyət dairəsini məhdudlaşdırmaq, alkoqol, narkotik qəbul etmək və s.) istifadə edirlər. Yeniyetməlik yaş mərhələsi inkişafın böhran dövrü kimi sosiallaşma prosesini çətinləşdirən bir sıra hallarla xarakterizə olunur. Odur ki, destruktiv davranışın səbəblərini öyrənərkən sosial qanunların təsir mexanizmini öyrənmək lazımdır.

**Problemin aktuallığı.** Məqalədə oğlan və qızlarda destruktiv davranış mexanizmlərinin formalaşmasının müxtəlifliyi aşkar olunmuş və onlar müqayisəli şəkildə təhlil edilmişdir. Yeniyetmələrdə destruktiv davranışa meylliliyinin artması onların psixokorreksiyaya köməyin zəruriliyi bir daha göstərir.

**Problemin elmi yeniliyi.** Elmi məqalədə yeniyetmələrin destruktiv davranışının psixoloji xüsusiyyətləri ardıcıllıqla araşdırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərinin müəllimləri, tələbələr, magistrantlar və doktorantlar istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Гребенщикова Л.Г. К вопросу о соотношении понятий «деструктивное», «агрессивное» и «девиантное» поведение / Л.Г.Гребенщикова // Сборники конференций НИЦ Социосфера. 2011. № 19. – с. 61-67.
2. Давлетбаева З.К. Асоциальное поведение: понятийный аспект. / З.К. Давлетбаева // Актуальные проблемы гуманитарных и естественных наук. 2011. № 6. – с. 190-198.
3. Змановская Е. В. Девиантное поведение личности и группы: [учебное пособие] / Е. В. Змановская, В. Ю, Рыбников. – Санкт-Петербург: Питер, 2011. – 351 с.
4. Савицкая Н.В. Основные направления социально-педагогической профилактики девиантного поведения детей и подростков //Социальные отношения. 2019. № 2. – с. 83-90.
5. Теняева О.В. Гендерные различия инструментально-стилевых характеристик подростков с девиантным поведением / О.В. Теняева, Н.А. Фомина // Российский научный журнал: электрон. версия журн. 2010. № 4. – 92-97 с.

**E-mail:** feqan.sefereliyev.97@mail.ru
**Rəyçilər:** *psixol.ü.fəls.dok., dos.* **Ü.A. Əfəndiyeva,**
*psixol.ü.fəls.dok., dos.* **M.C. İsmayılova**
**Redaksiyaya daxil olub:** 01.03.2023

UOT 159.9

**Mehriban Cəlal qızı İsmayılova**
psixologiya üzrə fəlsəfə doktoru
Azərbaycan Dövlət Pedaqoji Universitetinin
Pedaqoji psixologiya kafedrasının dosenti
https://orcid.org/0000-0002-0649-4625

**Yarməmməd Daşqın oğlu Hüseynov**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
https://orcid.org/0009-0004-1485-9112

# HƏMYAŞIDLARI QRUPUNDA QARŞILIQLI MÜNASİBƏTLƏR VƏ ÜNSİYYƏT YENİYETMƏ ŞƏXSİYYƏTİNİN FORMALAŞMASININ MÜHÜM AMİLİ KİMİ

**Мехрибан Джалал гызы Исмайлова**
доктор философии по психологии, доцент
Азербайджанского Государственного Педагогического Университета

**Ярмамед Дашгын оглы Гусейнов**
Азербайджанский Государственный Педагогический Университет

# ВЗАИМООТНОШЕНИЯ И ОБЩЕНИЕ В ГРУППЕ СВЕРСТНИКОВ КАК ВАЖНЫЙ ФАКТОР ФОРМИРОВАНИЯ ЛИЧНОСТИ ПОДРОСТКА

**Mehriban Jalal Ismayilova**
doctor of philosophy in psychology, associate professor at
Azerbaijan State Pedagogical University

**Yarmamed Dashgin Huseynov**
Azerbaijan State Pedagogical University

# RELATIONSHIPS AND COMMUNICATION IN A GROUP AS AN IMPORTANT FACTOR IN FORMING A TEENAGER'S PERSONALITY

**Xülasə.** Elmi məqalədə yeniyetmənin şəxsiyyətinin formalaşmasında həmyaşıdları ilə münasibətlərin və ünsiyyətin rolu araşdırılır. Müəllif qeyd edir ki, yeniyetmə həmyaşıdları ilə ünsiyyətdə öz şəxsiyyətini anlamağa, qabiliyyətlərini müəyyən etməyə cəhd göstərir. Ünsiyyətin şəxsi xarakteri, tez-tez mübahisələr və onların müzakirəsi izah edir ki, həmyaşıdları ilə ünsiyyət zamanı yeniyetmənin intellektual inkişafı baş verir, inancları formalaşır. Bütün bunlara əlavə olaraq, həmyaşıdları ilə yaxın dostluq şəraitində yeniyetmələr müəyyən bir ziddiyyət növünü öyrənir, yeni baxış və konfliktləri idarə etmək üçün yeni vasitə və üsullar əldə edir və müəllifin subyektiv mövqeyini tuturlar.
***Açar sözlər:*** *qarşılıqlı münasibət, ünsiyyət, davranış, həmyaşıdlar, özünü- təsdiq*

**Резюме.** В научной статье исследуется роль взаимоотношения и общения со сверстниками в формировании личности подростка. Автор отмечает, что подросток пытается понять свою личность и определить свои возможности во взаимодействиях со сверстниками. Личностный характер общения, частые споры и их обсуждение объясняют, что во время общения со сверстниками происходит интеллектуальное развитие подростка, формируются его убеждения. Помимо всего этого, в условиях тесной дружбы со сверстниками подростки усваивают определенный тип противоречия, приобретая вместе с этим новые средства и методы видения и управления конфликтом, занимают субъектную позицию автора.
***Ключевые слова:*** *взаимоотношение, общение, поведение, сверстники, самоутверждение*

**Summary.** The scientific article discusses the role of relationships and communication with peers in the formation of a teenager's personality. The author notes that a teenager is trying to understand his personality and determine his abilities in interactions with peers. The personal nature of communication, frequent disputes and their discussion explain that during communication with peers, the intellectual development of a teenager takes place, his beliefs are formed. In addition to all this, in conditions of close friendship with peers, adolescents learn a certain type of contradiction, acquiring new means and methods of vision and conflict management, and take the subjective position of the author.

***Key words:*** *mutual relations, communication, behavior, peers, self-affirmation*

Yeniyetməlik dövründə nəzərə çarpan mühüm psixoloji xüsusiyyətlərdən biri də yeniyetmənin sosial-psixoloji ünsiyyət fəaliyyətinin genişlənməsi, yoldaşları ilə qarşılıqlı münasibətə səy göstərməsidir. Yeniyetmənin yoldaşları ilə ünsiyyəti getdikcə genişlənir və möhkəmlənir. Lakin ünsiyyətin pozulması halları baş verdikdə bu, yeniyetməyə böyük sarsıntı gətirir, eyni zamanda, yoldaşlarının soyuq münasibəti onun üçün ən ağır cəzaya çevrilir. Bu yaşda yoldaşlıqda sadiqlik, doğruçuluq, müsbət qarşılıqlı münasibətlər kimi keyfiyyətlər aparıcı olur.

Həmyaşıdları ilə münasibətlərə gəldikdə, yeniyetmədə ünsiyyətə, bilik əldə etməyə, özünü tanımaya, özünütəsdiqə, qarşılıqlı dəstəyə tələbat həyata keçirilir. Özündə yaranan maraq yeniyetmədə insanların xarici və daxili keyfiyyətlərini bilmək və mənəvi qiymətləndirmək istəyini, özünü onlarla müqayisə etmək, öz təcrübələrini və hisslərini başa düşmək istəyini yaradır. Məhz bu dövrdə yeniyetmənin hiss və düşüncələri onu psixikasına yaxın olan qəhrəmanlarla yaxından tanış olması üçün xüsusilə zəruridir.

Həmyaşıdlarla ünsiyyət yeniyetməlik yaş dövründə aparıcı fəaliyyətdir, öyrənmə fəaliyyəti arxa plana keçir. Yeniyetmələr qruplarda həmyaşıdları ilə ünsiyyət qururlar, dostluqları çox emosional və təcrübələrlə doludur. Qarşı cinsə maraq yaranır. Yeniyetmə üçün yoldaşlarla ünsiyyət önəmlidir, onların münasibətləri pis olanda və yaxud alınmadıqda çox məyus olur, bunu öz faciələri kimi qəbul edirlər. Adətən, yeniyetmələr tək qalmaqdan qorxduqları üçün yoldaşları ilə münasibətlərini nizamda saxlamağa çalışırlar.

Yeniyetmə qızların və oğlanların ünsiyyətində əsas yer tutan onların bir-biri ilə sirlərini bölüşməsidir. Şəxsi məsələlərin məzmunu dərinləşdikcə yeniyetmədə sirr etibar edə biləcəyi dosta tələbat yaranır. Buna uyğun olaraq yeniyetmənin təsəvvüründə dost qayğıkeş olmalıdır, bir-birini başa düşməlidir, inanmalı və etibar etməlidir kimi fikirlər yaranır.

Yeniyetmənin dostları ilə ünsiyyəti onların mühakimə obyektinə çevrilir. Onlar dostlarının hərəkətlərini öz davranış və hərəkətləri ilə müqayisə edir, təhlil edir və səbəbini araşdırırlar. Bunun nəticəsində yeniyetmənin özü və yoldaşları haqqında təsəvvürləri genişlənmiş olur. Yeniyetməlik dövründə oğlan və qızların davranışı hələ ambivalent xarakter daşıyır: onlar həm bir-birilə maraqlanır, həm də onlar arasında seçicilik formalaşır [4, s.329].

Yeniyetməlik dövründə həmyaşıdlarla ünsiyyət onların şəxsiyyət kimi formalaşmasında həlledici rol oynayır. Yoldaşlar onlar üçün nümunəyə çevrilir, bir-birlərinə fəal psixoloji təsir göstərir, bir-birlərini tərbiyə edirlər. Yeniyetmə oğlan və qızlar üçün istər məktəb, istərsə də məktəbdənkənar ünsiyyətdə söhbət əsas yer tutur. Psixologiyada onun iki növünü fərqləndirirlər: *birinci növ* söhbətlərə yeniyetmələrin bir-birlərinə müxtəlif sahələri (elm və texnikadan tutmuş maraqlı həyat hadisələrinə qədər) əhatə edən yeni fakt və xəbərlər haqqında məlumat verdikləri söhbətlər aiddir. *İkinci növ* söhbətlərə isə onların planları, arzuları, gələcək haqqında düşüncələri, öz yoldaşlarının münasibətləri, hərəkət və keyfiyyətləri, uşaqların qarşılıqlı münasibətləri, sinifdə və ya tanış uşaqlarla baş vermiş hadisələr, özlərinin xüsusi münasibətləri haqqında söhbətlər daxildir. Onlar: a/ ayrı-ayrı oğlan və qızların keyfiyyətləri haqqındakı təəssüratlarını bir-biri ilə bölüşür; b/ oğlanlarla qızların qarşılıqlı münasibətlərini və sinfin sevgi macəralarını təhlil edir; c/ müşahidə etdikləri seksual səhnələr (konkret hadisə, şəkillər, kinofilmlər) haqqında bir-birlərinə məlumat verir; ç/ cinsi həyatın sirləri haqqında söhbət edirlər. *İkinci növ* söhbətlər həm rəfiqə qızların, həm dost oğlanların ünsiyyətində olduqca mühüm yer tutur. Onların çoxlu şəxsi sirləri də məhz bu sahə ilə əlaqədardır. Belə sirlərin məzmunu müxtəlif olsa da onların mənası həmişə eyni olmuşdur – bu, dost oğlanlardan və rəfiqə qızlar-

dan hər biri və ya ikisi üçün şəxsi, subyektiv cəhətdən mühümdür.

B.S. Volkov bu məsələni izah edərək qeyd edir ki, qızların bu sirləri onların bir-birilə qarşılıqlı münasibətlərinə, oğlanlarla münasibətlərinə, bununla əlaqədar təəssüratlarına, eləcə də cinsi yetişmə ilə əlaqədar olaraq nisbətən intim fikir və təəssüratlara aiddir. Oğlanların sirləri də öz məzmununa görə qızların sirlərinə çox oxşayır [3]. Həmin sirlər də onların bir-biri ilə və qızlarla qarşılıqlı münasibətlərinə, yaşlıların qarşılıqlı münasibətlərinin intim cəhətlərinə, yaşlıların davranışının bəzi cəhətlərini uşaqların təqlid etməsi təşəbbüsünə aiddir.

Yaxın yoldaş və dostla ünsiyyət yeniyetmənin mühakimələrinin xüsusi obyektinə çevrilir. O, dostunun davranış və rəftarını özünün davranış və rəftarı ilə müqayisə edir, onun ayrı-ayrı hərəkətlərini təhlil edib səbəbini araşdırır, yoldaşlıq məcəlləsi baxımından onun etik məzmununu nəzərdən keçirib qiymətləndirir. Həmin prosesdə yeniyetmənin yoldaşlarının və özünün şəxsiyyəti haqqında təsəvvürlərini zənginləşir, onlara və özünə verdiyi qiymətlər dəyişir.

O, ya dostu bağışlamır, dostluq əlaqələrini kəsir, ya da ona yeni tələblər verir. Bu o deməkdir ki, yeniyetmələr bir-birinə fəal münasibət bəsləyirlər: onlar nəinki özlərinin, həm də yaxın yoldaş və dostlarının nöqsanlarını islah etməyə çalışır, daha doğrusu, bir-birlərini əslində tərbiyə edirlər. Yeniyetmədə yeni və çox mühüm xüsusiyyət – başqa adama təsir göstərmək cəhdi əmələ gəlir ki, bu da onun ictimai fəallığını ifadə etməklə yanaşı, həm də yaşıdları ilə qarşılıqlı münasibətlərinin yeni xarakter kəsb etdiyini, yaşlılara məxsus normalar əsasında qurulduğunu göstərir.

Yeniyetmənin fəallığının artması, ünsiyyət dairəsini genişləndirmək cəhdi, insanlar arasındakı qarşılıqlı münasibətləri anlamağa çalışması onun hisslər aləmini də dəyişir. O, ətrafdakı hadisələrə öz reaksiyasını bildirir, çox vaxt emosiyalarını gizlədə bilmir. Onlarda xoşbəxtlik hissi mühüm əhəmiyyət kəsb edir. Lakin bərk məyus olduqda öz hisslərini büruzə verməkdən utanır və özlərini ağlamaqdan da saxlayırlar. Yeniyetmənin həyatında valideynlər nisbətən ikinci planda dayanır. Əvvəlki yaş dövrlərindən fərqli olaraq dəcəl, sözə qulaq asmayan, tez əsəbiləşən yeniyetmə artıq valideyni narahat etməyə başlayır. Valideyn övladının dərdinə şərik olmağa, ona məsləhət verməyə çalışsa da, yeniyetmə bu tövsiyələrə məhəl qoymur və nəticədə valideyn-övlad münasibətlərinin pozulması halları baş verir. Valideyni təəccübləndirən odur ki, övladı kənarda sakit və utancaqdır, evə gələndə isə əksinə, tərs, dəcəl, heç kəslə sirrini bölüşməyən sosial varlıqdır.

Bəzən yeniyetmə ailədə sevilmədiyini, yeri olmadığını düşünərək valideynin hər kiçik iradını şişirdilmiş və özünə qarşı olan böyük cəza kimi görür. Əslində isə yeniyetmə bu vəziyyəti dərk etmir. Bunun nəticəsi olaraq yeniyetmə valideynlərindən azad olma mübarizəsinə başlayır. Buna görə də valideynlər bu kimi halları nəzərə alaraq övladlarına ehtiyatla yanaşmalı, onları qıcıqlandıracaq münasibətlərə yol verməməlidirlər. Yeniyetməlik yaşı məktəbli yaşının bəsit bir dövrü deyildir. İnsan həyatının gələcək zəminləri bəlkə də bu yaşda yaradılır. İlk dəfə bu yaşda yeniyetmə özünü axtarır, kəşf edir. L.S. Vıqotskinin fikrincə, uşaq üçün mövcud olan ətraf aləmin yerində yeniyetmə üçün hüdudsuz bir dünya yaranır: yaşlılar dünyası.

Müəllimlə şagirdlər arasında münasibətlərin xarakteri ona görə mühüm əhəmiyyət kəsb edir ki, yeniyetmə şagirdlər daha çox təqlid etməyə, nümunə götürməyə meylli olduqlarına görə bu münasibətlərdən də dərs alırlar. Müəllim təkcə biliklərin əsaslarını öyrətmir, həm də sinif kollektivini təşkil edir, onların şəxsiyyətini formalaşdırır və bu onun uşaqlarla münasibətlərinin məzmununda öz əksini tapır, münasibətlərin tərbiyəvi xarakterini müəyyənləşdirir.

Yeniyetməlik dövrü bir çox tədqiqatçılar tərəfindən böyüklər arasında qaçılmaz qarşıdurma və yetkinlik dövrü kimi qəbul edilir. Əhəmiyyətli böyüklər şəxsiyyətin formalaşmasına və yeniyetmənin statusunun formalaşmasına mühüm təsir göstərir. D.B. Elkoninin fikrincə, yeniyetməlik yaş dövründə həmyaşıdları ilə ünsiyyət şəxsi intim formasında aparıcı fəaliyyətdir [6]. Bu fikir bir çox psixoloqların əsərlərində çoxyönlü və inandırıcı şəkildə əsaslandırılmışdır. Müəyyən edilmişdir ki, yaşıdları ilə ünsiyyət sahəsində yeniyetmənin yetkinlik hisslərinin inkişafı və gücləndirilməsi üçün optimal şərait mövcuddur.

Həmyaşıdları ilə qarşılıqlı münasibətlərdə yeniyetmə şəxsiyyətini dərk etməyə, imkanları-

nı müəyyənləşdirməyə çalışır. Ünsiyyətin şəxsi xarakteri, tez-tez mübahisələr və onların müzakirələr formasında olması onu izah edir ki, həmyaşıdları ilə təmaslar zamanı yeniyetmənin intellektual inkişafı baş verir, onun əqidəsi formalaşır. Yeniyetmə həmyaşıdları ilə ünsiyyət prosesində başqa insanlar haqqında onların vasitəsi və köməyi ilə özü haqqında məlumat əldə edir. Özünü tanımaq, yaxın yoldaşının, modelə uyğun olaraq, şəxsiyyətini aktiv şəkildə yenidən qurmaq cəhdlərinə səbəb olur.

Yeniyetmələr həmyaşıdlarının üstün konformizmdən istifadə edirlər. Bu da qrupda yeniyetmənin daxili sistemini gücləndirən *biz* hissini formalaşdırır. Ünsiyyət yeniyetmənin diqqətini cəlb etməsinə və düzgün münasibətinə yönəldilir. Birgə müzakirə nəticəsində yeniyetmə özü haqqında məlumatı tam və aydın şəkildə aydınlaşdırmaqla *mən*ini dərk edə bilir. Ancaq bütün həmyaşıdlar yeniyetmədə mən obrazının formalaşmasına eyni cür təsir göstərmir. Odur ki, yaxın və uzaq münasibətlər ayırd edilməlidir. Yaxın münasibətlərin funksiyaları və xüsusiyyətləri:

* yaxın həmyaşıdları ilə münasibətlər və valideynlərlə ilkin eyniləşdirmə çox vaxt aradan qaldırılır;

* yeniyetmələrə arxalana biləcəkləri və onları başa düşə biləcək yaxın dostlar lazımdır. Onlar təkcə sirlərini deyil, həm də hisslərini onlarla bölüşür, daxili problemlərin və şəxsiyyətlərarası münaqişələrin həllində bir-birinə kömək edirlər;

* yeniyetməlik sınaqlar dövrüdür. Uşaq özünü intellektual, sosial, şəxsi, şəxsiyyətlərarası münasibətlər sahəsində sınayır. Bu sınaqlar münaqişə yolu ilə həyata keçirilir. Münaqişənin nəticəsi çox vaxt qeyri-qənaətbəxş olur və o yeniyetmənin rifahına təsirini göstərir. Bu hallarda yaxın dostun köməyi müalicəvi olur.

* həmyaşıdlarla yaxın münasibətlər uzaq həmyaşıdlarla və valideynlərlə münasibətdən daha az mühakimə olunur;

* yaxın həmyaşıdlar bir-birinin özünə hörmətini artırır. Özünə hörməti artırmaq, emosional dəstək vermək faydalıdır.

* yaxın dostlar arasında qarşılıqlı əlaqələr həm rejim, həm də mövzu baxımından fərqlənir. Məsələn, yaxın dostların müzakirə etdiyi mövzular adətən uzaq həmyaşıdlarına toxunmur. Həmyaşıdları ilə yaxın dostluq şəraitində yeniyetmələr münaqişəni görmək və idarə etmək, müəllifin subyektiv mövqeyini mənimsəmək üçün yeni vasitə və üsullar əldə etməklə yanaşı müəyyən bir ziddiyyət növünə yiyələnirlər.

* dostlarla ünsiyyət yeniyetməlik dövründə valideynlərin, müəllimlərin anlaşılmazlığı, eləcə də həmyaşıdları ilə ünsiyyətdə yaranan ziddiyyətlər kimi çətinliklərdən çıxmağa kömək edir;

* şəxsi dəyərlər əsasən yaxın münasibətlərdə formalaşır və inkişaf edir. Dostlar, ümumiyyətlə, eyni inancları və baxışları bölüşürlər;

* eyni dəyərlər, normalar və maraqları dostları ilə bölüşən yeniyetməyə daha çox ünsiyyət dairəsində özünəinam qazanmağa kömək edir;

* yaxın münasibətlər yeniyetmənin sosial vəziyyətini artırır;

* yalnız yaxın, etibarlı münasibətlərdə yeniyetmə özünün daxili, bəzən dərin intim təcrübələrini və həyəcanverici fikirlərini ifadə etməklə, ilk növbədə, öz şəxsiyyətinə, obrazının subyektiv məzmununa təsir edə bilir.

Müəllim-şagird münasibətləri vakuumda formalaşmır. O, mürəkkəb, çoxşaxəli məktəbdaxili münasibət sisteminin bir hissəsidir və xarakteri də bu sistemin təsiri ilə müəyyənləşir. Müəllim və şagirdlərin qarşılıqlı münasibətləri yalnız yeniyetmələrə deyil, eyni zamanda, müəllimə də təsir göstərir. Müəllim əməyinin psixologiyasına aid tədqiqatların əksəriyyətində göstərilir ki, müəllimin öz işindən məmnunluğu, peşəsinə münasibəti, pedaqoji ustalığını artırmaq səyləri bir çox hallarda şagirdlərlə münasibətinin xarakterindən asılıdır.

**Problemin aktuallığı.** Həmyaşıdları ilə qarşılıqlı münasibətlərdə yeniyetmə şəxsiyyətini dərk etməyə, imkanlarını müəyyənləşdirməyə çalışır. Ünsiyyətin şəxsi xarakteri, tez-tez mübahisələr və onların müzakirələr formasında olması onu izah edir ki, həmyaşıdları ilə təmaslar zamanı yeniyetmənin intellektual inkişafı baş verir, onun əqidəsi formalaşır.

**Problemin elmi yeniliyi.** Elmi məqalədə müasir yeniyetmə şəxsiyyətinin inkişaf və psixoloji xüsusiyyətləri ardıcıllıqla araşdırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərinin müəllimləri, tələbələr, magistrantlar və doktorantlar istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Əlizadə, Ə.Ə. Pedaqoji psixologiya. / Ə.Ə. Əlizadə, H.Ə. Əlizadə – Bakı: ADPU-nun nəşr., 2010. – 600 s.

2. Əliyev, B.H. Pedaqoji psixologiya. / B.H. Əliyev, K. R. Əliyeva, R.V. Cabbarov – Bakı: Təhsil, 2011. – 256 s.
3. Əlizadə, Ə.Ə. Müasir Azərbaycan məktəblisinin psixoloji problemləri / Ə.Ə. Əlizadə. – Bakı, 2014. – 490 s.
4. Əzimli, Q. Yaş və pedaqoji psixologiyanın müasir problemləri. Dərs vəsaiti / Q. Əzimli. – Bakı: ADPU, 2006. – 516 s.
5. Волков, Б.С. Психология подростков / Б.С. Волков.– СПб.: Питер, 2010. – 240 с.
6. Эльконин, Д.Б. Некоторые аспекты психического развития в подростковом возрасте / Д.Б. Эльконин // Психология подростка / Под ред. Ю. И. Фролова. – М.: Роспедагентство, 2011. – с. 313-320.

**E-mail:** Yarmemmed20@gmail.com
**Rəyçilər:** *psix.ü.fəls.dok., dos*. **Q.V. Rəhimova,**
*psix.ü.fəls.dok.*, **G.H. Əlixanova**
**Redaksiyaya daxil olub**: 30.03.2023

*UOT 159.9*

***Yeganə Baxış qızı Əskərova***
*psixologiya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*
*https://orcid.org/0009-0002-0590-9630*

# İNTELLEKT ANLAYIŞI VƏ ONUN PSİXOLOJİ MAHİYYƏTİ

***Егяна Бахыш гызы Аскерова,***
*доктор философии по психологии,*
*старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

# ПОНЯТИЕ ИНТЕЛЛЕКТ И ЕГО ПСИХОЛОГИЧЕСКАЯ СУТЬ

***Yegana Bakhısh Askarova***
*doctor of philosophy in psychology*
*head teacher at Azerbaijan State Pedagogical University*

# THE CONCEPT OF İNTELLİGENCE AND İTS PSYCHOLOGİCAL ESSENCE

**Xülasə.** EQ bir insanın qabiliyyətlərini və iş göstəricilərini özündə əks etdirən fəallıq və ya intizam meyli, sonradan qazanılan xüsusiyyət deyil. Eyni zamanda, EQ şəxsiyyət ilə də bağlı deyildir. Bir insanın şəxsiyyətini nəzərdən keçirdiyimiz vaxt bu adamın utancaq, düşüncəli, üzüyola, zarafatcıl ya da əsəbi kimi bəzi xüsusiyyətlərini müəyyən edirik. Şəxsiyyət və emosional intellekt anlayışı bəzən bir-birilə qarışdırılsa da, qeyd etməliyik ki, onlar arasında çox böyük fərq var. Məqalədə bu fərqlər çox anlaşıqlı və əsaslı şəkildə araşdırılmışdır.
***Açar sözlər:*** *intellekt, mücərrəd təfəkkür, bacarıq, bilik, bacarıq, ağıl, hiss, istedad*

**Резюме**. Эмоциональный интеллект – это проактивный или дисциплинированный характер, отражающий способности и результаты человека, а не приобретенная черта. В то же время Эмоциональный интеллект не имеет отношения к личности. Когда мы рассматриваем личность человека, мы определяем некоторые особенности этого человека, такие как застенчивость, задумчивость, капризность, чувство юмора или нервозность. Хотя понятия личности и эмоционального интеллекта иногда путают, мы должны отметить, что между ними есть огромная разница. В статье эти различия были очень четко и подробно исследованы.
***Ключевые слова:*** *интеллект, абстрактное мышление, умение, знание, способность, разум, чувство, одаренность*

**Summary.** Emotional intelligence is not a tendency to be active or disciplined, which reflects a person's abilities and performance. At the same time, EQ is not related to personality. When we examine a person's personality, we identify some of the characteristics of that person, such as shyness, thoughtfulness, facial expressions, jokes, or nervousness. Although the concepts of personality and emotional intelligence are sometimes confused, it should be noted that there is a big difference between them. The article examined these differences in a very clear and thorough manner.
***Key words:*** *intellect, abstract thinking, skill, knowledge, ability, mind, feeling, intellect*

İntellektin nə olduğu və necə müəyyən edilməsi məsələsi uzun müddətdir ki, psixoloqların maraq dairəsini əhatə edir. Mövzu ilə bağlı ədəbiyyatlara nəzər salınanda intellektin bir-birindən fərqli tərifinə rast gəlinir. İntellekt anlayışı ilk test təcrübəsinin inkişafından bu yana, xüsusilə psixologiyada çox vaciblik qazanmasına baxmayaraq, ortaq məxrəcə gəlinmiş tək bir intellekt

tərifi mövcud deyildir. Buna səbəb kimi intellektin tək bir qabiliyyətdə özünü göstərməməsi, əksinə, müxtəlif bacarıqlardan ibarət əhatəli bir xüsusiyyət olmasını göstərmək olar [1 s.41].

Cəmiyyətdə bəzi insanların bilikli, müvəffəqiyyətli göründüklərinin, fərdi və ictimai həyata uyğunlaşmaqda, xüsusilə ünsiyyətdə çətinlik çəkdiklərinin, narahat və intizamsız fəaliyyət göstərdiklərinin şahidi oluruq. Bu halda, xüsusilə insan davranışıyla əlaqədar olan elmlər tərəfindən bəzi məsələləri yenidən nəzərdən keçirmək və tədqiq etmək lazım gəlmişdir. Bununla da insan beyni də yeni tədqiqatların mərkəzi nöqtəsi olmuş və intellekt, insan beyninin fəaliyyəti ilə əlaqədar əldə edilən yeni məlumatların izah edilməsi ilə yenidən qiymətləndirilmişdir. İntellekt tək istiqamətli, sabit, ölçülə bilən və real həyatdan əldə edilmişdir. Veksler intellekti fərdin məqsədli fəaliyyətinin, məntiqi düşüncəsinin və mühitin öhdəsindən gələ bilmək üçün girişdiyi cəhdləri özündə əks etdirən ümumi bir qabiliyyət kimi təyin etmişdir. İlk intellekt testinin müəllifi fransız psixoloq Alfred Bineyə görə, intellekt müəyyən bir məqsədə yönəlmək, məqsədə çatmaq üçün mübarizə aparmaq, uyğunlaşa bilmək və özünə tənqidi yanaşmaqdır. Bine intellekti, yaxşı mühakimə edə bilmə, yaxşı hökm verə bilmə və tənqidi olma kimi də təyin edir [2, s.61].

H. Qardner intellekti bir, ya da birdən çox mədəni mühit daxilində qiymətləndirilən bir problem həll etmə və ya məhsul istehsal etmə bacarığı kimi də təyin edir [3, s.45]. Piaje isə intellekti, ümumi mənada mücərrəd düşünmə, qavrama, problem həll etmə, bildiklərini yeni məsələlərə tətbiq etmə, fikir irəli sürmə, keçmiş təcrübələrdən əldə olunan məlumatları istifadə etmə kimi zehni bacarıqların cəmi olaraq təyin edir [3, s.47]. Psixoloq Villiam Luis Sternə görə, intellekt, fikirlərini şüuri olaraq yeni bir işə yönləndirə bilmə məsələsində ümumi bir bacarıqdır; həyatın tələb etdiyi yeni məsuliyyət və tələblərə zehni olaraq uyğunlaşa bilməkdir [4, s.41-42]. Edvard Torondayk intellekti real, yaxud da faktlar baxımından yaxşı reaksiya verə bilmə bacarığı kimi təyin edir (4. s.19). İntellekt bir-birindən fərqli sahələrə yayılan beyin gücünün həcmi, bu həcmin məhsuldar istifadə edilə bilməsi, bu istifadənin tarazlığı kimi təyin olunan birgə fəaliyyətdir [2, s.21]. İntellekt, dünyanın bizdən gözləmiklərinə ən yaxşı uyğunlaşa bilmə qabiliyyətidir. [5, s.14]. Geniş mənada intellekt, ümumi bir zehn gücü olaraq təyin edilə bilər [7, s.34]. Təriflərdən də görüldüyü kimi, intellekt özündə bir çox zehni işləri ehtiva edir. Dolayısı ilə də eyni intellekt səviyyəsində olan insanlarda bu funksiyaların müxtəlif olması nəticəsində müxtəlif şəxsiyyət quruluşları, davranış tərzləri, uyğunlaşma və həll yolu görünə bilinir.

İntellekt məlumat əldə etmə, öyrənmə və problem həll etməyə imkan yaradan şüuri bacarıqlar kompleksi kimi təyin olunur. Ümumi intellekt bir-biri ilə zəncir kimi əlaqəli olan zehni bacarıqlardan ibarət qavrayışı ifadə edir. Bir başqa mənada isə intellekt "fikirlərini şüuri olaraq yeni bir işə istiqamətlənə bilmə bacarığı, həyatın gətirdiyi yeni məsuliyyət və tələblərə zehni olaraq uyğunlaşa bilmə vəziyyətidir".

Amerika psixoloqu Raymond Kettel C. Spermanın elmi fəaliyyətinin təsiri ilə insan intellektini tədqiq etməyə başladı. O, Spermanın ideyasını davam etdirərək 1960-cı illərdə belə nəticəyə gəldi ki, ümumi intellekt iki faktordan ibarətdir. Bu faktorları Kettel maye və kristallaşmış intellekt adlandırırdı. Kettelə görə, maye intellekt əvvəlki təcrübələrdən asılı olmadan, obyektlər arasında münasibətləri dərk etmək qabiliyyətidir. Kristallaşmış intellekt isə əvvəllər əldə edilmiş təcrübələrə əsaslanaraq məsələləri həll etmək bacarığıdır. Beləliklə, obyektlər arasında əlaqənin kəşf edilməsi, baş verən hadisələrdə qanunauyğunluğun aşkarlanması, məsələlərin yeni həll yollarının tapılması maye intellektlə əlaqədardır. Əldə edilmiş biliklərin tətbiqi isə kristallaşmış intellekt ilə bağlıdır. Nəzəriyyənin müəllifinin və onun davamçılarının fikrincə, maye intellekt erkən gəncliyə qədər inkişaf edir və sonra onun səviyyəsi enməyə başlayır. Kristallaşmış intellekt isə orta yaşlara qədər artır, bir müddət sabit qalır və tədricən azalmağa başlayır. İntellekt üstündə ən çox tədqiqat aparılan qabiliyyətdir. İntellekt anlayışını izah etməyə yönələn tədqiqatların sayı artmışdır, lakin bununla belə intellektin necə bir qabiliyyət olduğu hələ də müzakirə olunur. Aşağıdakı intellekt nəzəriyyələri vardır:

1. Tək faktor nəzəriyyəsi intellekti ümumi bir qabiliyyət kimi qəbul edənlərin baxışlarına bir faktor nəzəriyyəsi deyilir. Bununla yanaşı, bu fikirdə olan bir çox psixoloq bu ümumi fikri qabiliyyəti bir-birindən fərqli şəkildə təyin etmişlər.

İntellekt testləri sahəsində tanınmış psixoloq Termana görə intellekt, mücərrəd fikirləşmə qabiliyyətidir. Davis intellekti, əldə olunan biliklərdən faydalanaraq problem həll etmə qabiliyyəti kimi izah edir. Ştern isə yeni qarşılaşılan vəziyyətlərin şərtlərini fikirləşmə qabiliyyətindən faydalanaraq qəbul edə bilmə, yeni həyat şərtlərinə uyğunlaşa bilmə gücü kimi təyin olunur.

Bütün bu izahlarda ortaq olan xüsusiyyətlərə görə intellektin fərdin ətrafına təsirli şəkildə adaptasiyasını təmin edən mücərrəd və ümumi qabiliyyət olduğu başa düşülür [5, s.274].

2. Cüt faktor nəzəriyyəsi. Sperman ümumi fikri qabiliyyəti cüt faktor nəzəriyyəsi ilə açıqlamağa çalışmışdır. 1904-cü ildə yazdığı "Ümumi İntellekt" adlı məqaləsində insanın bütün intellektual fəaliyyətində ortaq bir tərəf olduğunu göstərməyə çalışmışdır. Bu nəzəriyyəyə görə intellektual güc bir ümumi qabiliyyət ilə bir çox xüsusi qabiliyyətlərdən meydana gəlmişdir. Ona görə insan nə qədər ağıllı olsa, bir vəziyyətdə o qədər çox münasibət qurar və qarışıq bir problemi ən kəsə yolla həll edər [5, s.275].

3. Çox faktor nəzəriyyəsi. İntellekti çox faktor nəzəriyyəsi ilə izah edən alimlərdən Torndayk, Turston və Gilfordu göstərmək olar. Bu psixoloqlara görə, gündəlik davranışlarımızı nizamlayan fikri gizli güc bir tək ümumi qabiliyyət olmaqdan çox bir çox xüsusi qabiliyyətlərin bir yerə toplanmasından meydana gəlmişdir [5, s.277].

4. Piajenin intellekt nəzəriyyəsi. Jan Piaje intellektin istifadə və inkişafını bioloji bir modellə izah edir. Piajeyə görə, zehni quruluş və intellekt yaşla əlaqədar olaraq inkişaf edir və anadan olandan yeniyetməlik dövrünün sonuna kimi bu inkişaf davam edir [1, s.136].

5. Çoxtərəfli intellekt nəzəriyyəsi. Amerika psixoloqu Howard Gardner tərəfindən 1983-cü ildə təklif edilən çoxtərəfli intellekt nəzəriyyəsinə görə, bütün insanlar eyni tipli intellektə malik olmurlar. Hər bir fərd fərqli sahələrdə başqalarından daha üstün intellektə malik ola bilər. Hovard Qardnerin intellektin səkkiz növünü qeyd etmişdir. Beynin iki yarımkürəsinin fərqli sahələri və fərqli fəaliyyətləri nəticəsində əmələ gələn öyrənmənin daha həqiqi və qalıcı olduğuna, buna görə də insan intellektinin IQ-dən daha çox şeylə ifadə edilməsinin lazım olduğunu işarə etmiş və beləliklə, çoxşaxəli intellekt nəzəriyyəsi meydana gətirmişdir.

Qardner cəmiyyəti çoxlu intellekt qavrayışıyla tanış edərək intellektin təkistiqamətli olmadığı fikrini irəli sürdü. Çoxlu İntellekt qavrayışı uşaqların intellektinin onların musiqi, incəsənət, riyaziyyat, ədəbiyyat, idman kimi qabiliyyətlərinə görə qruplaşdırılması idi. Yəni Qardnerə görə, bir adamda, məsələn, musiqi intellekti yüksək olduğu halda, digər adamda riyaziyyat, incəsənət intellekti yüksək ola bilər. Qardner ilə başlayan çoxlu intellekt anlayışına emosional intellekt qavrayışı əlavə olundu.

Psixologiya sahəsindəki araşdırmalarda 1980-ci ilə qədər hisslərimizin intellekt üzərindəki təsiri nəzərə alınmırdı. Bunun ən əsas səbəbi biheviorizmdir. Bu, xüsusilə əsrin ortalarında psixologiyada hökmran olan B.F. Skinnerin biheviorizminin əlində idi. Onlara görə, hisslər də daxil olmaqla, insanın bütün daxili dünyası elmin xaricindədir. Qardner 1983-cü ildə nəşr olunan "Frames of Mind" adlı əsəriylə IQ tərzində düşünməyə qarşı mübarizə başlatmışdır. Ona və onun arxasınca gedən tədqiqatçılara görə, tək növ intellekt kimi götürülən IQ testləri bacarıqlı insanın təyin olunmasında kafi deyil. Çünki intellektin çoxnövlü bir quruluşu var. Gardner bunu çoxlu intellekt adlandırır. O, çoxlu intellekt nəzəriyyəsinə səkkiz sahəni aid etmişdir. Normal həyatda bu intellekt növləri bir-biri ilə əlaqədə olduğuna görə onların xüsusiyyətləri ayrılıqda nəzərə çarpmır. Lakin bütün intellekt növlərinin özünə xas quruluşu açıq şəkildə ortaya çıxır. Qardnerin müəyyən etdiyi intellekt növləri bunlardır: kinestetik intellekt, vizual-faza intellekti, musiqi intellekti, verbal-linqvistik intellekt, məntiqi-riyazi intellekt, interpersonal intellekt, interpersonal intellekt, naturalistik intellekt, ekzistensial intellekt, moral intellekt. Açıq-aydın görünür ki, çoxşaxəli intellekt qaydası universal xüsusiyyətlərə malikdir. Bunun səbəbi insan təbiətinin universal olmasıdır. Çoxşaxəli intellekt qaydası nəticəsində IQ testləri müstəqilliyini itirmişdir. Burada tədqiqat mövzusu baxımından əhəmiyyətli bir nöqtəyə diqqət yetirmək lazımdır. Bəzi tədqiqatçılar çoxşaxəli intellekt qaydasının iki sahəsinin "fərdi" və "şəxsiyyətlərarası" intellekt sahələrinin emosional intellekt sahəsi əmələ gətirdiyini qeyd edirlər.

Qardnerin ifadə etdiyi "fərdi" və "şəxsiyyətlərarası" intellekt sahələri, daha sonra

"Emosional intellekt" sahəsi olaraq yenidən formalaşdırılmışdır. Bununla birlikdə, xüsusilə iş həyatı və təhsil sahəsi baxımından da "Emosional intellekt" olaraq müəyyən edilən bacarıqların əhəmiyyətli bir yer tutduğunu söyləmək mümkündür."

Amerika psixoloqu Robert J. Sternberq üçtərəfli intellekt nəzəriyyəsini təklif etdi. Sternberqə görə, intellekt üç istiqamətdə inkişaf etməlidir: Analitik – insan aldığı informasiyanı analiz etməyi, müqayisə etməyi, qiymətləndirməyi bacarmalıdır; Kreativ (yaradıcı) insan yeni ideyalar verməyi, problemlərin yeni həllini tapmağı, fərz etməyi, kəşf etməyi bacarmalıdır; Praktik insan nəzəriyyələri tətbiq etməyi, öyrəndiklərindən praktik olaraq istifadə etməyi bilməlidir. Sternberq hesab edir ki, müasir təhsil sistemi insanların ancaq bilikləri yadda saxlamaq və analiz etmək qabiliyyətlərini qiymətləndirir. Bu zaman yaradıcılıq və bilikləri praktikada tətbiq etmək qabiliyyəti diqqətdən kənarda qalır. Qardnerin tədqiqatlarında fərdi intellekt çox az tədqiq olunmuşdur. Qardnerin fərdi intellekt tərifində hisslərin roluna və ustalıqla idarə olunmasına yer verilsə də Qardner və iş yoldaşları hissin intellekt üzərindəki roluna ətraflı şəkildə baxmayıb, hiss haqqındakı biliklər üzərində durmuşlar.

Qardnerin fərdi intellektdəki bilik ünsürləri üzərində dayanması o dövrün psixoloji modelini əks etdirir. Bu əsrin ortalarında akademik psixologiya B.F. Skinnerin formalaşdırdığı bihevioristlərin təsiri altında idi. Skinner ancaq obyektiv olaraq xaricdən görülə bilən davranışların elmi olaraq tədqiq edilə biləcəyi fikrində idi. Bihevioristlər hisslər də daxil olmaqla insanın bütün daxili dünyasını elmdən kənar bir şey kimi qəbul edirdilər. Daha sonra 1960-cı illərin sonlarında ortaya çıxan "elmi inqilab" sayəsində psixologiya elminin tədqiq mərkəzi zehnin məlumatı necə yazıb saxladığını və intellektin təbiətini öyrənməyə yönəlmişdir. Ancaq hisslər hələ də diqqətə alınmırdı. Alimlər arasındakı müstəqil ənənəvi baxışlara görə, intellekt məlumatların hissiz, emosiyasız, məsafəli istifadə olunmasıdır. Bu da emosiyanın intellektdə heç bir yerinin olmadığı və yalnız zehni həyatı qarışdırdığı fikrini meydana gətirirdi.

Alimlərin zehnin məlumatı necə istifadə etdiyinə dair modelləri duyğuların, hisslərin çox vaxt ağıldan üstün gəldiyi qənaətinə gətirir. Belə baxıldıqda elmi model yoxsul bir zehin modelidir. Hisslərin coşqu və təzyiqinin intellektə qatdığı gücü izah edə bilmirlər. Şüuri intellekt konsentrasiya, planlaşdırma, sözlərin ifadəsi, anlama və onu reallıqlara görə nizamlama ilə bağlıdır. Qısacası, IQ insanın fərdi bilik bankıdır. İnsanın hafizəsi, söz xəzinəsi və vizual beyin koordinasiyasıdır. Bu xüsusiyyətlərdən bəziləri müxtəlif məsələlərdə müvəffəqiyyətli olmağı asanlaşdırır, IQ tərəfdarları EQ-nun IQ-nun yerini almaq üçün irəli sürüldüyünü iddia etsələr də, tamamilə yanılırlar. IQ və EQ son dərəcə fərqli bir anlayışdır. Məsələ belədir ki, IQ həyatda müvəffəqiyyəti təmin edən bir vasitə kimi təqdim oluna bilməz. Tədqiqatlar göstərir ki, işdə uğur qazanmaqda IQ 1% ilə 20% arasında olan bir müvəffəqiyyəti təmin edirsə, EQ dərəcəsi yüksək olan insanlarda iş müvəffəqiyyəti 27% ilə 45% arasındadır. Tomas Stenli "Milyoner intellekti" adlı kitabında ABŞ-dakı 733 milyoner üzərində apardığı anketin nəticəsinə görə müvəffəqiyyətlərinin sirrinin ilk beş amilinin bu amillər olduğunu müəyyən etmişdir: insanlara qarşı düzgün olmaq, intizam, insanlarla yaxşı münasibət, özlərinə dəstək olan fərdlər, çalışqanlılıq...

Bütün bu amillər emosional intellekti əks etdirir. Şüuri intellekt (IQ) bu sırada 21-ci yerdədir. Bəzi amilləri çıxanda bu nisbət daha da düşür. Şüuri və emosional intellekt arasındakı ən böyük fərqlərdən biri IQ-nun sərhədlərinin müəyyənliyidir. Fərd 17 yaşında olanda IQ baxımından ən yüksək nöqtədə, gənclik dövründə sabit, yaşlılıq dövründə isə enişə keçir. Buna nəzərən EQ belə kəskin sərhədlərə malik deyil. Kanada və ABŞ-da 4000 insan üzərində aparılan tədqiqatlarda EQ balı 95,3-dən (bu yeniyetməlik dövrünün sonunda rast gəlinən bir dövrdədir) 102,7-yə qədər (40 yaşlarında EQ inkişafi sabitləşir) yüksələ bilir. EQ dərəcəsi 50 yaşını keçdikdən sonra 101,5 sərhəddinə qədər çox az miqdarda geriləyər, amma kəskin enişə keçməz. Bu vəziyyət həm kişilər, həm də qadınlara aiddir [8, s.37].

Sosioloqlar təkamülün insan ruhunda duyğuya niyə belə mərkəzi yer verdiyini müzakirə edərkən kritik anlarda ürəyin ağla qalib gəldiyinə işarə edirlər. Ona görə hisslərimiz təhlükə, acı bir itki, çətinliklərə qarşı bir hədəfə doğru irəliləmə, həyat yoldaşına bağlanma və bir ailə

qurmaq kimi təkcə ağlın öhdəsinə buraxılmayacaq vəziyyət və vəzifələrdə yolgöstərəndir. Hər duyğu bizi müxtəlif şəkildə hərəkət etməyə hazırlayır, hər biri insan həyatında təkrarlanan çətinliklərin öhdəsindən gələ biləcək şəkildə bizi istiqamətləndirir. Təkamül dövründə hisslər yol göstərən olsa da sivilizasiyanın gətirdiyi yeni reallıqlar elə sürətlə inkişaf etdi ki, təkamülün asta inkişafı buna çata bilmədi.

İnsan iki zehnə sahibdir; biri fikirləşir, o biri hiss edir. Bu iki qavrayış tərzi zehni həyatımızı əmələ gətirmək üçün qarşılıqlı təsir halındadır. Zehni hisslər insanın idrak fəaliyyəti zamanı baş verənləri dərk etməklə bağlı yaranır. [6, s.93]

Ağıllı zehin əslində hamımızın dərk etdiyi bir qavrayış tərzidir, şüurumuza daha yaxındır, düşüncəlidir və ölçü əks etdirə bilər. Bununla yanaşı fövri və güclü, hərdən da məntiqsiz olan bir qavrayış sistemi də vardır ki, bu da emosional zehindir. Bu emosional – ağıllı ikiliyin xalq arasındakı deyimi "qəlb" ilə "baş"dır. Bir şeyin düzgün olduğunu "qəlbdən" bilmək ağıllı zehin ilə fikirləşməkdən fərqli bir inam şəklidir, bir baxımdan daha dərindən əmin olmaqdır. Zehnin ağıllı-emosional tarazlığının müəyyən bir sərhədi var, hisslər sıxlaşdıqca emosional zehin hərəkətə keçir və əqli zehin təsirini itirir [9, s.319].

Biri emosional, biri ağıllı olan bu iki zehin əksərən bir uyğunlaşma ilə və fərqli şüur formalarını bir-biri ilə əlaqələndirərək həyatda öz yolumuzu tapmağa kömək olur. Ümumilikdə emosional və əqli zehin eyni tarazlıqdadır. Hiss ağlı zehnin işləməsinə kömək edir, əqli zehin isə emosional məlumatları formalaşdırır. Ancaq yenə də emosional və əqli zehin yarı müstəqil bacarıqlardır, hər ikisi də, göründüyü kimi, beyindəki fərqli, amma bir-biri ilə əlaqəli sistemlərin işləməyini əks etdirir. Çox vaxt bu iki zehin hiss, fikirlər üçün birlikdə işləyər, fikirlər isə hisslər üçün əvəzedilməzdir. Ancaq ehtiras bu tarazlığı sarsıdanda emosional zehin üstünlük təşkil edir və əqli zehni səmərəsiz hala gətirir. Necə olur ki, intellekt səviyyəsi kifayət qədər yüksək olan birisi axmaq bir hərəkət edir? Ona görə ki, akademik intellektin emosional həyatla elə də əlaqəsi yoxdur: aramızdakı ən ağıllı insanlar cilovlaya bilmədikləri ehtirasın, coşqun impulsun əsiri ola bilir. Yüksək IQ-li insanlar şəxsi həyatlarını təəccüb ediləcək şəkildə pis idarə edirlər.

Psixologiyanın açıq sirlərindan biri də IQ-nün ya da universitetə qəbul imtahanı ballarının həyatda kimin müvəffəqiyyətli olacağına dair qüsursuz bir ehtimal irəli sürə bilməməsidir. Bütöv bir şəkildə böyük qruplar baxımından IQ və həyat şərtləri arasında bir əlaqə olduğuna əmin olmaq olar: çox aşağı IQ-li əksər insanlar fəhləlik və buna oxşar işlər gördükləri halda, yüksək IQ-li insanlar pul qazandıqları işlərə (hər zaman olmasa da) girişirlər. IQ və emosional intellekt bir-birinin əleyhinə deyil, bir-birindən ayrı bacarıqlardır. Hamıda ağıl və emosional həssaslıq qarışıqdır. Əslində IQ və emosional intellektin bəzi tərəfləri arasında, az da olsa, bir əlaqə vardır, ancaq bu o qədər cüzidir ki, IQ ilə emosional intellektin bir-birindən ayrı faktlar olduğunu açıq-aydın ortaya çıxarır. Hər kəsə məlum olan IQ testlərinin əksinə "emosional intellekt səviyyəsi"ni üzə çıxardan bir dənə də olsun yazılı test yoxdur və heç bir vaxt da olmaya bilər.

Emosional intellektin hər cür ünsürü haqqında çoxlu tədqiqatlar aparılmasına baxmayaraq, empatiya kimi bəzi bacarıqları sınamağın ən yaxşı yolu insanın həmin işdə göstərdiyi hərəki bacarığı nümunə göstərməkdir; məsələn, bir insanın hisslərini həmin adamın videoya çəkilmiş üz ifadələrindən oxumaq kimi.. Berklidəki Kaliforniya Universitetindən psixoloq Cek Blok "Mənliyin dayanıqlılığı" deyə adlandırdığı emosional intellektə çox oxşayan bir ölçüdən istifadə edərək, nəzəri cəhətdən iki saf növü qarşılaşdırmışdır: yəni, yüksək IQ-li insanlarla inkişaf etmiş emosional bacarıqları olanları qarşılaşdırmışdır. Tapdığı faktlar olduqca aydındır. Saf yüksək IQ tipi (yəni emosional intellektdən ayrı tutulan), adətən, zehin dünyasında mütəxəssis, ancaq şəxsi dünyada qeyri-kafi bir intellektin karikaturasıdır. Qrafik qadın və kişilər arasında azacıq fərqliliklər göstərir.

Yüksək IQ-li kişi, gözlənildiyi kimi, geniş bir intellektual maraq və bacarıqlar seriyasına sahibdir. Əzmkar, stabil və öz problemlərini dərd etməyən biridir. Bundan başqa, tənqidçi, yuxarıdan aşağı baxan, vasvası, hisslərini cilovlayan, özünə qapalı, məsafəli, emosionallıq baxımından isə laqeyd və soyuqdur. Bunun əksinə, emosional intellekti yüksək şəxslər sosial cəhətdən balanslı, ünsiyyətcil, şən, qorxaqlığa və dərindən fikirləşməyə meylli olmayan biridirlər. İnsanlara bağlanma, məsuliyyət alma, etikalı olma xüsusiyyətləri diqqəti cəlb edir.

Münasibətlərində başqalarına qarşı mehribandırlar. Zəngin, amma yerli-yerində bir emosional həyatları var. Özləri, başqaları və yaşadıqları sosial dünyadan razıdırlar. Saf yüksək IQ-li qadınlar intellektlərinə əmindirlər. Fikirlərini sərbəst şəkildə ifadə edə bilir, intellektual mövzulara dəyər verir və geniş bir intellektual və estetik əlaqələrə sahibdirlər. Bu cür qadınlar, eyni zamanda, özlərini təhlil edə bilən, qayğıya, dərin fikirləşməyə, günahkarlıq hissi keçirməyə meylli, bundan başqa, qəzəblərini açıq-aydın büruzə verməkdən qaçan (bunu dolayı yolla edən) insanlardır.

Emosional intellekti yüksək olan qadınlar isə əksinə, səmimi, hisslərini birbaşa ifadə edə bilən, həyatdan bir məna tapan insanlardır. Bundan başqa, kişilər kimi onlar da ünsiyyətcil, şən, hisslərini lazımi tərzdə ifadə edə bilən və stressin öhdəsindən gələ bilən biridirlər. Sosial davranışları yeni insanlarla asanlıqla əlaqə yaratmaqlarını təmin edir. Saf IQ-lü qadınların əksinə, nadir hallarda qayğı ya da günahkarlıq hissi keçirir və dərin fikirlərə dalırlar [1, s.34-82].

Bu portretlər, əlbəttə ki, adi nümunələrdir, hər kəsdə IQ və emosional intellektin fərqli bir qarışığı vardır. Ancaq hər bir ölçünün insana ayrı-ayrı nə kimi xüsusiyyətlər əlavə etdiyini görməyimizi təmin edən bir dünyagörüşü təqdim edirlər. Bir insanda həm şüuri, həm də emosional intellekt olduğu halda bu portretlər üst-üstə düşür. Yenə də insanı insan edən xüsusiyyətlərin çoxu emosional intellektdən irəli gəlir.

Nəticə olaraq deyə bilərik ki, təkbaşına IQ insanın həyatda müvəffəqiyyətli olmasını təmin edə bilməz, ancaq hisslərlə əlaqələndirildiyi zaman müvəffəqiyyət əldə edilə bilər. Emosional intellekt IQ-yə alternativ deyil, yalnız bir əlavədir. Həyatda müvəffəqiyyət və xoşbəxtliyə nail olmaq üçün hər iki intellektə də ehtiyac vardır. Emosional intellekt özümüzü və başqalarını anlamaq, motivasiya edə bilmək, bəzi kədərli hadisələr qarşısında soyuqqanlılıq göstərib, məqsədimizə çata bilməyimiz, səy və stabillik göstərə bilməyimiz üçün lazımi bir bacarıqdır.

**Problemin aktuallığı.** İntellekt özündə bir çox zehni işləri ehtiva edir. Geniş mənada intellekt, ümumi bir zehin gücü olaraq təyin edilə bilər. Dolayısı ilə də eyni intellekt səviyyəsində olan insanlarda bu funksiyaların müxtəlif olması nəticəsində müxtəlif şəxsiyyət quruluşları, davranış tərzləri, uyğunlaşma və həll yolu görünə bilir. İntellekt və onun pedaqoji-psixoloji ədəbiyyatda qoyuluşu kimi vacib bir mövzuya həsr olunması məqalənin aktuallığını şərtləndirir.

**Problemin elmi yeniliyi.** Elmi yenilik onunla bağlıdır ki, intellekt məlumat əldə etmə, öyrənmə və problem həll etməyə imkan yaradan şüuri bacarıqlar kompleksi kimi təyin olunur. Ümumi intellekt bir-biri ilə zəncir kimi əlaqəli olan zehni bacarıqlardan ibarət qavrayışı ifadə edir. İntellekt sosial-psixoloji sistem kimi nəzərdən keçirilir, onun ayrı-ayrı mərhələlərinin səciyyəvi cəhətləri göstərilir və bu istiqamətdə aparılmış müxtəlif tədqiqatların nəticələri təhlil olunur.

**Problemin tətbiqi əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərinin müəllimləri, tələbə və magistrantlar, eləcə də praktik psixoloqlar yararlana bilər.

**Ədəbiyyat:**

1. Goleman, D. Duygusal Zeka Neden IQ'dan Daha Önemlidir?. Çeviren: Banu Seçkin Yüksel, İstanbul: Varlık yayınları, 2005. – 283 s.
2. Bacanlı, H. Gelişim ve Öğrenme. – Ankara: Nobel yayınevi, 2001. – 46 s.
3. Gardner, H. Çoklu Zeka Kuramı (Zihin Çerçeveleri), – İstanbul: Hayat yayınları, 2004. – 58 s.
4. Konrad S. Hendl C. Duygularla güçlünmek. – İstanbul: Hayat yayınları, 2005, – 81s.
5. Yaşarsoy Emine. Duygusal Zeka gelişim programının eğitilebilir zihinsel engelli öğrencilerin davranış problemleri üzerindeki etkisinin incelenmesi// nəşr edilməmiş doktorantura dissertasiyası, Çukurova University, Yüksek lisans tezi, Adana, 2006. – 45 s.
6. Əliyev M.S. Psixologiyanın əsasları (sxemlər). – Bakı: ADPU-nun nəşri, 2017.
7. Дэниел Гоулман. Эмоцинальный интеллект. – Москва: Сбербанк, 2011.
8. Mayer, J.D. & Coob, C.B. Educational Policy on Emotional Intelligence: Does It Make Sense// Educational Psychology Review, Vol:12, – New York: Dude publishing, 2000, № 2. – pp. 267-298.
9. Salovey, P. and Mayer, J.D. Emotional intelligence Imagination, Cognition, and Personality, 9, – New York: Cambridge University press, 1990. –pp.185-211.

**E-mail:** y.askerova@inbox.ru

**Rəyçilər:** *psixol.ü.fəls.dok., dos.* **N.T. Rzayeva,**
*psixol.ü.fəl.dok., dos.* **Ü.Ə. Əfəndiyeva**
**Redaksiyaya daxil olub:** 31.03.2023

*UOT 159.9*

***Günel Ədalət qızı Allahverdiyeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi*
*https://orcid.org/0009-0005-6664-7266*

# NEVROZUN NÖVLƏRİNİN XARAKTERİK XÜSUSİYYƏTLƏRİ

***Гюнель Адалет гызы Аллахвердиева***
*преподаватель Азербайджанского Государственного Педагогического Университета*

# ХАРАКТЕРНЫЕ ОСОБЕННОСТИ ТИПОВ НЕВРОЗА

***Gunel Adalat Allahverdiyeva***
*teacher at Azerbaijan State Pedagogical University*

# CHARACTERISTICS OF TYPES OF NEUROSIS

**Xülasə.** Nevroz, insanın sosial həyata uyğunlaşma cəhdləri nəticəsində yaranan ciddi və ya qalıcı davranış pozuntusudur. Bu, çətin həyat şəraitindən, şüursuz şəkildə edilən münaqişələri həll etmək üçün uğursuz cəhdlərdən yaranır. Nevroz xəstəliyi anatomik və ya fiziki səbəblərdən qaynaqlanmır, amma çox ciddi bir xəstəlikdir. Ziddiyyətlərə uyğunlaşa bilməmək, gərginlik və narahatlığa səbəb olur. Nevrozun səbəbi dəqiq məlum deyil. Bu xəstəlik müxtəlif vəziyyətlərdə özünü göstərir.

***Açar sözlər:*** *nevroz, qorxu nevrozu, nevrotik reaksiya, nevrotik hal, nevrotik inkişaf, panik hücumlar*

**Резюме.** Невроз – это тяжелое или стойкое расстройство поведения, возникающее в результате попыток человека приспособиться к социальной жизни. Оно возникает из-за сложных жизненных обстоятельств, безуспешных попыток разрешения конфликтов, предпринятых бессознательно. Невроз не вызван анатомическими или физическими причинами, но это очень серьезное заболевание. Неумение приспосабливаться к противоречиям приводит к напряжению и беспокойству. Точная причина невроза неизвестна. Это заболевание проявляется в разных ситуациях.

***Ключевые слова:*** *невроз, невроз страха, невротическая реакция, невротическое состояние, невротическое развитие, панические атаки*

**Summary**. Neurosis is a severe or permanent behavioral disorder resulting from a person's attempts to adapt to social life. It arises from difficult life circumstances, unsuccessful attempts to resolve conflicts made unconsciously. Neurosis is not caused by anatomical or physical causes, but it is a very serious disease. Inability to adapt to contradictions leads to tension and anxiety. The exact cause of neurosis is not known. This disease manifests itself in different situations.

***Key words:*** *neurosis, fear neurosis, neurotic reaction, neurotic state, neurotic development, panic attacks*

Beynəlxalq təsnifatda nevrozun 8 növü vardır:

– qorxu nevrozu;
– isterik nevroz;
– nevrotik fobiyalar;
– obsessiv-kompulsiv nevroz;
– depressiv nevroz;
– nevrasteniya;
– depressonalizasiya nevrozu:
– ipoxaodrik nevroz.

Nevrozun hər bir növündən asılı olaraq gedişinə görə təsnifatı da fərqlidir. Amma hər birinin inkişafında 3 mərhələ qeyd edilir:

1. Nevrotik reaksiya.
2. Nevrotik hal.
3. Nevrotik inkişaf.

*Həyəcanlı – fobik pozuntular (qorxu nevrozu).* Bu nevrozun psixopatoloji təzahürləri arasında panik hücumları, aqorafobiya və hipoxondrik fobiyalar daha çox rast gəlinir.

Panik hücumlar – gözlənilmədən meydana gələn və sürətlə, bir neçə dəqiqə ərzində vegetativ pozuntuların artan simptomatik kompleksi (vegetativ böhran – taxikardiya, döş qəfəsi nahiyəsində narahatlıq, boğulma hissi, havanın çatmaması, tərləmə, başgicəllənmə), gözlənilən ölüm hissi, huşun və ya özünənəzarətin itirilməsi, dəli olmaq qorxusu ilə birləşir. Panik hücumların təzahür müddəti dəyişkən olsa da, adətən 20-30 dəqiqə davam edir.

Aqorafobiya (açıq sahələrdən qorxma) – bir qayda olaraq, panik hücumlarla əlaqəli (və ya sonra) ortaya çıxır və mahiyyət etibarilə panik hücum təhlükəsi ilə dolu bir vəziyyətə düşməkdən qorxudan ibarətdir. Aqorafobiyanın meydana çıxmasına səbəb olan tipik vəziyyətlərə misal olaraq metroya minməyi, mağazada və ya böyük bir kütlənin içərisində olmağı və s. göstərmək olar.

Hipoxondrik fobiyalar (nozofobiyalar) – hər hansı bir ağır xəstəlikdən obsessiv qorxudur. Ən çox kardio insultofobiyalar, həmçinin sifilis fobiyalar müşahidə olunur. Narahatlığın dərəcəsi həddən çox artdıqda xəstələr bəzən öz sağlamlıq durumlarına tənqidi münasibəti itirirlər, müvafiq profilli həkimlərə müraciət edir və müayinə olunurlar. Hipoxondrik fobiyalar sayrışan hallar nevrozunda da çox rast gəlinən simptomdur.

*Nevrasteniya* – Nevrozların ən geniş yayılmış forması olan nevrasteniya yüksək oyanıqlıq, həssaslıq halları ilə yanaşı, astenik, depressiv sindrom və zəifliklə xarakterizə olunur. Nevrasteniyaya düçar olmuş insanlar ümumi yorğunluqdan, iş qabiliyyətinin azalmasından, güclü baş ağrılarından, zəiflikdən və yuxu pozğunluğundan əziyyət çəkirlər, əhval-ruhiyyələri tez-tez dəyişir, ən cüzi səbəb nəticəsində affektiv partlayış reaksiyaları müşahidə edilir. Bəzən insanın yaddaşı zəifləyir, tez-tez başı gicəllənir, əzələləri keyləşir, fikrini cəmləyə bilmir. Nevroloji müayinə zamanı xəstədə heç bir üzvi pozğunluq aşkarlanmadığı halda, reflekslərin yüksəlməsi, əl barmaqlarının titrəməsi kimi bir sıra funksional pozulma əlamətləri ayird edilir. Vegetativ əlamətlərdən təngənəfəsliyi, ürək döyünməni, ürək nayihəsində küt (bəzən əksinə sancan) ağrıları, ətrafların keyləşməsini göstərmək olar. Bəzi xəstələrdə həzm sisteminə aid pozuntular, məsələn, mədə və bağırsaqlarda xoşagəlməz hisslərin duyulması, iştahanın pozulması, qəbizlik (və ya tez-tez defekasiya aktı), mədə qıcıqları, gəyirmə halları, eləcə də taxikardiya, bradikardiya, qan təzyiqinin dəyişməsi, tərləmə, akrosianoz, qusma və s. əlamətlər təzahür edir. Göstərilən əlamətlər daimi xarakter daşımır, xəstənin əsəbiləşməsi, emosional gərginliyin güclənməsi ilə əlaqədar meydana çıxır.

Sayrışan hallar nevrozu (obsessiv-kompulsiv pozuntu) – Nevrozların bu forması insanda təşviş yaradan sayrışan fikirlərin (obsessiyalar) meydana çıxması və həmin fikirlərin öz növbəsində müəyyən sayrışan hərəkətləri (komplulsiyalar) təkrarlamağa vadar etməsi ilə xarakterizə olunur.

Sayrışan hallar nevrozunun (obsessiv-kompulsiv pozuntu) əsas əlaməti beyindən çıxmayan yorucu fikirlərdir. Sayrışan hallar nevrozunun üç forması mövcuddur:

1) sayrışan fikirlər(obsessiyalar);
2) sayrışan qorxu;
3) sayrışan hərəkətlər (komplulsiyalar).

Sayrışan fikrə qapıldıqda xəstə hər hansı bir mənasız fikir, yaxud sözü yadından çıxara bilmir, onu dəfələrlə təkrar edir.

Sayrışan qorxu halında insanın başına cürbəcür fikirlər gəlir. İlk növbədə, insan ağır xəstəliyə tutulmasından qorxur. Xəstəni tez-tez ölüm qorxusu bürüyür. Bütün bunların əsassız olduğunu dərk etməsinə baxmayaraq, vəziyyətdən çıxa bilmir.

Sayrışan hərəkətlər formasında xəstə yersiz bir hərəkəti dəfələrlə təkrar edir. Əslində isə sayrışan fikirlər psixoloji diskomfort yaradır, bu fikirlərdən xilas olmaq üçün insan müəyyən sayrışan hərəkətlər edir və bu, daxili gərginliyin müvəqqəti azalmasına gətirir. Lakin vəziyyətin bu cür yüngülləşməsi çox davam etmir və sayrışan fikirlər yenidən qayıdır.

Obsessiv-kompulsiv pozuntular çox müxtəlif ola bilər. Ən çox rast gəlinən obsessiyalar aşağıdakılardır:

* Təmizlik və şəxsi gigiyena ilə bağlı fikirlər, müəyyən ardıcıllıq gözləməklə əllərin dəfələrlə yuyulması;

* Hər hansı hərəkətin düzgün edilməməsi haqqında fikirlər (məsələn, qapını bağlamamaq, qazı söndürməyi unutmaq və s.) edilmiş hərəkətlərin təkrar-təkrar yoxlanılması;

* Ətrafdakılara qarşı aqressiv hərəkətlər etməyin mümkünlüyü barədə fikirlər (məsələn bıçaq gördükdə özündən asılı olmadan onunla kimisə vura bilmək qorxusu;

* Ehtiyat etdiyi situasiyaya düşməmək üçün ritual formasında müəyyən sözlərin (ürəyində və ya ucadan) təkrarlanması.

* Cinsi məsələlərlə bağlı sayrışan fikirlər (məsələn, homoseksualist olmaq qorxusu) və s.

* İnsanda tez-tez təkrarlanan hərəkətlər (məsələn, əlləri yumaq, nəyi isə yoxlamaq) və ya zehni proseslər ("ürəyində" saymaq, sözləri təkrarlamaq və s.);

Sayrışan hərəkətlər insana müvəqqəti yüngüllük gətirsə də, bir müddətdən sonra müvafiq situasiyada ritualları təkrar etməyə psixoloji tələbat yaranır.

Şəxs öz hərəkətlərinin mənasız olduğunu dərk edir, lakin bununla heç cür mübarizə apara bilmir. Bu fikir və təsəvvürlər insanda təşviş və psixoloji diskomfort yaradır.

*İpoxondrik nevroz.* İpoxondriya dedikdə ayrı-ayrı orqanların fəaliyyətinə həddindən artıq diqqət yetirmək, xəstələnməkdən qorxmaq və ya "ağır xəstəliyə tutulmaq qorxusu" başa düşülür. Belə adamlar heç bir əsas olmadan ağır xəstəliyə tutulduqlarını söyləyir, yardım üçün həkimlərə müraciət edir, bütün müayinələrdən keçməyə çalışırlar. Xəstələrin şikayətləri bəzən o qədər inandırıcı və əsaslandırılmış görünür ki, hətta təcrübəli həkimlər belə səhv diaqnoz qoyur, uzun müddət xəstəni müalicəyə cəlb edirlər.

İpoxondrik şikayətlərə, adətən, nevrozun digər əlamətləri ilə birlikdə rast gəlinir və müayinə zamanı nevrozu törədən psixogen amili aşkar etmək mümkün olur. İpoxondriya nevrozu vaxtında və düzgün müalicə olunmazsa xronik formaya keçir və xəstə illərlə həkimlərə müraciət edir.

*Depressiv nevroz.* Bu nevrozu xarakterizə edən başlıca cəhət nevrotik məzmunlu, yəni əsasını psixi travmalar təşkil edən və psixi müayinə zamanı asanlıqla aşkar edilən depressiyanın olmasıdır. Depressiv nevrozun başlanğıc mərhələsi və gedişi bir sıra xüsusiyyətləri ilə diqqəti cəlb edir. Xəstəliyin başlanğıcında distonik xarakterli vegetativ pozuntular, bir qədər sonra isə əhvalın enməsi, həyəcan və yuxu pozuntuları qeyd olunur. Gecələr narahat yatan şəxs yuxudan durarkən özünü əzgin və zəif hiss edir. Depressiv nevrozun yaranmasına digər amillərdə səbəb ola bilər.

*Klimakterik nevroz.* Klimaks dövründə qadınlarda yaranan nevroz halıdır ki, buda müxtəlif simptomlarla müşahidə olunur. Bu simptomlar üç qrupa bölünür:

birinci qrupa neyrovegetativ dəyişikliklər aiddir ki, bu zaman qadının bədəninin yuxarı ətraflarına istilik gəlir, dərisi quruyur, halsızlaşır, yuxusu pozulur, arterial təzyiqi tez-tez qalxır. Hətta bədənin bəzi yerləri keyiyir və qıcıqlanmalar hiss olunur;

ikinci qrupa endokrin mübadilə proseslərinin pozulması daxildir. Bu vaxt qadında kökəlməyə meyl artır. Eyni zamanda, qalxanvari vəzilərin funksiyası pozulur, oynaqlarda və əzələlərdə ağrılar olur;

üçüncü qrupa isə psixoemosional pozğunluqlar daxildir. Bu klimakterik dövrün ən ağır mərhələsidir. Bu zaman insan daim əsəbi olur. Ağlamağa meyllilik, yaddaşın zəifləməsi halları əmələ gəlir, eyni zamanda, qadında qorxu hissləri əmələ gəlir, güclü ürəkdöyünmə olur və o tez-tez hirslənir.

Nevrozların müalicəsində düzgün istirahət rejiminin və gündəlik yuxunun kifayət qədər olmasının təmin edilməsi çox vacibdir. Belə ki, doyunca yatmamaq halları və xroniki yorğunluq nevrozun yaranmasına "kömək" edir.

**Problemin aktuallığı.** Məqalədə nevrozun növləri müqayisəli şəkildə təhlil edilmişdir. Qeyd olunan xüsusiyyətləri nəzərə almaqla nevrozlu şəxslərin fəaliyyətini yüksək səviyyədə təmin etmək olar.

**Problemin elmi yeniliyi.** Nevrozlu şəxsləri xarakterik xüsusiyyətlərini araşdırmaq aktuallıq kəsb edir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərinin müəllimləri, tələbələr, magistrantlar və doktorantlar istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Alyamovskaya V.G., Petrova S.N. Məktəbəqədər yaşlı uşaqlarda psixoemosional stressin qarşısının alınması. – M.: Scriptorium, 2002. – 65s.
2. Zaporojets, A.V. Məktəbəqədər uşağın emosional inkişafı / Ed. CƏHƏNNƏM. Koşeleva. – M.: Maarifçilik, 1985. – 176 s.

*UOT 159.9*

***Günəş Əli qızı Əfəndiyeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Ümumi psixologiya kafedrasının baş müəllimi*
*https://orcid.org/0009-0003-1938-8965*

## ŞAGİRDLƏRİN ŞƏXSİYYƏT KİMİ YETİŞMƏSİNDƏ AİLƏ VƏ MƏKTƏB AMİLİ

***Гюнешь Али гызы Эфендиева***
*старший преподаватель кафедры Общей психологии*
*Азербайджанского Государственного Педагогического Университета*

## ФАКТОР СЕМЬИ И ШКОЛЫ В ФОРМИРОВАНИИ УЧАЩИХСЯ КАК ЛИЧНОСТИ

***Gunash Ali Afandiyeva***
*head teacher of General psychology department*
*at Azerbaijan State Pedagogical University*

## FAMILY AND SCHOOL FACTORS IN THE DEVELOPMENT OF STUDENTS AS PERSONALITIES

**Xülasə.** Müasir dövrdə yetişməkdə olan gənc nəslin hərtərəfli inkişafı, onlarda lazımi bilik, bacarıq və vərdişlərin, yüksək mənəvi keyfiyyətlərin təşəkkülü təlim-tərbiyə prosesi qarşısında duran ən ümdə vəzifələrdən biridir. Cəmiyyət üçün gərəkli olan şəxsiyyətin yetişməsində ailə və məktəbin – valideyn və müəllimin rolu danılmazdır. Məhz ailə və məktəb birliyinin möhkəm olması şəxsiyyətin inkişafına əsaslı təsir göstərə bilər. Məqalədə bütün bu məsələlərə toxunulmuş, şəxsiyyətin inkişafında müəllim və valideynin rolu tutarlı fikirlərlə şərh olunmuşdur.
***Açar sözlər:*** *şagird, müəllim, valideyn, cəmiyyət, şəxsiyyət, inkişaf, ailə, məktəb, tərbiyə*

**Резюме.** Одной из важнейших задач, стоящих перед учебно-воспитательным процессом является всестороннее развитие подрастающего поколения в современный период, формирование необходимых знаний, умений и навыков, развитие высоких моральных качеств. Велика роль родителей и учителей, семьи и школы в формировании личности, полезной обществу. Именно единство семьи и школы может оказать глубокое влияние на развитие личности. В статье затронуты все эти вопросы и обоснована роль учителя и родителей в развитии личности.
***Ключевые слова:*** *ученик, учитель, родитель, общество, личность, развитие, семья, школа, воспитание*

**Summary.** Comprehensive development of young generation, which presently forms, and development of knowledge, skills, habits and high moral qualities in them are the most important tasks for the educational process. The role of family and schools i.e. parents and teachers in the formation of persons needed for the society is undeniable. Exactly strength of family and school union can substantially influence development of personality. All these issues were discussed in the article, and the role teachers and parents in the development of personality was commented with weighty thoughts.
***Key words:*** *pupil, teacher, parent, society, person, de velop, family, shool, upbringing*

"Bəşər sivilizasiyasını ailəsiz və ailə həyat tərzi olmadan təsəvvür etmək mümkün deyil. Ailə öz mövcudluğunda bütün ictimai hadisələrin xüsusiyyətlərini əks etdirir" [1, s.400]. "Müasir Azərbaycan ailələrində uşaqlar gələcək həyatlarında əsas keyfiyyətlərindən biri olan ilkin əmək bacarıq və . vərdişlərinə yiyələnirlər. İnsana sevgi, hörmət və ətraf gözəlliklərlə uşaq ilk dəfə ailədə tanış olur" [1, s.107].

İnsan dünyaya fərd kimi gəlir, lakin bir şəxsiyyət kimi özünün həyatı və fəaliyyəti prosesində uzun və mürəkkəb bir yol keçərək yet-

kinləşir. Şəxsiyyətin formalaşmasında ailə tərbiyəsinin böyük rolu vardır. Tərbiyə sayəsində uşaqda yeni qabiliyyət və keyfiyyətlər yetişir, müəyyən xarakter yaranır və formalaşır. Uşaq təlim-tərbiyə vasitəsilə həqiqi olmağı öyrənir, geniş dünyagörüşünə sahib olur. Bir sözlə, uşaq tərbiyə prosesində formalaşır. Uşağın insanlıq dünyasına daxil olması ailədən başlayır. Ailə üzvləri, yaşlı adamlar uşağın tərbiyəsi ilə məşğul olur, ona qayğı göstərirlər. Valideyn də, müəllim də uşağın uşaq şəxsiyyətinə böyük təsir göstərən şəxslərdir. Təlim-tərbiyə prosesi müəllim və valideynlərdən xüsusi səriştəlilik və işə bələdlik tələb edir. Övlad tərbiyəsinin ən vacib məsələlərindən biri olduğuna xüsusi fikir verən N. Tusi "Əxlaqi-Nasiri" əsərində bu məsələyə ayrıca bir fəsil həsr etmişdir. N. Tusi ailə başçısının sağlam ailənin yaranıb qorunmasındakı rolunu xüsusi qiymətləndirir. O göstərir ki, ailə başçısı, birinci növbədə, evdəkilərin ümumi mənafeyinə riayət etməlidir. N. Tusi uşağın tərbiyəsində ağıla, idraka təsir edən başa salmaq yolunu əsas yol hesab edir və tərbiyədə aldadıcı və ucuz üsulların əleyhinə çıxır. Uşaqlara qarşı həssas olmaq, onların kiçik hərəkətini belə gözdən qaçırmamaq, vaxtında pis adət və hərəkətin qarşısını almaq ən kiçik, yaxşı bir hərəkət baş verdikdə onu tərifləyib adətə çevirmək, onlarda əməksevərlik, düzlük, bilik və peşəyə həvəs yaratmaq, xeyirxahlıq, başqalarına kömək vərdişləri aşılamaq, tənbəlliyə, yalan, böhtan, iftiraya, bədxahlıq etməyə, kədər və qəmlərə biganə qalmağa, xudpəsəndlik, öz hayına qalmaq və s. nifrət hissi öyrətmək uşaq tərbiyəsinin əsası hesab edilir. Uşaqlarda pis adətlərə, bəd əməllərə nifrət yaratmaq lazımdır. Uşaq inkişafının ilk anlarında çoxlu səhvlərə yol verər, qəbahətli iş görər, çox zaman yalançı, paxıl, oğru, xəbərçi, tərs və inadkar olar və başqalarını da zərərli və xoşagəlməz iş tutmağa vadar edər. Buna görə də N. Tusi uşağı körpəlikdən tərbiyə etməyə xüsusi fikir verməyi məsləhət görür.

Ailədə uşağın tərbiyəsi heç də həmişə müvəffəqiyyətlə getmir, çətinliklər qarşıya çıxır, müəyyən səhvlərə yol verilir. Açılan səhər özü ilə bir ümid, fərəh, qayğı gətirir. O, qapıları döyərək valideynləri, uşaqları səfərbərliyə atır, onları əmək fəaliyyətinə səsləyir. Açılan səhər ideal ailəyə sevinc, ümid gətirir, normal ailədə bu səhərdə hər kəs öz vəzifəsini yerinə yetirir, qalmaqallı ailələrdə isə səs-küy, əsəbilik, qışqırıq yaranır. Ailə tərbiyəsindəki mühüm nöqsanlardan biri uşaqların tərbiyəsində vahidliyin olmamasıdır. Ailə tərbiyəsində ən qorxulu cəhət uşağın tərbiyəsinə laqeyd münasibətdir. Qapalılıq, uşağı hər cür ünsiyyətdən, kollektivdən ayırmaq məktəbli şəxsiyyətinin formalaşmasına mənfi təsir edir. Valideynlərin övladlarına nə qədər çox inamı və etibarı varsa, bunun müqabilində daha yaxşı nəticə əldə edirlər. Tərbiyədə hədə-qorxu, cəza müsbət nəticə vermir, uşaqların ruhi aləmini zəhərləyir, onlarda yalançılıq, qorxaqlıq, ikiüzlülük kimi mənfi keyfiyyətlər yaradır, onları iradəsizləşdirir.

Ailədə uşaqların tərbiyəsinə fərdi yanaşmaq, onların fərdi xüsusiyyətlərini nəzərə almaq vacibdir. Tərbiyə işində uşağın yaş və cinsini də nəzərə almaq əsas amildir. Ailə həyatı şəxsiyyətin inkişafına bütövlükdə təsir göstərir, onun və hisslərinin inkişafında ananın roluna son dərəcə böyük əhəmiyyət verirlər. Uşaq xarici aləmə bütün münasibətləri ana vasitəsilə müəyyənləşdirir. Uşağın işi necə görməsinə nəzarət olunmalı, ona sərbəstlik verilməlidir.

Məktəbdə tərbiyə – həyata hazır olan, hərtərəfli inkişafa və bədii zövqə malik gümrah, nikbin, sağlam vətəndaşların yetişdirilməsinə xidmət edir. Uşaqların hər biri özünəməxsus fərdi xüsusiyyətlərə malikdir. Uşaq özlüyündə kəşf olunmamış dünyadır. Bu dünyaya bələd olmaq, onunla faydalı iş aparmaq üçün müəllim onu dərindən öyrənməlidir. Hər bir uşağın öz təfəkkürü, hissləri, maraq və qabiliyyətləri, idealı, iradi və xarakter əlamətləri, temperamenti vardır. Bu xüsusiyyətləri nəzərə almaq vacibdir.

Ailə və məktəb uşaq şəxsiyyətinin inkişafına əsaslı təsir göstərir. "Məktəbə daxil olması uşağın ictimai həyatındakı vəziyyətini dəyişməklə bərabər, onun qarşısında tamamilə yeni bir aləm açır... əlbəttə, bu münasibət heç asanlıqla formalaşmır... Bu vaxt müəllimin şəxsi nümunəsi çox mühüm tərbiyəvi əhəmiyyət kəsb edir, hətta şagirdlər ata-ananın dediklərindən müəllimin dediklərini üstün tutur" [2, s.242]. Təhsilin ilk günlərində uşaq tamam yeni təsirə düşür və elə həmin andan müəllimini sevməyə başlayır. Və bu andan etibarən "müəllim tapşırdı ki, …" ifadələrini tez-tez eşitməli oluruq. Bu, bir daha onu göstərir ki, məktəb yaşlı uşaq üçün müəllim avtoriteti böyük əhəmiyyət kəsb edir.

İlk gündən müəllim və şagirdlər arasında qarşılıqlı anlaşma prosesi ehtiyatlı və dəqiq qurulmalıdır. Lakin müəllimlər müxtəlif xarakterli olduğundan kollektivdə bu münasibətlərin yaranması və şagirdlərin yanaşma tərzi müxtəlif olur. Elə bu zaman həm məktəbdə, həm də ailədə müxtəlif problemlər yaranır. Əlbəttə ki, valideynlərin böyük əksəriyyəti belə bir vəziyyətdə müəllimin və məktəbin tələblərinə düşüncə ilə yanaşmalı və uşaqlarını bu prosesə tədricən alışdırmalıdırlar. Belə müəllim – valideyn arasındakı münasibətlər zamanı ata, yaxud ana məktəbdə uşağın sinfə oriyentasiyası, kollektiv və təhsilə münasibəti ilə maraqlanır. Bir çox hallarda isə valideyn məktəblə əlaqəsini tamam zəiflədir. Bunu isə vaxtın azlığı ilə əlaqələndirirlər. Bəzən isə "Biz onu məktəbə vermişik və sizə etibar etmişik. Əgər nə isə baş versə bizi çağırın".

Lakin bu halda valideynlər şüursuz olaraq uşaqların üzərində məsuliyyət yükünün azalmasını istəyirlər. Şagird 4-cü sinfə keçənə qədər məktəb və müəllimlə münasibət yaratmağa tələsmirlər. Tərəflər arasındakı qarşılıqlı münasibətin zəif olduğunu hiss edən şagird valideynləri ilə qeyri-səmimiliyə üstünlük verir. V.O. Suxomlinski deyirdi: "Uşağın mənəvi aləmini yalnız təlimə bağlamaq olmaz. Əgər biz buna çalışsaq, uşağın həyatı dözülməz olacaq. O, təkcə məktəbli deyil, hər şeydən əvvəl çoxtərəfli marağa və məqsədə malik olan insan olmalıdır". Bəzən sinifdəki müəllim-şagird münasibətlərinin pozulmasına müəllimin özünü pis hiss etməsi, məişət problemləri, yuxusuzluq və s. səbəb olur. Belə halda müəllim bütün zəifliyi bir kənara qoyub daha tələbkar və ciddi olmalıdır. O, bu məharətini asta tərzdə elə həyata keçirməlidir ki, özünəqapanan və astagəl uşaqları təlimdən uzaqlaşdırmasın. K.D. Uşinskinin dili ilə desək, əsl tərbiyəçi bir tərəfdən məktəblə, digər tərəfdən isə həyat və elm arasında əlaqələndirici rolunu oynamalıdır.

Yeniyetmələrə gəldikdə isə, onlar valideynlərinin məktəblə əlaqəsinə heç də cəhd göstərmirlər. Onlar belə hesab edirlər ki, yaranmış bütün problemləri özləri həll etməyə qadirdirlər. Bu zaman: "Müəllimin vəzifəsi, hər şeydən əvvəl, həmin fərdiyyətin psixoloji xüsusiyyətlərini öyrənərək ona təsir yollarını axtarmaq, seçmək və tətbiq etməkdir" [3, s.331]. Lakin, yaxşı olardı ki, bu hallarda valideynlərdən ana məktəblə əlaqəni kəsməsin. Çünki belə vəziyyətdə yalnız ana başa düşər və onu təhsilə yönəldə bilər. Hər şeydən əvvəl, uşağın ailədə istənilən halda hər iki valideynlə səmimi münasibəti və ünsiyyəti olmalıdır ki, düşdüyü çətin vəziyyətlərdə ilk olaraq problemlərini valideynləri ilə bölüşməyə bağlı olsun.

Uşağın şəxsiyyət kimi formalaşması prosesində bir sıra qaçılmaz olan və ciddi diqqət tələb edən problemlər meydana çıxır. Şəxsiyyətin formalaşması üçün meydana çıxan həlledici məqamları yaşla bağlı çətinliklər adlandırırlar ki, uşağın inkişafında özünü daha çox 2-dən 4-ə, 7-dən 9-a, 13-dən 16 yaşa keçərkən büruzə verir. 2 yaşdan 4-5 yaşa keçid dövründə uşaq şəxsiyyətində özünəməxsus tərslik meydana çıxır. 7-9 yaşlarında isə özünüqiymətləndirmənin ilkin tərəddüdləri meydana çıxır. Keçid yaş dövrü isə xarakterin inkişafına yeni növ çətinliklər əlavə edir. Cinsi yetişkənliklə əlaqəli bəzi problemlərin meydana çıxması da bu yaş dövrünə təsadüf edir. Buraya məhəbbət, sədaqət, həyat, ölüm kimi məfhumlar da daxildir. "Müəllimlər yeniyetmələrin cinsi tərbiyəsinə xüsusi diqqət yetirməlidirlər. Onlar ehtiyatla, səbirlə əks cinsə hörmət hissi tərbiyə etməlidirlər. burada ehtiyatsızlıq, bir söz əks cinsə ya marağı, yaxud da mənfi münasibəti artıra bilər" [4, s.186].

2-4 yaşlarında uşağın inkişafında ilk fizioloji krizis özünü göstərir. Bu zaman vegetativ endokrinoloji inkişaf sahəsində bir sıra dəyişiklər baş verir. Belə ki, boyun artması, daxili orqanların böyüməsi və psixo-nevroloji sistemin inkişafında nəzərəçarpacaq dəyişiklər baş verir. Bu keçid yaş dövründə valideynlər başa düşməlidirlər ki, uşaqların əsəb xəstəliklərinə tutulma ehtimalları güclənir. Psixoloqların böyük əksəriyyəti belə bir fikri dəstəkləyirlər ki, uşaq şəxsiyyətinin fizioloji inkişafının lazımı mərhələsində "Mən" obrazını kəşf edir. Bu zaman uşaq üçün sehrli bir "Mən" dünyası mövcud olmağa başlayır və o, bunu mövcud əlamətlərlə nəzərə çarpdırır. Belə halda uşaq şəxsiyyəti üçün istək birinci yerdə durur, yəni hər işdə " mən özüm", "mən istəyirəm", "mən edəcəm" ərköyünlüyü nəzərə çarpır.

Məktəb təliminə atılan addım uşaq şəxsiyyətinin inkişafında baş verən ən ciddi proseslərdən biridir. Bu zaman uşaq qayğısız uşaqlıq illərindən məsuliyyətlə dolu olan yeni bir aləmə ke-

çid alır. Aydındır ki, uşaq həyatın yeni sınaqlarına artıq daxilən hazır olmalıdır. Burada uşaq ağlının lazımi inkişaf səviyyəsiylə yanaşı onun mənəvi keyfiyyətlərinin inkişafı, daxili qaydaları da nəzərə alınır.“ ... şagirdlər gözləyirlər ki, müəllim onlara yaxşı dərs desin, yüksək qiymət versin, onların istəyini yerinə yetirsin və s.” [5, s.76]. Uşaq üçün maraqlı olmayan bir kollektivdə artıq özü də bilmədən müəyyən sosial mövqe tutmağa və çalışmağa başlayır.

Yeniyetmə yaş dövrünə keçdikdə isə, uşaq şəxsiyyətinin inkişafında kəskin dəyişikliklər nəzərə çarpır. Bu zaman onlarda daha çox eqoistlik, müstəqil qərar qəbuluna və fəaliyyətə can atma, özünü sübut etmə, tərslik və s. kimi xüsusiyyətlər üzə çıxır. “...yeniyetmədə özünə, öz şəxsi həyatına, şəxsiyyətinin xüsusiyyətlərinə maraq yarandıqca, özünüqiymətləndirmə tələbatı, özünü başqaları ilə müqayisə etmək meyli xüsusi məna kəsb edir. Bunun da nəticəsində yeniyetmə özü üçün öz “Mən”ini bir növ kəşf edir. Mənlik şüurunun formalaşmağa başlaması və inkişafı yeniyetmənin bütün psixi həyatına, onun təlim fəaliyyətinin xarakterinə, ətrafdakılarla münasibətinə, yaşlılarla, mənsub olduğu kollektivin üzvləri ilə qarşılıqlı münasibətlərinə öz təsirini göstərir” [6, s.58]. Yeniyetmələr əksər hallarda valideynlərinin onlara qarşı çıxmalarını qəbul etmirlər. Bu yaşda onlarda şəxsiyyətin inkişafına əks təsir göstərən xarici amillərə, məsələn, spirtli içkilərə, narkotiklərə və s. maraq artır. Yeniyetməni bu cür əməllərdən çəkindirmək üçün valideynlərin onlarla söhbəti kifayət deyil. Çünki bu yaş dövründə yeniyetmə özünü müstəqil hesab etdiyi üçün bütün proseslərdən keçməyə hazırdır. Valideynlər uşaqla əlaqədar hər hansı problemə rast gəldikdə kömək üçün məktəbə, məktəb psixoloquna müraciət edirlər. Məktəb psixoloqu uşağın yaşadığı və tərbiyə aldığı ailə, həmin ailə üzvləri arasındakı qarşılıqlı münasibət və s. ilə də maraqlanmalıdır. Məktəbin, məktəb psixoloqunun vəzifəsi uşağı tərbiyə etmək, onda mövcud olan qüsurları aradan qaldırmaq, onun şəxsiyyətindəki müsbət cəhətləri möhkəmləndirməkdən ibarətdir.

A.S. Makarenkonun sözləri ilə desək: “Tərbiyənin əsl mahiyyəti valideynin uşaqla birbaşa münasibətindən, onun hərəkətlərinə təsirindən deyil, ailə və şəxsi həyatın təşkilindən, bunun uşağın dünyasının düzgün təşkil olunmasından ibarətdir”.

**Problemin aktuallığı.** Gənc nəslin tərbiyəsi yaşadığı mühitlə, ünsiyyətdə olduğu insanlarla, təlim-tərbiyə aldığı pedaqoji kollektiv, ən vacibi isə böyüyüb başa çatdığı ailəsi ilə sıx bağlıdır. Ailə - cəmiyyətin insani dəyərlərin qorunmasını, nəsillərin mədəni və tarixi varisliyini təmin edən əsas elementidir. Ölkənin inkişafı haqqında fikir söyləmək üçün cəmiyyətdə ailənin vəziyyətinə və dövlətin ailəyə münasibətinə nəzər salmaq lazımdır. Ailənin əmin-amanlığı ölkənin tərəqqi və inkişaf meyarıdır. Ailəsini sevənlər cəmiyyətini də, vətənini də, xalqını da sevir. Ailəni də məktəb kimi qəbul etmək vacibdir, çünki burada uşaqlar ailə və cəmiyyət qarşısındakı vəzifələrini öyrənirlər.

**Problemin elmi yeniliyi.** Şagird şəxsiyyətinin inkişafında ailə və məktəbin rolu və vəzifələri hərtərəfli təhlil edilmiş, yeni tərbiyə yolları araşdırılmışdır.

**Problemin tətbiqi əhəmiyyəti.** Məqalədə göstərilən məsələlər məktəblərdəki pedaqoji-psixoloji prosesə yeni forma və metodların tətbiqində, yeni optimal variantların ortaya qoyulmasında istifadə edilə bilər.

**Ədəbiyyat**:

1. Çələbiyev, N.Z. Ailə psixologiyası. / N.Z. Çələbiyev. – Bakı: Mütərcim, 2015. – 424 s.
2. Qədirov, Ə.Ə. Yaş psixologiyası / Ə.Ə. Qədirov. – Bakı: Maarif, 2002. – 386 s.
3. Əmrahlı, L.Ş, Uşaq psixologiyası / L.Ş. Əmrahlı, N.T. Rzayeva. – Bakı, 2010. – 358 s.
4. Əliyev, R.İ. Tərbiyə psixologiyası / R.İ. Əliyev. – Bakı: Nurlan, 2006, – 196 s.
5. Həmzəyev, M.Ə. Ünsiyyətin psixologiyası / M.Ə. Həmzəyev, S.F. Əmiraslanova. – Bakı: Nurlan, 2007. – 178 s.
6. Bayramov, Ə.S. Sosial psixologiya. / Ə.S. Bayramov, Ə.Ə. Əlizadə. – Bakı: Qapp-Poliqraf, 2003, – 356 s.

**E-mail:** gunesh.efendiyeva1953@gmail.com

**Rəyçilər:** *psixol.ü.fəls.dok., dos*. **N.T. Rzayeva,**
*psixol.ü.fəls.dok., dos*. **Ü.Ə. Əfəndiyeva**
**Redaksiyaya daxil olub:** 31.03.2023

*UOT 159.9*

***Nişan Çingiz qızı Nuriyeva***
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*Bakı Dövlət Universiteti*
*https://orcid.org/0009-0009-9979-6822*

## GENDER SOSİALLAŞMASININ PSİXOLOJİ ƏSASLARI

***Нишан Чингиз гызы Нуриева***
*диссертант по программе доктора философии*
*Бакинского Государственного Университета*

## ПСИХОЛОГИЧЕСКИЕ ОСНОВЫ ГЕНДЕРНОЙ СОЦИАЛИЗАЦИИ

***Nishan Chingiz Nuriyeva***
*doctorial student in the program of doctor of philosophy*

## PSYCHOLOGICAL FOUNDATIONS OF GENDER SOCIALIZATION

**Xülasə.** Bütün dövrlərdə cəmiyyətlərdə qadın və kişilərə cinsiyyət rolları aşılanmışdır. Fərd bu rolların mənasını şüurlu şəkildə deyil, yaşadığı cəmiyyətin cins anlayışları əsasında qavramışdır. Gender sosiallaşması zamanı kişi rolu daha üstün, qadın rolu isə ikinci dərəcəli mövqe daşımışdır. Beləliklə, bioloji cinsdən başqa cəmiyyət tərəfindən qəbul edilmiş "qadın rolu" anlayışı irəli sürülmüşdür. Bu məqalədə gender sosiallaşması ilə əlaqəli gender rolları, psixoloji nəzəriyyələr və təsir edən amillərdən bəhs ediləcəkdir.
***Açar sözlər:*** *cins, gender, gender rolları, gender sosiallaşması*

**Резюме.** На протяжении всей истории мужчинам и женщинам во всех сообществах давались определенные гендерные роли, и люди усваивали эти роли добровольно или невольно, в зависимости от социальной структуры. При формировании гендерных ролей признавалась гегемония мужского пола, а женский пол отводился на второй план. Так, кроме биологического пола, появился «женский» пол, созданный обществом, которое предлагало некоторые виды существования при господстве патриархальной идеологии как в общественной, так и в частной сфере.
***Ключевые слова:*** *пол, гендер, гендерные роли, гендерная социализация*

**Summary.** Throughout the history, some gender roles had been given to the males and females in all communities and people internalized these roles voluntarily or involuntarily depending on the social structure. While forming the gender roles, the male gender's hegemony has been accepted and female gender has been placed as secondary. So except for biological sex, a 'female' gender has appeared that created by the society which offered some types of existence under a patriarchal ideology's domination in both public and private area. This article will discuss gender roles, psychological theories and influencing factors related to gender socialization
***Key words:*** *sex, gender, gender role, gender socialization*

Gender məsələlərinə maraq hər keçən gün daha da artmaqdadır. Gender psixologiyasına aid tədqiqatlar psixologiya elminin həm nəzəriyyə, həm də praktik hissənin inkişafına müsbət təsir edir. Sosiallaşma – sosial normaların, qaydaların, davranış xüsusiyyətlərinin mənimsənilməsi, sosial mühitə daxil olma prosesidir.

Gender sosiallaşması (sosiallaşması) – kişi və qadınların cəmiyyətdəki rolu, mövqeyi və məqsədi haqqında mədəni təsəvvürlərə uyğun olaraq normaların, davranış qaydalarının, münasibətlərin mənimsənilməsi prosesidir. Gender sosiallaşması çərçivəsində mənimsəmə dedikdə, uşaq əvvəldən oğlan və ya qız, kişi və ya qadın olmağın nə demək olduğunu öyrənməyi nəzərdə tutulur. Obyektivləşdirmə – öyrənilmiş gender nümunələrinin praktikada həyata keçirilməsidir. [1].

Kletsinə görə, gender sosiallaşması uşaq doğulandan – valideynləri onu gender rolu haqqında öyrətməyə başladığı andan başlayır. Sosiallaşma prosesi ömür boyu davam edir. Gender rolları sosial standartlar sistemidir, bir insanın oğlan (kişi) və ya qız (qadın) kimi tanınması üçün riayət etməli olduğu stereotiplərdir. Gender rolları həmişə insanın öyrəndiyi, şüurunda və davranışında pozduğu müəyyən normativ sistemlə əlaqələndirilir.

Müasir psixologiyada gender sosiallaşmasının vahid nəzəriyyəsi yoxdur, bu haqda həm güclü, həm də zəif tərəfləri olan bir neçə nəzəriyyə var. Z. Freydin mülahizələrinə əsaslanan psixoanalitik identifikasiya nəzəriyyəsinin tərəfdarları hesab edirlər ki, uşaq şüursuz şəkildə öz cinsindən olan yetkin şəxsin, əksər hallarda atasının və ya anasının obraz və davranışlarını özü ilə eyniləşdirir.

L. Kolberqin koqnitiv-genetik nəzəriyyəsi vurğulayır koqnitiv prosesin tərəfi kimi özünüdərkin rolunu xüsusilə vurğulayır: uşaq əvvəlcə kişi və ya qadın olmağın nə demək olduğu haqda fikirləşir, sonra özünü oğlan və ya qız kimi təsnif edir, fikir və davranışlarını gender roluna uyğunlaşdırır. S. Tompson cinsi rolun erkən inkişafında üç mərhələni ayırır: uşaq iki cinsin olduğunu öyrənir; özünü bu kateqoriyalardan birinə daxil edir; gələcək müqəddəratına təsir edəcək davranış və rol formalarını mənimsəyir.

S. Bern isə gender kimliyinin qurulmasının dörd mərhələsini ayırır: gender identifikasiyası (uşağın özünü bu və ya digər cinsə aid etməsi); gender sabitliyi (cinsiyyətin daimi olduğunu və dəyişə bilməyəcəyini başa düşmək); diferensial təqlid (ən yaxşı oğlan və ya qız olmaq istəyi), cinsin özünü tənzimləməsi.

Əksər tədqiqatçılar oğlan və qız uşaqlarının tərbiyə prosesini mənimsəmələrinin fərqli olduğunu, bu halın isə diferensial sosiallaşma adlandığını bildirirlər. Məsələn, İ.S. Kohn qeyd edir ki, ilkin şüurlu şəkildə öz cinsi haqqında özünüdərk uşaqda bir yaş yarımda formalaşır. İki yaşlı uşaq öz cinsini bilir, lakin bu atribusiyanı necə əsaslandıracağını hələ bilmir.

Üç yaşına qədər uşaqların 75%-i özünün oğlan və ya qız olduğunu bilir. Üç-dörd yaşında uşaq artıq şüurlu şəkildə ətrafındakı insanların cinsini fərqləndirməyi bacarır, lakin çox vaxt bunu təsadüfi xarici əlamətlərlə geyim, saç kəsimi və s. əlaqələndirir. Məsələn, bu yaşda uşaqlar əminliklə söyləyə bilərlər ki, oğlan qız paltarı geyinsə qıza çevriləcək. Uşaqlar cinsi-rol davranış modelini iki yolla öyrənir: digər uşaqların rol-davranış modelini müşahidə etməklə – bu tip təlim **dolayı öyrətmə** adlanır.

Eyni cinsindən olan valideynə özünü oxşatmaqla – bu növ təlimi isə psixoloqlar **imitasiya yolu ilə öyrətmə** və ya **modelləşmə** adlandırır. Uşağın öz gender eyniliyini dərk etməsi, həmçinin ona müəyyən münasibəti nəzərdə tutur ki,buraya cinsi-rol oriyentasiyası və cinsi-rol üstünlüyünü aid edirlər. **Cinsi-rol oriyentasiyası** – uşağın ondakı keyfiyyətlərin kişi və ya qadın rollarının tələblərinə və gözləmələrinə nə dərəcədə uyğun olduğu barədə təsəvvürləridir. Bu cür davranış gözləmələrindən də kişi və qadının "gender rolu" formalaşır.

Öyrətmənin başlıca prinsipi – müşahidə, mükafatlandırma, cəza vasitəsi ilə, birbaşa və dolayı əsaslandırma yolu ilə fərqləndirmədir. Ailədə mükafatlandırma funksiyasının yerinə yetirilməsi müvafiq davranışın inkişaf etməsinin əsas səbəbi rolunu oynaya bilər: adətən o adama bənzəməyə çalışırlar ki, o, dominant rolu oynasın. İnsanlar doğulduğu andan etibarən, doğulduğu mədəniyyətə mənsub olurlar gender stereotipləri haqqında məlumat əldə edirlər. Gender stereotiplərini öyrənmə prosesində qızlar necə qız, oğlanlar isə necə oğlan olmanı öyrənir, nəticədə fərdlərin cinslərinə uyğun münasibət və davranışları bəzi amillərin təsiri ilə formalaşır.

Gender sosiallaşmasının ilkin formalaşdığı yer ailədir. Ailə uşağın cəmiyyətdə kişi və qadın rollarını mənimsəməsində əvəzsiz rol oynayır. Ailədə uşaq ana, ata, bacı və qardaşların müəyyən davranışlarda olduğunu görür. Xüsusilə ana və ata evdə müxtəlif işlər görür (məsələn, yemək bişirmək, təmizlik etmək, zibil atmaq və s.) bütün bunları müşahidə edən uşaq başa düşür ki, bu tapşırıqlar cinsiyyətə əsaslanır. Həmçinin qoyulan adlar, geyimlər, alınan oyuncaqlar və rəftar tərzi ailə daxilində uşaqlar da gender sosiallaşmasının təməlini qoyur. Amerikalı psixoloqlar E. Makkabi və C. Ceklin gender sosiallaşması prosesini izah edən valideyn obrazlarının bir neçəsini qeyd edirlər:

1. Valideynlər oğlan və qız uşaqları ilə cəmiyyətin normativ gözləntilərinə uyğun şəkildə rəftar edir. Oğlanlar enerjili və rəqabət qabiliy-

yəti, qızlar isə qayğıkeşlik və anlayışlı olmasına görə valideynləri tərəfindən rəğbətləndirilir. Rol gözləmələrinə zidd davranış sərgiləyən uşaqlar isə cəzalandırılır.

2. Anadangəlmə cinsi fərqlər nəticəsində uşaqlar öz cinsinə xas davranışlar edərək valideynlərini stimulyasiya edirlər. Eyni valideyn davranışı oğlan və qız uşaqlarında fərqli davranışa səbəb ola bilər.

3. Valideynlər uşağı cinsi fikirlərə əsasən tərbiyə edirlər. Normativ davranış gözləntiləri valideynlərin düşüncə tərzinə, fikirlərinə uyğun olaraq dəyişə bilər.

4. Valideynlər daha çox üstünlüyü öz cinsindən olan uşağa verirlər. Məsələn, atalar daha çox diqqəti oğlanlara, analar isə qızlara göstərir. Onların düşüncələrinə görə öz cinslərinin xüsusiyyət və davranış tərzlərini uşağa öyrətmək daha asandır və s.

Oyuncaqlar – uşaqların dəyərlər sistemini və cəmiyyətin hazırladığı rolları öyrəndikləri, oynadıqları, əyləndikləri və vaxt keçirdikləri sosiallaşma fəaliyyətidir. Bəşəriyyət yaranandan bəri oyun qarşılıqlı əlaqə vasitəsi olmuşdur. Uşaq oyun və oyuncaqlarla doğulduğu cəmiyyətdə yaşamağa çalışır. Beləliklə, cəmiyyət sosiallaşan uşağı onun sosial qaydalarının davamlılığını oyun vasitəsi ilə əlaqələndirir.[2]

Genderə uyğun oyuncaqlarla oyun zamanı uşaq nəinki ənənəvi cinsi rolu mənimsəyir, həm də müəyyən vərdişlərə yiyələnir. Ailələrin uşaqları üçün oyuncaq seçimində cinsiyyətci mövqe sərgilədikləri müşahidə edilmişdir. Rəng və oyuncaq baxımından qız uşaqlı ailələr oyuncaq olaraq çəhrayı rəngə, gəlinciklərə, oğlan uşaqlı ailələr isə mavi rəng və oyuncaq seçimində isə avtomobillərə üstünlük verirlər. Cinslə müəyyən edilmiş oyuncaqlarla oynamaq uşaqların gender rollarının inkişafını məhdudlaşdırır və beləliklə, gender stereotiplərinin davamlılığını artırır ki, gələcəkdə bu uşaqların qaydalardan kənara çıxmaları şəxsiyyət xüsusiyyətlərinə zidd hərəkət kimi qəbul olunur.

Uşaq ədəbiyyatı – cinsi stereotipli məzmunlu kitabların oxunması uşaqlarda cinsi-rol davranışlarının güclənməsinə təsir edir. Personajların davranışları, rol bölgüləri, hansı peşə sahibi olmaları uşağa təsirsiz ötüşmür. Uşaq nağıllarındakı baş obrazların xüsusiyyətləri uşaqlar üçün etalon rolunu oynayır və inkişaf etməkdə olan fərdin istər fərdiyyət, istərsə də şəxsiyyətinə təsir edir. Uşaq ədəbiyyatı hər bir körpənin yaş dövrünün xüsusiyyətlərinə uyğun olaraq seçilməlidir.

KİV – Gender-rol sosiallaşmasında kütləvi informasiya vasitələri mühüm rol oynayır, axı onlar daimi şəkildə qadın və kişi obrazları haqqında məlumat verir. Televiziyadakı obrazlar şəxslər üçün real obraz kimi görünür. Tez-tez reklam olunan oyuncaqlar uşaqlar tərəfindən daha çox alınır və ya TV-də yayımlanan cizgi filmləri onlar tərəfindən maraqla qarşılanır. Müasir dövrdə sosial şəbəkələr və mobil oyunlar da KİV vasitələri sırasına daxildir. Valideyn nəzarəti olmadan istifadə olunan bu vasitələr sosiallaşma prosesinin tamam başqa səmtə yanlış informasiyaların, meyllərin qavranılması və həyata keçirilməsi ilə nəticələnə bilər.

Əgər ailənin sosiallaşma modelində cinslə əlaqəsi olan fərqlər müəllimin davranışında təkrar olunursa, kişi və qadın davranışının həmin cins üçün tipik olan formaları daha böyük dəstəyə alır. Müəllimlər münasibət-davranış, intizam öyrətmə təcrübələri ilə uşaqların gender sosiallaşmanın inkişafında mühüm rola malikdirlər. İbtidai sinif müəllimləri ilə aparılan bir araşdırmada, müəllimlərin sinif təcrübələrində cinsiyyətçi qavrayışlara malik olduqları aşkar edilmişdir. Məktəbdə müəllimlər oğlanlara aktivliyinə, aqressivliyinə, özünə əminliyə görə müsbət qiymət verdikləri halda, qızları daha çox zərifliyinə, passivliyinə, sözə qulaq asmalarına, rəhmli olmalarına görə dəyərləndirirlər [3].

Dost əhatəsi – dostluq münasibətləri uşaqların özünü inkişafında mühüm rol oynayır və uşaqların gender rollarına münasibətinə əhəmiyyətli təsir göstərir. Ailədə başlayan gender inkişafı dost qrupları tərəfindən gücləndirilir. Gender rolu stereotiplərinin üstünlük təşkil etdiyi dost qrupları olan uşaqların stereotiplərində artım müşahidə olunur. Belə dost qrupları olan uşaqlar əks cinslə deyil, həmcinsləri ilə oyun oynamağa üstünlük verirlər. Gender rolu stereotiplərinin dominant olmadığı dost qrupları olan uşaqlarda bu cür cinsi oriyentasiya müşahidə edilmir. Dost qruplarında uşaqlar cinsiyyətə uyğun davranışa görə bir-birlərini mükafatlandırır, məqbul olmadığını düşündükləri davranışları bəyənməyərək cəzalandırırlar. Dostlar tərəfin-

dən cəzalandırma uşaqların gender rolu stereotiplərinə daha çox bağlanmasına səbəb olur. Xüsusilə yeniyetməlik dövründə dostlar kifayət qədər önə çıxır. Dostlar yeniyetmələrin davranış və adaptasiyasının mühüm təyinediciləri hesab olunur. Yeniyetmələr açıq şəkildə ifadə etməsələr də bəyənilmək, görünmək, populyar olmaq istəyirlər. Bu vəziyyət gender rolları baxımından nəzərdən keçirildikdə, yeniyetmə qız və oğlanların gender rollarına uyğun davrandıqları zaman sosial cəhətdən gücləndikləri və dost qruplarında populyarlıqlarının artdığı ifadə edir.

**Problemin aktuallığı.** Məqalədə hər zaman aktual olmuş, hal-hazırda cəmiyyətimizdə baş verən "müasirlik" adı altında daha da aktuallaşan gender sosiallaşmasının yaranması, inkişafı və şəxsin həyat yolunda əhəmiyyətindən bəhs edilmişdir.

**Problemin elmi yeniliyi.** Məqalənin elmi yeniliyində sosiallaşma prosesinin şəxsiyyətin inkişafına təsirin psixoloji məsələləri araşdırılır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən psixologiya ixtisasının seçmə fənlərinin tədrisində istifadə oluna bilər.

**Ədəbiyyat:**


1. Eagly, A.H. Gender and social influence: A social psychological analysis. American Psychologist, 38(9), 1983. – 971-981 p.
2. Güder, S., & Alabay, E. 3-6 Yaş Arasındaki Çocukların Oyuncak Tercihlerinin Toplumsal Cinsiyet Bağlamında İncelenmesi. Ahi Evran Üniversitesi Kırşehir Eğitim Fakültesi Dergisi, 17(2), 2016. – 91-111 s.
3. Gao, D. Gender Justice and School Education. Frontiers of Education in China, 4, 2009. – 252-267 p.
4. Lindsey, L. L. Gender Roles: A Sociological Perspective. Pearson. 2014.
5. Neimand, A. Gender Socialization. Encyclopedia of Family Studies. 2016
6. Zeyneloğlu, S., & Terzioğlu, F. Toplumsal Cinsiyet Rolleri Tutum Ölçeğinin Geliştirilmesi ve Psikometrik Özellikleri. Hacettepe Üniversitesi Eğitim Fakültesi Dergisi, 40, 2011. – 409-420.


**E-mail:** heybetlin@mail.ru

**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **S.N. Əliyeva,**
*ped.ü.fəls.dok., dos.* **S.Y. Quliyeva**
**Redaksiyaya daxil olub:** 14.03.2023

*UOT 159.9*

***Pəri Fəxrəddin qızı Nağızadə***
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*Bakı Dövlət Universiteti*
*https://orcid.org/ 0009-0006-4383-2810*

# SOSİAL EMOSİONAL BACARIQLARIN SAĞLAM SİNİF MÜHİTİNƏ TƏSİRİ

***Пери Фахреддин гызы Нагизаде***
*диссертант по программе доктора философии*
*Бакинский Государственный Университет*

# ВЛИЯНИЕ СОЦИАЛЬНО-ЭМОЦИОНАЛЬНЫХ НАВЫКОВ НА ЗДОРОВУЮ АТМОСФЕРУ КЛАССА

***Pari Fakhraddin Nagizade***
*doctorial student in the program of doctor of philosophy*
*Baku State University*

# EFFECTS OF SOCİAL EMOTİONAL SKİLLS ON HEALTHY CLASSROOM ENVİRONMENTS

**Xülasə.** Əsas sosial-emosional bacarıqlar özünü dərk etmək, özünü idarə etmək, sosial dərk etmək, sosial münasibətləri tənzim etmək və məsuliyyətli qərar qəbul etməkdir. Bu bacarıqlara yiyələnən şəxs təhsil, iş, ailə həyatında daha uğurlu olurlar. Xüsusən sinifdə münasibətlərin səmərəli tənzim olunması üçün çox vacibdir. Sosial-emosional bacarıqlara sahib olan müəllim bu bacarıqları şagirdlərə daha rahatlıqla aşılaya bilir.

***Açar sözlər:*** *sosial, emosional, şagird, müəllim, bacarıq, məsuliyyət ,qərar*

**Резюме.** Ключевыми социально-эмоциональными навыками являются самосознание, саморегуляция, понимание других и ответственное принятие решений. Люди, которые приобретают эти навыки, более успешны в образовании, работе и семейной жизни. Это особенно важно для правильного регулирования отношений в классе. Учитель, обладающий социально-эмоциональными навыками, может легче привить эти навыки ученикам.

***Ключевые слова:*** *социальный, эмоциональный, ученик, учитель, умение, ответственность, решение*

**Summary.** Social-emotional skills are self-awareness, self-regulation, social-awareness, relationship skills, responsible decision-making. People who acquire these skills are more successful in education, work, and family life. It is especially important for the proper regulation of relations in the classroom. A teacher who has social-emotional skills can more easily instill these skills in students.

***Key words:*** *social, emotional, student, teacher, skill, responsibility, decision*

Sosial-emosional öyrənmə təlim və təhsildə vacib fəaliyyətlərdən biridir. Xüsusən özünü dərketmə, özünü idarəetmə, sosial münasibətləri idarəetmə və qərar qəbul etmə bacarıqlarının təkmilləşdirilməsində mühüm rol oynayır.

Müəllim və şagirdlərin əksəriyyəti ilin sonuna yaxın özlərini yorğun hiss edirlər və onlarda demotivasiya müşahidə olunur. Bu neqativ halların qarşısını almaq üçün sosial və emosional bacarıqların təkmilləşdirilməsinə daha çox üstünlük vermək lazımdır. Şagirdlərin təklikdə və sinifdə özlərini pozitiv məmnun hiss etməsində müəllimlər aparıcı rol oynayırlar. Çünki müəllimin sosial-emosional cəhətdən peşəkarlığı və kompetent olması bütün sinfə əsaslı şəkildə təsir göstərir.

Tədqiqatlar müəllimlərin peşə bacarıqlarının və sinif idarəetməsində istifadə etdikləri strategiyaların şagirdlərin uğurları ilə birbaşa əlaqədə olduğunu göstərir (Darling-Hammond, 1996; Fitzgerald & Bass, 1997).

Sinifdə pozitiv dəstəkləyici mühit formalaşdırmaq üçün müəllimin aşağıdakı sosial və emosional bacarıqlarının təkmilləşdirilməsinə ehtiyac var:

* şagirdlər üçün rol modeli olmaq (inkişaf etdirmək istədiyi xüsusiyyətləri öz davranışlarında nümayiş etdirmək);

* dərsə başlamazdan əvvəl və sonra sinif müzakirələri etmək, günlük məsələlər üzərindən şagirdlərlə danışmaq;

* tətbiq edəcəyimiz strategiyaların təsirli olacağına inam, çünki müəllimin inancları şagirdlər tərəfindən hiss edilir.

CASEL sosial-emosional öyrənmənin akademik göstəriciləri artıra biləcək, sinif davranışını yaxşılaşdıracaq, depressiyanı azaldacaq və şagirdlərin stresi idarəetmə bacarığını artıracaq tədqiqatları topladı. (CASEL, XX)

Nobel mükafatı laureatı iqtisadçı Ceyms Hekman deyir ki, sosial-emosional bacarıqlar motivasiya, vaxtın idarə edilməsi, özünütənzim etmək kimi icraedici fəaliyyət amilləridir və həyat nəticələri üçün vacibdir. Məsələ intellektual və ya emosional olaraq çərçivəyə salınmamalıdır. Sağlam təhsil İQ və EQ-nü vəhdətdə tələb edir. Sosial-emosional bacarıqlar aşağıdakılardır:

- özünüdərk etmək;
- özünütənzim etmək;
- sosial münasibətləri dərk etmək;
- sosial münasibətləri idarə etmək;
- məsuliyyətli qərar qəbulu.

Özünüdərk etmə sahəsində səriştə insanın öz duyğularını, məqsədlərini və dəyərlərini başa düşməsidir. Özünüidarə etmə sahəsində səriştələr insanın öz emosiya və davranışlarını tənzim edə bilməsidir. Məsələn: stresi idarə etmək, çətinliklərə dözmək və s. Sosial məsuliyyətlilik sahəsində səriştə göstərmək başqalarına müsbət münasibət bəsləmək və onlara hörmət etməkdir. Məsələn: empatiya, şəfqət hissi və s. Aydın ünsiyyət qurmaq, dinləmək, fəal əməkdaşlıq etmək, yersiz sosial təzyiqə müqavimət göstərmək, kömək etmək bu bacarıqlara daxildir. Məsuliyyətli qərar qəbulu vaxtında, düzgün qərar verilməsini tənzim edən bacarıqlardır.

İnsan inkişafının başlıca sahələri olan sosial, zehni, dil və akademik sahələr beyində və davranışda bir-biri ilə əlaqəlidir və hamısı öyrənmənin mərkəzində yer alır. (Jones və Kahn, 2017)

Həyatda, məktəbdə və karyerada uğur şəxslərin zehni, sosial, emosional və akademik inkişafına dayanır. Bir istiqamətdəki zəif inkişaf digər istiqamətdəki sağlam inkişafı zəiflətməkdədir. Bu səbəbdən şagirdlərin zəngin akademik göstəricilərlə əlaqəyə keçdiyi, bilik, bacarıq, sosial və emosional tərəflərini inkişaf etdirmələri üçün fürsət tapdıqları məktəb sistemi önəm təşkil edir. Bu istiqamətdə olan tədqiqatlar göstərir ki, sosial və emosional faktorların təlim-təhsil mühitinə nə qədər qatqıda olduğuna, məktəb rəhbərləri və müəllimlərin bu istiqamətdə bacarıqlarının inkişaf etdirilməsinin nə qədər vacib olduğuna diqqət çəkir.

Şəxsin erkən yaşlardan etibarən, məsələn, hər hansı bir problem qarşısında öz duyğularını tənzimləməsi, stresi idarə etməsi, sağlam düşünə bilməsi və sağlam addımlar ata bilməsi sosial-emosional bacarıqlardır. Çətin və dezavantajlı bir vəziyyətdə uşağın içində olduğu durumu və həyatı real şəkildə anlaması, məqsəd və hədəflərini müəyyənləşdirib tükənmədən çalışması, uğurlu olması, təvazökar olması sosial-emosional bacarıqlarla əlaqəlidir.

Psixoloji sağlamlıq və ya tükənməzlik olaraq ifadə edilən "psychological resilience" şəxsin mental və emosional olaraq çətinliklərlə başa çıxa bilməsi, böhran vəziyyətini idarə edə bilməsi, özünü güvəndə hiss edərək sağlam və xoşbəxt yaşaması üçün vacibdir.

Şəxslərin sosial-emosional bacarıqlara yiyələnməsində ailə, dostlar, məktəb və mühit böyük rol oynayır. Araşdırmalar göstərir ki, bu bacarıqlara erkən yaşlardan yiyələnənlər həm təhsil həyatlarında, həm də həyatlarının bütün sferalarında daha uğurlu olurlar. Məktəblərdə sosial və emosional bacarıqların şagirdlərə qazandırılması mövzusunda çoxlu yanaşmalar mövcuddur. Məktəb rəhbərlərinin sosial-emosional bacarıqlara yiyələnməsi onların məktəblərində hansı liderlik üslubundan istifadə etməsi qədər vacibdir. Məktəb rəhbərləri səmərəli öyrənmə mühiti formalaşdırmaqda və şagirdlərin uğurunu artırmaqda əsaslı bir rola malikdirlər. Sosial və emosional bacarıqların şagirdlərə qazandırılmasının önəmini dərk edən bir məktəb liderinin ilk öncə öz güc-

lü və zəif tərəflərinin fərqinə varması, inkişaf yoluyla özünü yeniləməyə çalışması vacibdir.

Sosial-emosional bacarıqlar məktəbin hər sahəsinə və bir şagirdin yaşamının hər sferasına təsir etməkdədir. Bu istiqamətdə aparılan tədqiqatlara baxıldığında tədqiqatçı alimlərin başında Gardner dayanır. Gardner "Çoxlu Zəka Nəzəriyyəsi" kitabında "şəxslərarası zəka" və "şəxsdaxili zəka" anlayışlarına aydınlıq gətirmişdir. Şəxslərarası zəka digər şəxslərlə münasibətə əsaslanıb onların duyğularını, niyyətini, temperamentini, istəklərini anlamaq bacarıqlarından ibarətdir. Şəxsdaxili zəka isə şəxsin özünü tanımasına, öz duyğularının, istəklərinin, hədəflərinin, temperamentinin, güclü və zəif tərəflərinin fərqində olmasına işarə edir. Beləliklə, şəxslərarası zəka digər şəxsləri anlamağı və onlarla işləyə bilməyi, şəxsdaxili zəka isə insanın özünü anlamasını və tanımasını vurğulayır.

Texnologiyanın inkişafına paralel olaraq insan münasibətlərinin əsası olan sosial-emosional öyrənmənin əhəmiyyəti olduqca artmışdır. Texniki bacarıqların önünə keçmişdir. Şirkətlərdə yaranan bir çox problemləri işçilər arasında yaşanan ixtilaflar meydana gətirir.

Məktəb mühitində şagirdlərin sosial və emosional bacarıqlarını inkişaf etdirmək üçün bir sıra şərtlərə əməl olunmalıdır.

Hər yaş qrupuna uyğun sosial və emosional öyrənmə proqramı hazırlanmalıdır. Yaş dövrlərinin xüsusiyyətlərinə uyğun olaraq günlük, həftəlik, illik dərs planları içində yer tutan riyaziyyat, fizika, tarix və s. dərslərdə olduğu kimi hər həftə işlənəcək müstəqil bir sosial-emosional öyrənmə proqramı da hazırlanmalıdır. İnkişaf etdiriləcək sosial- emosional öyrənmə proqramı şagirdlərin zehni inkişaflarına paralel olmalıdır.

Dərs proqramlarının məzmununa sosial-emosional öyrənmə proqramının hədəfləri yerləşdirilməlidir. Əsas hədəflər və mövzular tarix, din, əxlaq, həyat bilgisi kimi dərslərin tərkibinə də daxil edilməlidir. Şagirdlər eyni mövzularla fərqli zamanlarda həm zehni, həm də duyğusal olaraq qarşılaşacaqlar. Buna görə də davranışı dəyişdirmə və inkişafetdirmə faizləri artacaqdır

Müəllimlər bütün sosial əlaqələrdə sosial və emosional öyrənmə proqramının mövzularını vurğulamalıdırlar. Sinif daxilində nə yaşarlarsa yaşasınlar, fürsət tapdıqca hədəf mövzuya toxunmalıdırlar.

Məktəbdə müəllim, rəhbərlik və ailələri də əhatə edən bir sosial-emosional öyrənmə proqramı hazırlanmalıdır. Şagirdlər üçün hazırlanacaq sosial-emosional öyrənmə proqramının təsirli olması üçün onların sosial çevrəsinin də eyni bacarıqlara yiyələnməsi vacibdir. Bu səbəbdən məktəbdə müəllimlərə, rəhbərliyə və ailələrə təlim proqramına uyğun bir təlim verilməlidir. Əks təqdirdə bu bacarıqlarla qarşılaşmayan şagirdlər sadəcə bu istiqamətdə dərs keçirlər deyə bu bacarıqlara yiyələnmələri olduqca çətinləşəcək.

Sosial emosional öyrənmə proqramının hədəf kütləsi:

* təlim prosesinə qatılan bütün şagirdlər;
* özəl təlimə ehtiyacı olan bütün şagirdlər;
* müəllimlər, rəhbərlər və valideynlər.

Şagirdlər məktəb həyatının çox hissəsini sinifdə müəllimləri ilə birlikdə keçirirlər. Xüsusi ibtidai siniflər bu baxımdan diqqəti çəkir. Buna görə də müəllimlər şagirdlərə kiçik yaşlarından nümunə olmalı, öyrətmək istədikləri bacarıqları əyani şəkildə özləri göstərməlidirlər.

**Problemin aktuallığı.** Sosial-emosional bacarıqlar dövrün ən aktual məsələlərindən biridir. Xüsusən sağlam sinif mühitinin formalaşmasında çox vacib nüansdır.

**Problemin elmi yeniliyi.** Sinifdə sosial-emosional münasibətlərin düzgün tənzimlənməsi kimi vacib məsələ diqqət mərkəzinə gətirilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə müəllimlər, doktorantlar, dissertantlar və magistrantlar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. Aslan, Ş. Duygusal Zekâ Dönüşümcü ve Etkileşimci Liderlik. -Konya: Eğitim Yayınevi, 2013.
2. Avcı, Ö. "Öğrencilerin Duygusal Zekâ ile İletişim Becerileri Düzeylerinin Bağımlı Etkinliği Üzerine Bir Uygulama". Bartın Üniversitesi İktisadi ve İdari Bilimler Fakültesi Dergisi, Cilt:9, Sayı:18, 2018, – 205-220.

# *NƏSİLLƏRƏ NÜMUNƏ*
# *ПРИМЕР ДЛЯ ПОКОЛЕНИЙ*
# *EXAMPLE FOR GENERATIONS*



*UOT 37.0*

***Akif Nurağa oğlu Abbasov***
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
*https://orcid.org/0000-0002-9210-7141*

## GÖRKƏMLİ ƏRƏBŞÜNAS, ƏRƏB DİLİNİN GÖZƏL BİLİCİSİ

***Акиф Нурага оглу Аббасов***
*доктор педагогических наук, профессор, Заслуженный учитель*

## ВЫДАЮЩИЙСЯ АРАБИСТ, ПРЕКРАСНО ЗНАЮЩИЙ АРАБСКИЙ ЯЗЫК

***Akif Nuragha Abbasov***
*doctor of pedagogical sciences, professor, Honored teacher*

## OUTSTANDING ARABIST WITH EXCELLENT KNOWLEDGE OF THE ARABIC LANGUAGE

**Xülasə.** Tariyel Həsənov ərəb dilini yüksək səviyyədə bilirdi, bu dildə elə sərbəst danışırdı ki, tələffüzü, diksiyası elə mükəmməl idi ki, ərəblər onu özününkü bilirdilər. Deyəndə ki, o, azərbaycanlıdır, təəccüblənirdilər. Ərəb dilini mükəmməl bildiyi üçün uzun illər Tariyel ərəb ölkələrinə xidməti ezamiyyətə göndərilirdi.
***Açar sözlər:*** *ərəb dili, tərcüməçi, ərəb dilini yüksək səviyyədə bilmək, şərqşünas, ərəb dilinin gözəl bilicisi*

**Резюме**. Тариел Гасанов знал арабский язык на высоком уровне, свободно говорил на нем, а его произношение и дикция были настолько совершенны, что арабы признавали его своим. Они удивлялись, когда он говорил, что он азербайджанец. Так как Тариел в совершенстве знал арабский язык, то его на долгие годы отправляли в командировки в арабские страны.
***Ключевые слова:*** *арабский язык, переводчик, высокий уровень владения арабским языком, востоковед, отличный знаток арабского языка*

**Summary.** Taryiel Hasanov knew arabic at a high level, spoke it so freely that his pronunciation and diction were so perfect that the arabs recognized him as their own. They were surprised when he said that he was Azerbaijani. Since Tariel knew arabic perfectly, he was sent on business trips to arab countries for many years.
***Key words:*** *Arabic, translator, high level of Arabic language proficiency, orientalist, excellent expert in Arabic*

***Tariyel Bilal oğlu Həsənov 1992-ci ildən ömrünün sonuna kimi Bakı Dövlət Universiteti İlahiyyat fakültəsində baş müəllim vəzifəsində çalışmışdır***

Bu yazıda məqsədim müasir ərəbşünaslığın sayılıb-seçilən nümayəndələrindən biri olan Tariyel Bilal oğlu Həsənovun həyat yoluna nəzər salmaqdır. Gənclik illərimdə və sonralar onun fəaliyyəti ilə yaxından maraqlandığımdan uğurlarından xəbər tuta bilirdim. O, ərəbşünaslıq sahəsində hələ sağlığında özünə abidə ucaltmış, politoloq, professor Ələsgər Məmmədovun ləyaqətli, istedadlı yetirmələrindən idi. Ələsgər müəllim Tariyeli öz doğma övladı kimi sevir, uğurlarına hədsiz sevinir, onun ərəb dilinin incəliklərinə dərindən yiyələndiyini deyir və öz tələbəsinə görə qürur hissi keçirirdi.

Tariyel ərəb dilinə o səviyyədə bələd idi ki, bu dildə elə sərbəst danışırdı ki, tələffüzü, diksiyası elə mükəmməl idi ki, ərəblər onu özününkü bilirdilər. Deyəndə ki, o, azərbaycanlıdır, təəccüblənər, mat-məəttəl qalardılar. Tariyelin qarayanız olması da şəkk-şübhə yeri qoymurdu.

Tariyel 1941-ci ildə Əli Bayramlı rayonunun (1963-cü ildən Əli Bayramlı şəhəri, hazırda Şirvan şəhəri) Polad Poğay kəndində dünyaya göz açmışdı. 1 nömrəli rayon məktəbində, daha sonralar Azərbaycan Dövlət Universitetinin (hazırda BDU) Şərqşünaslıq fakültəsinin ərəb filologiyası şöbəsində təhsil almışdı. Universitetin axırıncı kursunda oxuyarkən ərəb dili sahəsindəki bilik və bacarığını nəzərə alaraq, onu Azərbaycan Radio və Televiziya Verilişləri Komitəsinə işə dəvət etmiş, ərəb dili redaksiyasında diktor vəzifəsinə təyin etmişdilər. Burada o, 1971-ci ilədək çalışmışdı.

Tariyel Bilal oğlu Həsənovun ərəbşünaslıq, ərəb dili sahəsindəki fəaliyyətini bir neçə istiqamətdə səciyyələndirmək mümkündür: radioda ərəb dili üzrə diktor, siyasi və elmi tərcüməçilik, elm və təhsildəki uğurlar, müəllimlik,, uzun müddət ərəb ölkələrində tərcüməçilik, prezident aparatında məsul vəzifə və s.

Ərəb dilini mükəmməl bildiyi üçün uzun illər Tariyel ərəb ölkələrinə xidməti ezamiyyətə göndərilirdi. Belə ki, bir il Yəmən Ərəb Respublikasında (1966-1967), 9 il İraq Respublikasında (1973-1977 və 1987-1992) xidməti vəzifədə olmuşdu. Bir müddət İraq Respublikasında keçmiş SSRİ Nazirlər Sovetinin İqtisadi İnkişaf Komitəsinin müşaviri vəzifəsini daşımışdı. Ölkələrarası yüksək səviyyəli danışıqlar zamanı tərcüməçi kimi fəaliyyət göstərirdi. Keçmiş ittifaqın Nazirlər Sovetinin sədri A.N.Kosıgin və İraq prezidenti Əhməd Həsən Əl-Bəkr arasındakı görüşdəki tərcüməçiliyi buna əyani sübutdur.

İraq Respublikasında xidməti vəzifəsini başa çatdırdıqdan sonra Azərbaycana qayıdan T.B. Həsənov 1992-ci ildən dünyasını dəyişənə qədər (2005) Bakı Dövlət Universitetinin İlahiyyat fakültəsində baş müəllim işlədi.

Tariyel Həsənov eyni zamanda dövlət qulluğunda çalışırdı. Bir çox illər respublika Prezidentinin İcra Aparatının Humanitar-siyasət şöbəsinin müdir müavini oldu. O, həm də elmi fəaliyyətlə məşğul idi. Azərbaycan Milli Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutunda kiçik elmi işçi, baş elmi işçi, şöbə müdiri vəzifələrində işləmişdi (1971-q987). 1971-ci ildə tarix elmləri namizədi (hazırda tarix üzrə fəlsəfə doktoru) elmi dərəcəsi almaq üçün akademik Ziya Bünyadovun elmi rəhbərliyi ilə "İraq xalqının imperializmə, irticaya qarşı demokratiya uğrunda mübarizəsində "İttihad Əş-Şə"b" qəzetinin rolu (1959-1960)" mövzusunda dissertasiya müdafiə etdi. İraqın müasir tarixinə və islam dini məsələlərinə dair bir monoqrafiyanın, 30-dan artıq elmi məqalənin müəllifi olmuş, "Quran"ı ərəbcədən dilimizə çevirmişdi.

Respublikamızın ziyalıları, alimləri, həmyerliləri, dostları, qohumları, tanışları Tariyeli həmişə hörmət və məhəbbətlə anır, ruhuna dua oxuyurlar. Bəzi fikirlərə müraciət edək:

* Tariyel Həsənov Azərbaycan ərəbşünaslığının sayılıb seçilən nümayəndələrindən biri-

dir… Onun ərəbcəsi çox qüvvətli, tələffüzü əla idi" (akademik Vasim Məmmədəliyev)

* Tariyel Həsənov bir həmkar kimi biz ərəbşünaslar üçün canlı əfsanə olmaqla bərabər, son dərəcə səmimi və təvazökar insan idi. Əvvəllər qiyabi olaraq tanımışam, daha sonra yaxın ünsiyyətimiz olub. Üzərinə düşən ziyalılıq missiyasını böyük məsuliyyət hissi ilə yerinə yetirən, ziyalı adını şərəflə daşıyan şəxsiyyət, müəllim və alim idi (Məmmədəli Babaşlı).

Ərəb dilinin mahir bilicisi, gözəl insan və şəxsiyyət Tariyel Həsənov 2005-ci il dekabrın 23-də dünyasını dəyişdi. Bəlkə də daha çox yaşayardı. Övladının faciəli ölümü onun belini, qəddini əydi. Hadisə belə baş vermişdi. Onlar İraq Respublikasında olarkən qızı terrorun qurbanı oldu. Bu, ataya çox pis təsir göstərdi.

Tariyel Həsənov Əli Bayramlıda sayılıb-seçilən bir nəslin nümayəndəsidir. Atası Bilal rayonun barmaqla göstərilən işgüzar, zəhmətkeş, bacarıqlı kişilərindən idi. Rayonda rəhbər vəzifələrdə də işləmişdi. Övladlarının təlim və tərbiyəsinə fikir verərdi. Hamısı ali təhsil almışdı. Tariyelin böyük qardaşı Lazər inşaatçı idi. Əli Bayramlının Təzə şəhər adlanan hissəsində beşmərtəbəli yaşayış binalarının əksəriyyəti, bir çox məktəb, səhiyyə və digər obyektlər onun iş icraçılığı, yaxud tikinti idarəsinə rəhbərlik etdiyi illərdə tikilmişdi. Təzə şəhərin təşəkkülü onun adıyla bağlıdır. Tariyelin digər qardaşı Akif ingilis dili müəllimidir. Mənə dərs deməsə də, Azərbaycan Pedaqoji Dillər İnstitutuna (hazırda ADU) qəbul imtahanlarına hazırlaşarkən ingilis dili imtahanına məni təmənnasız olaraq o hazırlaşdırmışdı. Akif müəllim Şirvan təhsil işçiləri və ingilis dili müəllimləri arasında öz dəsti-xətti ilə seçilmişdir.

Tariyel Bilal oğlu Həsənova həsr etdiyim yazını burada tamamlaya bilərdim. Lakin hələ 1971-ci il dekabrın 24-də Əli Bayramlı (hazırda Şirvan) şəhər "İşıq" qəzetində jurnalist Vaqif Abbasovla birlikdə Tariyel müəllimlə apardığımız müsahibəni də diqqət mərkəzinə gətirmək istərdim:

"***Biz Əli Bayramlıdanıq***

**TƏQVİMDƏN DÜŞƏN İLLƏR**

**Müxbir:** Söhbət get-gedə şirinləşir, dəftərçəmizin vərəqləri qeydlərlə dolurdu.

1966-cı ilin adi günlərindən biri. Moskvanın Şeremetyevo hava limanında bir təyyarə göyə qalxır. Aşağıda sərnişinləri yola salmağa gələnlərin əlləri xeyli müddət başları üzərində bayraq kimi dalğalanır, səfərə gedənlərə xoş arzular diləyir. "İL-18" Moskvaya "yeni görüşədək" sözlərini pıçıldayıb, yola düzəlir. Yalnız o, get-gedə kiçilib gözdən itdikdən sonra meydançadakılar dağılışırlar.

İçəridəkilər sovet mütəxəssisləridirlər. Sərnişinlər arasında bir gənc var. Gözlərinə qəhvəyi rəngli eynək taxmış qara çöhrəli bu gənc Tariyel Həsənovdur. 24-25 yaşı ancaq olar.

**Tariyel**: Yəmən Respublikasına gedirdik. Mən Hüdeydə-Təis avtomobil yolu tikintisində çalışan sovet inşaatçılarına tərcüməçilik edəcəkdim.

**Müxbir**: 1967-ci il. "İL-18" bir il Yəməndə olmuş Tariyeli doğma vətənə gətirir.

**Tariyel**: Yaman olurmuş vətən həsrəti. Bu bir ildə vətəndən ötrü burnumun ucu göynəyirdi. Tez-tez böyüyüb yaşa dolduğum Əli Bayramlı, anam, sevimli müəllimim professor Ələsgər Məmmədov, bir də ana Kür yadıma düşürdü. Üç dost idik. Ədalət, Rəhman, bir də mən. Günlərimiz Kürün sahilində keçərdi. Uşaq sevinci ilə özümüzü çaya atıb onun oynaq ləpələrini qucaqlardıq. Sonra da narın qumun üzərinə uzanıb arzularımızı Kürün "qulağı"na pıçıldardıq. Eh, nə tez keçdi o günlər, əlçatmaz, təkraredilməz xatirəyə çevrildi o günlər.

**Müxbir**: 1958-ci il. Üç dost Bakıya gəlir. Ədalət və Rəhman dillər institutuna, Tariyel isə universitetin şərqşünaslıq fakültəsinin ərəb dili şöbəsinə qəbul olunur.

1961-63-cü illər. Tariyel fakültə tələbə elmi cəmiyyətinin sədri seçilir. Ərəb dilində sərbəst danışdığına, zəngin söz ehtiyatına və yaxşı tələffüzünə görə onu Azərbaycan radiosuna dəvət edirlər. Təhsilini davam etdirməklə bərabər o, ərəb verilişləri şöbəsinə diktor işləyirdi. Universiteti fərqlənmə diplomu ilə bitirən Tariyel Həsənov aspiranturaya qəbul olundu. Elmi işlə məşğul olurdu.

**Tariyel**: Bir müddət Şərqşünaslıq fakültəsində ərəb dilindən dərs dedim. Daha sonra Azərbaycanın Xarici Ölkələrlə Dostluq və Mədəni Əlaqələr Cəmiyyətində işə çağırıldım. Hazırda ərəb dilində nəşr olunan "Sovet Azərbaycanı bu gün" məcmuəsinin redaktoruyam.

**Müxbir**: 1971-ci il. 18 noyabr. Azərbaycan EA-nın Şərqşünaslıq İnstitutunda iclas salo-

nuna xeyli adam toplaşıb. Gecikdiyimiz üçün ayaq üstə dayanmalı oluruq. Akademik Əbdülkərim Əlizadənin sədrliyi ilə T. Həsənov tarix elmləri namizədi elmi dərəcəsi almaq üçün akademik Ziya Bünyadovun elmi rəhbərliyi ilə "İraq xalqının imperializmə, irticaya qarşı demokratiya uğrunda mübarizəsində "İttihad Əş-Şəb" qəzetinin rolu (1959-1960)" mövzusunda dissertasiya müdafiə edəcəkdir. O danışır, ağır-ağır, təmkinlə. Gözlərimiz qarşısında qəzetin İraq xalqının həyatında oynadığı rol, onun meydana çıxdığı tarixi şərait, imperialistlərə qarşı apardığı mübarizə canlanır. Faktlar, sitatlar, qəzet səhifələrindən tərcümələr. Hiss edilir ki, gənc şərqşünas çox əziyyət çəkib. Bütün qüvvə və bacarığını elmi işinə sərf edib.

Müdafiə müvəffəqiyyətlə keçdi. Alimlər, dost-tanışlar, həmyerliləri gül-çiçək dəstələri ilə Tariyeli təbrik etdilər, onun sevincinə şərik oldular.

Opponentlər müdafiəni yüksək qiymətləndirdilər. Moskvalı alim, tarix elmləri namizədi Aş Fedçenkonun sözləri yaxşı yadımızdadır: "Həsənov yoldaşın elmi işi xırda qüsurlar istisna edilmək şərtilə, böyük əhəmiyyətə malikdir. Əsər Şərq tarixi elminə qiymətli töhfədir".

ADU-nun Şərqşünaslıq fakültəsinin müəllimi Əhməd Yusifi ilə söhbət edərkən o dedi: "Tariyel radioda işlədiyi vaxt respublikamıza qonaq gələn ərəb dostlarımız tez-tez bizdən soruşardılar: "Sizin diktor doğrudanmı azərbaycanlıdır?"

Bu təəccüb yersiz deyildi. Tariyel dili yaxşı bilirdi. Danışığı, bir də qarayanız çöhrəsi ərəblərdən fərqlənmirdi".

Tariyellə söhbətimiz sona çatmışdı Artıq onun danışdıqlarından özümüz nəticə çıxarmışdıq.

...Hər gün təqvimdən bir vərəq düşür. Bu günlər yığılıb illərin arxasını yerə vurur. Əminik ki, bu illər həmyerlimiz Tariyel Həsənovu elm yollarında daha yüksək zirvələrə aparacaqdır.

**Ayrılarkən**: Sizinlə heç yaxından tanış olmadım, – deyir.

– Həmyerlinizik, – dedim. – Tanış olaq: **Vaqif Abbasov, Akif Abbasov".**

**Problemin aktuallığı.** Ərəb dili sahəsində görkəmli mütəxəssis – bu dilin gözəl bilicisi, ərəb dili üzrə tərcüməçi, ictimai xadim, ərəb dili müəllimi haqqında söz açılır.

**Problemin yeniliyi**. Görkəmli şərqşünas T.B. Həsənovun həyat yoluna nəzər salınır.

**Problemin praktik əhəmiyyəti**. Məqalə magistrantlar və doktorantlar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. A.N. Abbasov, V.S. Abbasov. Təqvimdən düşən illər. Əli Bayramlı (hazırda Şirvan) şəhər "İşıq" qəzeti, 1971, 24 dekabr

**E-mail:** prof.akif@mail.ru
**Rəyçilər:** *ped.elm.dok., prof.* **İ.H. Cəbrayılov**,
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 10.04.2023

# *PEDAQOJİ DİQNOSTİKA*
# *ПЕДАГОГИЧЕСКАЯ ДИАГНОСТИКА*
# *PEDAGOGICAL DIAGNOSIS*

*UOT 373.3/.5*

***Nigar Nəsir qızı Niftəliyeva***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi*
*https://orcid.org/0000-0003-2810-9502*

## PEDAQOJİ DİAQNOSTİKANIN NƏZƏRİ TƏHLİLİ

***Нигяр Насир гызы Нифталиева***
*докторант по программе доктора философии, преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

## ТЕОРЕТИЧЕСКИЙ АНАЛИЗ ПЕДАГОГИЧЕСКОЙ ДИАГНОСТИКИ

***Nigar Nasir Niftaliyeva***
*doctorial student in the program of doctor of philosophy,*
*lecturer at*
*Azerbaijan State Pedagogical University*

## THEORETİCAL ANALYSİS OF PEDAGOGİCAL DİAGNOSTİCS

**Xülasə.** Pedaqoji diaqnostika müəllimlərin peşə fəaliyyətində, şagirdlərin şəxsi keyfiyyətlərinin formalaşması və inkişafında özünəməxsus rol oynayır. Diaqnostik tədqiqatlar pedaqoji və psixoloji istiqamətlər üzrə aparılır və tədqiqat nəticələrinin təhlilinə imkan yaradır.

Pedaqoji diaqnostika tədrisin metodiki, praktiki, nəzəri, elmi istiqamətidir və bu prosesin səmərəliliyinə zərurət yaradır. Pedaqoji diaqnostika təhsil prosesindəki çatışmazlıqları aşkara çıxarır, qüsurların yerindəcə operativ həllinə imkan yaradır, inkişaf istiqamətlərini müəyyənləşdirir.

***Açar sözlər:*** *pedaqoji diaqnostika, müəllim fəaliyyəti, diaqnostik qiymətləndirmə*

**Резюме.** Педагогическая диагностика играет своеобразную роль в профессиональной деятельности педагогов, в формировании и развитии личностных качеств учащихся. Диагностическое исследование проводится в педагогическом и психологическом направлениях и дает возможность анализировать результаты исследования.

Педагогическая диагностика является методическим, практическим, теоретическим, научным направлением обучения и создает необходимость эффективности этого процесса. Педагогическая диагностика выявляет недостатки образовательного процесса, позволяет оперативно устранять недостатки, определять направления развития.

***Ключевые слова:*** *педагогическая диагностика, деятельность учителя, диагностическое оценивание*

**Summary.** Pedagogical diagnosis plays a unique role in the professional activity of teachers, in the formation and development of personal qualities of students. Diagnostic research is conducted in pedagogical and psychological directions and provides an opportunity to analyze research results.

Pedagogical diagnostics is a methodical, practical, theoretical, scientific direction of teaching and creates a necessity for the efficiency of this process. Pedagogical diagnostics reveals deficiencies in the educational process, enables prompt resolution of defects, and determines development directions.

***Key words:*** *pedagogical diagnosis, teacher activity, diagnostic assessment*

Müəllim fəaliyyəti bu gün təhsil sisteminin olduqca zəruri tərkib hissəsi olmaqla yanaşı, onun gələcək məqsədlərinin prioritetlərindən biridir. Bu baxımdan da müəllim fəaliyyətinin daha da təkmilləşdirilməsi olduqca vacib əhəmiyyət daşıyan və aktual olan bir məsələdir. Müəllim fəaliyyətinin təkmilləşdirilməsinin əsas elementlərindən biri də pedaqoji diaqnostikadır. Pedaqoji diaqnostika şagirdlərin həssas, zəif tərəflərini üzə çıxarır, müəllimin fəaliyyətinin istiqamətlərini təyin edir.

Pedaqoji diaqnostika pedaqoji elmlərin özəyini təşkil edir. Bu termini pedaqoji ədəbiyyata ən birinci alman pedaqoqu K. İnqenkamp daxil etmişdir. Pedaqoji diaqnostika müasir dövrdə müəllimlərin peşə fəaliyyətinin zəruri elementidir, müəllim fəaliyyəti və ümumilikdə təhsil sisteminin təhlillərinə əsaslanaraq yeni perspektivləri müəyyən etməsində aparıcı rol oynayır. Diaqnostika termininə ilk dəfə 17-ci əsr müasir latın ədəbiyyatlarında rast gəlinmişdir. Bu ədəbiyyatlarda qeyd olunanlara əsasən deyə bilərik ki, diaqnostika sözünün etimologiyası qədim Yunanıstandan gəlir. Belə ki, *diaqnostika* yunan mənşəli: dia-vasitəsilə; *gignosko* - tanımaq, bilmək; *tika* – elm mənasını verən 3 sözün birləşməsindən əmələ gəlmişdir. Mənası “müəyyən etmək qabiliyyəti” deməkdir. Problemin aktuallığı yerli və xarici mütəxəssislərin diqqətini cəlb etmişdir.

Professorlar Ə.X. Paşayev və F.A. Rüstəmovun, pedaqoji elmlər doktoru Tovuz Eminlinin və digərlərinin apardığı tədqiqatlarda pedaqoji diaqnostika haqqında öz rəylərini bildirmişlər. Müəlliflər problemə özünəməxsus yanaşmanın vacibliyini qeyd edirlər. Belə ki, Ə. Paşayev və F. Rüstəmovun “Pedaqogika” dərsliyində şagirdlərin pedaqoji diaqnostikasını bu şəkildə qeyd etmişlər: “Diaqnostikanın məqsədi təlim prosesinin baş vermə şəraitini, onun nəticələrini dəqiq üzə çıxarmaq, qiymətləndirmək və təhlil etməkdir. Təlim prosesini səmərəli idarə etmək, mövcud şəraitdə optimal nəticələrə nail olmaq diaqnostikasız mümkün deyil”.

Pedaqoji elmlər doktoru T.B. Eminli isə: “Pedaqoji diaqnostikanın mahiyyəti diaqnostikanın subyektində baş verən keyfiyyət dəyişikliklərinin izlənilməsidir. Bundan başqa, inkişafda uğurların və uğursuzluqların müəyyənləşdirilməsi məqsədilə toplanmış materialın təhlili, baş verən dəyişikliklərin mənasının açılması vacibdir”, – demişdir.

Xarici mənbələrə görə pedaqoji diaqnostikanın əsas məzmunu: “orta məktəblərdə təlim-tərbiyə prosesində şagirdlərin mənimsəmə səviyyələrinin və müəllimlərinin pedaqoji ustalıqlarının dəyişilməsi əsasında alınan səmərəliliyin öyrənilməsinə deyilir”, – kimi izah edilir.

Pedaqoji ədəbiyyatlardan gəldiyimiz qənaətə əsasən deyə bilərik ki, pedaqoji diaqnostikanın ənənəvi, əsas və köməkçi metodları mövcuddur. Ənənəvi metodlara anketlər, nəzarət işləri, imtahanlar aiddir. Əsas metodlara uğur (nailiyyət) testləri, nəzarət tapşırıqları, köməkçi metodlara isə psixoloji testlər aiddir. [1]

Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi bu istiqamətdə bir çox tədbirlər görmüşdür. Yeniliklərə açıq olan bir cəmiyyətdə keyfiyyətli təhsil daima gündəmdə olan zərurətdir. Bu baxımdan son zamanlar görülən işlər dövlət siyasətinin tərkib hissəsi olub, onun tələblərinə cavab verməklə yanaşı, cəmiyyət – təhsil ictimaiyyəti tərəfindən də müsbət qarşılanmaqdadır.

Şagirdlərin diaqnostikası aşağıdakı ardıcıllıqla həyata keçirilir:

I mərhələ – biliyin səviyyəsinin ilkin quruluşunun müəyyənləşdirilməsi;

II mərhələ – tədris prosesi zamanı aparılan gündəlik (cari) yoxlama;

III mərhələ – tematik olaraq həyata keçirilən təkrar yoxlama. Əvvəlki bəhslər təkrarlanır;

IV mərhələ – ixtiyari bölmə üzrə keçirilən dövri yoxlama;

V mərhələ – bütün mərhələlərdə keçirilən yekun yoxlama. [6]

Pedaqoji diaqnostikanın vacibliyini təsdiq etmək üçün Elm və Təhsil Nazirliyinin keçirmiş olduğu monitorinq və təlimlərin nəticələrinə nəzər yetirək.

Elm və Təhsil Nazirliyinin illik hesabatlarında yayımladığı məlumatların statistikasına istinad etsək, nəticələrə əsasən müəllimlərin 18 faizi yüksək, 68 faizi qənaətbəxş, 14 faizi aşağı nəticə göstərmiş olduqlarının şahidi olarıq. 2015-ci ildə müəllimlər təlimlərə cəlb olunmuş və müəllimlərin 78 faizi yekunda öz göstəricilərini xeyli yaxşılaşdırmağa müvəffəq olmuşlar. 2015-2016-cı ildə ümumilikdə Bakıda 28.758,

ölkənin 12 bölgəsində isə 26.290 müəllim təlimlərdə iştirak etmişdir. Müəllimlərin 14.8%-i əla, 53.6%-i yaxşı nəticə göstərmiş, 31.6%-i müəllimin isə təkmilləşdirməyə ehtiyacı olduğu məlum olmuşdur.

2017-ci ildə isə 26 şəhər və rayondan müəllimlər diaqnostik qiymətləndirməyə cəlb olunmuş və 41360 müəllim bu imtahandan uğurla keçmişdir, eyni zamanda, 2017-ci ildə direktor, direktor müavinləri, məktəbdənkənar və sinifdənxaric işlər üzrə təşkilatçılar, yerli təhsili idarəetmə orqanlarında dövlət qulluğu və metodist vəzifələrində çalışanlar da cəlb olunub, 7195 nəfər pedaqoji işçi bu qiymətləndirmədən keçmişdir.

2018-ci ildə 21672 nəfər diaqnostik qiymətləndirmədə iştirak üçün müraciət etmiş, onlardan 16153 nəfəri qiymətləndirmədən keçmiş və vəzifə maaşları artmışdır.

2019-cu ildən isə psixoloqların da bu prosesə cəlb edilməsinə başlanılmışdır.

Müəllimlərin diaqnostik qiymətləndirilməsinin testlə təşkil olunması müəllim fəaliyyətində nəzərə çarpacaq inkişafa səbəb olur. Həmçinin yüksək nəticə əldə etmiş müəllimlərin elmi və praktik fəaliyyətinin ictimaiyyətə açıq olması, digər müəllimlərin də bundan yararlanmasına səbəb olub. Bu fəaliyyətə, həmçinin müəllimlərin əldə etdiyi digər uğurlar da daxil edilməlidir: sinif üzrə nəticələr, valideyn və müəllim həmkarları ilə müəllimin əməkdaşlığı, şagirdlərə münasibəti, şagirdlərin müəllimə münasibəti, əldə etdiyi beynəlxalq uğurları, layihələri və digər şəxsi-psixoloji cəhətləri də nəzərə alınmalıdır. Bunların da test nəticələrinin qiymətləndirilməsinə müvafiq şəkildə daxil edilməsi yaxşı olardı.

Bu nəticələrə diqqət yetirsək, müəllim fəaliyyətində pedaqoji diaqnostikanın mühüm rol oynadığını görə bilərik. Pedaqoji diaqnostika həm də müəllimin özünüdiaqnostikasıdır ki, bu da müəllimdən özünütəkmilləşdirməni, müasir yeniliklər, innovasiyalardan vaxtında xəbərdar olmaq, onların tətbiqini tələb edir. Bu da pedaqoji fəaliyyətin əsas elementlərindən biri və ən vacibidir.

Nəticə olaraq deyə bilərik ki, pedaqoji diaqnostika vasitəsi ilə müəllim fəaliyyətinin daimi təhlili aparılır. Bu həm təhsil sisteminin inkişafında, həm də müəllimin pedaqoji fəaliyyətindəki nöqsanların üzə çıxmasında, özünüinkişafında, sağlam rəqabətlilik mühitinin formalaşmasında aparıcı rola malikdir.

**Problemin aktuallığı.** Şagirdlərdən il ərzində götürülən imtahanlar, müəllimlər üzərində aparılmış müşahidələr və diaqnostik imtahanın nəticələri pedaqoji diaqnostika ilə əlaqədar aparılan bütün tədqiqatların zəruriliyindən bəhs edir.

**Problemin elmi yeniliyi.** Pedaqoji diaqnostikaya müəllimlərin peşə fəaliyyətində, şagirdlərin şəxsi keyfiyyətlərinin formalaşması və inkişafında əsas vasitə kimi yanaşılır.

**Problemin praktik əhəmiyyəti.** Məqalə müasir dövrdə aktual olan pedaqoji diaqnostika ilə əlaqədar araşdırma aparan hər bir gənc mütəxəssisə faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. Paşayev, Ə.X. Pedaqogika. / Ə.X. Paşayev, F.A. Rüstəmov. – Bakı: Elm və təhsil, 2012.
2. İlyasov, M.İ. Müəllimin pedaqoji ustalığı. / M.İ. İlyasov. – Bakı: Elm və təhsil, 2013. – 215 s.
3. TİPİİ. Məktəbdə psixoloji işin təşkili. Oxu materialı
4. Кочетова, А.И. Педагогическая диагностика в школе. / А.И. Кочетова. – Минск: Народная асвета, 1987.
5. Никитина, Н.Н. Введение в педагогическую деягельность: Теория и практика / Н.Н. Никитина, Н.В. Кислинская. – Москва: Академиа, 2008.
6. Петрова, О.О. Педагогика. Конспект лекций. / О.О. Петрова, О.В. Долганова, Е.В. Шарохина. – Москва: Эксмо, 2008.

**E-mail:** nasir2010@mail.ru

**Rəyçilər:** *ped.ü.elm.dok., prof.* **F. Rüstəmov,**
*ped.ü.elm.dok.* **A. İmanov**
**Redaksiyaya daxil olub:** 07. 04.2023

## *TƏLİM TEXNOLOGİYALARI*
## *ОБУЧАЮЩИЕ ТЕХНОЛОГИИ*
## *LEARNING TECHNOLOGIES*

*UOT 373.3/.5*

***Rasim Rəşid oğlu Abdurazaqov***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Respublikasının Təhsil İnstitutu*
*https://orcid.org/0000-0002-1697-8148*

***Gülzar Vidadi qızı Hüseynova***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
*https://orcid.org/0000-0002-2120-4294*

# VIII SINIFDƏ "NAQİLLƏRIN ARDICIL BİRLƏŞDİRİLMƏSİ" VIRTUAL PRAKTIK IŞ DƏRSININ MODELLƏŞDİRİLMƏSİ

***Расим Рашид оглы Абдуразагов,***
*доктор философии по педагогике, доцент*
*Институт Образования Азербайджанской Республики*

***Гюльзар Видади гызы Гусейнова***
*Азербайджанский Государственный Педагогический Университет*

# МОДЕЛИРОВАНИЕ ВИРТУАЛЬНОГО ПРАКТИЧЕСКОГО ЗАНЯТИЯ «ПОСЛЕДОВАТЕЛЬНОЕ СОЕДИНЕНИЕ ПРОВОДОВ» В VIII КЛАССЕ

***Rasım Rashıd Abdurazagov,***
*doctor of philosophy in pedagogy, associate professor at*
*Institute of Education of the Republic of Azerbaijan*

***Gulzar Vıdadı Huseynova***
*Azerbaijan State Pedagogy University*

# ON THE MODELING OF THE VIRTUAL PRACTICAL WORK LESSON "SERİES CONNECTION OF WIRES" IN THE VIII CLASS

**Xülasə.** Məqalədə ümumi orta təhsil səviyyəsinin VIII siniflərində fizika təliminin interaktiv pedaqoji texnologiyalarından biri kimi virtual praktik işlərin (laboratoriya işlərinin) icra mexanizmi şərh edilir. Bu məqsədlə "Fizikadan multimedia" elektron tədris resursundan istifadə edilmişdir. Həmin resursda verilən virtual Macromedia Flash animasiya proqramında hazırlanmışdır. Modellərdə yüksək səviyyədə interaktivlik, təlim səhnəsinin obyektləri ilə kvazireal istifadəçi hərəkətlərinin dinamikliyi təmin edilmişdir. Şagirdlərin virtual mühitdə müstəqil fəaliyyəti üçün statik təlimatlarla yanaşı, idarə olunan dinamik modullar təqdim olunmuşdur. Virtual praktik işlər fizikadan illik tematik planda icrası nəzərdə tutulan laboratoriya dərslərinin uğurlu təşkili üçün faydalı əlavədir. Belə işlər maksimum aydınlığı, fiziki eksperimentlər üçün real avadanlıqların dəqiq modelləşdirilməsini təmin edir. Nümunə olaraq VIII sinifdə "Naqillərin ardıcıl birləşdirilməsi" virtual praktik iş dərsinin modelləşdirilməsi ardıcıllığına baxılır.

***Açar sözlər:*** *virtual praktik iş, modelləşdirmə, elektrik dövrəsi, ardıcıl birləşdirmə, qiymətləndirmə*

**Резюме.** В статье механизм реализации виртуальных практических работ (лабораторных работ) трактуется как одна из интерактивных педагогических технологий обучения физике в VIII классах общеобразовательной ступени. Для этого был использован электронный образовательный ресурс «Мультимедиа от физики». Виртуальная анимация, представленная на этом ресурсе, создана в программе анимации Macromedia Flash. В моделях обеспечивается высокий уровень интерактивности, динамичность квазиреальных действий пользователя с объектами обучающей сцены. Наряду со статическими инструкциями были представлены управляемые динамические модули для самостоятельной деятельности учащихся в виртуальной среде. Виртуальный практикум является полезным дополнением к успешной организации лабораторных занятий по физике, которые планируется проводить в годовом тематическом плане. Такие работы обеспечивают максимальную наглядность, точное моделирование реальной аппаратуры для физических экспериментов. В качестве примера рассмотрена последовательность моделирования виртуального практического занятия «Последовательное соединение проводов» в VIII классе.

***Ключевые слова**: виртуальный практикум, моделирование, электрическая цепь, последовательное соединение, оценивание*

**Summary.** The article explains the implementation mechanism of virtual practical works (laboratory works) as one of the interactive pedagogical technologies of physics training in the VIII classes of the general secondary education level. For this purpose, the resource of "Physics multimedia" electronic lessons was used. It was created in the virtual Macromedia Flash animation program provided in the resource. The models provide a full level of interactivity, dynamism of quasi-real movements with the objects of the training scene. Along with static, controlled dynamic modules are provided for independent activity in the virtual environment of students. Virtual practical work is a useful addition to the successful construction of laboratory lessons in physics, which are planned to be carried out in the annual thematic plan. Maximum clarity of such work, accurate modeling of real equipment for physical experiments is provided. As an example, the suitability of virtual practical work lesson "Connecting wires" in grade VIII is considered.

***Key words:** virtual practical work, modeling, electric circuit, integration, evaluation*

Ölkəmizdə son illərdə aparılan təhsil islahatının başlıca istiqamətlərindən biri icbari ümumi təhsilin təlim metodlarının təkmilləşdirilərək cəmiyyətin informasiyalaşdırılma tempinə uyğunlaşdırılmasıdır. Bu isə şagirdlərin təlim nəticələrinin yüksəldilməsinə dair cəmiyyətin tələblərini, müasir Azərbaycanda tədris-metodiki dəstəyin tez-tez yenilənməsini, təlim prosesinin keyfiyyətinin yüksəldilməsi zərurətini aktuallaşdırır. Odur ki, ümumi təhsilin müxtəlif səviyyələrində digər fənlərlə yanaşı, fizikanın təlimi prosesinin də müasir tələblər əsasında yeniləşdirilməsinə ciddi ehtiyac yaratmışdır. İndi artıq şagirdlərə fiziki qanun və nəzəriyyələrin elmi əsaslarına dair akademik biliklər qazandırmaq kifayət deyil, onlarda qazanılan bilikləri fiziki eksperimentlər əsasında yoxlamaq, bu eksperimentlərin nəticələrini müasir texnologiyaların iş prinsipinin izahına və praktik həyatla əlaqəli proseslərə tətbiq etmək bacarıqları formalaşdırmaq tələb olunur. Bir tərəfdən təhsilin informatlaşdırılması, digər tərəfdən məktəblərimizin fiziki cihaz və avadanlıqlarla, demək olar, təmin olunmaması, fiziki eksperimentləri, praktik iş dərslərinin virtuallaşdırılmasını tələb edir [2; 3; 4; 5; 6; 7]. Ancaq qeyd etməliyik ki, fizika fənni üzrə virtual eksperimentlər və praktik iş dərslərini həyata keçirən proqram təminatı hələ də kifayət dərəcədə tətbiq olunmur. Bunun da səbəblərindən biri fənn müəllimlərinə yardım edəcək virtual dərs modellərinin az olmasıdır.

İşin **elmi yeniliyi** aşağıdakı müddəalarla müəyyən edilir.

- Ümumtəhsil müəssisələrinin VIII sinfində fizikadan virtual praktik işlərin təşkilinin zəruriliyi elmi-metodiki baxımdan əsaslandırılır.
- Fənn müəllimlərinə metodiki dəstək olaraq VIII sinifdə "Naqillərin ardıcıl birləşdirilməsi" virtual praktik iş dərsinin tədrisinin təşkili nümunəsi işlənərək təqdim olunur. Bu məqsədlə "Fizikadan multimedia" elektron tədris resurslarından istifadə olunmuşdur [9; 10].

**Mövzu.** "Naqillərin ardıcıl birləşdirilməsi" virtual praktik iş

| | |
|---|---|
| **Alt STANDARTLAR** | 1.1.2. İstilik və elektromaqnit (elektrik) hadisələrinə aid məsələlər qurur və həll edir.<br>1.1.5. İstilik hərəkəti və elektrik hadisələrinin qanunauyğunluqlarına aid topladığı məlumatları şərh edir.<br>3.1.1. İstilik və elektrik hadisələrinə aid ölçü cihazlarından istifadə edir.<br>3.1.2. İstilik və elektrik hadisələrinə uyğun fiziki kəmiyyətləri ölçür, hesablamalar aparmaqla nəticələri təqdim edir. |
| **Təlim NƏTİCƏLƏRİ** | •Elektrik işlədicilərini dövrəyə ardıcıl birləşdirilmə qanunauyğunluqlarını şərh edir.<br>•Ardıcıl birləşməyə aid sadə təcrübələr icra edir.<br>•Elektrik sxemlərini oxuyur və sxemə əsasən dövrə qurur. |
| **MƏQSƏD** | Şagirdlərin sabit cərəyan qanunlarına dair biliklərinin yoxlanması və möhkəmləndirilməsi, onların qrupda qarşılıqlı əməkdaşlıq prinsipi əsasında işləmək bacarıqlarını inkişaf etdirmək, yaradıcılıq keyfiyyətlərinin formalaşdırılması işinə yardım etmək. |
| **DƏRSİN TİPİ** | İnteraktiv |
| **İstifadə olunan İŞ FORMALARI** | Praktiki iş-interaktiv laboratoriya işi, bütün siniflə iş. |
| **İstifadə olunan ÜSULLAR** | Fəal/interaktiv metod, qruplarla iş, kompüter təqdimatı, müzakirə və müsahibə. |
| **Fənlərarası İNTEQRASİYA** | Riy.-1.2.5., 2.1.2., 4.2.1., 5.1.1.,<br>Tex.- 2.2.1., 2.2.2.,<br>Kim.-1.1.1., 4.1.1.,<br>İnf. -2.2.3., 2.2.4., 3.2.1., 3.3.2.,<br>Ədəb. -2.2.1.,<br>H.b.- 1.1.1., 4.2.1.. |
| **Tədris RESURSU** | 1. Kompüter.<br>2. Multimedia proyektoru.<br>3. “Fizikadan multimedia” diski. . 4 CD diskində, 3-cü disk, Elektrodinamika §53, Bakı: Bakınəşr, 2007.<br>4. İnteraktiv lövhə (mimio və ya “promethean”).<br>5. Vatman.<br>6. Markerlər dəsti.<br>7. Yapışqanlı lent və qayçı.<br>8. Murquzov M.İ., Abdurazaqov R.R., Əliyev R.M., Əliyeva D.Z. Fizika 8. Dərslik. Bakı, Bakınəşr, 2019.<br>9. Murquzov M.İ., Abdurazaqov R.R., Əliyev R.M., Əliyeva D.Z. Fizika: 8-ci sinif üçün. Müəllimlər üçün metodik vəsait. Bakı: Bakınəşr, 2019.<br>10. Abdurazaqov R.R. Fizikadan multimedia diskindən istifadə metodikası. II hissə: Elektrodinamika, Optika, Kvant fizikası. Bakı: Bakı-nəşr, 2007,48 s. |

| Fəaliyyət | İnkişafetdirici bacarıqlar |
|---|---|
| **I mərhələ. Sinfin təşkili (5 dəq)** | |
| **1.1. Şagirdlərin qruplaşdırılması.**<br>Salamlaşdıqdan sonra şagirdlər ixtiyari seçimlə 4 qrupa ayrılır.<br>**Tövsiyə.** Qrupların təlim nəticələri müxtəlif olan şagirdlərdən təşkil olunmasına diqqət yetirmək məqsədəuyğundur.<br>**1.2. Qrup fəaliyyətinə hazırlıq işinin təşkili.**<br>Bu məqsədlə qruplar yapışqanlı lent, qayçı, marker və vatmanla təchiz olunur. | • Kommunikativlik<br>• Əməkdaşlıq |
| **II mərhələ. Giriş müsahibəsi və müzakirəsinin təşkili (23 dəq)** | |
| **2.1. İşə aid nəzəri məlumatın təkrarlanması (10 dəq).**<br>**2.1.1.** Qruplara didaktik sorğu vərəqləri paylanır və suallar əsasında təqdimat hazırlamaq tapşırılır. Didaktik vərəqlərdə aşağıda göstərilən suallar verilə bilər.<br>• Naqillərin ardıcıl birləşməsi nəyə deyilir?<br>• Ardıcıl birləşdirilmiş naqillərdə cərəyan şiddəti nəyə bərabərdir?<br>• Ardıcıl birləşmədə dövrənin ümumi gərginliyi nəyə bərabərdir?<br>•Ardıcıl birləşdirilmiş dövrənin ümumi müqaviməti necə təyin edilir?<br>• Ardıcıl birləşdirilmiş eyni R müqavimətli n sayda naqildən ibarət dövrənin ümumi müqaviməti necə təyin edilir?<br><br>**2.2. Qrup liderlərinin təqdimatının təşkili (12 dəq)**<br><br>**2.2.1**. Qrup liderləri elektron (yaxud poster) təqdimatı edirlər. Hər təqdimat üçün 3 dəqiqə vaxt verilir.<br>2.2.2. Sualların cavabının ekranda illüstrasiyası [8, 161-167, 177-182].<br>Müəllim sualların doğru cavablarını təqdimatdan sonra illüstrasiya edir.<br>• *Qanun və təriflər:* Birinci naqilin sonu ikincinin başlanğıcı, ikinci naqilin sonu üçüncünün başlanğıcı ilə və s. birləşməsindən yaranan elektrik dövrəsi ardıcıl birləşdirilmiş dövrə adlanır.<br>• Ardıcıl birləşmədə dövrənin istənilən hissəsində cərəyan şiddəti eynidir: $I=I_1=I_2$<br>• Dövrənin uclarındakı gərginlik ayrı-ayrı naqillərin ucarındakı gərginliklərin cəminə bərabərdir: $U=U_1+ U_2$<br>• Ardıcıl birləşdirilmiş naqillərin ümumi müqaviməti ayrı ayrı naqillərin müqavimətləri cəminə bərabərdir. $R_a=R_1+R_2$<br>• Ardıcıl birləşdirilmiş eyni R müqavimətli n sayda naqildən ibarət dövrənin ümumi müqaviməti bir naqilin müqavimətindən n dəfə böyükdür: $R_a= n*R$<br><br>**2.3. İşin icra mərhələlərinin soruşulması (6 dəq).**<br>Sinifdə virtual praktik işin icra ardıcıllığı frontal sorğu keçirməklə soruşulur. Şagirdlər müəllimin əvvəlki dərsdə onlara verdiyi didaktik material əsasında [1] virtual praktik işin icra mərhələlərinin düzgün ardıcıllığını qeyd edirlər. | • Tənqidi düşünmə<br>• Müzakirəetmə<br>• Ünsiyyət<br>• Əməkdaşlıq<br>• Fərziyyə irəli sürmə<br>• Mülahizəsini əsaslandırmaq<br>• Təqdimetmə<br>• Tətbiqetmə<br>• Rəqabət aparmaq<br>• Problem həlletmə<br>• Kollektivçilik<br>• Fiziki qanunauyğunluğu mənimsədiyini sərbəst nümayişetmə |

| | |
|---|---|
| Virtual elektrik dövrəsinin qurulması.<br>1. İki elektrik lampası, açar və cərəyan mənbəyindən ibarət ardıcıl birləşmə sxeminin çəkilməsi;<br>2. Elektrik sxeminə əsasən dövrənin qurulması;<br>3. Dövrənin sxeminə uyğun olaraq voltmetr paralel, ampermetr isə ardıcıl qoşulmaqla ardıcıl birləşmiş dövrənin xarakteristik kəmiyyətləri sabit cərəyan qanununa əsasən ölçülür. | |
| **III mərhələ. Virtual praktik işin icrasının təşkili (12 dəq)** | |
| **3.1. Praktik işin icrası (10 dəq).**<br>Virtual laboratoriya işinin icrasına başlamaq üçün əvvəlcə § 53-dən laboratoriya işləri bloku açılır [10] . Bu zaman animasiya ekranına sabit cərəyan mənbəyi, iki etalon müqavimət, ampermetr, voltmetr, reostat və açardan ibarət dövrə gəlir. Animasiya ekranında yerləşən açarın üzərinə basdıqda dövrə qapanır, lampalar közərir (şəkil 1). | • Kompüter texnologiyasından istifadə edə bilmək<br>• Virtual təlim resursundan istifadə edə bilmək |
| **Şəkil 1.** | |
| Dövrəni qapadıqdan sonra, voltmetrin sıxaclarına birləşdirilmiş naqillərin sərbəst uclarını əvvəlcə birinci, sonra ikinci, daha sonra isə, birinci və ikinci naqillərin uclarına toxundurun. Hər dəfə voltmetr və ampermetrin göstərişlərini 2-ci cədvəldə qeyd edin (şəkil 2). | • Əməkdaşlıq<br>• Ünsiyyət qurmaq<br>• Kollektivdə işləmək<br>• Sorğu və məlumat cədvəllərindən istifadə etmək |
| **Şəkil 2.** | |
| Laboratoriya işinin növbəti mərhələsinə də reostat vasitəsilə dövrədəki cərəyan şiddətini dəyişməklə təcrübəni daha iki dəfə təkrar edin və ölçmələrin nəticələrini cədvəldə qeyd edin (şəkil 3). | • Kompüter savadlılığı<br>• Ölçü cihazlarının xarakteristikalarını müəyyən etmək |






**Şəkil 3.**

Virtual praktik iş zamanı tam dövrə müqaviməti üçün hesablamadan alınan qiyməti ardıcıl birləşdirilən iki müqavimətin cəmi ($R=R_1+R_2$) ilə müqayisə edilir. Ölçü və hesablamalardan alınan nəticələri müqayisə etməklə iş davam etdirilir. Daha sonra dövrə uclarındakı U gərginliyi, etalon müqavimətlərin uclarındakı $U_1$ və $U_2$ gərginliklərin cəmi ilə müqayisə edilir. Beləliklə, bütün ölçmələr aparıldıqdan sonra Om qanununa görə dövrənin ümumi müqaviməti, gərginliyi təyin edilir:

$$R_1 = \frac{U_1}{I} = \frac{1}{0{,}5}\frac{V}{A} = 2\ Om.$$

$$R_2 = \frac{U_2}{I} = \frac{1}{0{,}5}\frac{V}{A} = 2\ Om$$

$$R_3 = \frac{U_3}{I} = \frac{2}{0{,}5}\frac{V}{A} = 4\ Om$$

$$R_a = R_1 + R_2 = 2Om + 2Om = 4\ Om$$

$$U = U_1 + U_2 = 1V + 1V = 2\ V$$

Hesablamaların nəticəsi qeyd edilməklə aşağıdakı virtual cədvəl tamamlanır (cədvəl 2).

- Riyazi savadlılıq
- Elmi savadlılıq
- Müqayisə etmə
- Riyazi savadlılıq
- Müqayisə etmə
- Nəticəçıxarma

**Cədvəl 2.**

| *S/s* | *$U_1$, (V)* | *$U_2$, (V)* | *U, (V)* | *I, (A)* | $R_1 = \left(\frac{U_1}{I}\right)$, $(Om)$ | $R_2 = \left(\frac{U_2}{I}\right)$, $(Om)$ | $R_3 = \left(\frac{U_1}{I}\right)$, $(Om)$ | *$R_a=R_1+R_2$*, $(Om)$ | *$U_a=U_1+U_2$*, *(V)* |
|---|---|---|---|---|---|---|---|---|---|
| **1.** | *1* | *1* | *2* | *0,5* | 2 | 2 | 4 | 4 | 2 |
| **2.** | | | | | | | | | |
| **3.** | | | | | | | | | |

**3.2. Nəticələrin təqdimatı (2 dəq).**
Qruplar virtual cədvəli qeyd edilmiş poster (və ya kompüter) əsasında təqdimat edirlər.

- Müqayisə etmə
- Nəticəçıxarma

**IV mərhələ. Qiymətləndirmə (5 dəq)**

*Qiymətləndirmə* kəmiyyət və keyfiyyət baxımından həyata keçirilə bilər.
4.1. Kəmiyyətcə qiymətləndirmə – maksimum 100 bal.
4.1.1. İşə aid nəzəri məlumatın təkrarlanması mərhələsində qrup təqdimatlarının qiymətləndirilməsi – maksimum 40 bal.

4.1.2. İşin icra mərhələlərinin düzgün təsvirinin qiymətləndirilməsi – maksimum 10 bal.
4.1.3. Virtual praktik işin icrasının qiymətləndirilməsi – maksimum 40 bal.
4.1.4. Tamamlanmış virtual cədvəlin və nəticələrin illüstrasiyasının qiymətləndirilməsi – maksimum 10 bal.
4.2. Keyfiyyətcə qiymətləndirmə.
Aşağıdakı meyarlar əsasında təlim məqsədlərinə nail olmaq səviyyəsi müəyyən edilə bilər [9, 168-170].
*Qiymətləndirmə.* Müəllim dərsin təlim məqsədlərinə nail olmaq dərəcəsini aşağıdakı meyarlar üzrə qiymətləndirə bilər.
*Qiymətləndirmə meyarları*: şərhetmə, təcrübə icraetmə, dövrəqurma.

| MM-lar | I səviyyə | II səviyyə | III səviyyə | IV səviyyə |
|---|---|---|---|---|
| Şərhetmə | Elektrik işlədicilərini dövrəyə ardıcıl birləşdirilmə qanunauyğunluqlarını deklorativ bilik əsasında şərh edir. | Elektrik işlədicilərini dövrəyə ardıcıl birləşdirilmə qanunauyğunluqlarını anlayaraq şərh edir. | Elektrik işlədicilərinin dövrəyə ardıcıl birləşdirilmə qanunauyğunluqlarını təhlil əsasında şərh edir. | Elektrik işlədicilərinin dövrəyə ardıcıl birləşdirilmə qanunauyğunluqlarını dəyərləndirərək şərh edir. |
| Təcrübə-icraetmə | Ardıcıl birləşməyə aid sadə təcrübələri yalnız qrup fəaliyyətində icra edir. | Ardıcıl birləşməyə aid sadə təcrübələri müstəqil icra edir. | Ardıcıl birləşməyə aid sadə təcrübələrin nəticələrini anlayaraq icra edir. | Ardıcıl birləşməyə aid sadə təcrübələr n nəticəsini dəyərləndirərək icra edir. |
| Dövrəqurma | Apardığı araşdırmadan formal nəticə çıxarmaqla dövrəni qurur və onu təqdim etməyi bacarır. | Apardığı araşdırmadan anlayaraq düzgün nəticə çıxarmaqla dövrəni qurur və onu təqdim etməy bacarır. | Apardığı araşdırmadan təhlil əsasında düzgün nəticə çıxarmaqla dövrəni qurur və onu təqdim etməyi bacarır. | Apardığı araşdırmadan ümumiləşmələr əsasında nəticələri düzgün qiymətləndirərək dövrəni qurur və onu təqdim etməyi bacarır. |

## *NƏTİCƏ*

1. Ümumtəhsil müəssisələrinin VIII sinfində fizikadan "Naqillərin ardıcıl birləşdirilməsi" virtual praktik iş dərsinin modelləşdirilməsi nümunəsində müasir interaktiv pedaqoji texnologiyaların inkişaf imkanları ilə uyğunluğu aşkar olundu.

2. Ümumtəhsil müəssisələrində fizika təlimində rəqəmsal resurslardan sistemli istifadə edilməsi kursun təlim strategiyasının daha da zənginləşdirilməsinin mühüm istiqamətlərindən biri kimi şagirdlərin fənnə maraqlarının, bilik və bacarıqlarının yüksəlməsində əhəmiyyətli rol oynadığı göründü.

**Ədəbiyyat:**

1. Abdurazaqov R.R. Yeni nəsil multimedia dərsliyi: Metodik vəsait. II hissə: Elektrodinamika, Optika, Kvant fizikası. – Bakı: Baknəşr, 2007, – 48 s.
2. Abdurazaqov R.R., Məsimov N.M., Padarov X.İ. Elektron dərsliklər əsasında fəal tədrisin təşkili məsələləri // Azərbaycan məktəbi, 2008, № 5. – s. 62-68.
3. Abdurazaqov R.R. Fizika tədrisində yeni informasiya texnologiyalarından istifadənin rolu. Fasiləsiz pedaqoji təhsildə elektron təlim texnologiyalarının tətbiqi. // Respublika elmi-praktik konfransının materialları. – Bakı, 2010. – s. 125-129.

4. Abdurazaqov R.R., Məsimov N.M., Cəlilova S.X. Təlim prosesinə yeni informasiya texnologiyalarının tətbiqinin müsbət cəhətləri. Nəzəriyyə ilə təcrübənin əlaqəsindəki rolu // Azərbaycan məktəbi, 2011, № 2, – s. 68-71.
5. İsmayılov İ.N. Fizikanın tədrisində yeni informasiya texnologiyalarından istifadə (laboratoriya praktikumu): Dərs vəsaiti. – Bakı, 2017, – 176 s.
6. İsmayılov İ.N., Abdullayev. C.S. Təlimin texniki vasitələri və yeni informasiya texnologiyaları. Tədrisdə onlardan istifadə metodikası (fizika materialları əsasında): Dərs vəsaiti. – Bakı: ABU, "Təhsil", 2006, – 358 s
7. İsmayılov İ.N. Ümumtəhsil məktəblərində fizikanın tədrisində yeni informasiya texnologiyalarından istifadə üzrə işin sistemi.
8. Murquzov M.İ., Abdurazaqov R.R., Əliyev R.M., Əliyeva D.Z. Fizika -8: Dərslik. – Bakı: Bakınəşr, 2019.
9. Murquzov M.İ., Abdurazaqov R.R., Əliyev R.M., Əliyeva D.Z. Fizika 8. Müəllimlər üçün metodik vəsait. – Bakı: Bakınəşr, 2019.
10. Murquzov M.İ., Abdurazaqov R.R. Fizikadan multimedia. 4 CD diskindən 3-cü disk: Elektrodinamika, Optika, Kvant fizikası. – Bakı: Bakınəşr, 2007.

**E-mail.** miss.gulkam@mail.ru
**Rəyçilər:** *ped.üz.fəl.dok., dos*. **N.L. Axundov,**
ped.ü. fəl.dok., dos. **S.X. Cəlilova**
**Redaksiyaya daxil olub:** 17.04.2023

*372.854*

***Səfər Əmin oğlu Raziyev***
*biologiya üzrə fəlsəfə doktoru, dosent*
*UNEC-in Zaqatala filialı*
*https://orcid.org/0000-0003-3544-814X*

***Gülzar Nizam qızı Quliyeva***
*kimya üzrə fəlsəfə doktoru, dosent*
*Sumqayıt Dövlət Universiteti*
*https://orcid.org/0000-0001-9864-9921*

***Sevinc Nizam qızı Cəfərova***
*böyük laborant*
*Sumqayıt Dövlət Universiteti*
*https://orcid.org/ 0009-0001-9743-2437*

## ELEKTROLİZ QANUNLARININ TƏDRİSİNDƏ İNTEQRASİYA

***Сафар Амин оглы Разиев***
*доктор философии по биологии, доцент*
*Закатальского филиала UNEC*

***Гюльзар Низам гызы Гулиева***
*доктор философии по химии, доцент*
*Сумгаитского Государственного Университета*

***Севиндж Низам гызы Джафарова***
*старший лаборант*
*Сумгаитского Государственного Университета*

## ИНТЕГРАЦИЯ В ПРЕПОДАВАНИИ ЗАКОНОВ ЭЛЕКТРОЛИЗА

***Safar Amin Raziyev***
*doctor of philosophy in biology,, assistant professor at*
*Zagatala branch of UNEC*

***Gulzar Nizam Guliyeva***
*doctor of philosophy in chemistry, assistant professor at*
*Sumqait State University*

***Sevinj Nizam Jafarova***
*head laborant at*
*Sumqait State University*

## INTEGRATION IN THE TEACHING OF THE LAWS OF ELECTROLYSIS

**Xülasə.** Məqalədə tədris prosesinin keyfiyyətini artırmaq üçün və eləcə də elektroliz prosesini daha yaxşı mənimsəmək üçün kimya və fizika fənləri arasında əlaqəyə istinad olunmuşdur. İnteqrasiya vasitəsilə öyrənənlərin mənimsəməsini asanlaşdırmaq, eyni zamanda, təlimə marağını artırmaq mümkündür. Həm də bu zaman təlim yükü azaldığından tədris prosesinin səmərəliliyi artmış olur. Məqalədə tədris prosesində elektroliz prosesinin izahı zamanı kimya və fizika fənlərinin inteqrasiyası əsas xətt kimi götürülür.

***Açar sözlər:*** *kimya, fizika, üsul, laboratoriya, təlim*

**Резюме.** В статье речь идет о взаимосвязи между химией и физикой для повышения качества учебного процесса, а также для лучшего освоения процесса электролиза. Благодаря интеграции можно облегчить обучение учащихся и в то же время повысить их интерес к обучению. Также, поскольку снижается учебная нагрузка, повышается эффективность учебного процесса.

В статье интеграция химии и физики взята за основную линию при объяснении процесса электролиза в учебном процессе.

***Ключевые слова:*** *химия, физика, метод, лаборатория, обучение*

**Summary.** The article referred to the relationship between chemistry and physics to improve the quality of the teaching process and also to master the electrolysis process better. Through integration, it is possible to facilitate the learning of learners and at the same time increase their interest in learning. Also, since the training load is reduced, the efficiency of the teaching process increases.

In the article, the integration of chemistry and physics is taken as the main line when explaining the process of electrolysis in the educational process.

***Key words:*** *chemistry, physics, methods, laboratory, teaching*

Praktik vərdişlərin əldə olunması istiqamətində işlərin qurulması dövrün tələblərinə cavab verən kompetensiyalara malik şəxsiyyət yetişdirilməsinə səbəb olur ki, bu da yetişən gənclərin gələcəkdə sosial mühitə adaptasiyasını asanlaşdırır. Ona görə də ilk növbədə, məşğələləri qruplarla iş təlim üsulu ilə keçirilməsini tövsiyə edirik. Qruplara bölünmə öyrənənlərin öz ixtiyarlarına buraxılır və onlar 4-6 nəfərlik qruplara bölünürlər. Növbəti mərhələdə tədqiqatın aparılması nəzərdə tutulur, bunun üçün öyrənənlərə tapşırıq vərəqləri paylanılır və bu yalnız onları tədqiqatlara istiqamətləndirmək məqsədi daşıyır. Daha sonrakı mərhələdə öyrənənlər informasiya mübadiləsini həyata keçirirlər. Bu zaman "Karusel" üsulundan istifadə edilir. İnformasiya müzakirəsini bitirdikdən sonra alınan nəticələr ümumiləşdirilir. Qoyulan məsələnin vacibliyini nəzərə alaraq öyrənənlər tərəfindən son dövrlərə qədər bu sahədə görülmüş işləri analiz edirlər. Qruplar növbə ilə təqdimatlarını nümayiş etdirirlər. Şərti olaraq təyin olunmuş lider öz fikirlərini yoldaşları ilə müzakirə edərək hər konkret məsələ barədə nəticələri açıqlayır. Bu prosesdə digər qrupların da debat təşkil etməsi mümkündür. Müzakirələrdən sonra ümumi nəticəyə gəlinir.

Biz bu işdə Faradeyin elektroliz qanunları üzrə aşağıdakı istiqamətlərdə müzakirələr aparmağı lazım bildik: ionlar, elektrolitik dissosiasiya, elektroliz, Faradey qanunlarının: Faradeyin I qanunu, Faradeyin II qanununun elmdə, məişətdə, texnikada, təbabətdə, qalvanoplastika, qalvanostegiya və s. tətbiqi. Müzakirələrin müxtəlif yaş səviyyəli yaş qruplarında aparılması nəticələrin dəqiq olacağına zəmanət verir. Sözsüz ki, dərsin məqsədi elektroliz prosesini öyrənmək üçün kimya və fizika fənnindən qazanılan biliklərin inteqrasiyasına əsaslanaraq elm və təcrübə arasında əlaqə yaratmaqdan ibarətdir.

Tapşırıqların təcrübi və məsələ həlli yolu ilə həlli elektroliz hadisəsinin mahiyyətini açmaq, elektrodda baş verən prosesləri müəyyən etmək bacarığını formalaşdırmaq, elektrolizin geniş tətbiqi əhəmiyyətini göstərməkdən ibarət olması fizika və kimya fənlərinə idraki maraq, təfəkkür, problemlərin həllində və eksperimental tapşırıqların yerinə yetirilməsində nəzəri biliklərdən praktikada istifadə etmək bacarığını inkişaf etdirmək, əlavə ədəbiyyatla işləmək bacarığını inkişaf etdirmək, tədris materialının təqdimatını hazırlamaq kimi səriştələrin inkişafını təmin edir. Resurslar kimi kompüter, proyektor, ekran, "Elektroliz"in təqdimatı, elektroliz qanununun keyfiyyətcə yoxlanılması üzrə eksperimental iş üçün avadanlıq, enerji mənbəyi, birləşdirici naqillər, mis sulfat məhlulu olan şüşə, cüt elektrodlar açardır.





Laboratoriya işlərinin görülməsi üçün tövsiyələr:

1. Tərəzidən istifadə edərək katodun kütləsini m1 təyin edin.
2. Şəkildə göstərilən alətlərdən istifadə edərək elektrik dövrəsini yığın.
3. Elektrodları məhlul olan qaba daxil edin, açarı bağlayın və eyni zamanda saniyəölçəni yandırın, dövrədə cərəyanı 2 A-ə təyin edin. 15 dəqiqədən sonra. dairəni açın. Katodu filtr kağızı ilə yumşaq bir şəkildə silin.
4. Elektrolizdən sonra katodun m2 kütləsini təyin edin.
5. Elektrod üzərində buraxılan mis m kütləsini hesablayın.
6. Elektroliz zamanı elektrolitdən keçən q yükünü təyin edin.
7. Elektrodu yenidən məhlul olan qaba endirin, açarı bağlayın və eyni zamanda saniyəölçəni işə salın.
8. Katodun kütləsinin ölçülməsini hər 5 dəqiqədən bir daha 4 dəfə təkrarlayın, hər dəfə elektrodda buraxılan misin kütləsini və bu müddət ərzində elektrolitdən keçən yükü hesablayın.
9. Ölçmə və hesablamaların nəticələrini laboratoriya işləri üçün dəftərdəki cədvələ qeyd edin.

| **№** | **Katodun kütləsi, m1, kq** | **Təcrübədən sonra katodun kütləsi, m2 , kq** | **Misin kütləsi, m, kq** | **Zaman, t, s** | **Cərəyan şiddəti, İ,A** | **Yük, q, K** |
|---|---|---|---|---|---|---|
| **1** | | | | | | |
| **2** | | | | | | |
| **3** | | | | | | |
| **4** | | | | | | |
| **5** | | | | | | |

10. Katodda çökdürülmüş mis kütləsinin elektrolitdən keçən yükdən asılılığının qrafikini çəkin.
11. Qrafikdə orta nöqtəni tapın. Misin elektrokimyəvi ekvivalentinin qiymətini hesablayın.
12. Nəticəni laboratoriya işi üçün dəftərə yazın: nə ölçdünüz və nəticə nə oldu.

Qiymətləndirmə mərhələsi xüsusi əhəmiyyət kəsb edir. Bu mərhələ həm qruplar arasında, həm də öyrədən tərəfindən həyata keçirilir. Qiymətləndirmə zamanı qrupların fəallıq, əməkdaşlıq, tərtibat, təqdimatı və s. nəzərə alınmalıdır.

Son zamanlar fənlərin inteqrasiyasının daha fəqrli şəkildə gündəmə gəlməsi və təhsilin keyfiyyətinin yüksəldilməsində əhəmiyyətinin artması metodika sahəsində çalışan tədqiqatçıların bu sahədə xüsusilə daha inkişafyönlü məsələlərə diqqət yetirməsinə təkan vermişdir. Təd-

qiqatımızda məqsəd müasir təlim metodları, innovasiyalar, informasiya kommunikasiya texnologiyaları (İKT), fənlərarası inteqrasiya və s. istifadə etməklə yuxarıda deyilənlərə nail olmaqdır. Öyrənənlər Faradey qanunlarını fənlərarası inteqrasiya prizmasından dərk edərək elektroliz, elektrolitik dissosiasiya haqqında məlumata malik olmaqla yanaşı, Faradeyin I və II qanunları, onların kompleks formada öyrənilməsi, həmin qanunların tətbiq sahələri, qalvanoplastika, qalvanostegiya və s. haqda biliklərin praktik nəticələrini dərk etmiş olacaqlar. Bu tədqiqatlarda məqsədlərdən biri də fizika və kimya fənlərinin təkcə bu qanunlar çərçivəsində nə qədər ortaq məsələlərinin olduğunu dərk etməsidir.

Təlim prosesində öyrənənlərin tapşırıqlar vasitəsilə əldə edəcəkləri nəticələrə diqqət yetirək:

1. Anlayışların təqdimatı: elektrolitik dissosiasiya, ərintilərin və məhlulların fiziki və kimyəvi baxımdan elektrolizi və onların mənimsənilməsi. Faradey qanununun tətbiqi, praktiki məsələlərin həlli üçün istifadəsi.

2. Hesablama və keyfiyyət məsələlərini həll etmək, elektroliz zamanı baş verən kimyəvi reaksiyaların tənliklərini tərtib etmək və təcrübənin aparılması texnikası bacarıqlarının formalaşdırılması.

3. Hər bir şagirdin tədris prosesində iştirakı üçün optimal şəraitin yaradılması, öyrənənlərin müstəqil işi ilə birgə komandada işləmək vərdişlərinin formalaşdırılması.

4. Kommunikativ və informasiya bacarıqlarının inkişafı.

Tədqiqat üsullarını seçərkən biz öyrənənlərin gələcəkdə kollektiv işə uyğunlaşmasını nəzərə almışıq, çünki "Əqli hücum" üsulunda qrup üzvləri qarşıya qoyulmuş məsələlərin həlli üçün səylərini birləşdirilməli olurlar. Konkret bir mövzu üzrə fəaliyyət üçün onlar öz aralarında kimya elmindən məlum olan mol, molyar kütlə, valentlik, Avaqadro sabiti, qatılıq və s. kimi anlayışların qrup üzvlərindən kimin daha yaxşı məlumata malik olmasını müzakirə edirlər. Qanunların yuxarıda adları çəkilən ayrı-ayrı sahələrdə tətbiqinin araşdırılması üçün qrup üzvləri təhsilin prinsiplərindən olan demokratik prinsipi üstün tutaraq öz aralarından növbəlilik əsasında lider seçirlər. O, qrup üzvlərinin potensialını nəzərə alaraq iş bölgüsü aparır. Bu proses hər bir qrupda bir-birləri ilə təmas yaratmadan həyata keçirilir. Bu, yuxarıda dediyimiz "Əqli hücum" üsulunun üstün cəhətlərindən biridir və öyrənənlərin idrak qabiliyyətlərinin inkişafında mühüm rol oynayır. Proseslərin gedişində "Karusel" üsulu tətbiq edilir. İş prosesinin nəticəsi elektron və bu mümkün olmazsa, yazılı formada həyata keçirilir.

Son məqsəd əldə edilmiş nəticələrin qruplar arasında müqayisə edilərək daha üstün olanının ortaya çıxarılmasıdır. Faradeyin elektroliz qanunlarının nə dərəcədə praktik əhəmiyyətə malik olması hər bir qrupun araşdırmasının yekunu olaraq ortaya çıxır. Öyrənənlər qanunların, ilk növbədə, nəzəri tərəflərini araşdırılır. Bunun ardınca onların məişət, texnika, tibb və s. sahələrdə tətbiqinin hər qrup üçün necə işıqlandırıldığı tutuşdurulur. Bu zaman Venn diaqramından istifadə edilir. Son olaraq elektroliz qanunlarının öyrənilməsində onların "Əqli hücum", "Karusel" və Venn diaqramının qrupların son nəticələri təqdim etməsində nə dərəcədə effektiv olduğu ortaya çıxır.

Refleksiya mərhələsində dərsi yekunlaşdırıb qiymətləndirməni bu ifadələrin köməyi ilə həyata keçiririk:




Tədqiqatların müxtəlif səviyyəli öyrənənlərlə aparılması nəticələrin dəqiqliyinə müsbət təsir etdi. Bu, həm də seçilən tədqiqat metodlarının düzgünlüyünə dəlalət edir. Öyrənənlər təqdimatlarda sonuncu dediklərimiz barədə də məlumat verirlər. Ev tapşırığı olaraq, həlli öyrənənlərə kömək edəcək mövzuya uyğun müxtəlif səviyyəli tapşırıqların seçimini təklif edirik. Sonda müəllim öyrənənlərə deyir ki, bu gün dərsimizdə elektroliz prosesinin öyrənilməsinə həm kimya, həm də fizika elmi baxımından müxtəlif yanaşmalardan istifadə etdik və bizim tədqiqatçı, yaradıcı işlərimiz nəticəsində hər biriniz kəşf sevincini, bir-birinizin elmi və praktik cəhətdən qarşılıqlı zənginləşməni hiss etdiniz. Dərs zama-

nı məlumat mübadiləsi ağıldan və təcrübədən keçən yeni hissləri dərk etməyə, biliyə səbəb oldu. Nəticə olaraq onun da bildirmək lazımdır ki, fizika və kimya fənlərinin müştərək termin və kəmiyyətlərin bu qanunların tədrisində istifadə edilməsi inteqrativlik üçün ən gözəl nümunədir.

**Problemin aktuallığı.** Hazırda elmlərin inteqrasiyası günün tələbinə çevrilmişdir. Bu prosesdə bir elmin tədrisində digər elmin materialından mexaniki istifadə didaktik məqsədlərə çatmaqda bir o qədər də effektli ola bilməz. Bunun üçün bir fənnin aprobasiya olunmuş qanununun digər fəndə tətbiqi həyata keçirilməlidir.

**Problemin elmi yeniliyi.** Faradey qanunlarının öyrənilməsi, müasir üsullarla inteqrativ şəkildə tədrisi təlim prosesinə yeni nəfəs gətirir, mövzunun qavranılmasını asanlaşdırır.

**Praktik əhəmiyyəti və tətbiqi.** Gələcəkdə fizika ilə digər fənlərin də inteqrasiyası üzrə tədqiqatları davam etdirmək və çoxfənli inteqrasiyanın praktik nəticələr verməsində rolunu araşdırmaq qarşımızda bir vəzifə kimi durur.

**Ədəbiyyat:**

1. Əsgərov Ş.G. "Tərəqqinin fəlsəfəsi". UNEC Espert, 2016, № 2, – s. 6-7I
2. Podlasty I.P. (2000) Pedagogy of primary school: tutorial for students of pedagogical colleges: Moscow, Humanitarian publishing centre: VLADO
3. Raziyev S.Ə. Fizikanın innovativ təlim metodları və fənlərarası inteqrasiya ilə tədrisi təcrübəsindən // BDU, Beynəlxalq konfrans, 4-5 aprel 2019, – s. 340-341
4. http://schooled.ru/lesson/physics/9klas/9klas.files/image153.jpg
5. https://nsportal.ru/shkola/fizika/library/2018/10/30/urok-fiziki-v-profilnom-8-klasse-po-teme-laboratornaya-rabota-po
6. https://koncpekt.ru/starshie-klassy/konspekty-uroka/fizika-11klass/6789-zakon-elektroliza.html

**E-mail:** q.gulzar@mail.ru

**Rəyçilər:** *tex.ü.fəls,dok., dos.* **F.Ə. Mirzəyev,**
*kim.ü.fəls.dok.,* **V.N. Əhmədov**
**Redaksiyaya daxil olub:** 09.03.2023

*UOT 372.800.2*

***Mehriban Ağa qızı Həsənova***
*Gəncə Dövlət Universitetinin dosenti*
*Orcid İd:0000-0002-7627-5196*

***Leyla Elçin qızı Mehdiyeva***
*Gəncə Dövlət Universitetinin müəllimi*
*Orcid İD:0000 0003 2870 2533*

# İNFORMATİKA MÜƏLLİMLİYİ İXTİSASI ÜZRƏ TƏDRİS PROQRAMLARI VƏ DƏRSLİKLƏRİNİN TƏHLİLİ

***Мехрибан Ага гызы Гасанова***
*доцент Гянджинского Государственного Университета*

***Лейла Эльчин гызы Мехтиева***
*преподаватель Гянджинского Государственного Университета*

# АНАЛИЗ УЧЕБНЫХ ПРОГРАММ И УЧЕБНИКОВ ПО СПЕЦИАЛЬНОСТИ УЧИТЕЛЯ ИНФОРМАТИКИ

***Mehriban Agha Hasanova***
*associate professor at Ganja State University*

***Leyla Elchin Mehdiyeva***
*lecturer at Ganja State University*

# ANALYSIS OF CURRICULUM AND TEXTBOOKS IN THE SPECIALTY OF TEACHER OF INFORMATION SCIENCE

**Xülasə.** Təhsilin məzmunu, onun tərbiyələndirici və inkşafetdirici xüsusiyyətləri tədris planları, proqramları və nəhayət, dərsliklərdə konkretləşdirilməklə öz əksini tapır. Məqalədə bu vəzifələrin həlli ilə əlaqədar məsələlər araşdırılmışdır. Göstərilmişdir ki, dərsliklər və proqramlar hazırlanarkən insanların psixologiyasında, düşünmə, qavrama qabiliyyət və prosesində, həyat şəraitindəki amillərin hal-hazırkı vəziyyəti və eyni zamanda, 5-10 il sonrakı vəziyyəti ehtimal edilərək nəzərə alınması zəruridir.
***Açar sözlər:*** *təlimin məqsədi, tədris planı, tədris proqramı, dərslik, kitab yazan müəlliflər, dərsliklərin didaktik funksiyaları*

**Резюме.** Содержание образования, его воспитательные и развивающие особенности отражаются в конкретизации учебных планов, программ и, наконец, учебников. В статье рассматриваются вопросы, связанные с решением этих проблем. Было показано, что при разработке учебников и программ необходимо учитывать факторы психологии, мышления, восприятия и процессов происходящих в жизни людей, их текущую жизненную ситуацию, а также ситуацию через 5-10 лет.
***Ключевые слова:*** *цель обучения, учебный план, учебная программа, учебник, авторы книг, дидактические функции учебников*

**Summary.** The content of education, its edifying and developing features are reflected by concretizing curricula, programs and, finally, textbooks. The article examines issues related to the solution of these tasks. It was shown that when preparing textbooks and programs, it is necessary to take into account the factors in the psychology, thinking, perception and process of people, the current state of life and at the same time the state of 5-10 years later.
***Key words:*** *purpose of training, curriculum, curriculum, textbook, book authors, didactic functions of textbooks*

Məlumdur ki, kitab yazan müəlliflər təhsilin məzmununun strukturunu seçəndə təlimin məqsədi, öyrənilən biliklərin xarakteri və xüsusiyyətləri, tələbələrin oxuma səviyyəsinə verilən tələbləri nəzərə alırlar. Bunun üçün məzmun müəyyən edilməsi çox vacib məsələdir. Tədris edilən fənlərin məzmunu isə 3 əsas sənəddə öz əksini tapır: 1) tədris planı 2) tədris proqramı 3) dərslik.

Hal-hazırda tədris prosesinin məzmunu tədris planı, fənlər üzrə tədris proqramları ilə müəyyən olunur və dərslik və dərs vəsaitlərində, informasiyanı toplayıb saxlayan elektron avadanlıqlarda (video disklərdə, video kasetlərdə, fləş kartlarda, bulud texnologiyası, kompüter avadanlığında) əks olunur. Tədris planı tədris müəssisəsinin sertifikatı hesab olunur, əsasən aşağıdakıları özündə əks etdirir:

1) semestrlərin və tətillərin müddətini, tədris ilini;

2) öyrənilən fənlərin tədris müəssisəsində tam siyahısını;

3) təlim illəri üzrə fənlərin bölüşdürülməsini;

4) hər bir fənnin bütün təlim müddətində və hər bir qrupda öyrənilməsinə ayrılan saatların miqdarını;

5) hər bir fənnin öyrənilməsinə verilən həftəlik saatların miqdarını;

6) praktikumların müddətini, strukturunu və sair.

Tədris planında cəmiyyətin qəbul etdiyi təhsil, tərbiyə idealı, müəyyənləşdirilmiş məqsədlər, təhsilin məzmununun formalaşdırılması konsepsiyası da öz əksini tapır. Buradan belə çıxır ki, bu və ya digər ali məktəbdə öyrədilən fənləri, onların qrup üzrə tədris ardıcıllığını, hər bir fənnə ayrılan saatların miqdarını, tələbələrin fəaliyyət növlərini, təhsilin müddətini əks etdirən sənədə tədris planı deyilir. Tədris planına daxil edilən fənlər məcburi və seçmə fənlərə ayrılır. Tədris planları həmin sahəyə rəhbərlik edən işçilər (dekan, kafedra müdirləri və s.) tərəfindən işlənib hazırlanır və təsdiq olunur.

Tədris planı əsasında bütün fənlər üzrə tədris proqramları tərtib olunur. Tədris proqramı 2 hissədən: izahat vərəqindən və tədris proqramının məzmunundan ibarət olur. İzahat vərəqində tədris fənninin vəzifələri, tərbiyə və inkişaf imkanları, müəllimə aid olan metodik göstərişlər qeyd edilir. Tədris proqramlarında aşağıdakılar öz əksini tapır:

1) fənnin öyrənilməsinin məqsəd və vəzifələri haqqında izahat vərəqəsi, tələbələrin bilik və bacarıqlarına verilən əsas tələblər, təlimin aparılması üçün tövsiyə olunan forma və metodlar;

2) öyrənilən materialın mövzuya uyğun məzmunu;

3) fənnin ayrı-ayrı mövzularının öyrənilməsinə sərf ediləcəyi saatların təxmini miqdarı;

4) formalaşacaq dünyagörüşünün əsas elementlərinin siyahısı;

5) fənlərarası əlaqəni yaratmaq üçün göstərişlər;

6) tədris avadanlığının və əyani vəsaitlərin siyahısı;

7) tövsiyə edilən ədəbiyyat siyahısı.

Deməli, tədris planına əsasən fənnin hissələrin və ya bölmələrini, mövzularını, mövzulara aid məsələləri, fənn üçün ayrılmış saatları, mövzular üçün izahat vərəqinə malik olan sənədi tədris proqramı adlandırmaq olar.

Təhsildə diferensiallaşma proseslərinin dərinləşməsi ilə əlaqədar olaraq tədris proqramlarının müxtəlif variantları işlənib hazırlanır. Diferensial proqramlardan istifadə etmək, fənni dərindən və ya əksinə, öyrəniləcək qruplar yaratmaq haqqında qərarı ali məktəbin elmi şuraları verir. Tədris ədəbiyyatına ali məktəb dərslikləri, məlumat kitabları, əlavə oxu kitabları və sair aiddir.

Təhsilin məzmunu, onun tərbiyələndirici və inkşafetdirici xüsusiyyətləri dərsliklərdə konkretləşdirilməklə öz əksini tapır. Normal dərslik təhsilin məzmununa verilən bütün tələblərə cavab verməlidir. O, həmçinin maraqlı, mümkün qədər qısa, sadə oxunaqlı, başa düşülən, və estetik tərtibata malik olmalıdır. Dərslik tələbələrin təlim prosesində şüurlu və fəal iştirakını, tədris materialının tam mənimsənilməsini təmin etməlidir. Bu vəzifələrin həlli ilə əlaqədar olaraq dərslik aşağıdakı didaktik funksiyaları yerinə yetirir:

1) Motivasiyalaşdırıcı funksiya. Bu, tələbələri fənni öyrənməyə sövq edən, işə maraq və pozitiv münasibət formalaşdıran stimullar yaratmaqdan ibarətdir;

2) İnformasiya vermə funksiyası. Bu, tələbələrə biliklərin, həmçinin genişləndirmək, dünyagörüşünü formalaşdırmaq üçün mümkün olan bütün yollardan istifadə etməklə informasiya almaq imkanı yaratmaqdan ibarətdir;

3) Nəzarət-korreksiya funksiyası. Bu, tələbələr təlimin gedişini və nəticələrini yoxlamağı,

özünü qiymətləndirməyi və korreksiya imkanları yaratmağı, həmçinin zəruri bacarıq və vərdişləri formalaşdırmaq üçün çalışmaları yerinə yeritməyi nəzərdə tutur.

İnformatika müəllimliyi ixtisasında təhsil alan zaman tələbələr proqramlaşdırmanın əsaslarını, riyazi və kompüter modelləşdirilməsini öyrənir, alqoritmləşdirmə metodları, kompüter qurğuları, məlumatın ötürülməsi və saxlanılması haqqında ümumi anlayışlar əldə edir. Bundan başqa, tələbələr "Analitik həndəsə", "Cəbr", Riyazi analiz, Riyazi məntiq" kimi riyazi fənlər üzrə sistemli biliklər qazanır. Çünki bu biliklər olmasa, proqramlaşdırmanı başa düşmək və tətbiq etmək mümkün olmayacaqdır. Həmçinin pedaqogikanın əsasları, informatika və riyaziyyatın tədrisi metodları, psixologiya fənləri də tədris olunur.

İnformatika müəllimi ixtisası üzrə ali məktəb diplomu alaraq məktəblərdə, orta ixtisas məktəblərində və gələcəkdə magistratura təhsili alıb, ali məktəblərdə də müəllim kimi fəaliyyət göstərmək olar. Həmçinin bu ixtisası bitirdikdə mühəndis-proqramçı, kompüter sistemləri administratoru və s. kimi fəaliyyət göstərmək də olar. Ona görə də bu fəaliyyət sahələrinin hər birində işləmək üçün proqramlaşdırmanı mükəmməl bilmək lazımdır.

Proqramların hazırlanması zamanı daim yenilənmələri və yeni proqram mühitinin xarakteristikasını nəzərə almaq lazımdır. Lakin daim yenilənən müasir zamanda elm və texnikanın inkişaf dinamikasını izləmək çətindir. Dərsliklər və proqramlar hazırlanarkən məhz nəzərə alınması vacib olan məsələlərdən biri də bu inkişaf dinamikasıdır.

Hər bir ixtisas üzrə yeni-yeni kəşflər və yeniliklər meydana gəlir. Bunun üçün dərsliklər və proqramlar hazırlanarkən hal-hazırkı vəziyyətlə bərabər 5-10 il sonranı da nəzərə almaq zəruridir. Çünki hal-hazırda verilən təhsil, tələbələr üçün uzun zaman gərəkli olmalı və onların əmək bazarında tələbatını ödəməlidir.

Texnologiya inkişaf etdikcə cəmiyyət, insanlar da dəyişir. İnsanların psixologiyasında, düşünmə, qavrama qabiliyyət və prosesində, həyat şəraitində dəyişikliklər baş verir. Beləliklə, dərsliklər və proqramlar hazırlanarkən yuxarıda qeyd etdiyimiz amillərin hal-hazırkı vəziyyəti və eyni zamanda, 5-10 il sonrakı vəziyyəti ehtimal edilərək nəzərə alınması zəruridir.

**Problemin aktuallığı.** Azərbaycanda savadlı və yüksək hazırlıqlı proqramçıların hazırlanması aktual və vacib olan bir məsələdir. Bu səbəbdən də Respublikamızın ali məktəblərində və digər tədris ocaqlarında informatika, İKT, Proqramlaşdırma dilləri və s. fənlərin tədrisində istifadə olunan dərsliklər günün tələblərinə cavab verməlidir. Məqalədə bu istiqamətdə məsələlərə toxunulduğu üçün onun aktuallığı aydın olur.

**Problemin elmi yeniliyi** tədris üçün istifadə olunan sənədlərin araşdırılmasıdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə göstərilən nöqsan və edilən tövsiyələri müəlliflərin nəzərə alması dərs vəsaitlərinin günün tələblərinə cavab verməsinə gətirir ki, bu da tədrisin keyfiyyətinin artırılması istiqamətində atılmış addımlar hesab olunur.

**Ədəbiyyat:**


1. 2. Gervais J. The operational definition of competency-based education // The Journal of Competency-Based Education. 2016. № 1. P. 98-106. DOI: 10.1002/cbe2.10113.
2. Chiu M. H., Lin J. W. Modeling competence in science education // Disciplinary and Interdisciplinary Science Education Research. 2019. Vol. 1. No 1. Pp.. 1-11. Available from: https://diser.springeropen.com /counter/pdf/10.1186/s43031-019-0012-y.pdf (date of access: 13.11.2022)
3. Matthews M. R. Models in science and in science education: An introduction // Science & Ed-ucation. 2007. Vol. 16. No 7. P. 647–652. DOI: 10. 1007/s11191-007-9089-3. Available from: https: //l ink. springer. com/article/10. 1007/s11191-007-9089-3#citeas (date of access: 10.11. 2022).
4. Petrova V.N., (2017), Potential of problem based learning technology in high school practice, *Siberian Journal of Psychology*, 65, 112-124.
5. Hasanova M. A., (2021), Eliminating curricula deficiencies for Informatics teacher specialty in Azerbaijan, Turkish Journal of Computer and Mathematics Education (Turcomat), 10, p.2223-2230.
6. Pozdeeva S.I., (2016), Problem and problem-based learning the comparative analysis, *Siberian pedagogical Journal,* 2, 95-99.


**E-mail:** Mehriban -70@mail.ru, n.leyla95@mail.ru
**Rəyçilər:** *ped.elm.dok., prof.* **Ə.Q. Pələngov,**
*fiz.-riy.ü.fəls.dok., dos.* **Ə.Ə. Aslanov**
**Redaksiyaya daxil olub:** 11.04.2023

UOT 372.800.2

**Almaz İsrayıl qızı Həsrət**
Bakı şəhəri, Binəqədi rayonu, R. Əliyev adına 3 nömrəli tam orta məktəbin direktoru
https://orcid.org/0009-0004-7665-5107

# RƏQƏMSAL BACARIQLAR İNFORMASİYA MƏDƏNİYYƏTİNİN TƏMƏLİDİR

**Алмаз Исраил гызы Хасрат**
директор полной средней школы № 3 имени Р. Алиева Бинагадинского района города Баку

# ЦИФРОВЫЕ НАВЫКИ – ОСНОВА ИНФОРМАЦИОННОЙ КУЛЬТУРЫ

**Almaz Israyil Hasrat**
director of complete secondary school No. 3 named after R. Aliyev of Binagadi district of Baku city

# DIGITAL SKILLS ARE THE FOUNDATION OF INFORMATION CULTURE

**Xülasə.** Məqalədə şagirdlərdə rəqəmsal bacarıqlar və informasiya mədəniyyətinin formalaşdırılması müasir məktəb qarşısında duran əsas məqsədlərdən biri kimi təqdim olunur. Qeyd olunur ki, bu məqsədin reallaşdırılması informatika fənninin məzmununa yeni yanaşma tələbini irəli sürür. Müəllif rəqəmsal bacarıqları informasiya mədəniyyətinin təməli hesab edir, informasiya mədəniyyətinin pedaqoji anlayışlar sırasına aid olduğunu vurğulayır. Beynəlxalq, o cümlədən ölkəmiqyaslı əmək və təhsil bazarında rəqabətə davamlı şəxsiyyət yetişdirmək, e-vətəndaş hazırlığı müasir məktəb modelinin əsas missiyalarından biri kimi xarakterizə olunur.

***Açar sözlər:*** *rəqəmsal bacarıqlar, rəqəmsal savadlılıq, informasiya mədəniyyəti, informasiya səriştəsi, e-vətəndaş, informasiya kommunikasiya texnologiyaları*

**Резюме**. В статье формирование цифровых навыков и информационной культуры у учащихся представлено как одна из основных задач, стоящих перед современной школой. Отмечается, что реализация этой цели требует нового подхода к содержанию информатики. Автор считает цифровые навыки основой информационной культуры и подчеркивает, что информационная культура относится к кругу педагогических понятий. Воспитание электронного гражданина, в том числе конкурентоспособной личности как на международном, так и на национальном рынке труда и образования охарактеризовано как одна из основных миссий современной школьной модели.

***Ключевые слова:*** *цифровые навыки, цифровая грамотность, информационная культура, информационная компетентность, электронный гражданин, информационно-коммуникационные технологии*

**Summary**. In the article, the formation of digital skills and information culture in students is presented as one of the main goals facing the modern school. It is noted that the realization of this goal requires a new approach to the content of informatics. The author considers digital skills to be the foundation of information culture, and emphasizes that information culture belongs to the range of pedagogical concepts. E-citizen training is characterized as one of the main missions of the modern school model, to train a competitive personality in the international, including national labor and education market.

***Key words:*** *digital skills, digital literacy, information culture, information competence, e-citizen, information communication technologies*

İnformasiyalaşmanın sürətlə artdığı və texnologiyaların inkişaf edərək insan həyatında mühüm yer tutduğu dövrdə cəmiyyətin sifarişinə uyğun hərtərəfli şəxsiyyət yetişdirmək funksiyasını qarşısına məqsəd qoyan yeni məktəb modeli formalaşır. Bu məktəb modeli təhsilalanlarda müasir informasiya kommunikasiya texnologiyalarından istifadə etmək bacarıqlarına qabil, dinamik mühitə uyğunlaşa bilən şəxsiyyət yetişdirmək missiyasını yerinə yetirir. İnformasiyalaşan cəmiyyətdə fəaliyyət göstərə biləcək, beynəlxalq, o cümlədən ölkəmiqyaslı əmək və

təhsil bazarında rəqabətə davamlı, e-vətəndaş, e-insan hazırlamaq, informasiya səriştəsinə malik şəxsiyyət yetişdirmək yeni məktəb modelinin missiyaları sırasında olan məsələlərdəndir. Bu, missiya həm də "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər" sənədində (2 fevral, 2021-ci il) nəzərdə tutulan "növbəti onillikdə ölkənin sosial-iqtisadi inkişafına dair Milli Prioriteti"nin üçüncü istiqamətinin: "rəqabətli insan kapitalı və müasir innovasiyalar məkanı"ın reallaşdırılmasına təkan verir.

Müasir bilik cəmiyyətində fəaliyyət göstərmək üçün rəqəmsal əsr və onunla əlaqəli informasiya çoxluğunda bir çox səriştələrə sahib olmaq vacibdir. Məlumatlar bolluğundan vacib olanı müəyyənləşdirmək, seçmək, onu emal etmək və istifadə edə bilmək, lazım gəldikdə, sosial şəbəkələrə inteqrasiya edə bilmək informasiya savadlılığı məsələsini gündəmə gətirir. Bu da XXI əsrin bilik və bacarıq sırasında əsas keyfiyyətlərdir. Müasir məktəb öz yetirmələrinə rəqəmsal biliklər aşılayır. Rəqəmsal biliklər isə informasiya səriştəsi, informasiya mədəniyyəti, informasiya ilə işləmək bacarığı və vərdişləri, son nəticədə strategiya, sistem və transformasiya biliklərini hədəfləyir. (2). Nəticədə biliklərin idarə edilməsi, informasiyanın axtarışı, məlumatın seçilməsi, qiymətləndirilməsi və işlənməsi üzrə yaxşı inkişaf etmiş, təkmil bacarıqlara malik məzun yetişir. Sadalanan məqsədlərə nail olmaq üçün, ilk növbədə, məktəb öz kadr bazasını rəqəmsal bacarıqlar və informasiya mədəniyyətinə malik heyətdən təşkil edilməsi öhdəliyini yerinə yetirməlidir. Həmçinin təhsilalanları da bu istiqamətdə formalaşdırmağı, ilk növbədə, informatika fənninin məzmununa yeni yanaşma etməli, rəqəmsal bacarıqlar, informasiya texnologiyalarından istifadə bacarıqlarının aşılanmasını ön plana çəkməlidir.

Cəmiyyətin inkişafında əsas amillərdən biri olan informasiya mədəniyyəti iki fundamental anlayış: informasiya və mədəniyyət əsasında formalaşsa da, hazırkı dövrdə rəqəmsal savad, rəqəmsal bacarıqlar sayəsində tətbiq olunur. İnformasiya mədəniyyəti insanın ümumi mədəniyyətinin tərkib hissəsi olmaqla bu iki mövcud anlayışın: informasiya və mədəniyyətin inteqrativliyinin nəticəsidir. İnformasiya – insanın ətraf aləmdən aldığı məlumatlar və biliklərdir. Mədəniyyət – bilik, bacarıq, mütəşəkkillik, mənəviyyat və yaradıcılıq qabiliyyəti olmaqla beş əsas komponenti özündə cəmləyən insanın yaradıcı həyat fəaliyyətidir. İnformasiyanın qəbulu, yadda saxlanılması, emalı, təqdim edilməsi və s. informasiya mədəniyyətinin konseptual modelini təşkil edir. Bura təbii, genetik xüsusiyyətlərlə yanaşı, təhsilin, cəmiyyətin, sosiumun təsirləri nəticəsində sonradan qazanılan keyfiyyətlər də daxildir. İnformasiya təhsili konsepsiyası seçilə bilən faktiki bilik və metodoloji səriştə arasında əlaqənin yeni əksini tələb edir. İnformasiya mədəniyyətinin formalaşması prosesi üç istiqamətdə gedir:

1. Şagirdin hərtərəfli şəxsiyyət kimi formalaşır.
2. Ölkə üçün vətəndaş yetişdirilir.
3. Cəmiyyət üçün müasir insan hazırlanır.

Mədəniyyət zənginliyinə malik olan insan özü, sosiumu, xalqı, dövləti və nəhayət, cəmiyyət üçün mühüm olan amilləri daha düzgün, faydalı, uğurlu şəkildə qavrayır və tənzimləyir. İnsanın, sosial sistemin mədəniyyətinin lazımi səviyyədə olması üçün hökmən zəruri olan iqtisadi, demoqrafik, ekoloji, siyasi amillərlə yanaşı, təhsil səviyyəsinin, bilik və bacarıqlarının da lazımi dərəcədə, o cümlədən yaşadığı dövrün inkişaf səviyyəsinə uyğun olması vacibdir.(5). İnformasiya mədəniyyəti əsasən informasiyanı almaq, emal etmək, ətrafa təqdim etmək, ünsiyyət qurmaq və s. kimi insan fəaliyyətini əhatə edir. Hər hansı peşə sahibi bu modelə uyğun fəaliyyət göstərir. Belə qənaətə gəlmək olar ki, müxtəlif peşə sahiblərinin hər biri öz peşələri üzrə təcrübə toplamaqla yanaşı, həm də öz fəaliyyət sahələri üzrə müəyyən səviyyədə informasiya mədəniyyətinə yiyələnirlər. İnsan peşə və sənət seçiminə əsasən ümumtəhsil məktəblərində təhsil aldığı dövrdə istiqamətlənir. Eləcə də informasiya mədəniyyətinin aşılanması və formalaşması məktəb mühitindən başlanır.

Hər hansı məlumatı seçmək, axtarışını təşkil etmək, qəbul etmək, yaddaşda saxlamaq, emal etmək və ötürmək informasiya mədəniyyətinin əsas komponentləridir. İnformasiya mədəniyyətinin formalaşması prosesi onun komponentlərinin imkanları ilə əlaqəlidir. Yüksək informasiya mədəniyyəti insana gündəlik həyatda və peşəkar fəaliyyətdə istənilən növ informasiya ilə işləmək və informasiyadan səmərəli istifadə edə bilmək imkanı verir. İnformasiya mədəniy-

yətinin əsasını dövrün informasiya resurslarından istifadə edilməsi bacarıqları təşkil edir. Müasir dövrün informasiya proseslərini, resurslarını əsasən İKT sistemi təşkil edir. Qazanılan bilikləri bacarığa çevirməklə tətbiq etmək, həmçinin mövcud biliyi yeni kontekstlərə çevirə bilmək, yeni biliklər əldə etmək, informasiya resurslarından, İKT-dən, alətlər toplusundan istifadə etmək qabiliyyətləri, metodik səriştəyə, strategiyaya yiyələnmək və koqnitiv qabiliyyətlərə, etik nitq və davranışa sahib olmaq informasiya mədəniyyətini formalaşdıran amillərdir. (Porat E., Blau I., Barak A., 2018). Deməli, İKT, rəqəmsal bacarıqlar üzrə bilik və vərdişlər müasir bacarıqlar sırasında aparıcı mövqedədir və onu informasiya mədəniyyətinin təməli hesab etmək olar.

Rəqəmsal bacarıqlar və ya rəqəmsal səriştə informasiya-kommunikasiya texnologiyalarından, rəqəmsal informasiyalardan, rəqəmsal mediadan istifadə üçün tələb olunan bilik və bacarıqları özündə cəmləyir, informasiya mədəniyyətinin formalaşmasında və təkmilləşməsində həlledici rola malikdir (2). Müəyyən tapşırıqları yerinə yetirmək, problemləri həll etmək, ünsiyyət qurmaq, idarə etmək, əməkdaşlıq etmək kimi səriştələr rəqəmsal bacarıqlar və informasiya mədəniyyətinin sintezi ilə əldə olunur. Rəqəmsal bacarıqlarla inteqrativlik təşkil edən informasiya mədəniyyəti onlayn təlim zamanı, öyrənmə prosesində, müəyyən tapşırıqların həllində, asudə vaxtın təşkilində, sosial şəbəkədən istifadə etdikdə, gündəlik həyat proseslərində keyfiyyətli, səmərəli, uyğun, yaradıcı, çevik, etik fəaliyyətə imkan verir. İnformasiya mədəniyyəti rəqəmsal cihazlardan və şəbəkə texnologiyalarından təhlükəsiz və lazımi şəkildə istifadə etmək, məlumat təhlikəsizliyini saxlaya bilmək, ünsiyyət qurmaq, hər hansı hadisə və prosesi qiymətləndirmək, iqtisadi və sosial həyatda hərtərəfli iştirak edə bilmək üçün həlledici rol oynayır. Bu səbəbdən də ümumtəhsil məktəbləri qarşısında duran əsas vəzifələrdən biri rəqəmsal bacarıqlara sahib şəxsiyyət yetişdirməkdən ibarətdir. Elektron poçt, bloqlar və sosial şəbəkələr və s. kimi rəqəmsal formatlar, həmçinin video və podkastlar kimi digər media formatlarının yaradılması, təhlükəsizliyinin təmin edilə bilməsi bu bacarıqlar sırasına daxildir.

İnformasiya bolluğu şəraitində şagirdlərin doğru və yanlış, dolğun və primitiv məlumatlar içərisindən düzgün olan məlumatı seçə bilmək bacarığı olmalıdır. Bu isə tənqidi düşünmə, məntiq, analiz-sintez, tutuşdurmaq, yoxlamaq kimi proseslərin tətbiqi əsasında mümkündür. Bu kontekstdə rəqəmsal savadlılıq ön plana çıxır. Artıq ümumtəhsil məktəblərində rəqəmsal bacarıqlar təlim layihəsi tətbiq olunur. Bu layihənin tətbiqi şagirdlərin rəqəmsal dünyanın təqdim etdiyi imkanları daha yaradıcı və müstəqil şəkildə istifadə etmək, texnoloji inkişafın dəyişdirdiyi dünyadan maraq dairələrinə uyğun olanı seçə bilmək bacarıqları aşılayır. Rəqəmsal bacarıqlar informasiya mədəniyyətinin təməlidir. Rəqəmsal bacarıqlar və informasiya mədəniyyətinin hər biri spesifik xüsusiyyətlərlə yanaşı, müəyyən ümumi cəhətlərə də malikdirlər, həmçinin hər ikisi vizual və taktil öyrənmə, praktik bacarıqların formalaşmasına xidmət edir.

Rəqəmsal bacarıqlar şagirdlərdə alqoritmik düşüncə və məntiqin inkişaf, yeni texnologiya və rəqəmsal bacarıqları təcrübədə öyrənmək, proqramlaşdırmanın sirlərinə bələd olmaq səriştəsi formalaşdırır. Rəqəmsal bacarıqlar və informasiya mədəniyyəti sayəsində şagirdlər İKT bacarıqlarına dərindən yiyələnir, informasiya məkanında sərbəst və məqsədyönlü fəaliyyət göstərə bilir, rəqabətəqabiliyyətli, məntiqi və qeyri-standart düşüncəyə malik olur. İnformasiya cəmiyyətinin və rəqabətədavamlı informasiya mədəniyyətinin yaradılması bir sıra ölkələrin dövlət siyasətinin əsas istiqamətinə çevrilmişdir.

**Problemin aktuallığı.** "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər" sənədində əsas istiqamətlərdən biri də məhz dünyada artan rəqabətə hazır olmaq üçün yüksək rəqabətli insan kapitalının formalaşdırılmasıdır. Bu çağırış təhsil müəssisələri qarşısında rəqəmsal bacarıqlar və informasiya mədəniyyətinə malik şəxsiyyət yetişdirmək missiyasını aktuallaşdırır.

**Problemin elmi yeniliyi** informatika fənni üzrə yeni məzmunun mənimsənilməsidir. Bu məzmunda rəqəmsal bacarıqlar və informasiya mədəniyyəti ön plana çəkilir. Rəqəmsal bacarıqlar informasiya mədəniyyətinin, həmçinin, formalaşmasının təməli kimi təqdim olunur.

**Problemin praktik əhəmiyyəti** "İnformatika" fənninin tədrisinə yeni yanaşmanın tətbiqidir. Bu yanaşma şagirdlərdə rəqəmsal bacarıqlar və informasiya mədəniyyətinin formalaşmasını aşılayır, informasiya mədəniyyətini pedaqoji anlayışlar sırasına daxil edir.

**Ədəbiyyat:**


1. "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər" Azərbaycan Respublikası Prezidentinin 2021-ci il 2 fevral tarixli, 2469 nömrəli Sərəncamı ilə təsdiq edilmişdir. https://e-qanun.az/framework/46813
2. Əsədova İ.M. Xüsusi öyrənmə çətinliyi – disleksiya və yeni təlim Layihələri: Rəqəmsal bacarıqlar və STEAM. // – Bakı: Məktəbəqədər və ibtidai təhsil, 2023, № 1.
3. Колин К.К. Новая информацинная культура общества как глобальная проблема. http://confifap: cpic.ru/upload/2008/repotc/t694.doc
4. Yuan Wang, Ryan Baker Content or platform: Why do students complete MOOCs? // MERLOT of Online Learning and Teaching, 2015, № 1.
5. David Bawden Information and digital literacies: a review of concepts // Journal of Documentation, 2001, № 2
6. Measuring digital literacies: Junior high-school students' perceived competencies versus actual performance // Computers & Education. 2018, № 2


**E-mail:** almazhasret@gmai

**Rəyçilər:** *ped.ü.fəl.dok., dos* **Ə.M. Abbasov,**
*ped.ü.fəl.dok., dos.* **A.X. Hacıyev**
**Redaksiyaya daxil olub:** 17.04.2023

*UOT 373.3/.5*

***Elnarə Vahid qızı Qasımova***
*Bakı şəhəri, Nərimanov rayonu 193 nömrəli tam orta məktəbin direktor müavini*
*https://orcid.org/0009-0006-0768-9391*

# TƏLİM PROSESİNİN OPTİMALLAŞDIRILMASI YOLLARI

***Эльнара Вахид гызы Гасымова***
*заместитель директора полной средней школы №193*
*Наримановского района города Баку*

# ПУТИ ОПТИМИЗАЦИИ УЧЕБНОГО ПРОЦЕССА

***Elnara Vahid Gasimova***
*deputy director of the complete secondary school No. 193*
*of the Narimanov district of Baku city*

# WAYS TO OPTIMIZE THE LEARNING PROCESS

**Xülasə.** Məqalədə təlim prosesinin optimallaşdırılması yollarından bəhs olunur. Müəllif qeyd edir ki, təlimin optimallaşdırılması üsulu müəllim və şagirdlərin fəaliyyətinin elə qarşılıqlı əlaqəsidir ki, burada müəyyən vaxt çərçivəsində təlimin səmərəliliyinin maksimal nəticələrinin alınması əvvəlcədən istiqamətlənmiş olur. Yəni şagird və müəllimin yüklənməməsi nəzərdə tutulur. Müəyyən meyarlar nöqteyi-nəzərindən mövcud şəraitdə təlim və tərbiyənin ən yaxşı variantlarının, məzmununun, forma və metodlarının elmi cəhətdən əsaslandırılmış seçimi və həyata keçirilməsi pedaqoji prosesin optimallaşdırılması adlanır.

***Açar sözlər:*** *optimallaşdırma, təlim prosesi, keyfiyyət, prinsip, qanunauyğunluqlar, şagird, müəllim, müasir məktəb*

**Резюме.** В статье повествуется о путях и способах оптимизации процесса обучения. Автор отмечает, что метод оптимизации обучения представляет собой такое взаимодействие деятельности учителей и учащихся, при котором заранее направляются максимальные результаты эффективности обучения в определенные временные рамки. То есть предполагается, что ученик и учитель не будут слишком загружены. Оптимизацией учебного процесса с точки зрения определенных критериев называется научно обоснованный выбор и реализация в существующих условиях оптимальных вариантов, содержания, форм и методов обучения и воспитания.

***Ключевые слова:*** *оптимизация, процесс обучения, качество, принцип, закономерности, ученик, учитель, современная школа*

**Summary.** The article tells about the optimization of the learning process. The author notes that the learning optimization method is such an interaction between the activities of teachers and students, in which the maximum results of learning efficiency are sent in advance within a certain time frame. That is, it is assumed that the student and teacher will not be too busy. The optimization of the educational process in terms of certain criteria is the scientifically based choice and implementation in the existing conditions of the best options, content, forms and methods of education and upbringing.

**Key words:** *optimization, learning process, quality, principle, patterns, student, teacher, modern school*

Optimallaşdırmanın nəzəriyyəsi və metodikası pedaqoji əməyin ümumi nəzəriyyəsinin elmi cəhətdən təşkilinin elementlərindən biridir. Bu, məqsədyönlü fəaliyyətin əsası kimi optimal variantların seçilməsi üçün əlverişli şərait yaradır. Pedaqoji fəaliyyətin optimal seçim nəzəriyyəsinin işlənməsinin metodoloji əsasını sistemli yanaşma təşkil edir. Yalnız o halda optimal variantlardan söhbət gedə bilər ki, sistemin komponentləri arasında bütün qanunauyğun əlaqələr

nəzərə alınsın. "*Optimal*" termini latınca *optimus*, yəni "ən yaxşı" mənasını verərək müəyyən şəraitə və vəzifələrə uyğun deməkdir. *Optimallaşdırm*a, sözün əsl mənasında, mövcud şəraitdə qoyulan vəzifələrin həlli üçün ən yaxşı variantın seçilməsidir. Müəyyən meyarlar nöqteyi-nəzərindən mövcud şəraitdə təlim və tərbiyənin ən yaxşı variantlarının, məzmununun, forma və metodlarının elmi cəhətdən əsaslandırılmış seçimi və həyata keçirilməsi pedaqoji prosesin optimallaşdırılması adlanır.

Optimallaşdırma fəaliyyətdə əsas götürülməsi haqqında metodoloji müddəaya əsaslanır. Təlimin optimallaşdırılması nəzəriyyəsinin inkişafında M.M. Mehdizadə [1], M.N. Skatkin, M.M. Potaşnik, A.M. Moiseev və başqa alimlər də böyük töhfə vermişlər. Təlimin optimallaşdırılması probleminin tədqiqində kifayət qədər təcrübə toplanmışdır: optimallaşdırma konsepsiyasının əsas prinsipləri müəyyənləşdirilmiş; vəzifələrin, məzmunun, təlimin forma və metodlarının müəyyən olunmuş meyarlar nöqteyi-nəzərindən optimal variantının seçilməsi metodikası təklif edilmiş; təlimin optimallaşdırılması metodikasının təcrübəyə tətbiqi üzrə ölçü sistemi işlənmişdir. Təlim-tərbiyə prosesinin optimallaşdırılması konsepsiyası alternativ variantlar içərisində ən əlverişlisinin seçimi metodlarının öyrənilməsi çərçivəsində idarəetmə qərarlarının qəbul edilməsi nəzəriyyəsinə əsaslanırdı.

Beləliklə, təlimin optimallaşdırılması nəzəriyyəsində təlim-tərbiyə prosesinin bütün obyektləri qarşılıqlı əlaqədə göstərilmişdir: onlardan birinin vəziyyətinin dəyişməsi sistemin başqa hissələrindəki vəziyyətə də öz təsirini göstərir. Ona görə də bir sahədə müvəffəqiyyətin əldə edilməsinin başqa sahədə geriliyə səbəb olmaması üçün təlim-tərbiyə prosesinin səmərəliliyinin yüksəldilməsi üzrə kompleks tədbirlərin görülməsinə xüsusi diqqət yetirilirdi. Bu vəzifənin yerinə yetirilməsi üçün alimlər tərəfindən təlim prosesinin optimallaşdırılması üzrə pedaqoqların fəaliyyət üsullarının tam bir sistemi işləndi. Bunun əsas mərhələləri idarəetmə qərarlarının qəbul edilməsi mərhələsinə uyğun gəlir: a) idarəetmə qərarlarının işlənilməsinin mərhələləri; b) təlim prosesinin optimallaşdırılması üzrə pedaqoqların fəaliyyətinin üsulları sistemi. Optimallaşdırma nəzəriyyəsi didaktikaya təlimin qanunauyğunluqlarından və təlim prinsiplərindən irəli gələn kateqoriyanı – təlimin optimallaşdırılması üsullarını daxil edir. Təlimin optimallaşdırılması üsulu müəllim və şagirdlərin fəaliyyətinin elə qarşılıqlı əlaqəsidir ki, burada müəyyən vaxt çərçivəsində təlimin səmərəliliyinin maksimal nəticələrinin alınması əvvəlcədən istiqamətlənmiş olur. Yəni şagird və müəllimin yüklənməməsi nəzərdə tutulur.

Təlim prosesinin optimallaşdırılmasının tamlığı onun əsas elementlərinin – vəzifələrinin, metodlarının, vasitələrinin, formalarının, məzmununun optimal variantlarının seçilməsi üsullarının məcmusundan ibarətdir. Təlim üsulları sisteminin yeniliyini dərk etmək çox vacibdir. Çünki müəllim fəaliyyətinin təlimin optimallaşdırılmasına yönəlmiş ayrı-ayrı üsulları müəyyən dərəcədə pedaqoqlara tanışdır. Lakin burada keyfiyyət məsələsi ortaya çıxır. Əgər müəllim təlim prosesinin optimal quruluşunun bütün üsullarını mənimsəyibsə, o həmin müəyyən edilmiş vaxtda daha böyük nəticələr əldə edir. Bir halda biz optimallaşdırma üsullarından danışırıq, digər halda isə təlim prosesini optimallaşdırma bacarığından. Əvvəlcə optimallaşdırmanın vəzifələrini planlaşdırılmasından başlayan təlimin hazırlıq mərhələsi üzərində dayanaq. Optimal planlaşdırma təlim vəzifələrinin layihələndirilməsinə kompleks yanaşmanı tələb edir. Təhsilin, tərbiyənin və inkişafın vəzifələrini eyni bir dərsdə birlikdə həll etmək lazımdır. Bu cür yanaşma təlimin səmərəliliyini yüksəldir və əsası odur ki, bu təlim-tərbiyə məsələlərinə əlavə vaxt sərf edilmir. Eyni zamanda, optimal planlaşdırma təlim prosesi gedən sistemin xüsusiyyətlərini nəzərə almaqla vəzifələrin konkretləşdirilməsini zəruri hesab edir. Lakin sinfin xüsusiyyətlərini öyrənmədən təlim vəzifələrinin konkretləşdirilməsi mümkün deyil. Bu zaman aşağıdakılar yerinə yetirilməlidir: real təlim imkanlarının təxmini qiymətləndirilməsi; mövcud şəraitin qiymətləndirilməsi; mümkün olan maksimal nəticələrin proqnozlaşdırılması; sinif və ev tapşırıqlarına sərf olunan optimal vaxtın planlaşdırılması. Şagirdlərin bu cür öyrənilməsi əsasında təlim vəzifələrinin konkretləşdirilməsinin həyata keçirilməsi təlimin üsullarının optimallaşdırılması rolunu oynayır. Çünki bu cür yanaşma şagirdlərin real təlim imkanlarının tipik üstün və zəif tərəflərini aşkar etməyə imkan verir. Təlim vəzifələrinin layihələndirilməsindən sonra müəllim onun seçiminə başlayır.

Əsas fikrin göstərilməsi ilə təlimin məzmununun optimal variantının, fənlərarası əlaqələndirmənin və təlim materialının səmərəli quruluşunun seçimi şagirdləri yükləmədən onların təhsil, tərbiyə və inkişafı qarşısında qoyulmuş vəzifələri müvəffəqiyyətlə həll etməyə imkan verən optimallaşdırma üsulları rolunu oynayır.

Məzmun seçimindən sonra təlimin metod və vasitələrini seçmək zərurəti meydana çıxır. Buna görə də təlimin optimallaşdırılmasının növbəti üsulu metod və vasitələrin elə seçimidir ki, müəyyən olunmuş vaxt ərzində qoyulmuş vəzifələri uğurla həll edə bilsin. Mövzu üzrə mümkün metodik variantların tanış olması yolu ilə bu cür seçim həyata keçirilir. Bu zaman vəzifələrin, materialın məzmununun, şagirdlərin imkanlarının və müəllimin özünün şəxsi metodik yanaşmalarının xüsusiyyətlərini uyğunlaşdırmaq zəruridir. Təlimin optimallaşdırılmasının başqa üsulu isə elə təşkilati formaların seçimidir ki, qarşıya qoyulmuş vəzifələr uğurlu nəticələrə imkan versin. Bu üsul yalnız ümumi sinfə deyil, həm də zəif oxuyan, nisbətən hazırlıqlı və başqa şagirdlərə diferensial yanaşmanı həyata keçirməyi nəzərdə tutur. Təlimin diferensiallaşmasında əsas diqqəti zəif şagirdlər üçün tapşırıqların sadələşdirilməsinə deyil, ümumi sinfə verilən tapşırıqların yerinə yetirilməsi zamanı müəllimin köməyinin diferensiallaşdırılmasına yönəltmək məqsədə müvafiqdir. Bu, biliklərin qazanılmasında boşluqları aradan qaldırmağa imkan verir. Optimal şərait yaradılmadan təlim prosesinin qarşıya qoyduğu vəzifələri müəyyən olunmuş vaxt çərçivəsində həll etmək mümkün deyil. Burada təlim materiallarının, məktəbin gigiyena şəraitinin, mənəvi-psixoloji atmosferin, məktəbin estetik tərtibatının rolu böyükdür. Birinci növbədə normativ zəruri şəraitin yaradılması üçün bütün ölçüləri götürmək lazımdır. Lakin təlimin optimallaşdırılması bütün səviyyələrdə ideal şərait yaranana qədər saxlamaq olmaz. Optimal quruluş da idealdan onunla fərqlənir ki, müasir məktəb üçün tipik olan şəraitdə maksimal dərəcədə nəticələrə nail olmağa səy göstərmək lazımdır. Növbəti mərhələdə məzmunun, metodların, vasitələrin və təlimin təşkili formalarının seçilmiş variantlarının köməyi ilə təlimin optimallaşdırılmasının müəyyən edilmiş vəzifələri həyata keçirilir. Şagirdlərin təlimində optimallaşdırmanın mühüm istiqamətlərindən biri onlarda həqiqi elmi biliklər üzrə anlayışların formalaşmasıdır. Onların reallaşması prosesində yaradıcı işlərin, həmçinin proqramlaşdırılmış tapşırıqların yerinə yetirilməsində müstəqil işlərə əhəmiyyətli yer verilir.

Hər hansı bir anlayışı uşaqlara çatdırmaq üçün aşağıdakı prinsipləri əsas götürmək zəruridir:

✓ Təbiətəmüvafiqlik prinsipi. Bu prinsip təlim prosesini insana xas olan təsviretmə, tamaşadan zövqalma intuisiyanın inkişafına uyğun təşkil etməyə imkan verir;

✓ Mədəniyyətəmüvafiqlik prinsipi. Bu prinsip insanın təbiətini nəzərə almağa, sosial təcrübəni tətbiq etməklə fəaliyyətin ümumi istiqamətini müəyyən etməyə imkan verir;

✓ İnteqrasiya prinsipi. Bu prinsip təbiət elmləri xarakterli məlumatların və insan fəaliyyəti haqqında informasiyaların arasında uyğunluğun müəyyən edilməsini nəzərdə tutur;

✓ Pedosentrizm prinsipi, başqa sözlə desək, uşaq üçün daha əhəmiyyətli, aktual biliklərin seçilməsini nəzərdə tutur;

✓ Məzmunun nəzəriyyə ilə bağlılığı, yeni verilən tapşırığın mahiyyətini üzə çıxarmaq, formalaşdırmaq, nəticələrini, priyomlarını sübuta yetirmək";

✓ Şagirdlərin təhsilində ardıcıllıq və yenilik etmək prinsipi. Bu prinsip şagirdlərin təlimində ardıcıllığın, həmçinin onların inkişafının "aktual zonasını" və "yaxın inkişaf zonasını" nəzərə alan tapşırıqların məzmununun seçilməsini nəzərdə tutur.

Yuxarıda deyilənlərdən belə nəticəyə gəlmək olar:

1. Təlim prosesinin optimallaşdırılması şagirdlərin emosiya və hisslərinin düzgün istiqamətləndirilməsinin təlimin səmərəli keçməsi və şagirdlərin sağlamlığının qorunması üçün böyük rolu vardır. Onların hərəkətləri, böyüklərə olan münasibəti emosiya və hissləri cilovlamaq bacarığından asılıdır. Bunlar şagirdlərin əhval-ruhiyyəsini, fəaliyyətini, məhsuldarlığını artıra da bilər, tormozlaşdıraraq fəaliyyəti dayandıra da bilər.

2. Müşahidələr göstərir ki, şagirdlərin fikri fəaliyyəti yalnız yeni biliklərin, qanunauyğunluqların, bacarıqların mənimsənilməsinə deyil, eyni zamanda yeni iş tərzində işləməyə alışmağa, yenilikləri yeni situasiyada qəbul etməyə yönəlir.

3. Təcrübə göstərir ki, təlim prosesinin optimallaşdırılmasında psixoloji ab-havanın ya-

radılması da idrak qabiliyyətlərinin təzahürünə və inkişafına müsbət təsir göstərir.

4. Məqalənin nəticələri göstərir ki, yuxarıda deyilənləri nəzərə almaqla yeni layihələrin hazırlanmasına və tətbiqinə, təlim prosesinin keyfiyyətcə yeni səviyyəyə yüksəldilməsinə və bu prosesdə şagirdlərin sağlamlığının qorunmasına real imkanlar yaranmışdır.

Beləliklə, təlim prosesinin optimal qurulmasına təlimin prinsip və qanunauyğunluqlarını nəzərə almaqla, müasir metod və formalardan istifadə etməklə, şagirdlərin fizioloji xüsusiyyətlərini və ümumi sinfin şəraitini və başqa amilləri öyrənməklə nail olmaq olar.

**Problemin aktuallığı.** Əgər müəllim təlim prosesinin optimal quruluşunun bütün üsullarını mənimsəyibsə, o həmin müəyyən edilmiş vaxtda daha böyük nəticələr əldə edir.

**Problemin elmi yeniliyi.** Təlim prosesinin optimallaşdırılmasının tamlığı onun əsas elementlərinin optimal variantlarının seçilməsi üsullarının məcmusundan ibarətdir. Əsas fikrin çatdırılması, şagirdlərdə oxumağa motivasiyanın yaradılması, təlimin diferensiallaşdırılması, mənəvi-psixoloji atmosferin yaradılması və optimallaşdırma meyarları nöqteyi-nəzərindən təlimin nəticələrinin təhlili şagirdlərin ümumi inkişaf səviyyəsinin yüksəlməsini göstərmişdir.

**Problemin praktik əhəmiyyəti.** Təlimin optimallaşdırılması üsullarının göstərilməsi müəllim və şagird fəaliyyətində maksimal nəticələr alınmasına təsir edir, yəni onların hər ikisinin yüklənməməsini nəzərdə tutulur.

**Ədəbiyyat:**


1. Mehdizadə, M.M. Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları / M.M. Mehdizadə. – Bakı: Maarif, 1982.
2. Ağayev ,Ə.Ə. Təlim prosesi, ənənə və müasirlik / Ə.Ə. Ağayev. – Bakı: Adiloğlu, 2006.
3. Müəllim hazırlığının aktual problemləri və modernləşdirilməsi. / M.C. Mahmudov, R.L. Hüseynzadə, M.İ. İlyasov [və b.]. – Bakı: Mütərcim, 2015, – s. 216.
4. Əlizadə, Ə.Ə. Yeni pedaqoji təfəkkür: ideyalar, prinsiplər, problemlər. Psixopedaqoji araşdırmalar. / Ə.Ə. Əlizadə. – Bakı: Adiloğlu, 2001, – 162 s.
5. Бабанский, Ю.К. Избранные педагогические труды / сост. М.Ю. Бабанский. – М.: Педагогика, 1989. – 560 с.


**E-mail:** elnaravaliyeva1@gmail.com

**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **B.O. İbadova,**
*ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva**
**Redaksiyaya daxil olub:** 14.04.2023

*UOT 37.0*

***Reyhan Tapdıq qızı Hacızadə***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi*
*orcid.org/ 0000-0002-2287-2905*

# DƏRSDƏ MODELLƏŞDİRMƏ VƏ QURAŞDIRMA İŞLƏRİ ZAMANI KİÇİKYAŞLI MƏKTƏBLİLƏRİN İDRAK FƏALLIĞININ TƏMİN EDİLMƏSİ

***Рейхан Тапдыг гызы Гаджизаде***
*преподаватель Азербайджанского Государственного Педагогического Университета*

# ОБЕСПЕЧЕНИЕ ПОЗНАВАТЕЛЬНОЙ АКТИВНОСТИ МЛАДШИХ ШКОЛЬНИКОВ ПРИ МОДЕЛИРОВАНИИ И УСТАНОВОЧНЫХ РАБОТАХ НА УРОКЕ

***Reyhan Tapdıq Hajizade***
*teacher at Azerbaijan State Pedagogical University*

# PROVISION OF COGNITIVE ACTIVITY OF JUNIOR SCHOOLCHILDREN IN MODELING AND INSTALLATION WORKS IN THE LESSON

**Xülasə.** Məqalədə modelləşdirmə və quraşdırmaya aid məmulatın hazırlanması metodikasından, şagirdin özündə zəngin ideya irəli sürmə məqamların olmasından danışılır. Əl hərəkətləri, anlamaq və texnoloji əməliyyatlar aparmaqla idrak fəaliyyətinə yönəldilməsi kimi məsələlər öz əksini tapmışdır.
***Açar sözlər:*** *model, birləşdirmə, quraşdırma, konstruktor, idrak fəallığının inkişafı*

**Резюме.** В статье повествуется о способе подготовки изделия, связанного с лепкой и моделированием, и наличии богатых идей у самого ученика. Нашли также отражение такие вопросы, как движения рук, понимание и сосредоточение внимания на познавательной деятельности путем выполнения технологических операций.
***Ключевые слова:*** *модель, комбинация, установка, конструктор, развитие познавательной деятельности*

**Summary.** The article talks about the method of preparing a product related to modeling and installation, and the presence of rich ideas in the student himself. Issues such as hand movements, understanding and focusing on cognitive activity by performing technological operations were reflected.
***Key words:*** *model, combination, installation, constructor, development of cognitive activity*

Model özünəməxsus bir idrak vasitəsidir. “Model” termindən insan fəaliyyətinin müxtəlif sahələrində geniş istifadə olunur. Modelləşdirmə sözündə model fransız, italyan, latın sözlərində analoji oxşarlıq olmaqla ölçü, nümunə, norma kimi başa düşülür. Obyektin, prosesin, hadisənin əvəzləyicisi kimi istifadə olunan obrazdır. Təsvir, sxem, çertyoj, qrafik, plan, riyazi ifadə və s., başqa sözlə, model real obyektin sadələşdirilmiş oxşarıdır.

Modelləşdirmə üsulu bir tədqiqat aləti kimi insanın təbiət və cəmiyyətin inkişaf qanununa uyğunluqlarını dərk etməsi prosesində, ətraf aləmin praktik dəyişdirilməsi yollarının axtarılmasında mühüm yer tutur. Modellər hərəkət edən və hərəkətsiz olurlar. Model əşyanın bütün xüsusiyyətlərini (müəyyən miqyas daxilində dəyişdirilən ölçülərini, iş prinsipini, onun xarici təsvirini) özündə əks etdirir.

Şagirdlərin hərtərəfli inkişafında modelləşdirmə və quraşdırmaya aid müəyyən təsəvvürlər formalaşdırılır. Onlar artıq müəyyən əşyaları təsəvvür etməklə, həm də onların maketini, oyuncaq şəklində kiçik formalarını görür, tanıyırlar [1, s.8].

İbtidai siniflərdə "Texnologiya" fənn kurikulumunda "texnika elementləri" məzmun xəttinin mahiyyətini əks etdirən konseptual sənəddə öz əksini tapır. Bu məzmun xətti üzrə şagirdlərə gündəlik həyatda qarşılaşdıqları texnikanın ümumi xarakteristikasının öyrədilməsi, elmi-texniki tərəqqinin nailiyyətləri, istehsal texnologiyalarının təkmilləşdirilməsi, müasir texniki qurğular və konstruksiyalar haqqında ilkin məlumatların verilməsi, bu sahədə müvafiq bacarıq və vərdişlərin qazanılması nəzərdə tutulur.

Modelləşdirmə və maketləşdirmə işlərinin təşkili ilə əlaqədar ibtidai siniflərdə şagirdlərin texnoloji biliklər və bacarıqlara yiyələnmələri onların təfəkkür imkanlarını artırır.

"Təyyarə" modeli; Kibrit qutularından" Minik avtomobili"nin modelinin hazırlanması təlim mövzuları mühüm əhəmiyyətə malikdir. Qeyd olunan mövzuların tədrisi metodikasına aydınlıq gətirməyi məqsədəuyğun sayırıq.

"Təyyarə" modeli. Mövzu üzrə standartlara (1.2.1.; 1.2.2.; 1.2.3.; 1.2.4.; 1.3.1.; 1.3.2.) müvafiq olaraq şagirdlər aşağıdakı təlim məqsədlərinə uyğun bilik və bacarıqlar qazanırlar:

– təyyarə modelinin hazırlanması üçün iş yerini təşkil edir;

– təyyarə modelinin hazırlanması üçün emal vasitələri seçir;

– təyyarənin hazırlanması ardıcıllığını müəyyənləşdirir;

– təyyarə materialına uyğun emal texnologiyaları seçir;

– təyyarənin detallarını hazırlayır;

– detalları qatlamaqla təyyarəni hazırlayır.

Yeni bilik verən dərsin iş formaları kiçik və böyük qruplarla aparılır, iş üsulları isə müzakirə, beyin həmləsi və Venn diaqramı ilə keçirilir.

Motivasiya, problemin qoyuluşu: Müəllim şagirdlərə bir neçə təyyarənin oxşar və fərqli cəhətlərini sadalayır.

Tədqiqat sualı: Təyyarəni necə hazırlamaq olar?

Müəllim təyyarənin hazırlanması planı və ya texnoloji xəritəsi haqqında məlumat verir.

İşin yerinə yetirilməsi ardıcıllığı: dəftər vərəqini iki yerə qatlamaq; ülgünü damalar üzrə vərəqin üzərinə köçürmək və kəsmək; təyyarənin burnunu iki dəfə xətt üzrə qatlamaq və sancağı burnuna geydirmək; quyruğunu və qanadlarını qatlamaq.

Tədqiqatın aparılması: Müəllim şagirdləri dörd qrupa bölür və dəftər vərəqindən qatlama üsulu ilə təyyarə hazırlamaq tapşırığı verir. Qruplar tapşırığı yerinə yetirirlər.

Məlumatın mübadiləsi: Müəllim qrupların təqdimatını dinləyir.

Məlumatın müzakirəsi və təşkili: Müəllim müzakirəni təşkil edərək suallar verir.

Təyyarə nəyə əsasən uçur? (Şagirdlər cavab verirlər);

Təyyarəni necə hazırladınız? (Şagirdlər cavab verirlər.).

Nəticələr və ümumiləşdirmələr: Müəllim şagirdlərin fikirlərini sistemləşdirərək, bir daha təyyarə hazırlanması ardıcıllığına diqqət yönəldir.

Qiymətləndirmə: Müəllim qrupların iş yerinin təşkiletmə, emal vasitələrini seçmə, iş ardıcıllığını müəyyənləşdirmə, emal texnologiyası seçmə, detallarını hazırlama, təyyarə modelini tam hazırlama meyarlarına əsaslanaraq qiymətləndirməni müvafiq qayda üzrə aparır.

Model hazırlamaq üzrə şagirdlərin ibtidai siniflərdə emal bacarıqlarına malik olması onların idrak qabiliyyətinin, texniki təfəkkürün inkişafına təminat verir.

Texnologiya fənninin tədrisi şagirdlərin xarakterinin formalaşmasına, onların estetik, mənəvi, intellektual inkişafına, texnoloji bacarıqlar əldə etmələrinə şərait yaradır, texniki təfəkkürün imkanlarını genişləndirir. Texniki təfəkkür emal proseslərində formalaşır. İstehsal prosesləri texniki əməliyyatları özündə ehtiva edir. Buna görə də texniki mədəniyyət meydana gəlir; texniki təfəkkür şagirdləri yaradıcılığa daha çox sövq edir, bu da onların texnoloji olaraq formalaşmasına səbəb olur; texniki təfəkkür ixtiraçılığın sayını artırır və yeni texnoloji dəyərlərin yaranmasını özündə ehtiva edir; texnoloji nəsillərin ardıcıllığını təmin edir; insan kapitalının yaranmasını texniki təfəkkür təmin edir; texniki təfəkkür texnologiya dərsində əməlin fikirlər üzərində üstünlüyünü təmin edir və s.

"Minik avtomobili maketinin hazırlanması" mövzusu nümunəsinə baxaq. Standartlar (1.1.2.; 1.2.1.; 1.2.2.; 1.2.3.; 1.3.1.; 1.3.2.; 2.1.1.; 1.3.3.; 1.3.4.) təlim məqsədlərində reallaşdırmaqla texniki təfəkkürün hərtərəfli inkişafına səbəb olur. Bura daxildir: texnoloji maşınları (nəqliyyat, yük, məişət) bir-birindən fərqləndirir;

– müvafiq emal texnologiyasını (kəsmə, birləşdirmə, qatlama) təyinatına görə sadə şəkildə izah edir;

– maket hazırlamaq üçün emal vasitəsini seçir;

– maketin hazırlanma ardıcıllığını müəyyənləşdirir;

– maketi hazırlamaq üçün emal texnologiyasını seçir;

– maketin materialına uyğun emal texnologiyasını seçir;

– məmulatın detalını hazırlayır;

– detalları birləşdirməklə minik avtomobilinin maketini hazırlayır;

– maketin hazırlanmasında sadə tərtibat bacarığı nümayiş etdirir;

– qayçı və yapışqanla işlədikdə müvafiq təhlükəsizlik və gigiyena qaydalarına riayət edir.

Müəllim qarşıya qoyulan təlim məqsədlərin həlli üçün dərsin mərhələlərə uyğun didaktik tələblərini təmin etməlidir. Kiçik və böyük qruplarda aparılan iş formasında, müzakirə və beyin həmləsi fəal təlim üsulları düzgün tətbiq edilməli, təchizat kimi ağ karton, avtomobil ülgüsü, qayçı, PVA yapışqanı, kibrit çöpləri, əlləri silmək üçün əski, fırça təmin olunmalıdır.

Dərsin gedişi.

Motivasiya, problemin qoyuluşu: Müəllim ilk mərhələdə şagirdlərə tapmaca ilə müraciət edir. "O nədir ki, bədəni dəmirdən, ayaqları rezindən". Şagirdlər tapmacanın cavabının "avtomobil" olduğunu söyləyirlər.

Tədqiqat sualı: Kibrit çöplərindən minik avtomobilinin maketini necə hazırlamaq olar?

Müəllim minik avtomobilinin hazırlanma planı haqqında şagirdlərə məlumat verir: minik avtomobilinin açılış təsvirinə və onun hazır maketinin təsvirinə diqqətlə baxmaq; minik avtomobilinin açılış təsvirini qayçı vasitəsilə kəsmək və kartona kibrit çöplərini yapışdırmaq; qatlanma xətlərindən yarıqlar açmaq və avtomobilin maketini yığmaq; maketin detallarını yapışqanla bərkitmək.

Müəllim qayçı və yapışqanla iş zamanı təhlükəsizlik texnikası və gigiyena qaydalarını şagirdlərin diqqətinə çatdırır.

Tədqiqatın aparılması: Müəllim şagirdləri dörd qrupa bölür.

"Minik avtomobilinin maketini hazırlamaq" tapşırığını verir.

İnformasiya mübadiləsi: Müəllim qrupların təqdimatını dinləyir.

İnformasiyanın müzakirəsi və təhlili:

Müzakirə sualları: Açılış təsviri dedikdə nə başa düşürsünüz? (Açılış təsviri dedikdə, məmulatın bütün detalları ilə birlikdə vərəqdə açılışı nəzərdə tutulur);

Avtomobilin maketini hazırlamaq üçün ilk mərhələdə nə etdiniz? (Avtomobilin açılış təsvirini kəsdik və karton üzərinə kibrit çöplərini ardıcıllıqla yapışdırdıq.);

Sonra nə etdiniz? (Qatlanma xətlərindən yarıqlar açaraq maketi yığdıq.);

Yekun mərhələdə nə etdiniz?(Avtomobil maketinin detallarını yapışqanla yapışdırdıq.)

Nəticələr və ümumiləşdirmə: Müəllim şagirdlərin cavablarını yekunlaşdıraraq, bir daha minik avtomobili maketinin hazırlanma texnologiyası üzərində dayanır.

Qiymətləndirmə rəğbətləndirmə yolu ilə aparılır.

Real idrak motivasiyasının (biliklərə yiyələnmək həvəsinin) yaranmasını təmin edən fəal təlimin imkanlarından müəllim səmərəli istifadə etmək üçün dərsin aşağıdakı xüsusiyyətlərini reallaşdırılmalıdır: Dərsə başlayarkən müəllim şagirdləri qoyduğu problemin həllinə yönəltməli; təlim dialoji şəkildə aparmalı, qarşılıqlı əlaqə yaradılmalı; dərs kiçik tədqiqata bənzəyir şagirdlərin bilikləri müstəqil əldə etməsi üçün müəllim bələdçilik etməli; suallar və tapşırıqlar təfəkkürün məntiqi, tənqidi, yaradıcı növlərinə aid olmalı; müəllim biliklərin həyati məqsəd daşımasını təmin etmək üçün praktiki tapşırıqlar verməlidir; təlim fəaliyyətinin qiymətləndirilməsi üçün kəmiyyət və keyfiyyət vasitələrindən səmərəli istifadə etmək [3, s.112]

Şagirdləri ibtidai siniflərdən başlayaraq sadə quraşdırma işlərinə cəlb etmək, onlarda sadə konstruksiya ilə bağlı bilik və bacarıqların qazanılmasına, yaradıcı təfəkkürün inkişafına imkan yaranmış olur.

Bəs konstruksiya nə deməkdir? Konstruksiyaetmə: məmulat hazırlanmasının ən vacib başlanğıc mərhələsidir (konstruksiya — latın dilindən tərcümədə "quruluş" deməkdir). Adətən, konstruksiyaetməni məmulatın xəyali təsəvvüründən başlayır. Daha sonra onun eskizini, texniki rəsmini və çertyojunu işləyərək yaradıcı əmək sərf etməklə həmin xəyali təsəvvürləri gerçəkləşdirirlər.

Son dövrlərdə elmi-texniki tərəqqi, istehsal sahələrinin artması, sənaye və iqtisadiyyatın inkişafı cəmiyyətin, insanların yaşayışına müsbət təsir göstərsə də, ekoloji tarazlığın pozulmasına səbəb olmuşdur. Bir çox elm sahələri ilə müqayisədə kimyanın ekologiya ilə bağlılığı daha geniş olduğu üçün ekoloji tarazlığın pozulmasında onun rolu böyükdür. Kimya sənayesinin sürətlə inkişafı atmosfer, hidrosfer və litosferin çirklənməsinə səbəb olmuşdur. Kimyanın tədrisində şagirdlərə ekoloji problemləri yaradan səbəblər, onların aradan qaldırılması yollarına aid müvafiq bilik və bacarıqların verilməsinə xüsusi diqqət yetirilməlidir. Kimya fənni kurikulumu və onun əsasında yazılan yeni dərsliklərdə deyilənlər nəzərə alınmışdır. Bu baxımdan məqalənin mövzusunun təlim-tərbiyə prosesinin qeyd edilən vacib məsələlərinə həsr olunması məqsədəuyğun hesab edilmişdir.

Kimya fənni kurikulumu əsasında aparılan təlim-tərbiyə prosesinin təşkilində mühüm məsələlərdən biri şagirdlərin müasir təhsilin tələblərinə uyğun bilik və bacarıqlara yiyələnməsidir. Bunun üçün istər dərs, istərsə də dərsdənkənar məşğələlərdə şagirdlərin fəaliyyəti qeyd edilən istiqamətə yönəldilməlidir. Şagirdlər dərsin mövzusuna uyğun olaraq məzmunu əks etdirən materialı dərindən mənimsəməli və onlara aid təlim nəticələri əldə etməlidirlər. Kimya fənni kurikulumunun məzmun xətlərinin alt standartlarının düzgün reallaşdırılması ilə buna nail olmaq olar. Ümumi təhsilin hər iki səviyyəsinə aid təlim nəticələrində maddələrin quruluşu, xassələri, baş verən hadisə və proseslər, onların tətbiq sahələri ilə yanaşı, ekoloji problemlərə aid məsələlər də öz əksini tapmışdır.

Ətraf mühitin çirklənməsi və ekoloji tarazlığın pozulması kimi hallara səbəb olan amillərdən biri müasir dövrümüzdə istehsal sahələrinin xüsusilə də kimya sənayesinin inkişaf etməsi, müxtəlif növ kimya məhsullarının istehsal olunmasıdır. Canlılar üçün təhlükə yaradan məsələlərdən biri də ətraf mühitdə deqradasiya proseslərinin baş verməsidir ki, bu proseslər də biosferi çirkləndirir. Antropogen təsirlər də ekologiyaya böyük zərər vurur. Belə ki, bu təsirlərin nəticəsində okean sularının səviyyəsində 2 sm artma, atmosferdə parnik effektini yaradan qaz və tozların toplanması nəticəsində ozon təbəqəsində 1-2% nazilmə baş verir. Ekoloqlar düşünürlər ki, əgər vəziyyət belə davam edərsə, bir neçə onillik keçdikdən sonra bəşəriyyəti çox təhlükəli fəlakət gözləyir. Atmosferin çirklənməsi, həmçinin hidrosfer, eyni zamanda, biosferin də çirklənməsidir ki, nəticədə müxtəlif növ xəstəliklər yaranır.

Meqapolislərin tikilməsi, yolların salınması, yaşıl bitkilərin məhv olunması insan fəaliyyəti nəticəsində yaranan ekoloji problemlərdir. Bu isə birinci növbədə yerin landşaftının dəyişilməsinə gətirib çıxarır. Antropogen fəaliyyət ətraf mühitə təsir göstərir və bu təsir bütün sahələrdə aydın şəkildə hiss olunur.

Kənd təsərrüfatında düzgün istifadə olunmayan mineral gübrələr, torpağa lazım olan miqdardan artıq verilən pestisidlər alınan məhsullara öz təsirini göstərir. Nitratların və başqa elementlərin meyvə və tərəvəzlərdə miqdarının artıq olması insan orqanizmi üçün təhlükəli vəziyyətdir. Nitratlar bitkilərin kökləri vasitəsilə yaxşı mənimsənilir. Həmçinin nitratların amin turşulara çevrilməsi bitkilərin orqanizmində baş verən zəncirvari reaksiyalarda həyata keçir. Bu proses nəticəsində isə zülal əmələ gəlir. Zülalsız həyatı təsəvvür etmək mümkün deyil və onsuz həyat yoxdur. Kənd təsərrüfatında nitratların artıq miqdarından istifadə olunduqda həmin artıq miqdarda olan nitratlar mənimsənilməyən formada orqanlarda toplanır ki, bu da insanlar üçün təhlükəli olan maddə şəklində bağırsaq xəstəliklərini əmələ gətirir. Bundan başqa, hemoqlobinə də təsir göstərir ki, bu zaman iki valentli dəmir oksidləşərək üçvalentli dəmirə çevrilir və hemoqlobində oksigenin daşınması qabiliyyəti pozulur. Buna görə də meyvə və tərəvəzlərdə nitratların miqdarı, yəni onun normal olması müntəzəm şəkildə yoxlanılmalıdır.

Havanın tərkibi müxtəlif qazlardan təşkil olunmuşdur. Bu qazlara azot, rodon, arqon, oksigen və s. aiddir. Ancaq təbiətdə belə tərkibə malik havanın olması qeyri-mümkündür. Havanın qaz mühitində çox miqdarda xırda maye, həmçinin bərk hissəciklər vardır. Hava dispers və yaxud aerozol sistem halında olur. Havanı çirkləndirən bu çirkləndiricilər havaya biosfer vasitəsilə daxil olur. Hava biosferin digər komponentləri ilə, yəni su ilə, torpaqla və canlı orqanizmlər ilə qarşılıqlı təsirdə olduqda biosferdə maye və bərk hissəcikləri əmələ gətirir. Biosferin bir hissəsi havadır.

Təbiətdə baş verən bir sıra təbii proseslər dispers hissəciklər ilə havanın təchizedicilərdir. Güclü vulkan püskürdükdə yaranan xırda bərk

və eyni zamanda, maye hissəciklər havaya qalxır. Həftələrlə havada qala bilən bu hissəciklər və bunlarla birlikdə qazlar 20 km, hətta ondan da çox yüksəkliyə qalxırlar.

Hər il bir sıra ölkələrdə baş verən yanğınlar zamanı tüstünün xırdalanmış bərk hissəcikləri on, yüz kilometrlərlə ərazilərdə yayıla bilir. Mineral tozlar bozqır, həmçinin torf yanğınları nəticəsində də əmələ gələ bilir. Torpaq eroziyası zamanı və onunla əlaqədar olaraq qum tufanları baş verdikdə, dağ süxurları aşındıqda və dağıldıqda xırda hissəciklər havaya dolur.

Bir sıra sənaye sahələri atmosferi süni çirkləndirir. Bunlar aşağıdakılardır:

1) Qara metallurgiya;
2) Kimya və neft-kimya sənayesi;
3) Tikinti materialları sənayesi;
4) İstilik elektrik stansiyaları;
5) Nəqliyyat tullantılarının atmosferi çirkləndirməsi və s..

Günümüzdə nəqliyyat tullantılarının atmosferi çirkləndirməsi qlobal problemlərdəndir. Nəqliyyat vasitələrinin, xüsusilə avtomobillərin havanı çox çirkləndirdiyi məlumdur. Nəqliyyatın insanların həyatında əhəmiyyəti böyükdür. Şəhərlərin böyüməsi bu problemi daha da kəskinləşdirir. Avtomobillərdən çıxan qazlar havanı çirkləndirir. Havanın bu yolla çirklənməsi havanı çirkləndirən qazların təxminən 69-81%-ə qədərini təşkil etməkdədir. Əvvəllər bu problemə günümüzdəki qədər əhəmiyyət verilmirdi. Bunun səbəbi avtomobillərin sayının daha az olması idi. Nəticədə ətraf mühit üçün təhlükəli vəziyyət deyildi. Günümüzdə isə bu, çox ciddi problemdir.

Məlum olmuşdur ki, avtomobil mühərrikləri il ərzində iki milyard tondan artıq neft yanacağı işlədir. Hesablamalara əsasən, ildə təxminən 15 min kilometr yolu getmiş avtomobil 4360 kq oksigen işlətmiş olur. Həmçinin atmosferi karbon-dioksid, karbon-monoksid və başqa zərərli qazlarla çirkləndirir. Yüz kilometr yolu gedən avtomobilin işlətdiyi oksigen insanın bir il ərzində udduğu oksigenin miqdarına bərabərdir. Avtomobillərdən atmosferə buraxılan zərərli qazların konsentrasiyası təkcə onun mühərriyinin tipi ilə əlaqəli deyil, həmçinin avtomobillərin texniki vəziyyəti, avtomobilə göstərilən xidmət və yolun xarakteri ilə də əlaqəlidir.

Qloballaşan dünyada baş verən prosesləri dərindən dərk edən şəxsiyyətyönlü insan yetişdirmək bugünkü təhsilin əsas məsələlərindən biridir. İstənilən sahədə çalışan hər bir kəs ekoloji təhsilə yiyələnməlidir. Ekoloji təhsil təhsil sisteminin bir hissəsi olmaqla yanaşı, həm də onun əsas hissəsi olmalıdır. Ədəbiyyat, tarix, təbiətşünaslıq necə vacib olan sahələrdirsə, ekoloji təhsil də ən az bu sahələr qədər vacibdir. Ekoloji təhsil insanlarda təbiətə qarşı düzgün münasibətin formalaşdırılması üçündür. Bununla da demək olar ki, gələcəkdə insanın mövcudluğu, eyni zamanda inkişafı mümkündür.

Ekoloji münasibətlər sistemində yaranan deformasiya və gələcək qarşısında insanlarda məsuliyyətsizlik ekoloji böhranların əsas mənbəyi hesab edilir. Ümumiyyətlə, əhalidə təbiətə qarşı istehlak münasibəti vardır. Əhali arasında ətraf mühitin öyrənilməsi və yaxşılaşdırılması üçün təşkil olunan tədbirlərdə iştirak etmək inkişaf etməmişdir. Buna görə də təbiətə qarşı məsuliyyət hissinin formalaşdırılması ekoloji təhsilin əsas məqsədidir.

Şagirdlərdə ekoloji biliyin, bacarığın, həmçinin ekoloji tərbiyənin olması təmin edilməlidir. Bu isə sistemli şəkildə şagirdlərə dərs zamanı aşılanmalıdır.

Kimyanın tədrisi prosesində ekoloji anlayışların formalaşdırılması mühüm əhəmiyyət kəsb edir.

Kimyanın tədrisində ekoloji bilik və bacarıqların formalaşdırılması üçün, ilk öncə, şagirdlər onların məzmunu və mahiyyəti ilə tanış edilməlidir. Bu məqsədlə, ilk növbədə, şagirdlərə ekologiya ilə bağlı anlayışlar barədə məlumat verilməli, onların dərk edilməsinə diqqət yetirilməlidir. Belə ümumi anlayışlara ekoloji tərbiyə, ekoloji təhsil, ətraf mühit, atmosfer, biosfer, antropogen, aerozol, maddələrin dövranı, mühit amilləri, çirkləndiricilər, təbiətin mühafizəsi, təbii mənbələr, antropogen mənbələr və s. aiddir.

Kimya fənni kurikulumu əsasında həyata keçirilən təlim-tərbiyə prosesində mövzuların məzmununa uyğun olaraq şagirdlərin müvafiq ekoloji bilik və bacarıqlara yiyələnmələrinə diqqət yetirilməlidir. Bu bilik və bacarıqların məzmunu tədris vahidlərində əks olunan mövzunun məzmunundan asılıdır. Müəllim dərsin planını hazırlayarkən alt standartların və onlara uyğun təlim nəticələrinin müəyyənləşdirilməsində bu məsələni nəzərdə saxlamalıdır. Əsasən də kimyəvi maddələr, onların birləşmələrinin alınması və xassələrinə həsr olunmuş dərslərdə baş verən

proseslərin ətraf mühitə təsirinin xeyirli və zərərli cəhətlərinin araşdırılması üçün ekoloji bilik və bacarıqlar zəruridir.

Kimyanın tədrisində şagirdlərdə formalaşdırılması zəruri hesab edilən ekoloji bilik və bacarıqları aşağıdakı kimi sistemləşdirmək olar:




Kimya elmi təcrübələrlə zəngin olan elmdir. Şagirdlər müxtəlif təcrübələri apardıqda onlarda praktik bacarıqlar formalaşır. Müəllimin şagirdlərə aşıladığı ekoloji biliklər sayəsində onlar təbiətin mühafizəsinə həsr olunmuş tədbirlərdə iştirak etmək kimi bəzi əməli bacarıqlara, həmçinin vərdişlərə yiyələnirlər.

**Problemin aktuallığı.** Qloballaşan dünyada əhali sayının kəskin artması təbiətdə sanki bir ağırlıq yaratdı. Bu səbəbdən təbii resursların azalması və atmosferdə parnik effektinin artması, ozon dəliyinin genişlənməsi hadisəsi baş verdi. Kimya sənayesinin ətraf mühitə təsirləri də bir sıra problemlərin yaranmasına səbəb oldu. Kimya fənninin tədrisində şagirdlərdə ekoloji anlayışların formalaşdırılması dövrün prioritet məsələlərindəndir.

**Problemin elmi yeniliyi.** Kimya fənninin tədrisində şagirdlərdə ekoloji təhsillə bağlı bilik və bacarıqların formalaşdırılması, müasir təhsilin tələblərinə uyğun şagirdlərdə ekoloji aspektin inkişaf etdirilməsi və hər bir mövzuya uyğun ekoloji biliklərin aşılanmasıdır.

**Problemin praktik əhəmiyyəti.** Ekoloji bilik və bacarıqlar haqqında verilən məlumatlardan, ekoloji anlayışlardan kimya fənninin tədrisi prosesində sistemli şəkildə istifadə metodikasından, verilən məlumatlardan metodika sahəsində tədqiqat aparanlar faydalana bilərlər.

**Ədəbiyyat:**

1. G.N. İsmayılova, İ.Z. Məmmədov. Kimyanın tədrisində ekoloji aspektin formalaşdırılması // – Bakı: Kimya məktəbdə, 2018, № 62-63, – s. 24-29.
2. G.N. İsmayılova. Okean, dənizlərin ağır metallarla çirklənməsi və şagirdlərdə ekoloji biliklərin formalaşdırılması // – Bakı: Kimya məktəbdə, 2019. № 67, – s. 27-31.
3. G.V. Şadlinskaya, G.Ə. Qasımova. X sinifdə üzvi kimyanın tədrisi prosesində ekoloji anlayışların formalaşdırılması // – Bakı: Kimya məktəbdə, 2018. № 61, – s. 31-36.
4. G.V. Şadlinskaya, G.Ə. Qasımova. Neft emalı zamanı ətraf mühitin çirkləndirilməsi və onun aradan qaldırılması yolları // – Bakı: Kimya məktəbdə, 2017. № 60, – s. 71-76.
5. Q.Ş. Məmmədov, M.Y. Xəlilov. Ekologiya və ətraf mühitin mühafizəsi. / Q.Ş. Məmmədov, M.Y. Xəlilov. – Bakı: Elm, 2005. – 435 s.
6. Q.Ş. Məmmədov, M.Y. Xəlilov. Ekologiya, ətraf mühit və insan. – Bakı: Elm, 2006. – 608 s.

**E-mail:** gulnara.ismayilova@yandex.ru
**Rəyçilər:** *dos.* **A.C. Quliyev**
*kimya.ü.fəls.dok.* **G.V. Şadlinskaya**
**Redaksiyaya daxil olub:** 11.04.2023

## *BİOLOGİYANIN TƏDRİSİ METODİKASI*
## *МЕТОДИКА ПРЕПОДАВАНИЯ БИОЛОГИИ*
## *METHODS OF TEACHING BİOLOGY*

*UOT372.857*

***Rauf Lütfəli oğlu Sultanov***
*biologiya üzrə elmlər doktoru, professor*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
*https://orcid.org/0000-0002-9564-0531*

# FƏAL TƏLİM PROSESİNDƏ PEDAQOJİ BİOETİKANIN BİOLOJİ BİLİKLƏRLƏ ƏLAQƏLİ ÖYRƏNİLMƏSİNİN İMKAN VƏ YOLLARI

***Рауф Лютфели оглы Султанов***
*доктор биологических наук, профессор*
*Азербайджанский Государственный Педагогический Универстет*

# ПУТИ И СПОСОБЫ ОБУЧЕНИЯ ПЕДАГОГИЧЕСКОЙ БИОЭТИКЕ, СВЯЗАННОЙ С БИОЛОГИЧЕСКИМИ ЗНАНИЯМИ, В ПРОЦЕССЕ АКТИВНОГО ОБУЧЕНИЯ

***Rauf Lutfalı Sultanov***
*doctor of biological sciences, professor*
*Azerbaijan State Pedagogical Univesity*

# POSSİBİLİTİES AND WAYS OF LEARNİNG PEDAGOGİCAL BİOETHİCS RELATED TO BİOLOGİCAL KNOWLEDGE İN THE PROCESS OF ACTİVE LEARNİNG

**Xülasə.** Bioetika insanı əhatə edən canlı aləmdə yeni təfəkkür tərzi kimi meydana çıxmışdır. Bioetikanın bir sahəsi pedaqoji bioetikadır. Pedaqoji bioetikanın əsas vəzifəsi müəllim – şagird, müəllim – valideyn arasında normal etik münasibətlərin yaradılmasıdır.

Məqalədə fəal təlim prosesində pedaqoji bioetikanın bioloji biliklərlə əlaqələndirilməsinin imkan və yolları təhlil edilir, araşdırılır.

Bioetika biliklərin tədrisi prosesində sinfin mərhələləri şagirdin yaşı, inkişaf səviyyəsi nəzərə alınaraq təlim metodları və formaları seçilməlidir.

Məqalədə 6-11-ci siniflərdə fəal təlimin mərhələləri üzrə pedaqoji bioetikanın bioloji biliklərlə əlaqəli tədrisinin mahiyyəti və onun öyrənilmə dərəcəsi açıqlanır.

***Açar sözlər:*** *bioetika, sağlamlıq, bilik, bacarıq, insan, pedaqoji bioetika, fəal təlimin mərhələləri*

**Резюме.** Биоэтика возникла как новый способ мышления в живом мире, который окружает человека.Одним из направлений биоэтики считается педагогическая биоэтика. Главной задачей педагогической биоэтики является создание нормальных этических отношений между учителем – учеником, учителем – родителем. В статье анализируются и исследуются возможности и пути соединения педагогической биоэтики с биологическими знаниями в процессе активного обучения. В процессе обучения биоэтическим знаниям методы и формы обучения должны выбираться с учетом этапов занятия, возраста учащегося, уровня развития.

В статье раскрывается сущность преподавания педагогической биоэтики, связанной с биологическими знаниями на этапах активного обучения в 6-11 классах, и степень ее усвоения.

***Ключевые слова:*** *биоэтика, здоровье, знание, способность, человек, педагогическая биоэтика, этапы активного обучения*

*Rauf Lütfəli oğlu Sultanov*

**Summary.** Bioethics has emerged as a new way of thinking in the living world that surrounds man. One area of bioethics is pedagogical bioethics. The main task of pedagogical bioethics is the creation of normal ethical relations between teacher – student, teacher – parent.

The article analyzes and investigates the possibilities and ways of connecting pedagogical bioethics with biological knowledge in the process of active learning.

In the process of teaching bioethics knowledge, teaching methods and forms should be selected taking into account the stages of the class, the age of the student, the level of development.

In the article, the essence of the teaching of pedagogical bioethics related to biological knowledge on the stages of active learning in grades 6-11 and its degree of learning is explained.

***Key words:*** *bioethics, health, knowledge, ability, human, pedagogical bioethics, stages of active learning*

Müəllim təlim prosesində fəal təlimin metodlarından istifadə etməklə şagirdlərin yaradıcı təfəkkürünü formalaşdırır və inkişaf etdirir. Müəllim mövzu ilə əlaqədar fəal təlim metodlarının seçimində daim diqqətli olmalıdır. Fəal təlim metodlarının düzgün seçilməsi və tətbiqi təlimin keyfiyyətinin yüksəlməsinə səbəb olur.

Tədris prosesi zamanı sinfin mərhələləri, şagirdin yaşı, inkişaf səviyyəsi nəzərə alınaraq təlim metodları və formaları seçilməlidir. Pedaqoji bioetikanın biologiya ilə əlaqələndirilməsi zamanı tədris prosesində mövcud olan fərdi, cütlərlə, qrupla və kollektivlə iş zamanı görülən təlim formalarından istifadə edilməlidir. Hər bir şagirdin bilik səviyyəsinin inkişafını izləmək, düşüncələrini öyrənmək üçün fərdi təlim formasından istifadə edilməlidir.

Tədris prosesində fəal təlimin digər təlim formalarından istifadə zamanı şagirdlər müəllim və şagird ilə əməkdaşlıq etməyi, bir-birini dinləməyi öyrənir və müzakirə etmək bacarığına yiyələnirlər.

Fəal təlim prosesində pedaqoji bioetikanın biologiya ilə əlaqəsinin öyrənilməsinin geniş imkanları mövcuddur. Fəal təlimin mövcud yeddi mərhələsinin hər birinin özünə məxsus fərqli spesifik xüsusiyyətləri mövcuddur.

Fəal təlimin motivasiya mərhələsində pedaqoji bioetikanın biologiya ilə əlaqəli öyrənilməsinin fəaliyyət mexanizmi işə salınır. Mövcud əlaqələrin öyrənilməsi ilə əlaqədar problemli vəziyyət yaradılır və mövzunun mahiyyətinə uyğun tədqiqat sualı formalaşdırılır. Dərsin bütün sonrakı gedişi məhz motivasiyanın nə dərəcədə uğurlu yaradılması və həyata keçirilməsindən asılıdır.

Pedaqoji bioetikanın biologiya ilə əlaqəli öyrənilməsi prosesində bir sıra fərziyyələri törədən problemli vəziyyət idrak motivasiyanın meydana gəlməsinə səbəb olur. Mövzu ilə əlaqədar motivasiyanın yaradılması zamanı pedaqoji bioetikanın biologiya ilə əlaqəli öyrənilməsinin vəziyyəti və onun şagirdlərin bu sahədəki bilik səviyyəsinə uyğunluğu nəzərə alınmalıdır.

Fəal təlimin tədqiqat mərhələsində pedaqoji bioetikanın biologiya ilə əlaqəli öyrənilməsi zamanı müəllim mövzuya uyğun bilik, bacarıq və vərdişlərə malik olmalıdır. İnteraktiv təlimin həyata keçirilməsi üçün mövzu ilə əlaqədar metodiki üsullardan və ya texnikalardan düzgün istifadə edilməlidir.

Fəal təlimin informasiya mübadiləsi mərhələsində pedaqoji bioetikanın biologiya ilə əlaqəli öyrənilməsi zamanı müəllim şagirdlərin apardıqları tədqiqatları təqdim edir. Bu mərhələlərin əsas məqsədi iki mövzunun əlaqələndirilməsi prosesində bütün şagirdləri bioetikaya dair yeni faktlar və tapıntılarla tanış etməkdir.

Fəal təlimin informasiya müzakirəsi mərhələsinin məqsədi pedaqoji bioetikanın biologiya ilə əlaqəli öyrənilməsi zamanı yeni faktlar əsasında bilikləri sistemləşdirmək və tədqiqatın sualına cavab tapmaq üçün başlıca əlaqəni üzə çıxarmaqdır. Bu zaman təlimin müqayisə, təhlil və sintez kimi üsullardan istifadə olunmalıdır. Aparılan tədqiqatlarda yol verilən səhvlər və ya qaranlıq qalan məsələlər müzakirə olunaraq mövzuya aydınlıq gətirilməlidir.

Fəal təlimin nəticə və ümumiləşdirmə mərhələsində müəllim mövzu ilə əlaqədar şagirdlərdən əvvəlki mərhələdə qeyd edilmiş bütün fikirləri bir ümumi ideya halında birləşdirməyi və ümumiləşdirməyi tapşırır. Axırda müəllim şagirdlərin köməyi ilə deyilənləri ümumiləşdirir bir sistem halına salır.

Fəal təlimin yaradıcı tətbiqetmə mərhələsində mövzu ilə əlaqədar şagirdlərin öyrəndiklərinin tətbiqi üçün onlara yaradıcı tapşırıqlar verir.

Fəal təlimin qiymətləndirmə, refleksiya mərhələsində meyarlar əsasında qiymətləndirmə aparılır.

Yetişməkdə olan gənc nəslin heyvanlara olan etik münasibətlərinin formalaşması həyatın ilk illərində ailədən başlamalıdır. Təbiətə və canlılara qarşı etik münasibətlərin formalaşması uşağın öhdəsində olduğu valideynlərlə, digər böyüklərlə olan qarşılıqlı münasibətlərdən başlayır. Uşaqlar əhliləşdirilmiş heyvanların həyatı, onların inkişafı, çoxalması və yaşayış tərzi ilə tanış olmalıdır. Heyvanlarla xoş rəftar etməli, incidilməməsi və onlara qarşı sevgi münasibəti yaradılmalıdır. Uşaqlarda ilk bioetik münasibətlər canlı mühitə qarşı düşünülmüş formada olduqda formalaşır. Ona görə də valideyn, böyüklər və müəllim hər zaman ən yüksək səviyyədə etik davranış qaydalarını yetişməkdə olan gənc nəslə öyrətməli və bu istiqamətdə etik tərbiyəni formalaşdırmalıdır. Bioetika sahəsində mövcud bilikləri mənimsəyən gənc nəsil sosioloji və siyasi qərarlar qəbul etməyə qadir vətəndaşlar olurlar.

Fəal təlimin tətbiqi ilə əlaqədar VI-XI siniflərdə biologiya fənninin tədrisi prosesində pedaqoji bioetikanın öyrədilməsi imkanları yaranır.

VI sinifdə biologiya fənninin tədrisi ilə əlaqədar "İnsan və canlı təbiət" mövzusunun tədrisi zamanı müəllimlər fəal təlimin müxtəlif üsul, metod və texnikalarından istifadə edərək şagirdlərə bioetik biliklərin çatdırılmasını həyata keçirirlər.

"İnsan və canlı təbiət" mövzusunda şagirdlər qoruqlar, yasaqlıqlar, milli parklarla tanış olur, onların əhəmiyyətini dərk edir. Təbiətin qorunması və onu çirkləndirənlərlə mübarizə aparmağa çalışır. Şagirdlər bioetik bilikləri biologiyanın tədrisi ilə əlaqəli şəkildə öyrənirlər.

VII sinifdə "Dərman bitkiləri" mövzusunun tədrisi zamanı şagirdlər bu bitkilərin insan həyatında rolunu anlayır, onları mühafizə etməklə bioetik biliklərə yiyələnirlər. Beləliklə, şagirdlərə bioetik biliklər çatdırılaraq, onlarda bitkilərə, ümumilikdə təbiətə qarşı humanist münasibətlər formalaşdırılır.

VIII sinifdə "Orqan nəqli həyat verir" mövzusunun tədrisi zamanı müəllim İKT-nin köməyilə əlavə məlumatların verilməsini, bunun əsasında müzakirəni təşkil etməklə şagirdlərə müstəqil şəkildə öz fikirlərinin səsləndirilməsinə şərait yaradır.

Qeyri-leqal yollarla orqan transplantasiyasını həyata keçirən həkimlərin olması, insanların icazəsi olmadan onlardan orqanların köçürülməsi, orqan alqı-satqısı ilə məşğul olan insanların olması etik normalara uyğun fəaliyyəti cinayətdir.

Dünyada orqan transplantasiyası əməliyyatları insanların razılığı əsasında aparılır. Bu bahalı əməliyyatları yalnız imkanlı şəxslər həyata keçirə bilir. İmkansız insanlar buna ehtiyac duyduğu halda, ondan istifadə edə bilmir. Bu, hüquqların bərabərliyi prinsipinin pozulması etik münasibətlərə uyğun deyildir. Beləliklə, orqan nəqlinə ehtiyacı olan insanlar öz taleyi ilə barışmalı olurlar.

Mövzu ilə əlaqədar məlumatlar şagirdlərin nəzərinə çatdırılmalı və etik münasibətlər barədə müzakirələr təşkil edilməlidir. Dünyada etik normalara uyğun hər bir insanın ehtiyacının ödənilməsi və transplantasiya əməliyyatlarının keçirilməsi üçün şəraitin dövlət səviyyəsində yaradılması vacibdir. Əlbəttə, bu, bioetik münasibətlərin formalaşmasından və tibb elminin inkişafından asılıdır.

Bioetikanın bir sahəsi kimi orqan transplantasiyası elmi də inkişaf etməkdədir. Şagirdlərin bu mövzu ilə əlaqədar fikirlərinin öyrənilməsi onların gələcək həyatında bir bioetik şəxsiyyət kimi yetişməsinə şərait yaradacaqdır. Beləliklə, nəticədə pedaqoji bioetikanın biologiya ilə əlaqəli öyrənilməsinin və yollarından istifadə etməklə bioetik münasibətlər formalaşdırmaq mümkün olacaqdır. Müəllim IX sinifdə "Viruslar" mövzusunu tədris edərkən bioetikanın biologiya ilə əlaqələndirilməsinin imkanlarını təhlil etməli və fəal təlimin üsul, metod və texnikalarından istifadə etməklə onun tədrisini həyata keçirməlidir.

Müəllim virus xəstəlikləri və ondan özünü necə qoruya bilməsi ilə əlaqədar şagirdlərə esse yazmağı tapşırır. Bildiyimiz kimi, korona I virus 2019-cu ildən başlayaraq, hal-hazırda qlobal bir problem olaraq qalmaqdadır.

Fəal təlim prosesində şagirdlər bioetikanın biologiya ilə əlaqələndirilməsinin imkanından istifadə edərək telekommunikasiya mənbələrinə istinad edərək mövzu ilə əlaqədar öz fikirlərini irəli sürürlər. Bu zaman şagirdlərin tədqiqatçılıq qabiliyyəti inkişaf edir və onlar ətrafında baş verənlərə qarşı daha diqqətli olmağa çalışırlar. Müəllimin şagirdin yeni kəşf etdiyi biliklərlə razılaşması şagirddə özünə inamı artırır.

"Ali sinir fəaliyyətinin əsas tipləri" mövzusunda müəllim hər bir şagirdin hansı tipə

məxsus olmasını fərdi şəkildə müəyyənləşdirmək üçün psixoloji test təqdim edir. Müəllim şagirdin hansı tipə məxsus olmasını bilməklə ona qarşı hansı bioetik münasibətlərə uyğun yanaşmağı düzgün müəyyənləşdirə bilir. Müəllim bioetik tərbiyə prosesində bunları nəzərə almaqla temperament tipinin mənfi cəhətlərini aradan qaldıra bilir.

Müəllim pedaqoji bioetikanın biologiya ilə əlaqələndirilməsi prosesində şagirdlərə bu bilikləri çatdırmaqla onlarda bioetik münasibətlər qurur.

X sinifdə "Havanın çirklənməsi qlobal ekoloji problem kimi" aktual mövzu ilə əlaqədar müəllim şagirdlərin biliklərini formalaşdırır. Burada həm ekoloji, həm də bioetik baxımdan şagirdlərə sərbəst şəkildə öz fikirlərini bildirmək imkanı yaranır. Şagirdlərdə bioetik münasibətlər formalaşdırılaraq onların yaradıcı təfəkkürü inkişaf etdirilir. Müəllimin şagirdlərdə pedaqoji etik münasibətlərin formalaşdırılmasında fəal təlimin müzakirə metodlarından istifadə etməsi daha səmərəlidir. Bu mövzunun tədrisi prosesində şagirdlərdə biologiya, coğrafiya və bioetik biliklər bir-biri ilə əlaqəli tədris olunur. Burada həm fəndaxili, həm də fənlərarası inteqrasiyanın köməkliyi ilə şagirdlərin elmi bilikləri arasında qarşılıqlı əlaqə yaranır.

Müəllim XI sinifdə pedaqoji bioetika ilə əlaqədar "Canlılarda klonlaşma" və "Bitkiçilik və heyvandarlıqda istifadə olunan müasir metodlar“ adlı mövzulara diqqət yetirməlidir.

Müəllim "Canlılarda klonlaşdırma“ mövzusu ilə şagirdləri tanış edir, hüquqi, dini aspektləri müəyyənləşdirir. Bioetik biliklərin bioloji biliklərlə qarşılıqlı əlaqələndirilməsinin imkanlarını öyrənir. Müəllim İKT-nin klonlaşması ilə bağlı imkanlardan istifadə edərək şagirdləri yeni məlumatlarla tanış edir. Alimlərin, həkimlərin və mütəxəssislərin fikirlərinə əsasən müzakirələr aparılır. Şagirdlər klonlaşmanın etik cəhətdən düzgün olub-olmamasını, onun aparılmasının mahiyyəti və qanunauyğun olub-olmaması barədə müzakirələr aparır və yekunda müəllim şagirdlərlə birlikdə müəyyən nəticələr əldə edir.

Müəllimin "Bitkiçilik və heyvandarlıqda istifadə olunan müasir metodlar“ adlı mövzu bağlı mövcud mənbələr və İKT-nin imkanlarından istifadə edərək debat metodundan və digər üsullar tətbiq etməklə şagirdlərlə müzakirələr keçirməsi yaxşı nəticə verir. Müəllim dərsdə müzakirə şəkildə fəndaxili və fənlərarası inteqrasiyanı həyata keçirir. Burada biotexnologiya, gen mühəndisliyi ilə bağlı mövcud məlumatlar bioetika baxımından müzakirə olunur. Müəllim və şagirdlər, həmçinin genetik modifikasiya olunmuş orqanizmlər və onların məhsulları haqqında məlum faktlarla bioetik baxımdan təhlil aparırlar.

Beləliklə, müəllim fəal təlimin metodlarından istifadə etməklə, pedaqoji bioetikanı bioloji biliklərlə əlaqələndirməklə şagirdlərin bu sahədə məntiqi, tənqidi və yaradıcı təfəkkürünü inkişaf etdirir. Şagirdlər nəticə etibarilə əldə etdikləri bioetik biliklərə əsasən düzgün qərar qəbul etməyi bacarırlar. Şagirdlər bioetik bilikləri interaktiv metodlarla öyrənməklə mühakimə etməklə, müzakirə aparmaqla və təsəvvür etmək kimi qabiliyyətini inkişaf etdirirlər.

**Problemin aktuallığı.** Bioetikanın bir sahəsi pedaqoji bioetikadır. Onun əsas vəzifəsi müəllim-şagird, müəllim-valideyn arasında normal etik münasibətlərin yaradılmasıdır. Müəllim pedaqoji bioetikanın biologiya ilə əlaqəli öyrənilməsini təşkil etməklə bioetik bilikləri şagirdlərə çatdırmalıdır. Münasibətlərin düzgün şəkildə qurulması problemin aktuallığını göstərir.

**Problemin elmi yeniliyi.** Fəal təlimin mövcud mərhələlərinin hər birinin özünə məxsus spesifik xüsusiyyətləri mövcuddur. Məqalədə ilk dəfə olaraq fəal təlimin mərhələləri üzrə pedaqoji bioetikanın bioloji biliklərlə əlaqəli öyrənilməsinin mahiyyəti, fərdi xüsusiyyətləri müəyyənləşdirilmişdir.

Burada, həmçinin fəal təlimin tətbiqi ilə əlaqədar VI-XI siniflərin hər birində biologiya fənninin tədrisi prosesində pedaqoji bioetikanın mövzuları müəyyən edilmişdir. Mövzular təhlil edilərək şagirdlərə bioetik biliklərin çatdırılmasının imkan və yolları müəyyənləşdirilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Pedaqoji bioetikanın bioloji biliklərlə əlaqəli öyrənilməsini imkan və yolları müəyyənləşdirilərək onun tədris prosesində tətbiq edilməsi məqsədəuyğun hesab edilmişdir. Fənn üzrə dərsliklər, dərs vəsaitləri və metodik vəsaitlər tərtib olunarkən nəticələrə istinad etmək mümkündür.

**Ədəbiyyat:**

1. Sultanov R.L Biologiya fənn kurikulumunda "İnsan və onun sağlamlığına dair" mövzuların inteqrasiya prinsipi əsasında tədrisinin xüsusiyyətləri. // – Bakı: Humanitar elmlərin öyrənilməsinin aktual problemləri, 2016. № 4, – s. 329-331.
2. Sultanov R.L Ekoloji mədəniyyətin formalaşmasının mütərəqqi ənənələri. // – Bakı: Azərbaycan məktəbi, 2017. – s. 42-43.
3. Sultanov R.L. Müəllimin xüsusi pedaqoji etik davranışı qaydaları. // – Naxçıvan: Naxçıvan Müəllimlər İnstitutunun xəbərləri, 2020, № 2, – s. 53-57.
4. Sultanov R.L Biotik biliklərə dair təfəkkürün inkişaf etdirilməsində fəndaxili və fənlərarası inteqrasiyadan istifadənin imkanları. // – Bakı: Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, 2022. cild 89. № 1, – s. 138-142.
5. Sultanov R.L, Yusifova A.Ə., İbrahimova X.Q. Bioetika fənninin proqramı. Biologiyanın tədrisi metodikası ixtisası üzrə. – Bakı, 2022. –15 s.

**E-mail:** rsultanov@bk.ru
**Rəyçilər:** *biol.elm.dok., prof.* **M.Ş. Babayev,**
*ped.ü. fəls.dok., dos.* **A.X. Hacıyev**
**Redaksiyaya daxil olub:** 17.04.2023

*UOT 372.857*

***Qəzənfər Musa oğlu Əliyev***
*biologiya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı elmi işçisi*
*https://orcid.org/0009-0004-1940-1717*

# BİOLOGİYANIN TƏDRİSİNDƏ BİLİK VƏ BACARIĞIN TƏTBİQİ PROSESİNDƏ ŞAGİRDLƏRDƏ TƏDQİQATÇILIQ BACARIĞININ İNKİŞAF ETDİRİLMƏSİ YOLLARI

***Газанфар Муса оглы Алиев***
*доктор философии по биологии, ведущий научный сотрудник*
*Института Образования Азербайджанской Республики*

# ПУТИ РАЗВИТИЯ ИССЛЕДОВАТЕЛЬСКИХ НАВЫКОВ УЧАЩИХСЯ В ПРОЦЕССЕ ПРИМЕНЕНИЯ ЗНАНИЙ И УМЕНИЙ ПРИ ПРЕПОДАВАНИИ БИОЛОГИИ

***Gazanfar Musa Aliyev***
*doctor of philosophy in biology, leading reserсher at the*
*Instutide of Education of the Respublic of Azerbaijan*

# WAYS TO DEVELOP STUDENTS' RESEARCH SKILLS IN THE PROCESS OF APPLICATION OF KNOWLEDGE AND SKILLS IN TEACHING BIOLOGY

**Xülasə.** Biologiyanın tədrisində bilik və bacarığın möhkəmləndirilməsi tətbiqi prosesi mühüm yer tutur. Bu barədə məqalədə həm nəzəri, həm də praktiki işlərin yerinə yetirilməsi, bu sahədə şagirdlər üzərində müəllim nəzarətinin gücləndirilməsi, bilik və bacarıqların inkişaf etdirilməsi, bilik və bacarığın yoxlanması üçün yazı işlərinin aparılması, yoxlanması, qiymətləndirilmə haqqında ətraflı məlumat verilmişdir.
***Açar sözlər:*** *genetik, seleksiya, mikroorqanizm, irsiyyət, fenotip, genotip*

**Резюме.** Процесс закрепления знаний и умений играет важную роль в преподавании биологии. В статье представлена подробная информация о выполнении как теоретической, так и практической работы, усилении контроля учителя за учащимися по данному направлению, развитии знаний и умений, проведении письменных работ, а также по проверке и оцениванию.
***Ключевые слова:*** *генетик, селексия, микроорганизм, наследования, фенотип, генотип*

**Summary.** The process of consolidating knowledge and skills plays an important role in teaching biology. The article presents detailed information on the implementation of both theoretical and practical work, strengthening the teacher's control over students in this direction, developing knowledge and skills, conducting written work, as well as checking and evaluating.
***Key words:*** *genetic, selection, microorganism, inheritance, phenotype, genotype*

Biologiyanın tədrisində bilik və bacarığın tətbiqi prosesi mühüm yer tutur. Bu prosesdə isə əsasən şagirdlərin müstəqil fəaliyyətinin səfərbər edilməsi tələb olunur. Belə bir fakt olduğu halda qarşıya bir sual çıxır: biologiyanın tədrisində bilik və bacarığın tətbiqi, möhkəmləndirilməsi dedikdə nə başa düşülür? Bu prosesdə şagirdin tədqiqatçılıq bacarığını hansı yollarla inkişaf etdirmək olar? Suala əsaslandırılmış şəkildə cavab vermək üçün yenə məktəb təcrübəsinə və özümüzün uzunmüddətli elmi, həm də pedaqoji fəaliyyətimizin nəticələrinə müraciət etdik. Belə nəticəyə gəlmək olar ki, biologiyanın tədrisində proqram materialları elə tərtib edilməlidir ki, orada əvvəl nəzəri materiallar verilməli, sonra isə verilmiş materialların möhkəmləndirilməsi və tətbiqi üçün şagirdlər tərəfindən bir sıra əməli işlərin yerinə yetirilməsi tələb olunsun.

Bu məqsəd üçün şagirdlər tərəfindən yerinə yetirilməsi zəruri sayılan tədris prosesində şagirdlərin tədqiqatçılıq bacarığını inkişaf etdirilməsinə xidmət edən müstəqil işlər aşağıdakı kimi qruplaşdırılmalıdır: praktiki işlər, yoxlama yazı işləri, canlılar üzərində fenoloji müşahidələrin aparılması, müxtəlif məzmunlu bioloji məsələlərin həlli: kolleksiya, cədvəl, model və diaqramların hazırlanması, albom, hesabat və referatların tərtibi, dərslik, sorğu və məsələ kitabları üzrə iş və s.

Proqramda nəzərdə tutulan praktik işlər müəllimlər tərəfindən dəyişdirilə və ya yenisi ilə əvəz oluna bilər, daha doğrusu, məktəbdə avadanlıq və reaktivlərin proqram səviyyəsinə uyğunluğundan asılı olaraq praktik işlər təşkil edilə bilər. Tədris proqramında praktik işlər yalnız bitkilər bölməsində nəzərdə tutulur. Praktiki işlərin təşkilində tədrisin praktik istiqamətinin gücləndirilməsi, daha doğrusu, şagirdlərin tədqiqatçılıq bacarığının inkişaf etdirilməsinə maksimum dərəcədə üstünlük verilməlidir. Müəllim sadəcə olaraq şagirdlərin əməli işinə istiqamət verməli və nəzarət etməlidir.

Praktik işlər zamanı şagirdlər preparat və avadanlıqları özü seçməli, təcrübələr üçün cihazları quraşdırmalı, təcrübələri aparmalı, nəticələrə aid hesabat və ya cədvəl tərtib etməlidir. İşin sonunda təcrübələrin nəticələrinin düzgünlüyü müzakirə edilərkən şagirdlərin cədvəl və ya hesabat nəzərdən keçirilməli, qiymətləndirilməlidir. “Bitkilər” bölməsində proqram üzrə bir sıra praktik işlərin keçirilməsi nəzərdə tutulur. Bitki toxumlarının cücərmə faizini müəyyən edilməsinə aid praktik işin təşkilini nəzərdən keçirməlidir.

Mövzu: “Mədəni bitkilərin toxumlarının cücərmə qabiliyyətinin müəyyən edilməsi” (praktik iş qruplarla aparılır).

Məqsəd: toxumların cücərmə faizini təyin etmək, səpin aparmaq, səpin vaxtını və toxumu səpmə dərinliyini müəyyənləşdirmək bacarığını formalaşdırmaq.

Təchizat: lobya, çovdar, buğda, arpa, noxud, qum, su, süzgəc, qab və s.

İşin gedişi: müəllim şagirdləri 4-5 nəfərlik qruplara bölməlidir. Qruplara həm toxum və cücərmə ləvazimatı, həm də aşağıdakı tapşırıq vərəqlərini paylamalıdır. Tapşırıq vərəqəsindəki tapşırıqların öz dəftərlərinə köçürülməsi şagirdlərə tapşırıq kimi verilir:

– qabın divarını filtr kağız (və ya qumla) ilə örtün;

– qabın hər birinə 100 ədəd noxud və ya buğda toxumu düzün, onu isladana qədər su tökün; aşağıda göstərilən cədvəli dəftərinizə çəkin. Toxumların hər gün nəmliyini yoxlayın. Cücərən toxumları seçin və cədvələ qeyd edin.

| ***Cücərmə tarixi*** | ***Cücərtinin sayı*** | ***Cücərmə qabiliyyəti faizlə*** |
|---|---|---|
| 25 m. 2023 | 20 ədəd | 20% |
| 26 m. 2023 | 30 ədəd | 30% |
| 27 m. 2023 və s | 25 ədəd və s | 25% və s |

Sonda 100 ədəd toxumdan 10 gün müddətində neçəsinin cücərdiyi yoxlanılır, faizlə miqdarı, cədvəldə yazılır. Məsələn, 100 toxumdan 96 ədədi cücərmişsə, deməli, cücərən toxumun cücərmə 1 faizi 96-dır.

Praktik işin sonunda qrup rəhbəri görülmüş işlər barədə sinif qarşısında məlumat verməlidir. Qruplar bir-birinin işini qiymətləndirə bilərlər. Təcrübə göstərir ki, şagirdlər yoldaşlarının və özlərinin işini əsasən düzgün qiymətləndirirlər.

“Bitki hüceyrəsinin quruluşu” mövzusu ilə əlaqədar şagirdlərdə optik cihazları (lupa, mikroskop, ştativli lupa və s.) qruplaşdırmaq və onlardan istifadə olunması bacarığının möhkəmləndirilməsinə fikir verilməlidir. Hər bir şagird müstəqil olaraq soğan pərdəsi, pomidor və qarpız hüceyrələrinə aid mikropreparatları hazırlamağı, lupa, mikroskop vasitəsilə hüceyrələri müşahidə etməyi bacarmalıdır.

“Kökün növləri və kök sisteminin tipləri” mövzusunu öyrənərkən şagirdlər mil və saçaqlı kökləri, əmici telləri, kök üsküyü fərqləndirmə bacarığının möhkəmləndirilməsinə aid aqrotexniki tədbirləri bilməlidir. Texniki, tərəvəz və çoxillik bitkilərin diblərini yumşaltmaq, köklərin ucunu vurmaq və s., kök sistemini qüvvətləndirməyi və bitkilərin qidalanma sahəsini genişləndirmək kimi texniki üsullardan istifadəni bacarmalıdırlar.

“Zoğun tumurcuqlarından istifadə edilməsi” mövzusunda köklə yeraltı gövdələri fərqləndirməyi, vegetativ çoxaltmaq üçün əkin materiallarını hazırlamağı (kartof yumruları, çilikləri, calaq materiallarını), calaq etməyi bacarmalıdır.

Şagirdlər tədris-təcrübə sahəsində vegetativ yolla kartof, bəzək bitkilərini çoxaltma, pambıq kollarının ucunu vurma işlərini praktik olaraq yerinə yetirməlidirlər.

"Yarpağın xarici quruluşu" mövzusunda nəzəri biliklərlə yanaşı, yarpaqların quruluşuna görə fərqləndirməyi, təsnif etməyi, gövdə düzülüşünü izah etməyi bacarmalı, otaq bitkisinə qulluq etməlidirlər.

"Çiçək və meyvə" bəhsini keçərkən şagirdlərə çiçəklərin axtalanması, süni yolla çarpaz tozlanmanın texnikasını öyrətmək vacibdir. Bəzi bitki güclü çiçəkləyir, lakin az bar verir. Şagirdlər belə halların səbəblərini və onun qarşısının alınması yollarını öyrənməlidirlər. Məlum olduğu kimi, bitkiləri calaq etmənin müxtəlif üsulları və vaxtları vardır.

"Örtülütoxumlu (çiçəkli) bitkilər şöbəsi" bəhsini öyrənərkən tədqiqatçılıq bacarığının inkişafına daha geniş imkanlar açılır. Belə ki, şagirdlər proqram üzrə xaççiçəklilər, gülçiçəklilər, kəpənəkçiçəklilər (paxlalılar), badımcançiçəklilər, mürəkkəbçiçəklilər və zanbaq fəsiləsini öyrənməlidirlər. Belə olduqda təsərrüfat əhəmiyyətli bitkilərə aid praktik vərdişlərin öyrənilməsi və şagirdlərin tədqiqatçılıq bacarığının inkişafı üçün imkanlar genişləndirilməlidir. Müəllim təsərrüfat əhəmiyyətli bitkilərin biologiyasının öyrədilməsi, onların becərilməsinin aqrotexnikasına dair praktik vərdişlərin və şagirdlərin tədqiqatçılıq bacarığının inkişaf etdirilməsi məsələlərinə daha çox diqqət verilməlidir.

"Bitkilərin şöbələri"ni öyrədərkən ayrı-ayrı şöbələrin iqtisadi əhəmiyyətinin aydınlaşdırılması, onların faydalı və zərərli cəhətlərinin izahına diqqət artırılmalıdır. Yosunları öyrənərkən onların yer üzərindəki üzvi kütlənin hazırlanmasındakı rolunu, qıjıkimiləri öyrənərkən daş kömürün əmələ gəlməsində qıjıkimilərin tarixi rolu məsələlərinə diqqət artırılmalıdır. Çılpaq və örtülütoxumlu bitkilərin öyrədilməsində onlardan inşaat materialı, qida məhsulu kimi istifadə edilməsi, becərilməsinin aqrotexnikası, sağlamlıq əhəmiyyəti, meşə və bitki örtüyünün qorunub mühafizəsi, bərpası məsələləri, bakteriyaları öyrənərkən insan, heyvan və bitkilərdə xəstəlik törədən bakteriyalara qarşı mübarizə tədbirlərinin, göbələkləri öyrənərkən onların insanların qidası, xəstəliklərin müalicəsində əhəmiyyəti, göbələklərin becərilməsinin aqrotexnikasının, mamırların öyrənilməsində torfun əmələ gəlməsi, ondan gübrə, yanacaq kimi istifadə olunması ilə şagirdləri əsaslı tanış etmək və onların tədqiqatçılıq bacarığını inkişaf etdirmək lazımdır.

**Problemin aktuallığı.** "Biologiya" fənninin məzmunu şagirdlərdə bilik, bacarıq və vərdişlərin formalaşması üçün böyük potensiala malikdir. Buna görə şagirdlərə sistemli olaraq tədris materiallarını rəsmi yadda saxlamağa deyil, müxtəlif intellektual bacarıqlarla işləyərək onu mənimsəməyə kömək etmək lazımdır.

**Problemin elmi yeniliyi.** Müəllimlərə nəticələrin bir standart tələb kimi verilməsi onlara fəaliyyətində sərbəst olmağa, müvafiq təlim strategiyaları seçməyə, yaxud öz imkan və şəraitlərinə uyğun strategiyalar hazırlamağa imkan yaradır.

**Problemin praktik əhəmiyyəti.** Biologiya kursunun (VIII-XI siniflər) tədrisində şagirdlərin bilik və bacarıqlarını formalaşdırmaq baxımından biologiya müəllimləri pedaqoji-psixoloji əsaslardan istifadə edə, məqalədə verilmiş materiallardan faydalana bilərlər.

**Ədəbiyyat:**

1. Babayev, M.S. Ümumi biologiya. / M.S. Babayev. – Bakı, 2004.
2. Nəcəfov E.Ə. Orta məktəbdə ümumi biologiyanın tədrisi metodikası. – Bakı, 2004.
3. Мамонтов, С.Г. Биология. / С.Г. Мамонтов. – М.: Дрофа, 1997.
4. Babayev R. Orucov F. Tədqiqatçılıq metodu və onun tədrisi // Kimya və biologiya tədrisi, 1989, № 2
5. Ələkbərov, U. Bitkilər, Bakteriyalar. Göbələklər. Ümumtəhsil məktəbləri üçün dərslik. / U. Ələkbərov. – Bakı, 2007

**E-mail:** aliyevq@mail.ru.
**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **H.M. Hacıyeva,**
*ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva**
**Redaksiyaya daxil olub:** 11.04.2023

*UOT 372.857*

***Əliyənnağı Məhəmmədtağı oğlu Məhərrəmov***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
*https://orcid.org/0009-0002-6752-7136*

# BİOLOGİYA FƏNLƏRİNİN TƏDRİSİ ZAMANI MÖVZULARIN TƏRBİYƏEDİCİ İMKANLARININ NƏZƏRƏ ALINMASI

***Алияннаги Магомедтаги оглы Магеррамов***
*доктор философии по педагогике, доцент*
*Азербайджанский Государственный Педагогический Университет*

## *УЧЕТ ВОСПИТАТЕЛЬНЫХ ВОЗМОЖНОСТЕЙ ТЕМ ПРИ ПРЕПОДАВАНИИ БИОЛОГИИ*

***Aliyannaghi Mahammadtaghi oglu Maharramov***
*doctor of philosophy in pedagogy,assistant professor*
*Azerbaijan State Pedagogical University*

## TAKING INTO ACCOUNT THE UPBRİNGİNG OPPORTUNITIES OF TOPICS IN TEACHING BIOLOGY

**Xülasə.** Məqalədə əsaslandırılır ki, müasir dövrdə məktəblərimizin qarşısında duran əsas vəzifələrdən biri fənlərin (biologiya) tədrisi prosesində geniş savada, intellektə malik gənclər yetişdirməklə bərabər mənəvi cəhətdən mükəmməl, hərtərəfli inkişaf etmiş, yüksək mədəniyyətə malik şəxsiyyət formalaşdırmaqdır. Biologiya müəllimi hazırlığında hərtərəfli, düzgün tərbiyənin verilməsi, elmi dünyagörüşünün formalaşdırılması vacibdir. Göstərilir ki, biologiya təlimi prosesində hər bir müəllim şagirdlərə bilik verməklə yanaşı proqram əsasında tərbiyənin əsaslarını da çatdırmalıdır. Bütün tərbiyə növləri eyni zamanda aparılmalı və bir-birini tamamlamalıdır.

Məqalədə biologiya fənləri şagirdlərə yurdumuzun fauna və florası haqqında bilik verməklə yanaşı, onları sevmək, qorumaq, vətənpərvərlik kimi hisslərin tərbiyə olunmasına geniş yer verilmişdir. Əsərdə xüsusi olaraq gəstərilir ki, mövzuya, onun mahiyyətinə müvafiq fəal təlim üsullarının düzgün seçilməsi təlimin tərbiyəedici vəzifəsinin səmərəliliyini artırır, onu daha da intensivləşdirir. Tədqiqatın əsası kimi göstərilir ki, biologiya müəllimi həm də tərbiyəçidir. Əsərdə biologiya müəlliminin tərbiyəçilik vəzifələri sistemləşdirilərək verilmişdir.

***Açar sözlər:*** *təlim, tərbiyə, təfəkkür, dünyagörüşü, ekoloji tərbiyə, estetik tərbiyə, vətənpərvərlik tərbiyəsi, şəxsiyyətyönümlülük, tərbiyəedici*

**Резюме.** В статье утверждается, что одной из основных задач, стоящих перед нашей школой на современном этапе, в процессе преподавания предметов (биологии), является воспитание молодежи с широким кругозором и интеллектом и формирование нравственно совершенной, всесторонне развитой, высококультурной личности. В подготовке учителей биологии важно обеспечить всестороннее, правильное образование и сформировать научное мировоззрение. Показано, что в процессе обучения биологии каждый учитель должен передавать знания учащимся, а также доносить основы образования на основе программы. Все виды образования должны осуществляться одновременно и дополнять друг друга.

В статье предмет биологии дает учащимся знания о животном и растительном мире нашей страны, а также воспитывает такие чувства, как любовь, защита и патриотизм. В работе специально указано, что правильный подбор активных методов обучения, соответствующих теме и ее сути, повышает эффективность учебной задачи обучения и делает ее еще более напряженной. Основой исследо-

вания является то, что учитель биологии является также воспитателем. В работе систематизированы воспитательные обязанности учителя биологии.

***Ключевые слова:*** *обучение, воспитание, мышление, мировоззрение, экологическое воспитание, эстетическое воспитание, патриотическое воспитание, личностноориентированность, воспитательная*

**Summary.** It is argued in the article that one of the main tasks facing our schools in the modern era is to educate young people with broad knowledge and intelligence in the process of teaching subjects (biology) and to form morally perfect, comprehensively developed and highly cultured personalities. It is important to provide a comprehensive, correct education and to form a scientific worldview in biology teacher training. It is shown that in the process of teaching biology, each teacher should impart knowledge to the students as well as convey the basics of education based on the program. All types of education should be carried out simultaneously and complement each other.

In the article, biology subjects provide students with knowledge about the fauna and flora of our country, as well as education of feelings such as love, protection, and patriotism. It is specifically stated in the work that the correct selection of active training methods corresponding to the topic and its essence increases the efficiency of the educational task of training and makes it even more intense. The basis of the research is that the biology teacher is also an educator. In the work, the teaching duties of the biology teacher are systematized.

***Key words:*** *training, education, thinking, outlook, ecological education, aesthetic education, patriotic education, personality orientation, educational*

Müasir dövrdə məktəb qarşısında duran əsas vəzifələrdən biri tədris prosesində geniş savada, intellektə malik gənclər yetişdirməklə bərabər, mənəvi cəhətdən mükəmməl, hərtərəfli inkişaf etmiş, yüksək mədəniyyətə malik şəxsiyyət formalaşdırmaqdır. Deməli, ictimai inkişaf tələb edir ki, indiki müəllimlər nəinki ixtisas və elmi cəhətdən məlumatlı olmalı, həm də ictimai münasibətlərə, ictimai və əmək fəaliyyətinə elmi yaradıcılığa hazır olmalı, yüksək mənəvi, əqli, əxlaqi keyfiyyətlərə yiyələnməlidirlər. Bu mənada biologiya müəllimi hazırlığı respublikamızda yaxşılaşır, təlim və tərbiyə milli əsasda qurulur, biologiyanın tədrisinə aid yeni dərsliklər yazılır, təkmilləşir. Əsas məsələ ondan ibarət olmalıdır ki, şagirdə verilən təlim (bioloji biliklər) və tərbiyə elmi xarakter daşımalı və hadisələri elmi dəlillər əsasında dərk etməlidirlər. Biologiya müəlliminin əsas vəzifəsi şagirdlərdə düzgün elmi təfəkkür yaratmaqdır. Biologiya müəllimi hazırlığında bütün tərbiyə elementləri: elmi dünyagörüşü, əmək tərbiyəsi, fiziki tərbiyə, estetik və etik tərbiyə, ekoloji tərbiyə, cinsi və gigiyenik tərbiyə eyni zamanda aparılmalı və biri-birini tamamlamalıdır. Şagirdlər məktəb illərində təbiət haqqında bioloji anlayışları öyrənirlər. Bu anlayışlar biologiya tədrisində (biologiya 6; 7; 8; 9; 10; 11-ci siniflər) genişlənir, təcrübələrdə sübut olunur, onlardan təfəkkür formalaşır və elmi dünyagörüşü yaranır. Elmi dünyagörüşü nəticəsində şagirdlər təbiəti və onun qanunlarını düzgün dərk edir, onu sistemə salır [6, s.164].

Təbiət və cəmiyyət hadisələri materialist qanunlar əsasında dərk olunur. Dialektik metod hər şeyi inkişafda və hərəkətdə görür. Canlıların həyati prosesləri, onların sadədən mürəkkəbə, ibtidaidən aliyə doğru inkişafının təkamül təlimi baxımından izahı dialektik materializmə əsaslanır. Canlı təbiətin inkişaf qanunlarını öyrənmək üçün əvvəlcə hüceyrə, orqan və orqanlar sistemi bütövlükdə bitki və heyvanın quruluşu, təbiətlə qarşılıqlı əlaqəsi öyrənilir [5, s.178].

Təlim prosesində hər bir müəllim bütün il boyu nəinki şagirdlərə bilik verməlidir, eyni zamanda, proqram əsasında şagirdlərə tərbiyənin əsaslarını öyrətməlidir. Bu baxımdan biologiya fənlərində mövzuların tədrisində geniş imkanlar vardır.

Təlimin tərbiyəedici vəzifəsinin başlıca əhəmiyyəti bundan ibarətdir ki, müəllim dərs zamanı təlim prosesinin gedişindən asılı olmayaraq materialın məzmununda olan tərbiyəvi ünsürləri, mənaları üzə çıxarır və onları şagirdlərin şüuruna çatdırır. Mənəvi şüuru formalaşdırmaqla onlarda müəyyən müsbət keyfiyyətlərin tərbiyə olunmasına zəmin yaradır. Əslində təlim öz-özünə şagird şəxsiyyətinə müsbət təsir göstərə bilmir. Bu məsələ biologiya fənləri üzrə mövzuların məzmunundan və biologiya müəlliminin onu necə tədris etməsindən çox asılıdır.

Buna görə də hər bir müəllim keçdiyi mövzunun tərbiyəvi məqsədini aydın dərk etməli, mövzunun tərbiyəvi imkanlarını müəyyənləşdirməli və dərsin gedişində onu reallaşdırmağı bacarmalıdır.

Ümumtəhsil məktəblərində tədris fənlərinin, o cümlədən biologiya fənlərinin xarakteri elədir ki, hər bir dərsin özündə tərbiyəvi ünsürlər vardır. Lakin görkəmli rus pedaqoqu N.İ. Piroqovun belə bir fikrini yaddan çıxarmaq olmaz ki, bu ünsür çox zaman dərində olur və bəzən səthi, müşahidəçi üçün görünməz qalır. Bundan istifadə etməyən müəllim isə K.D. Uşinskinin dediyi kimi: "Uşaqlar üzərində ən başlıca və gerçək təsir vasitələrini itirmiş olur" [2, s.178]. Biologiya müəllimi mövzunu planlaşdırarkən, dərsə hazırlaşarkən onun təhsilverici vəzifəsi ilə yanaşı, tərbiyələndirici vəzifəsini də nəzərə almalı, özünün biliyindən, dünyagörüşündən istifadə etməklə, həmin tərbiyəvi imkanları (ekoloji, estetik, vətənpərvərlik, cinsi gigiyenik, əmək, iqtisadi, fiziki, mənəvi, əxlaqi) üzə çıxarmağı bacarmalı, şagirdlərdə qeyd etdiyimiz tərbiyəvi keyfiyyətləri aşılamağa çalışmalıdır. Görkəmli rus yazıcısı və pedaqoqu L.N. Tolstoy qeyd edirdi: "Əgər şagirdləri elmlə tərbiyə etmək istəyirsənsə, öz elmini sev və onu yaxşı bil. Belə olsa şagirdlər səni sevərlər, sən də onları tərbiyə edərsən: yox, əgər onları özün sevmirsənsə, şagirdlərini öyrənməyə nə qədər məcbur etsən də, sənin verdiyin elm onlara tərbiyəvi təsir göstərməyəcəkdir" [2, s.178].

Təbiət fənlərinin məzmunu dünyagörüşün formalaşmasında, şüurda dünyanın vahid mənzərəsinin yaranmasında və s. mühüm rol oynayır. Biologiya fənləri şagirdlərə yurdumuzun fauna və florası haqqında bilik verməklə yanaşı, onları sevmək, qorumaq, vətənpərvərlik kimi hisslərin tərbiyə olunmasına, estetik hisslərin formalaşmasına səbəb olur.

Təlimin tərbiyələndirici xarakter daşıması və təlim prosesində yüksək tərbiyəvi nəticələr əldə etmək o qədər də asan məsələ deyildir. Məktəblərimizdə keçilən biologiya dərslərinin təhlili, aparılan müşahidələr bunu deməyə imkan verir ki, əksər biologiya müəllimləri bu işin öhdəsindən gələ bilmirlər, tərbiyəedici işi biologiya müəlliminin işi hesab etmirlər. Bu baxımdan dediyimiz məqsədə nail olmaq üçün təlim prosesində təhsilləndirici və tərbiyəedici funksiyaların vəhdətinə nail olmaq lazım gəlir. Bu da biologiya müəllimindən geniş bilik və erudisiya, hərtərəfli hazırlıq tələb edir. Biologiya fənləri üzrə təlimin tərbiyəedici vəzifəsinin həyata keçirilməsi təlim üsullarının düzgün seçilməsi ilə sıx bağlıdır. Nəzərə almaq lazımdır ki, mövzuya, onun mahiyyətinə, məqsəd və vəzifələrinə müvafiq fəal təlim üsullarının düzgün seçilməsi təlimin tərbiyələndirici vəzifəsinin səmərəliliyini artırır, onu daha da intensivləşdirir. Eyni zamanda əlverişli təlim şəraitinin yaradılması və dərsin emosionalı fonda keçilməsi də burada mühüm təsir imkanları yaradır.

Şəxsiyyətyönlü təhsilə nail olunması təlimin (biologiya) tərbiyələndirici vəzifəsinin müvəffəqiyyətlə yerinə yetirilməsi üçün əsas baza rolunu oynayır. O, şagirdin mövcud biliyinə, təcrübəsinə arxalanmaqla onun şəxsi keyfiyyətlərinin formalaşması və üzə çıxması üçün şərait yaradır, təfəkkürün inkişafına, yaradıcı, fəal, təşəbbüskar şəxsiyyətin təşəkkül tapmasına səbəb olur.

Biologiya fənlərini tədris edən müəllim həm də tərbiyəçidir. Onun tərbiyəçilik vəzifələrinə aşağıdakıları aid etmək olar [1]:

– biologiya tədrisinə maraq yaratmaq;

– canlı aləmə hümanist münasibət formalaşdırmaq;

– şagirdlərin bütün tərbiyə növlərini mənəvi, estetik, ekoloji, əmək, gigiyenik, cinsi, vətənpərvərlik, iqtisadi, fiziki, özünün və ətrafdakıların sağlamlığına düzgün yanaşma və s. həyata keçirir;

– yalnız biliyə yox, həm də hisslərə təsir etməyi bacarmaq;

– biologiyanın tədrisinin inkişafetdirici, tərbiyəedici vəzifəsinin əsas məqsədi – şagirdlərin hərtərəfli inkişafına nail olmaq [3, s.61].

Beləliklə, bütün vəzifə və metodlardan istifadə etməklə şagirdlərin təfəkkürünü tərbiyə etmək biologiya təliminin və müəllimin ən başlıca vəzifəsi olmalıdır.

1. Ümumtəhsil məktəblərində təbiət, biologiya fənlərinin inteqrativ şəkildə tədrisi şagirdlərin tərbiyəsində mühüm rol oynayır.

2. Gəldiyimiz nəticəyə əsasən deyə bilərik ki, biologiya fənlərinin tədrisində şagirdlərin inkişafını və tərbiyəsini, onların bu istiqamətdə şüurunu formalaşdırmaq üçün böyük imkanlar vardır. Bu imkanların müəyyənləşdirilməsi və

tədris prosesinə tətbiqi, təlimin yeni texnologiyalar əsasında qurulması dərsin daha canlı və maraqlı olmasına, şagirdlərin tədris prosesinə marağının artmasına, onlarda yaradıcılıq, müstəqillik, fəallıq kimi keyfiyyətlərin formalaşmasına zəmin yaradır.

3. Şagirdlərin tərbiyə mədəniyyətinin formalaşdırılmasında maarifləndirmə, inkişafetdirmə, tərbiyəetmə, proqnozlaşdırma funksiyalarının vəhdətlə tətbiqi mühüm rol oynayır.

Müəllim məktəbdə bioloji təhsilin öyrədilməsi müddətində tərbiyəvi təlimin gedişini, elmi cəhətdən düzgün və plana uyğun olaraq hər bir kursun tədrisində işləməlidir [4, s.5].

Hərtərəfli inkişaf şəxsiyyətin yetişdirilməsi, kamil mütəxəssislərin hazırlanması, o cümlədən pedaqoji kadrların tərbiyəsi işi onların bilavasitə yüksək əqidəyə yiyələnmələri prosesi ilə sıx bağlı olaraq həyata keçirilir [7, s.78].

**Problemin aktuallığı**. Təlim prosesində hər bir biologiya müəllimi il boyu şagirdlərə bilik verməklə yanaşı, eyni zamanda, tərbiyənin əsaslarını da öyrətməlidir. Biologiya fənlərində mövzuların tədrisində tərbiyənin verilməsi üçün geniş imkanlar var. Təlimin tərbiyəedici əhəmiyyəti bundan ibarətdir ki, müəllim dərs zamanı təlim prosesinin gedişindən asılı olmayaraq materialist məzmunda olan tərbiyəvi ünsürləri, mənaları üzə çıxarır və onları şagirdlərin şüuruna çatdırır. Biologiya müəllimi mövzunun tərbiyəvi məqsədini aydın dərk etməli, dərsin gedişində onu şagirdlərə çatdırmağı bacarmalıdır.

**Problemin elmi yeniliyi**. Biologiya müəllimi hazırlığında tərbiyənin bütün elementləri: elmi dünyagörüşü, estetik, ekoloji, əmək, fiziki, vətənpərvərlik və s. eyni zamanda aparılmalı və biri-birini tamamlamalıdır. Təlimin tərbiyəedici vəzifəsini müəllim yaradıcılıqla üzə çıxarmalı, şagirdlərinə çatdırmalıdır. Biologiya müəllimi təlim verməklə bərabər, həm də tərbiyəedəndir.

**Problemin praktik əhəmiyyəti**. Biologiya müəllimi hazırlığında tərbiyə, onun elementləri geniş təhlil edilir, tövsiyə olunur ki, işin səmərəliliyi baxımından yazılacaq dərsliklərdə mövzuların tərbiyəvi tərəfləri qismən açıq şəkildə verilsin, bu istiqamətdə metodik ədəbiyyatlar çap olunaraq müəllimlərə çatdırılsın. Bütün bunlar biologiya müəllimi hazırlığına köməklik göstərəcəkdir.

**Ədəbiyyat:**

1. Abbasov, A.N. Pedaqogika (müxtəsər konspekt və sxemlər) / A.N. Abbasov – Bakı: Mütərcim, 2007.
2. İlyasov, M.İ. Müəllimin pedaqoji ustalığı. / M.İ. İlyasov. – Bakı: Elm və təhsil, 2013, – 215 s.
3. Hacıyeva, G.N. Biologiyanın tədrisi metodikası. / G.N. Hacıyeva. – Bakı, 2019, – 358 s.
4. Hüseynov, Ə.M. Biologiyanın tədrisinin ümumi metodikası / Ə.M. Hüseynov, M.Ş. Babayev, Ə.M. Məhərrəmov. – Bakı, 2003, – 138 s.
5. Hüseynov, Ə.M. Orta məktəbdə biologiya tədrisinin nəzəri və metodik əsasları / Ə.M. Hüseynov. – Bakı, 2000, – 266 s.
6. Hüseynov, Ə.M. Biologiya tədrisinin elmi və metodik əsasları. / Ə.M. Hüseynov, Ə.M. Məhərrəmov. – Bakı, 2015, – 138 s.
7. Məhərrəmov, Ə.M. Azərbaycanda ali pedaqoji təhsilin inkişaf tarixindən. / Ə.M. Məhərrəmov. – Bakı, 1998, – 126 s.

**E-mail:** aliyannagi.maharramov@gmail.com
**Rəyçilər:** *biol.ü.fəls.dok., prof* .**Y.K. Əhmədov,**
*biol.ü.fəls.dok.* **Q.M. Əliyev**
**Redaksiyaya daxil olub:** 15.11.2022

*UOT 372.857*

***Xoşqədəm Qonaq qızı İbrahimova***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
*https://orcid.org/0009-0005-3290-6290*

***Aynur Zəbulla qızı Şıxəliyeva***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# MƏKTƏB BİOLOGİYA KURSUNUN TƏDRİSİNDƏ MƏSƏLƏ HƏLLİ TEXNOLOGİYASININ TƏTBİQİ ÜZRƏ İŞİN SİSTEMİ

***Хошгедем Гонаг гызы Ибрагимова***
*доктор философии по педагогике, доцент*
*Азербайджанский Государственный Педагогический Университет*

***Айнур Забулла гызы Шыхалиева***
*Азербайджанский Государственный Педагогический Университет*

# СИСТЕМА РАБОТЫ ПО ВНЕДРЕНИЮ ТЕХНОЛОГИИ РЕШЕНИЯ ЗАДАЧ ПРИ ПРЕПОДАВАНИИ ШКОЛЬНОГО КУРСА БИОЛОГИИ

***Khoshgadam Zabulla Ibrahimova***
*doctor of philosophy in pedagogy,*

*assistant professor at*
*Azerbaijan State Pedagogical University*

***Aynur Zabulla Shikhaliyeva***
*Azerbaijan State Pedagogical University*

# PROBLEM SOLVED IN THE TEACHING OF THE SCHOOL BIOLOGY COURSE SYSTEM OF WORK ON THE APPLICATION OF TECHNOLOGY

**Xülasə.** Məqalədə biologiyanın tədrisində qiymətləndirmə vasitələrinin tərtibinə verilən müasir tələblər xarakterizə edilir, tiplərinə görə məsələlərin həlli texnologiyasının imkan və yolları göstərilir.
***Açar sözlər:*** *biologiya, qiymətləndirmə vasitələri, məsələ həlli texnologiyası, məsələ tipləri*

**Резюме.** В статье характеризованы современные требования, предъявляемые к разработке средств оценивания при преподавании биологии. Автором показаны возможности и пути технологии решения задач согласно их типам.
***Ключевые слова:*** *биология, средства оценивания, технология решения задач, типы задач*

**Summary.** The article characterizes the modern requirements for the development of assessment tools in teaching biology. The author shows the possibilities and ways of technology for solving problems according to their types.
***Key words:*** *biology, volitional teals, problem solving technology, issues and tynes*

Ümumtəhsil məktəblərində biologiyanın tədrisində tətbiq edilən qiymətləndirmə vasitələri təlim prosesinin ayrılmaz tərkib hissəsidir. Forma və məzmununa görə bir-birindən fərqlənən qiymətləndirmə vasitələri içərisində məsələ həlli texnologiyasından istifadəyə üstünlük ve-

rilməsi təlim nəticələrinin reallaşdırılması səviyyəsinin öyrənilməsində müstəsna əhəmiyyətə malikdir. Belə ki, məsələ həlli tədris materialının tərkibinə daxil edilmiş nəzəri biliklərin praktiki bacarıqlarla əlaqələndirilməsini, qanun və qaydaların formalaşdırılmasını stimullaşdırır və təfəkkürün inkişaf etdirilməsini təmin edir. Odur ki, biologiyanın tədrisində məsələ həllinin səmərəli təşkili aktual problemlərdəndir.

Respublikamızın orta məktəblərində hazırda istifadədə olan dərsliklər fənn kurikulumları əsasında yenidən işlənmişdir. Siniflər üzrə təlim materialının struktur və məzmunu dəyişdirilmişdir. Yeni qiymətləndirmə standartlarına görə mövzulara dair dərsliklərə daxil edilmiş qiymətləndirmə vasitələri test formasında verilmişdir [6, 7]. Onların əksəriyyətinin məzmununu diqqətlə nəzərdən keçirdikdə isə bir sıra hesablamaların həyata keçirilməsinin zəruri olduğu aydın görünür [4]. Ona görə də, məsələ həlli texnologiyalarına verilən tələblərlə əlaqədar olaraq, fənn kurikulumlarını nəzərdən keçirdik. Belə məlum olur ki, məsələ həlli digər təbiət elmləri üzrə fənn kurikulumunda fəaliyyət istiqaməti kimi verildiyi halda, biologiya fənn kurikulumunda qiymətləndirmə vasitəsi olaraq göstərilmişdir [6]. Bu səbəbdən də təlim prosesində məsələlərin tərtibinə və həlli yollarının öyrədilməsinə diqqət yetirilməsi fənn müəllimlərinin ixtiyarına verilir.

Məktəb təcrübəsi göstərir ki, fənn müəllimləri fəal dərsin yaradıcı tətbiqetmə mərhələsində əsasən dərslikdə mövzulara dair göstərilən test tapşırıqlarından istifadə etməklə kifayətlənirlər. Bu zaman illüstrativ materialların izahından doğan tədris vahidlərində qanun və anlayışların mahiyyətini özündə əks etdirən, o cümlədən interaktiv xarakterli məsələ nümunələrinə az diqqət yetirilir. İstər summativ qiymətləndirmə toplularına, istərsə də qəbul imtahanlarına daxil edilən qiymətləndirmə tapşırıqları içərisində məzmununa məsələ həlli daxil edilmiş qiymətləndirmə vasitələrinin üstünlük təşkil etməsi də mövcud problemin aktuallığını təsdiq edən əsas amillərdən biri kimi özünü göstərir [3].

Ümumtəhsil məktəblərində biologiyanın tədrisində şagirdlərə canlılar aləminin müxtəlif qruplarının həyat tərzi, morfoloji-anatomik quruluşu, onlarda gedən fizioloji proseslər, habelə insan və təbiət arasındakı qarşılıqlı əlaqələr haqqında elementar biliklərin verilməsi nəzərdə tutulmuşdur [5]. Təlim prosesində tətbiq edilən tədris resursları fəal dərsin ayrılmaz hissəsinə çevrilmişdir. Çünki onlarla işləmək şagirdlər üçün həm yeni bilik mənbəyi, həm də öyrənilən materialın mənimsənilməsi, təkrarlanması, ümumiləşdirilməsi üçün bir vasitədir. Biologiyanın tədrisi texnologiyasında bu məqsədlə cədvəl və şəkillər, təbii obyektlər, paylama materialları, -filmlər və kinokliplər, multimedia nümunələrindən ibarət vizual tədris vəsaitlərindən istifadə etməklə zəruri təsəvvürlər və anlayışlar formalaşdırılır. Həmçinin müxtəlif səviyyəli orqanizmlər, bioloji sistemlər arasındakı əlaqələrin və qarşılıqlı asılılıqların açıqlanmasına xüsusi diqqət yetirilir. Təlim materialının şüurlu surətdə mənimsənilməsini təmin etmək üçün səviyyələrə görə inteqrativ əlaqələr qurulur [2].

Müasir təlim şəraiti müəllimləri təkcə əyani vasitələrdən biliklərin verilməsində istifadə etmək üçün deyil, həm də onlardan tapşırıqların yerinə yetirilməsinə necə töhfə verəcəyini düşünməyə məcbur edir. Tədris vasitələrinin tərtibi texnologiyalarının inkişafı təlim nəticələrinin qiymətləndirilməsində tətbiq edilən qiymətləndirmə vasitələrinin də təkmilləşdirilməsini tələb edir.

Şagirdlərin bilik və bacarıqlarının yoxlanması üçün həm cari, həm də yekun qiymətləndirmə əsasən qapalı və açıq tipli test tapşırıqları ilə aparılır. Test tapşırıqları qabiliyyət göstəricilərinə və çətinlik səviyyələrinə görə fərqlənir. Qabiliyyət göstəricilərini özündə ehtiva edən terminoloji ümumiləşdirici, uyğunluğu müəyyənləşdirən, proqnostik və situativ test tapşırıqları zəruri fəaliyyət istiqamətlərini stimulyasiya edir. Onlar məqsəd və vəzifələrinə görə meyar və ya normativyönlü olur.

Müxtəlif məzmunlu tədris vahidlərinə dair dərsliklərdə verilən testlərin, demək olar ki, əksəriyyəti hesablamaların aparılmasını tələb edir. Bioloji qanun və qanunauyğunluqların əsaslandırılması, bioloji proseslərin tənzimlənməsi üçün vacib olan şərtlərin aşkar edilməsi, test tapşırıqları şəklində təqdim edilməsinə baxmayaraq, cavablandırılması məsələ həlli ilə həyata keçirilməsinə zərurət yaranır. Müşahidələrin aparılması, praktik iş və laboratoriya məşğələlərinin yekun nəticələrinin hesablanması və təqdimatların hazırlanmasında cədvəllərin tərtibi, asılılıq qrafiklərinin işlənməsi və s. fənnə dair mə-

sələ həlli texnologiyasının tətbiqi üçün geniş imkanlar açır. Şagirdlərin tədqiqat işlərinə cəlb edilməsi, layihələrin işlənməsi və bu qəbildən olan qiymətləndirmə tapşırıqları ilə əlaqəli olur.

Öyrənmə prosesində məsələlərin həll edilməsi şagirdlərin fəallığını artırır. Onlar məsələnin şərtinə daxil edilən bioloji hadisə və proseslərin mahiyyətini öyrənir, həlli yollarını axtarır, müxtəlif fərziyyələr irəli sürür, müvafiq qanun və qaydalara istinad edərək hesablamalar aparır. Şübhəsiz ki, təlim nəticələrinin qiymətləndirilməsində məsələ həlli texnologiyasının tətbiqi şagirdlərdə zehni fəaliyyətin aktivləşməsinə, məntiqi təfəkkürün və idrak müstəqilliyinin inkişafına səbəb olur və fənnə marağın artmasına imkan yaradır.

Məsələ həlli texnologiyası iki əsas mərhələnin həyata keçirilməsi ilə xarakterizə edilir. Birinci mərhələdə məsələnin verilişi təhlil edilir və mətninə uyğun olaraq şərtlər tərtib edilir. Növbəti mərhələdə vacib bir məqam, şagirdlərə kəmiyyət dəyişikliyinin sözlə ifadə etmək yollarını anlamağı, riyazi ifadələr və ya tənliklər şəklində düzəltməyi öyrətməkdir. Məsələnin şərtinə əsaslanaraq köməkçi verilənlərin qeyd edilməsi isə, onun həlli yollarını planauyğun tərtib etməklə hesablamaların aparılmasını asanlaşdırır. Son mərhələdə alınan cavabların doğru olduğunu təsdiq etmək üçün nəticənin yoxlanması aparılır.

Riyaziyyatın müasir dünyada və bioloji tədqiqatlardakı rolu şagirdlərə əsas riyazi anlayış və metodları öyrətmək, riyazi ifadələrdən (düstur, qrafik, sxem, cədvəl, qanun və qanunauyğunluqlar) istifadə edərək problemi formalaşdırmaq, riyazi metodlardan istifadə edərək məlumatları təhlil etmək bacarığını inkişaf etdirir [1]. Hesablamalarda natural ədədlər, adi və onluq kəsrlər, ədədi və həndəsi silsilə, tənasüblərin qurulması, ədədə görə faizin tapılması, asılılıq qrafiklərinin tərtib edilməsi və s. bu kimi əməlləri yerinə yetirməklə bioloji hadisə və proseslərin mahiyyətinin mənimsənilməsi təmin edilir. Bu zaman təlim materialının sistemli şəkildə riyazi modelləşdirilməsinə də zəmin yaranır. Qeyd etdiyimiz qaydalara müvafiq olaraq bir neçə test tapşırıqlarının cavablarını tapmaq üçün tələb edilən, məsələləri nəzərdən keçirdik.

1.Göyərçinin dayaq-hərəkət sisteminin kütləsi 150 qramdır. Skelet, bu sistemin kütləsinin 20%-ni təşkil edir. Döş əzələsinin çəkisini hesablayın.

Test tapşırığı VII sinif dərsliyində verilən "Quşlar sinfi" fəslinə aiddir. Testin cavabı 2 gedişli məsələ həlli ilə tapılmalıdır. Ilk növbədə, məsələnin şərtinə görə, dayaq-hərəkət sisteminin kütləsinin 20%-ni skelet təşkil etdiyini nəzərə alıb aşağıdakı tənasüblə bu sistemin tərkibindəki əzələlərin kütləsi tapılmalıdır.

150 qr. – 100%

X qr. – 80 % X=120 qr.

Alınan nəticə göyərçinin ümumi bədən əzələlərinin kütləsi olacaqdır. Digər tərəfdən, dərslikdən o da məlumdur ki, göyərçində döş əzələlərinin kütləsi ümumi bədən əzələlərinin kütləsinin 2/1-ə bərabərdir. Deməli, məsələ həllinin sonrakı mərhələsində bədən əzələlərinin ümumi kütləsini yarıya bölməklə döş əzələlərinin kütləsini tapırıq:

120 qr : 2= 60 qr.

Deməli, döş əzələsinin kütləsi 60 qramdır.

2. Əgər həkimin bir sutkalıq enerjisi yalnız karbohidratların hesabına ödənilirsə, onda bu qədər enerjinin ayrılması üçün o nə qədər qurudulmuş kartof yumrusu ilə qidalanmalıdır?

Göstərilən qiymətləndirmə vasitəsi test tapşırığı şəklində verilməsinə baxmayaraq, doğru cavabın tapılması bir məsələ həllidir. Şagird "İnsan" dərsliyində qeyd olunan qida normalarını bilməli və IX sinif dərsliyindən "Hüceyrənin kimyəvi tərkibi" fəslinə dair biliklərə yaxşı yiyələnməlidir. Dərslikdən məlumdur ki, zehni əmək adamının, o cümlədən həkimin sutkalıq enerji tələbatı 13474 kC-dur. Digər tərəfdən 1 qram karbohidratın parçalanması nəticəsində 176 kC enerji ayrıldığını nəzərə alsaq, 13474 kC enerjinin ayrılması üçün 13474:17,6=766 qram karbohidratın tələb olunduğunu hesablayırıq. Qurudulmuş yarpaqlarda, meyvələrdə, kartof yumrularında 70%-ə qədər karbohidrat olduğunu nəzərə alıb,

766 qr. – 70%

X qr. – 100%

tənasübü əsasında hesablamaq olar ki, 766 qr. karbohidrat – 1094 qr qurudulmuş kartof yumrusunda toplanır. Deməli, – 1094 qr qurudulmuş kartof yumrusunda toplanan karbohidratlar həkimi bir sutkalıq enerji ilə təmin edə bilər.

3. 600 nukleotiddən qurulmuş bir DNT molekulunda adenin nukleotidi varsa, onda bu

DNT molekulunun tərkibindəki sitozin və timin nukleotidlərinin cəmi neçə olar?

Məlumdur ki, DNT molekulunda adenin nukleotidinin sayı timin nukleotidinin sayına bərabərdir (A=T). Deməli, bu DNT molekulunda A+T=400 olacaq. Onda Q+S=600-400=200. Digər tərəfdən Q=S, yəni S (sitozin)=100. Buradan aydın olur ki, S+T=100+200=300. Beləliklə, bu DNT molekulunda sitozin və timin nukleotidlərinin cəmi 300 olar.

Təqdim edilən qiymətləndirmə vasitələri, test nümunələri şəklində müxtəlif məzmunlu təlim nəticələrinin mənimsədilməsi səviyyəsinin yoxlanması üçün tərtib edilmişdir. Testlərin doğru cavablarının tapılması isə uyğun tədris vahidlərində verilən məlumatlara istinad edərək, məsələlərin həllini tələb edir. Təlim prosesində mövcud problemin reallığını nəzərə alaraq, müəllim hazırlığı ilə məşğul olan universitetlər içərisində ilk dəfə olaraq, ADPU-nun tədris planına "Məktəb biologiya kursunda məsələ həlli texnologiyası" seçmə fənn kimi 1920-ci ildən daxil edilmişdir.

**Problemin aktuallığı.** Müasir təlim şəraitində tədris vasitələrinin tərtibi texnologiyalarının inkişafı təlim nəticələrinin qiymətləndirilməsində tətbiq edilən qiymətləndirmə vasitələrinin də təkmilləşdirilməsini zərurətə çevirmişdir. Əsasən test nümunələri şəklində verilən tapşırıqların əksəriyyətinin cavablandırılmasında isə hesablamaların aparılması tələb olunur. Bu baxımdan fənnin xüsusiyyətlərini nəzərə alaraq, tiplərinə görə məsələlərin qurulması və həlli texnologiyalarına müasir yanaşmanın tədqiqi aktual problemlərdəndir.

**Problemin elmi yeniliyi**. Biologiyanın tədrisində təlim nəticələrinin obyektiv qiymətləndirilməsində şagirdlərdə təfəkkürün inkişafını və inteqrativ xarakterli bilik və bacarıqlar formalaşdırılmasını təmin edən tiplərinə görə məsələlərin tərtibi qaydaları və həlli texnologiyaları öyrənilmişdir.

**Problemin praktik əhəmiyyəti**. Məzmununa məsələlər daxil edilmiş test tapşırıqlarının operativ həlli təlim prosesində tiplərinə görə həlli texnologiyasının mənimsənilməsini tələb edir. Odur ki, fənn müəllimləri və şagirdlər mövcud problemləri aradan qaldırmaq məqsədilə faydalana bilərlər.

**Ədəbiyyat:**


1. Разниченко Г.Ю. Лекции по математическим моделям в биологии. Часть 1. – «Ижевск: НИЦ «Регулярная и хаотическая динамика», 2003.
2. Бондарук М.М. Занимательные материалы и факты по общей биологии в вопросах и ответах 5-11 классы. – Волгоград: Изд. Учитель, 2007.
3. İbrahimova X.Q. Məktəb biologiya kursunda məsələ həllinin texnologiyası: Ali məktəblər üçün dərs vəsaiti / X.Q. İbrahimova. – Bakı, 2022. – 183 s.
4. Kazımov İ.M., Bayramova B. Biologiya-Ümumtəhsil məktəblərinin VI-XI sinifləri üzrə qiymətləndirmə vasitələri, gündəlik dərs planlaşdırmalarının tərtibi: Metodik vəsait. – Bakı: ADPU-nun nəşri, 2019, – 214 s.
5. Kərimov C.R. Biologiya (Yeni proqram əsasında tərtib edilmiş dərs vəsaiti). – Bakı: Zərdabi. MMV, 2021. – 272 s.
6. Ümumtəhsil məktəbləri üçün biologiya fənn kurikulumu. – Bakı, 2013.
7. Ümumtəhsil məktəbləri üçün yeni dərslik komplektləri.


**E-mail:** imrankazimov89@gmail.com

**Rəyçilər:** *biol.ü.fəls.dok., dos.* **T.Q. Abdullayeva,**
*biol.ü.fəls.dok.* **Q.M. Əliyev**
**Redaksiyaya daxil olub:** 09.03.2023

*UOT 372.857*

***İmran Musa oğlu Kazımov***
*biologiya üzrə fəlsəfə doktoru,*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*
*https://orcid.org/0009-0000-9437-2603*

***Arzu Mehman qızı Abdulzadə***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

## ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ BİOLOGİYANIN TƏDRİSİNDƏ KİMYA FƏNNİ İLƏ İNTEQRASİYANIN OPTİMAL YOLLARI

***Имран Муса оглы Казымов***
*доктор философии по биологии, старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

***Арзу Мехман гызы Абдуллазаде***
*Азербайджанский Государственный Педагогический Университет*

## ОПТИМАЛЬНЫЕ ПУТИ ИНТЕГРАЦИИ ХИМИИ В ПРЕПОДАВАНИИ БИОЛОГИИ В ОБЩЕОБРАЗОВАТЕЛЬНЫХ ШКОЛАХ

***Imran Musa Kazymov***
*doctor of philosophy in biology,*

*senior lecturer at*
*Azerbaijan State Pedagogical University*

***Arzu Mehman Abdullazade***
*Azerbaijan State Pedagogical University*

## OPTIMAL WAYS OF INTEGRATION WITH CHEMISTRY IN THE TEACHING OF BIOLOGY IN GENERAL EDUCATION SCHOOLS

**Xülasə.** Məqalədə biologiya fənn kurikulumun əsasında tərtib edilmiş dərslik komplektləri araşdırılır və təlim nəticələrinin reallaşdırılmasında kimya fənni ilə inteqrasiyanın səmərəli yolları göstərilir.
***Açar sözlər:*** *biologiya, kimya, inteqrasiya, təlim nəticələri, məntiqi təfəkkür*

**Резюме.** В статье исследуются комплекты учебников на основе учебной программы по биологии и показаны эффективные пути интеграции с химией в реализации результатов обучения.
***Ключевые слова:*** *биология, химия, интеграция, результаты обучения, логическое мышление*

**Summary.** The article examines textbook sets based on the curriculum of biology and shows effective ways of integration with chemistry in the realization of learning outcomes.
***Key words:*** *biology, chemistry, integration, learning outcomes, logical thinking*

Müasir məktəbimizin və təhsilin qarşısında duran əsas vəzifələrdən biri şəxsiyyət formalaşdırmaq və gənc nəslin gələcək sosial həyata hazırlanmasında fənlərə dair bilik və bacarıqların mənimsənilməsini təmin etməkdən ibarətdir. Bu baxımdan biologiya fənninin imkanları olduqca genişdir. Çünki canlılar aləmindən bəhs edən biologiya elmi onların müxtəlif quruluş sə-

viyyələrinin morfoloji-anatomik xüsusiyyətlərini, həyat tərzini və onlarda gedən fizioloji prosesləri, cansız təbiətlə qarşılıqlı əlaqələrini öyrənir. İnsan və onun sağlamlığı, ekoloji problemlər, yeni texnologiyaların meydana gəlməsində biologiya elminin müstəsna rolu ön plana çəkilir. Odur ki, Respublikamızda aparılan təhsil islahatlarının yekun mərhələsində qəbul edilən fənn kurikulumları əsasında tədrisin təşkilində monitorinqlərin aparılması nəticəsində fənn müəllimlərinin qarşılaşdığı problemlərin aradan qaldırılması məqsədi ilə metodik vəsaitlərin işlənməsi, elmi əsərlərin yazılması və elmi pedaqoji ictimaiyyətə çatdırılması müstəsna əhəmiyyət kəsb edir. Bu qəbildən olan problemlərdən biri də təlim prosesində fənlərarası inteqrasiyanın yaradılması üzrə işin sisteminin təkmilləşdirilməsidir [3].

Bir qayda olaraq, fənlərarası inteqrasiya orta məktəblərin tədris planına daxil edilmiş fənlərə istinad etməklə həyata keçirilməlidir. Biologiyanın təbiət elmləri ilə inteqrativ əlaqələndirilməsi, xüsusilə kimya fənni ilə inteqrasiyanın təşkilinə müasir yanaşmanın imkan və yollarının öyrənilməsi bu baxımdan aktual problemlərdəndir.

Məlumdur ki, canlılar aləmi açıq bir sistem kimi cansız təbiətlə daima qarşılıqlı əlaqədə fəaliyyət göstərir. Özünə lazım olan qida maddələrini və oksigeni qəbul etməklə orqanizmini qurur, böyüyür, inkişaf edir. Qidalanma mənşəyinə və formalarına görə biri digərindən fərqlənən müxtəlif səviyyəli orqanizmlərdə baş verən fizioloji proseslər maddələrin çevrilməsi ilə müşayiət olunur. Nəticə olaraq, təbiətdə maddələrin dövranında yaxından iştirak edirlər. Maddələr dövranının getməsi üçün tələb olunan enerjinin illik qaynağı günəşdir. Belə ki, bütün yaşıl bitkilərdə yaşıl yosunlarda, sianobakteriyalarda, infuzor tərlikdə, volvoksda $CO_2$ və $H_2O$ – dan yararlanaraq fotosintez prosesi nəticəsində qeyri-üzvi maddələrdən üzvi maddələr sintez edirlər. Bu zaman günəş enerjisi kimyəvi rabitələr enerjisinə çevrilir. Canlı orqanizmlər üçün vacib olan su, karbon, oksigen, azot və fosfor v s. elementlər həm sərbəst halda, həm də birləşmələr şəklində təbiətdə maddələr dövranına daxil olurlar. Odur ki, müxtəlif səviyyəli orqanizmlərin quruluş strukturunda rast gəlinən maddələrin bioloji xüsusiyyətlərini izah edərkən şagirdlərdə materialist dünyagörüşü formalaşdırmaq üçün kimya fənni ilə inteqrasiyanın qurulması tələb olunur. Fizioloji proseslərin, ekoloji problemlərin, insan və onun sağlamlığına təsir edən amillərin molekulyar səviyyədə öyrənilməsi, bir sıra biotexnologiyaların müəyyən mərhələlərinin aydın şəkildə təqdim olunması inteqrativ əlaqələrin təşkili səviyyəsindən asılıdır. Belə ki, biologiya müəllimləri kimya fənninə dair müəyyən bilik və bacarıqlara malik olmalıdır. Elementlərin dövrü sistemini xarakterizə etməyi, bəsit və mürəkkəb maddələrin müxtəlif qruplarının kimyəvi tərkibini, o cümlədən fiziki və kimyəvi xassələrini, alınma üsullarını mənimsəməlidirlər. Makro və mikroelementlərin, həmçinin ultramikroelementlərin, canlı orqanizmlərin struktur quruluşunun formalaşmasında və fizioloji proseslərin gedişinə tənzimləyici rolunu nümunələrlə izah etməyi bacarmalıdırlar. Kimyəvi rabitələrin növlərini, reaksiyaların getmə şəraitini və tiplərini fərqləndirməklə yanaşı, onlara bioloji proseslərin izahında istinad etməlidir [2, 4, 5].

Proqram (fənn kurikulumları) və dərslik komplektlərinin təhlili, məktəb təcrübəsinin öyrənilməsi onu göstərir ki, bu sahədə bir sıra uyğunsuzluqlar mövcuddur [1, 6, 7]. Fəndaxili inteqrasiyaya daha çox üstünlük verilməsi ilə tərtib edilmiş fənn kurikulumlarında fənlərarası əlaqələr bəzi hallarda diqqətdən kənarda qalmışdır. İstər siniflər üzrə, istərsə də ayrı-ayrı mövzulara dair təlim nəticələrinin reallaşdırılması üçün tətbiq edilən inteqrativ yanaşma qaydası özünü qismən doğrultmur. Belə ki, proqram əsasında hazırlanan, müəllim üçün metodik vəsaitlərdə göstərilən inteqrasiya cədvəli əsasında təlim prosesinin təşkilində təlim nəticələrini reallaşdırmaq imkan xaricində qalır. Çünki dərsin mövzusu ilə yaxından tanış olduqda məlum olur ki, zəruri olan inteqrativ əlaqələrin bir qismi inteqrasiya cədvəlinə daxil edilməmişdir. Eyni zamanda, bir sıra mövzulara görə verilən inteqrasiya cədvəlində isə aidiyyatı olmayan inteqrativ əlaqələrlə rastlaşmaq mümkündür. Aidiyyatı olmayan mövzularda mütəmadi təkrarlanan fənlərə də rast gəlinir.

Məktəb təcrübəsinin öyrənilməsi onu göstərir ki, fənn müəllimləri kimya fənni ilə inteqrasiyanın təlim prosesində təşkili baxımından çətinlik yaradan bir sıra obyektiv və subyektiv səbəblər irəli sürürlər:

– kimya fənninin biologiya fənni ilə paralel tədris olunmaması;

– dərslik komplektlərində, o cümlədən müəllim üçün metodik vəsaitdə verilən inteqrasiya cədvəlindəki uyğunsuzluqlar;

– problemə dair internet resurslarının azlıq təşkil etməsi və mövcud materialların mənimsənilməsində qarşılaşdıqları çətinliklər;

– tədris vahidlərinin həddən artıq yüklənməsi, dərsə ayrılan vaxtın azlığından yaranan problemlər.

Hazırda fənn kurikulumları yenidən işlənir, qeyd edilən problemlərin əksəriyyətinin nəzərə alınması məqsədəuyğun olardı. Təlim prosesində kimya fənni ilə inteqrasiyanın tətbiqində müsbət nəticələrin əldə edilməsi fənn müəllimlərinin öz işinə səriştəli yanaşmasından asılıdır. Onlar dərsin hazırlıq mərhələsində digər didaktiv prinsiplərlə yanaşı, inteqrasiya prinsipinin təşkilini imkan və tələblərə uyğun qurmalıdır. İlk növbədə, tədris vahidi üzrə nəzərdən keçirilməsi və sinfin səviyyəsi təlim-tədris bazasının təchizat imkanları diqqət mərkəzində saxlanılmalıdır. İnteqrativ əlaqələrin qurulmasında metod seçiminin düzgün aparılması, İKT imkanlarından məqsədyönlü istifadə, öncədən mövzuya dair slaydların hazırlanması və s. dərsə ayrılan vaxta qənaət etməyə imkan verir. Bir qayda olaraq, şagirdlərin qazandıqları biliklərin sistemli şəkildə mənimsədilməsi və möhkəmləndirilməsi isə inteqrativ xarakterli qiymətləndirmə tapşırıqlarının tədris vahidlərinə və fəsildə öyrədilən bilik, bacarıq və vərdişlərə əsaslanaraq tərtib edilməsindən çox asılıdır. Dərsin gedişində mənimsədilməsi çətinlik yaradan bir sıra inteqrativ əlaqələri layihələrin işlənməsində, dərsdənkənar məşğələlərdə, o cümlədən referatların işlənməsində, müvafiq təqdimatların hazırlanmasında bir mövzu kimi nəzərə almaq mümkündür.

Təcrübə göstərir ki, inteqrasiyanın yaradılmasında biologiya müəllimlərinin kimya fənninə dair bilik və bacarıqlarının qaneedici səviyyədə olması mühüm əhəmiyyətə malikdir. Onlar qarşılaşdığı çətinlik yaradan kimya fənni ilə bağlı bəzi mövzuların izah edilməsinə, məktəbin kimya müəllimlərini də cəlb edə bilərlər. Pedaqoji təlimatda bu cür yanaşmanın tətbiq edilməsinə imkan verir. Prosesin vacib olan digər bir cəhəti isə əldə edilən kimyəvi bilik və bacarıqların bioloji hadisə və proseslərə yaradıcı tətbiqetmə səviyyəsidir.

Mövzu: Hüceyrənin kimyəvi tərkibi. (IX sinif)

Alt standart: Hüceyrənin element tərkibini şərh edir.

İş forması: Kollektiv, qrup və cütlərlə iş

İş üsulu: Keys texnologiyası, beyin həmləsi, müzakirə sual-cavab, təqdimat.

İnteqrasiya: Azərbaycan dili, Fizika, Kimya.

Beyin həmləsi üsulundan istifadə edərək, şagirdlərə VII-VIII siniflərdə hüceyrənin kimyəvi tərkibinə və kimya fənnindən öyrəndikləri maddələrin xassələrinə dair yönəldici suallar verilir:

– Canlı orqanizmlərin hüceyrələri hansı kimyəvi elementdən təşkil olunmuşdur?

– Hüceyrə üçün zəruri olan elementlər hansılardır?

– Kimyəvi maddələr neçə qrupa bölünür?

– Hüceyrənin mürəkkəb maddələri hansılardır?

Fəal dərsin motivasiya mərhələsində D.İ.Mendeleyevin dövrü sistem cədvəlinin, orqanizmin hüceyrələrində ən çox rast gəlinən bir sıra kimyəvi elementlərin birləşmələrinə dair tərtib edilmiş cədvəlin nümayiş etdirilməsi də daha məqsədəuyğun hesab edilir. Digər tərəfdən, mövzu ilə bağlı dərslikdə verilən təlim materialı müəllim üçün metodik vəsaitdə göstərilən saytlara müraciət etməklə zənginləşdirilməlidir. Dərsin məqsədinə müvafiq təlim nəticələrini tam əhatə edən tədqiqat suallarının çıxarılması isə əhəmiyyət daşıyır.

1. Hüceyrədə olan qeyri-üzvi birləşmələrinin və suyun hüceyrənin həyat fəaliyyətindəki rolu nədən ibarətdir?

* hüceyrənin tərkibinə daxil olan maddələri qruplar üzrə təsnif etmək.

* mineral duzların hüceyrənin həyat fəaliyyətində rolu.

2. Hüceyrənin tərkibinə daxil olan üzvi maddələrin tərkibi və onların bioloji xüsusiyyətləri:

* hansı üzvi maddələrin molekulunda karbon, hidrogen və oksigendən əlavə azot, kükürd və fosfor elementləri də iştirak edir?

* zülalların sintezi, DNT və RNT-nin kimyəvi tərkibinin müqayisəli təhlili.

* fosfor elementi orqanizmində hansı hüceyrələrdə üzvi və qeyri-üzvi birləşmələrin tərkibinə daxil olur?

3. Hüceyrənin əsas həyati xassələri hansılardır?

* kimyəvi reaksiyanın tipləri və oksidləşmə reduksiya reaksiyaları haqqında.

* elementlərin quruluşu, üzvi katalizatorlar.

Məlumdur ki, mövzuya dair çıxarılan tədqiqat sualları müəllim tərəfindən müxtəlif cədvəl, sxem və s. şəklində də təqdim oluna bilər. Hər bir qrupun nümayəndəsinin çıxışı digər yoldaşlarının yaxından iştirakı və müəllimin rəhbərliyi ilə ətraflı cavablandırılır. İnformasiya mübadiləsi mərhələsində müəllim tərəfindən verilən yönəldici və prosesin aydınlaşdırılmasına xidmət edən yüngülləşdirici suallar mənimsəməni təmin etmək üçün əhəmiyyət kəsb edir.

Fəal dərsin ümumiləşdirmə və nəticəçıxarma mərhələsində fənn müəllimləri təlim materialına müvafiq dərsin məqsədinə nail olmaq üçün xüsusi yanaşmanı sistemli şəkildə əlaqələndirməli və ümumiləşdirməlidirlər. Bu zaman şagirdlər üçün anlaşılması çətinlik doğuran bir sıra məqamlara dair əlavə izah verməlidir.

Təcrübə göstərir ki, fəal dərsin yaradıcı tətbiqetmə mərhələsində müəllimlər, adətən, dərslikdə mövzu üzrə nəzərdə tutulan qiymətləndirmə tapşırıqlarından istifadə etməklə kifayətlənirlər. Təlim materialının zənginləşdirilmiş məzmununu əhatə edən inteqrativ xarakterli tapşırıqların tərtibi də diqqət mərkəzində olmalıdır. Mövzunun aktuallığını nəzərə alaraq ev tapşırıqlarının verilməsində, kimya fənni ilə inteqrativ əlaqələrin mahiyyətini özündə əks etdirən tapşırıqlara üstünlük verilməlidir. Eyni zamanda, bu qəbildən olan mövzularla bağlı layihələrin işlənməsi də şagirdlərdə elmi dünyagörüşünün inkişaf etdirilməsinə, bilik və bacarıqların formalaşmasına zəmin yaradar.

**Problemin aktuallığı.** Təlim prosesində digər didaktiv prinsiplərlə yanaşı, inteqrasiya prinsipinin reallaşdırılması müstəsna əhəmiyyət kəsb edir. Çünki şagirdlərdə elmi dünyagörüşün formalaşdırılması, təfəkkürün və yaradıcılıq qabiliyyətinin inkişaf etdirilməsi təlim prosesi əsasında səviyyələrə görə inteqrasiyanın səmərəli təşkilindən asılıdır.

Məktəb təcrübəsi göstərir ki, səviyyələrə görə inteqrasiyalar təşkilində çətinlik yaradan fənlərarası inteqrasiyadır. Biologiyanın kimya fənni ilə əlaqəli tədrisində inteqrasiyanın imkan və yollarının öyrənilməsi bu sahədə mövcud problemlərin aradan qaldırılması üçün əhəmiyyət daşıyır və optimal variantların işlənməsinə zəmin yaradır.

**Problemin elmi yeniliyi**. Mövcud problemlə bağlı biologiya kurikulumunun və yeni dərslik komplektlərinin təhlili, məktəb təcrübəsinin öyrənilməsi proqramların işlənməsində koordinasiya əlaqələrinin qurulmasına diqqət yetirilməsini tələb edir. Siniflər üzrə tərtib olunmuş “Müəllim üçün metodik vəsait”ə daxil edilən inteqrasiya cədvəlinin işlənmə prinsipi yenilənməlidir ki, biologiyanın tədrisində kimya fənni ilə inteqrasiyanın təlim nəticələrinə uyğun görülməsi təmin edilsin.

**Problemin praktik əhəmiyyəti.** Aparılan tədqiqatın nəticələrindən istər ümumtəhsil məktəbləri üçün fənn kurikulumlarının və istərsə də dərslik komplektlərinə daxil edilmiş inteqrasiya cədvəllərinin işlənməsində bəhrələnmək olar. Biologiyanın tədrisində kimya fənni ilə inteqrasiyanın səmərəli təşkili üzrə işin sistemində fənn müəllimləri faydalanmaqla təlim prosesini təkmilləşdirə bilərlər.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasının Ümumtəhsil pilləsinin Kimya fənni üzrə proqram (kurikulum). – Bakı, 2013.
2. Lətifov, İ.U., Kimya. 9-cu sinif dərslik. / İ.U. Lətifov, S.Ə. Mustafa. – Bakı, 2016.
3. Kazımov, İ.M., Abdulzadə A.M. Ümumtəhsil səviyyəsində biologiyanın tədrisində kimya fənni ilə inteqrasiyanın imkanları. // Magistrant (dövri-elmi jurnal). – Bakı: ADPU nəşr, 2022, № 4, – s. 69-74.
4. Kərimov, C.R. Biologiya (Yeni proqram əsasında tərtib olunmuş dərs vəsaiti). / C.R. Kərimov -Bakı: “Zirvə nəşri” MVV, 2021, – 272 s.
5. Qasımov, Ə. Kimya (abituriyentlər üçün dərs vəsaiti). / Ə. Qasımov. – Bakı: Güvən, 2020, – 431 s.
6. Ümumtəhsil məktəblərinin Biologiya fənni üzrə dərslik komplektləri.
7. Ümumtəhsil məktəbləri üçün Biologiya fənn kurikulumu, 2013.


**E-mail:** imrankazimov89@gmail.com

**Rəyçilər:** *biol.ü.fəls.dok., dos.* **H.M. Hacıyeva,**
*biol.ü.fəls.dok.,* **İ.M. Kazımov**
**Redaksiyaya daxil olub:** 09.03.2023

# *XARİCİ DİLLƏRİN TƏDRİSİ METODİKASI*
# *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИНОСТРАННЫХ ЯЗЫКОВ*
# *METHODS OF TEACHING FOREIGN LANGUAGES*

*UOT 37.0*

***Афаг Аллахверди гызы Садыгова***
*доктор философии по педагогике, доцент*
*Азербайджанского Государственного Университета Культуры и Искусств*
*https://orcid.org/0009-0007-6770-2460*

## СОПОСТАВИТЕЛЬНОЕ ИЗУЧЕНИЕ ЭТИКЕТНЫХ ФОРМУЛ РУССКОГО И АЗЕРБАЙДЖАНСКОГО ЯЗЫКОВ

***Afaq Allahverdi qızı Sadıqova***
*pedaqogika üzrə fəlsəfə doktoru,*
*Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin dosenti*

## RUS VƏ AZƏRBAYCAN DİLLƏRİNDƏ ETİKET FORMULLARININ MÜQAYİSƏLİ ÖYRƏNİLMƏSİ

***Afag Allahverdi Sadıgova,***
*doctor of philosophy in pedagogy, associate professor at*
*Azerbaijan State University of Culture and Arts*

## COMPARATIVE STUDY OF LABEL FORMULA IN RUSSIAN AND AZERBAIJANIAN LANGUAGES

**Xülasə.** Məqalədə rus və Azərbaycan dillərində müxtəlif etiket formullarının yaranma tarixindən, bu söz və ifadələrin müxtəlif ünsiyyət situasiyalarında istifadəsindən bəhs edilir, həmçinin hər iki dildə etiket formulları təqdim olunur. Şəraitdən asılı olaraq etiket formulları fərqli ola bilər. Nitq etiketi müəyyən nitq davranış qaydalarını ifadə edir. Etiket formulları cəmiyyətdə qəbul edilən, demək olar ki, bütün hallar üçün nəzərdə tutulmuş sabit ifadələrdir və həm yazılı, həm də şifahi formada, bütün üslub və janrlarda mövcuddur. Bu ifadələr görüşərkən və ayrılanda, kiməsə təşəkkür edəndə və ya üzr istəyəndə, tanışlıq vəziyyətində və bir çox başqa hallarda etiket formullarının köməyi ilə münasibət bildirirlər. Etiket formulları strukturuna və semantikasına görə bir çox dildə eynidir.
***Açar sözlər:*** *etiket formulları, nitq etiketi, ünsiyyət, ünsiyyət şəraiti, münasibət, etiket lüğəti*

**Резюме.** В статье рассматривается история возникновения разных этикетных формул в русском и азербайджанском языках, использование этих слов и выражений в различных ситуациях общения, а также представляются этикетные формулы в обоих языках. Этикетные формулы могут быть различны в зависимости от ситуации. Речевой этикет представляет собой определенные правила речевого поведения, а также устойчивые формулы вежливости. Этикетные формулы – это устойчивые выражения, принятые в обществе, предусмотренные практически на все случаи жизни и существуют как в письменных, так и в устных формах, во всех стилях и жанрах. С помощью этикетных формул выражают отношение при встрече и расставании, когда кого-либо благодарят или приносят свои извинения, в ситуации знакомства и во многих других случаях. Этикетные формулы идентичны во многих языках по своей структуре и семантике.
***Ключевые слова:*** *этикетные формулы, речевой этикет, общение, ситуация общения, отношение, этикетная лексика*

**Summary.** The article discusses the history of the emergence of different etiquette formulas in the Russian and Azerbaijani languages, the use of these words and expressions in various communication situations, and also presents etiquette formulas in both languages. Etiquette formulas may be different depending on the situation. Speech etiquette represents certain rules of speech behavior, as well as stable formulas of politeness. Etiquette formulas are stable expressions accepted in society, provided for almost all occasions and exist both in written and oral forms, in all styles and genres. With the help of etiquette formulas, they express their attitude when meeting and parting, when they thank someone or apologize, in a situation of acquaintance and in many other cases. Etiquette formulas are identical in many languages in their structure and semantics.

***Key words:*** *etiquette formulas, speech etiquette, communication, communi-cation situation, attitude, etiquette vocabulary*

Правильное использование этикетных формул является необходимым условием успеха в общении. Этикетные формулы могут быть различны в зависимости от ситуации. Ознакомление этикетными формулами очень важно на начальном этапе обучения. Речевой этикет представляет собой определенные правила речевого поведения, а также устойчивые формулы вежливости.

В общении, в том, как люди обращаются друг к другу, проявляются воспитание людей, уважительное отношение к собеседнику. С помощью словесных формул мы выражаем отношение при встрече и расставании, когда кого-либо благодарим или приносим свои извинения, в ситуации знакомства и во многих других случаях.

Этикет – установленный порядок поведения. Слово этикет произошло от греческого слова **этика** (нравственность). Этика – это учение о морали, в частности, о правилах и нормах человеческого поведения.

Этикетные формулы – это устойчивые выражения, принятые в обществе. Они предусмотрены практически на все случаи жизни и существуют как в письменных, так и в устных формах, во всех стилях и жанрах.

К этикетным формулам относятся: слова вежливости; знакомства, благодарности; приветствия и прощания; обращения и привлечения внимания, предложения и приглашения; поздравления и пожелания.

При изучении этикетных формул предполагается учитывать лингвистические и экстралингвистические факторы, тесно связанные с явлениями этнического, психологического и социального характера, то есть факторы, связанные непосредственно с развитием языка и факторы, не имеющего прямого отношения к языку. Этикетные формулы идентичны во многих языках по своей структуре и семантике.

Общение начинается с приветствия. С помощью формул приветствия устанавливается контакт и в формулах приветствия выражается эмотивная функция речевого этикета.

Что такое эмотивная функция? Эмотивная функция – функция, связанная с отражением эмоций говорящего в конкретном речевом высказывании. Эмотивная функция – это не только сообщение какого-либо факта действительности, но также и отношение к нему говорящего. Обмен приветствиями зависит от характера встречи и взаимоотношений, сложившихся между собеседниками. С помощью словесных формул мы выражаем отношение при встрече и расставании, когда кого-либо благодарим или приносим свои извинения, в ситуации знакомства и во многих других случаях [1, http].

Приветствовать, здороваться – это проявление уважения, вежливости; подтверждение знакомства, возможности завязать разговор; своеобразное пожелание благополучия.

В обоих языках использованию этикетных формул в конкретной ситуации влияет взаимоотношения между собеседниками. Например: Формулам **Здравствуй(-те)! Привет!** *(разг.)* в азербайджанском языке соответствует слово **Salam! Salaməleyküm! Xoş gördük!**, хотя русское приветствие **Привет!** используется только в разговорной речи. И еще одно отличие в том, что в азербайджанском языке слово **Salam! Salaməleyküm! Xoş gördük!**, не дифференцируется в зависимости от того, к какому лицу или лицам функционирует обращение, а в русском языке наоборот: слово **Здравствуй(-те)!** дифференцируется формами **ты (вы), (Вы)**. А формулы приветствия **«Добрый вечер.**

**Доброе утро. Добрый день»** были переняты из Европы и вошли в русскую речь только в конце XVII века. Если выражения **«Добрый вечер. Доброе утро. Добрый день»** в русском языке являются нейтральными выражениями приветствия в речи, то в азербайджанском языке эти выражения дифференцируются формами **sən / (ты), siz (Siz) / вы (Вы),** в зависимости от того, кому адресуются эти формулы – к лицу или к аудитории: **Sabahın xeyir!** ***(sənin);*** **Sabahınız xeyir!** ***(sizin (Sizin));*** **Günortan xeyir!** ***(sənin);*** **Günortanız xeyir!** ***(sizin (Sizin));*** **Hər vaxtın xeyir!** ***(sənin);*** **Hər vaxtınız xeyir!** (***sizin (Sizin));*** **Axşamın xeyir!** ***(sənin);*** **Axşamınız xeyir!** ***(sizin (Sizin))***. Приветственное выражение **«Добро пожаловать»** означает, что приход расценивается как благо. И в азербайджанском языке эквивалент этого выражения **«Xoş gəlmisiniz»** полностью совпадает по значению. Этикетная формула **«Добро пожаловать»** в русском языке является нейтральной, то есть не различается форма обращения лицу или группе. Но в азербайджанском языке дифференцируется в зависимости от обращения к лицу или лицам: **«Xoş gəlmisən»** ***(sən)***, **«Xoş gəlmisiniz»** ***(siz (Siz))***. Дифференцируются также в зависимости от ситуации обращения формула **«Gecəniz xeyrə qalsın!»,** хотя русский эквивалент этой формулы не дифференцируется: **«Спокойной ночи! Доброй ночи!».** В русском и азербайджанском языках эти формулы приветствия содержат благопожелания. Слова **добрый** и **xeyir** имеют одинаковую семантику: «благоприятный, несущий благо, успех, радость» [2, 309 с.].

С XVIII века под влиянием европейских языков стали появляться в русской речи новые приветствия: «Всего хорошего», «Желаю тебе (Вам)...». Следует отметить, что национальные пожелания русских, как правило, связаны с пожеланием здоровья: «Будь(-те) здоров(-ы)». И в азербайджанском языке имеется эквивалент этих выражений: «Xeyir apar (aparın)!», «Sənə (sizə) arzulayıram...», «Sağlıqla qal (qalın)!».

Мы рассмотрели дифференциацию лишь этикетных формул приветствия, но и у других этикетных формул существуют различия и в русском, и в азербайджанском языках.

Предлагаем этикетные формулы русского и азербайджанского языков в форме таблиц.

| **Слова и выражения со значением приветствия и прощания:** | |
|---|---|
| Здравствуй (-те)! | Salam! |
| Доброе утро! С добрым утром! | Sabahın xeyir! Sabahınız xeyir! |
| Добрый день! | Günortan xeyir! Günortanız xeyir! Hər vaxtın xeyir! Hər vaxtınız xeyir! |
| Добрый вечер! | Axşamın xeyir! Axşamınız xeyir! |
| Привет! (разг.) | Salam! |
| До свидания! | Xudahafiz! |
| До встречи! До скорой встречи! | Görüşənədək! Tezliklə görüşənədək! |
| Спокойной ночи! Доброй ночи! | Gecəniz xeyrə qalsın! |
| Прощай (-те)! | Əlvida! |
| До завтра! | Sabahadək! Sabaha qədər! |
| До вечера! | Axşamadək! Axşama qədər! |
| До понедельника! | Bazar ertəsinədək! Bazar ertəsinə qədər! |
| До следующей недели! | Gələn həftəyədək! Gələn həftəyə qədər! |
| Всего хорошего! Всего доброго! | Xeyirlə gedin! Xeyir aparın! |
| Пока (разг.). | Hələlik! |

| **Слова и выражения** со значением **просьбы и извинения** | |
|---|---|
| Скажи (-те), пожалуйста … | Buyur (-un) (zəhmət olmasa), de…(deyin…) |
| Посоветуй (-те), пожалуйста … | Buyur (-un) (zəhmət olmasa), məsləhət ver… (verin...) |
| Объясни (-те), пожалуйста … | Buyur (-un) (zəhmət olmasa), izah et… (izah edin…) |
| Будь (-те) добр (-ы), скажи (-те), пожалуйста | Zəhmət olmasa deyin... |
| Будь любезен… Будьте любезны … | Zəhmət olmasa.... Lütfən... |

nin yaradılması, komandanın qarşılıqlı əlaqələrinin təşkili, marketinq tədbirlərinin icrası, ictimaiyyətlə əlaqələrin təşkili, informasiya-reklam xarakterli nəşrlərin hazırlanması, İnternetdə informasiya nümayəndəliyinin (saytın) yaradılması v.s. daxildir. [8].

İT-dən istifadənin təhsil müəssisələrinin fəaliyyəti üçün belə səciyyəvi aspektləri var: dərs cədvəllərinin hazırlanmasının avtomatlaşdırılması, tələbələrin qrup və birləşmələrə bölgüsü, tədris planlarının işlənməsi və rəsmiləşdirilməsi, müəllimlərin tədris yüklərinin planlaşdırılması, müvəffəqiyyət üzrə hesabatların tərtibi, kataloqların aparılması, tədris-metodiki resursların və kitabxana fondunun uçotu, elektron kitabxananın yaradılması, qarışıq və distant təlim sistemində idarəetmə və s. Təhsildə istifadə olunan proqram vasitələri, öz növbəsində, idarəetmə fəaliyyətinin tipik proqram təminatı, təhsil müəssisələri üçün dərs və imtahan cədvəllərinin hazırlanması proqramı, tədris planlarının formalaşdırılması üçün elektron formalar, testləşdirmə sistemləri və s. ixtisaslaşdırılmış proqram təminatından ibarətdir.

İKT-in tədris prosesinə inteqrasiyası elektron təlim vasitələrindən, tədris resursları informasiya-axtarış sistemlərindən, kommunikasiya tədris vasitələrindən, tədris prosesində müvəffəqiyyətlə istifadə olunan, lakin xüsusi olaraq təlim üçün nəzərdə tutulmayan elektron resurslardan, o cümlədən İnternet resurslarından istifadəni nəzərdə tutur.

Elektron materiallar hal-hazırda istənilən tədris fənninin metodik təminatının ayrılmaz komponentini təşkil edir. Çap tədris vəsaitləri və müəllimlər üçün metodik tövsiyələrlə yanaşı, öyrədici proqramlar, çap və elektron informasiya resursları, lüğətlər və ensiklopediyalar, əlavə multimedia materiallar, müəllimlər üçün instrumental vasitələr, işçi dəftərlər, məşq və nəzarətedici proqram və trenajorlar, dərs vəsaitlərinin veb-saytları və təlim kurslarının veb-səhifələri, annotasiya yazılmış İnternet resursların kataloqları, elektron kommunikasiya vasitələri və s. tədris kompleksləri aiddir.

*Əyani, distant və qarışıq formalı təlimin təşkili.* Tədris məqsədləri ilə tətbiq edilən resursların və proqram vasitələrinin təsnifatı üçün təklif edilən, tədris materiallarının strukturundan tutmuş tələbələrin fəallıq dərəcəsinə qədər müxtəlif təsnifat əsaslarından istifadə olunur. Müxtəlif tipli resurslardan kompleks istifadə informasiya-təhsil mühitini yaradır. Belə mühit təlimdə İKT-dən səmərəli istifadəni təmin edən müxtəlif tipli resursları əhatə edən açıq proqram məhsulu ola bilər ya da müxtəlif resurslar kompleksindən istifadə hesabına yaradıla bilər.

Təhsildə kompüter resurslarının tətbiqi sahəsində xarici təcrübə göstərir ki, tədris prosesi üçün lazım olan müxtəlif tipli elektron tədris resurslarının (ETR) sayı təhsil proqramının, tədris fənninin spesifikası və təlimin forması (əyani, distant, qarışıq) ilə təyin edilir. ETR-nın işlənib hazırlanması kadr resursları (proqramlaşdırma, pedaqoji dizayn mütəxəssisləri, konkret tədris fənni üzrə müəllimləri), xeyli zaman və maliyyə tələb edir. [6]

Bununla belə tədris materiallarının konkret tələbə qruplarının tələblərinə və təlim şəraitinə uyğunlaşdırılması üçün müəllimlərin ETR sərbəst işləyib hazırlamasına imkan verən xüsusi proqram vasitələri ilə təminatı zəruridir. Bu məqsədlə müxtəlif tipli tətbiqi və instrumental proqramlardan istifadə olunur. Bu proqramların köməyi ilə kompüterdə iş bacarıqları olan müəllimlər proqramlaşdırma sahəsində mütəxəssislərə müraciət etmədən zəruri tədris materialları yarada bilərlər.

A.İ. Başmakov və İ.A. Başmakovun elektron dərslik və dərs vəsaitlərinin hazırlamasına həsr edilmiş tədqiqatında [6] elektron tədris resurslarının təsnifat əsasını pedaqoji məqsədlər təşkil edir. Bu, kompüter tədris materiallarının aşağıdakı növlərini fərqləndirməyə imkan verir: nəzəri hazırlıq vasitələri (elektron dərsliklər, kompüter öyrədici sistemləri, biliklərin kompüter nəzarət sistemləri); praktiki hazırlıq vasitələri (kompüterli məsələ kitabçası/praktikumları, kompüter trenajorları); köməkçi vasitələr (kompüter laboratoriya praktikumları, kompüter məlumat kitabçaları, multimedia tədris məşğələləri); kompleks vasitələr (kompüter təlim kursları).

Elektron tədris materiallarının təsnifatı üçün əlavə əsaslar kimi müəlliflər telekommunikasiya texnologiyaları, şəbəkə tədris materialları (lokal/qlobal şəbəkə üçün nəzərdə tutulmuş); informasiyanın təqdim edilmə forması (multimedia/qeyri-multimedia); öyrənilən obyektin modelinin xarakteri (proqramla reallaşdırılan riyazi model/fiziki modellər); istifadəçi interfeysinin növü (ənənəvi qrafiki/virtual reallıq əsasında) və s. xarakteristikaları nəzərə almağı təklif etdilər.

Ənənəvi tədris nəşrləri və elektron tədris materialları üçün ortaq olan təlim vasitələrinin təsnifatının ən əhəmiyyətli parametrlərindən biri məzmun-struktur aspektidir [6]. Belə ki, kompüter öyrədici proqramda materialın mənimsənilməsinin bütün mərhələlərinin (nümayiş, məşq, nəzarət) olması onu elə məhz nəzarətedici və ya testləşdirici proqram adlandırmağa əsas verir. Bu yanaşmaya əsasən elektron tədris materialları çap tədris materiallarının müvafiq janrlarının analoqudur: materialın öyrənilməsinin bütün mərhələləri dərsliklərdə, dərs vəsaitlərində və tədris komplekslərində; məşq və nəzarət mərhələləri məsələ və tapşırıqlar toplularında, laboratoriya praktikumlarının materiallarında; nəzarət mərhələsi nəzarətedici tapşırıqlar/materiallar toplularında təqdim edilmişdir. Adı çəkilən dərs vəsaitləri növlərindən başqa, lüğətlər, məlumat kitabçaları, ensiklopediyalar, xəritələr, atlaslar kimi əlavə və köməkçi çap və elektron tədris materiallarından da istifadə olunur. Bundan başqa, həm çap, həm də elektron vəsaitləri müəllimin rəhbərliyi altında öyrənmə, özünütəhsil və sərbəst iş üçün də nəzərdə tutula bilər. [8]

ETR-nın tədris prosesinə inteqrasiyası üçün ənənəvi və elektron formatlı tədris materialların optimal nisbəti təyin edilməlidir. ETR həm artıq mövcud olan çap vəsaitləri, audio və videokurslar, həm də əvvəldən elektron reallaşdırılması nəzərdə tutulan orijinal tədris materialları əsasında yaradıla bilər.

Elektron və ənənəvi dərsliklərin məzmun nisbətindən asılı olmayaraq, ETR-nın təsnifat parametrləri texnoloji imkanlardan təhsil məqsədlərində istifadə ilə bağlı olacaq. Onların diapazonu elektron nəşrlərin və çap materiallarının saxlanılması və ötürülməsindən tutmuş, virtual təlim mühitlərinin yaradılmasına qədər çox genişdir. Bu əsasda elektron təlim vasitələrinin təsnifatı 3 resurs qrupuna bölünə bilər:

1) informasiyanın xətti təqdimatından istifadə edən ETR. Belə ETR təlimin məzmununa və üsullarına hər hansı yeni aspektlər gətirməyib informasiyanın saxlanması və yayılması üçün əlavə imkanlar təklif edir. Bu tip tədris materiallarını onların həcmindən, strukturundan, janrından və çap nəşrləri ilə nisbətindən asılı olmayaraq çap nəşrlərinin elektron versiyası (surəti) adlandırmaq olar;

2) informasiyanın qeyri-xətti və multisensor nümayişini təklif edən hipermətn və hipermedia ETR. Bu, biliklərin əldə edilməsi prosesini daha çox aktivləşdirməyə və fərdiləşdirməyə imkan verir;

3) İKT-dən təhsil prosesinin idarə edilməsi və tələbələrin fəaliyyətinin interaktiv rejimdə təşkili üçün istifadə olunan interaktiv tədris materialları. Belə tədris materiallarına öyrədici proqramlar, kompüter trenajorları, offlayn və onlayn rejimdə istifadə üçün nəzərdə tutulmuş modelləşdirici tədris proqramları aiddir.

Ümumən xalis şəkildə "xətti", "qeyri-xətti" və "interaktiv" elektron tədris materialları mövcud deyil. Onlarda yalnız bu və ya digər yanaşmanın üstünlüyündən və çap vəsaitlərinin xarakteristikasında olduğu kimi, onun təcəssümünün keyfiyyətindən danışmaq olar. Xətti mətnlərdə hətta çap şəklində belə informasiyanın qeyri-xətti elementlərini (istinadlar sistemi, haşiyələr və s.) əks etdirir. Elektron reallaşdırmada belə imkanlar (elektron mündəricatdan, sənədin sxem və strukturundan istifadə və s.) daha çox olur.

Hipermətnlər xətti mətnlərin qeyri-xətti təşkilidir. Çox vaxt dərsliyin elektron versiyası adlandırılan kompüter dərsliyi materialın xətti və hipermətn təşkilini, habelə interaktiv testləri, təlimin nəticələrinin statistik təqdimetmə vasitələrini və s. özündə birləşdirə bilir. Bununla əlaqədar olaraq ETR ilə ənənəvi dərs vəsaitlərini (çap, audio, video) yaxud "interaktiv" və "qeyri-interaktiv" ETR-ini qarşı-qarşıya duran və bir-birini inkar edən vəsaitlər kimi nəzərdən keçirmək deyil, hər tip təlim vasitələrinin imkanlarından maksimum səmərəli istifadə etmək lazımdır. [10]

Təhsildə İKT-nin tətbiqi xüsusiyyəti elədir ki, onların məzmununa yeni yanaşmaları texniki imkanlara nisbətdə ikinci dərəcəli olur. Başqa sözlə, əvvəlcə yeni texniki qərarlar meydana çıxır, sonra isə onlardan təhsildə istifadə variantları axtarıb tapılır.

Təhsil texnologiyalarına əhəmiyyətli təsir göstərmiş son texniki nailiyyətlərdən multimedia və kompüter telekommunikasiya sistemlərini xüsusi vurğulamaq lazımdır. Qeyd etmək lazımdır ki, sərbəst işin təşkilində interaktiv qarşılıqlı təsirin zirvəsini modelləşdirici proqramlar təşkil edir. Multimedia texnologiyası hər hansı

hadisəni, prosesi, situasiyanı müxtəlif nöqteyi-nəzərdən və müfəssəl təsvir edən müxtəlif statistik və ya dinamik təsvirlərin monitorda əks etdirilməsi üçün müxtəlif vasitələrdən istifadəni nəzərdə tutur.

Koqnitiv qrafikaya əsaslanan texnologiya dünyanın sintetik (inteqrativ) obrazlarının yaradılması vasitəsilə təlim imkanlarını genişləndirir. Bu, çoxlu sayda psixi analizatorları qoşmaqla informasiyanın qavranılması və mənimsənilməsi üçün imkan yarada bilər, bu da qavrayışın ümumi çoxfunksional təbiətinə uyğun olaraq idrak prosesini xeyli aktivləşdirir.

Yeni təlim üsulları və İKT-nin tələbələrin müstəqil idraki fəaliyyətinə təsirinin öyrənilməsinə xeyli tədqiqatlar həsr edilmişdir. Bu tədqiqatlar göstərir ki, təlimin ənənəvi və müasir metodlarını inteqrasiya edərək müstəqil idrak fəaliyyətini təşkil etmək mümkündür. Tədris materialında analiz, sintez, strukturlaşdırma və istiqamətləndirmə, anlayış, məntiqi və mücərrəd düşüncə növləri inkişaf edir. Son illərin tədqiqatlarında kompüter texnologiyalarından istifadə tələbələrin müstəqilliyinin inkişafı şərti kimi təqdim edilir.

Təlimin virtual sistemlərinin yaradılması və tətbiqi çevik təhsil mühitinin formalaşmasına xidmət edir. Tələbələrin təlimi və müstəqilliyinin inkişafında İT-dən istifadə problemi üzrə tədqiqatlar göstərir ki, təhsil mühitinə aktiv qoşulmanın aşağıdakı istiqamətləri mövcuddur:

*1. Təhsilin keyfiyyətin yüksəldilməsi imkanlarının genişləndirilməsi istiqaməti:*

1.1. Tələbə təfəkkürünün inkişaf etdirilməsində yeni imkanların yaranması, hər bir tələbənin kompüterlə sərbəst işi ilə biliyin əldə edilməsinin fərdi üsullarının seçimi;

1.2. İKT elmi-texniki inqilabın aləti;

1.3. Təhsil sferasının real dünyaya yaxınlaşdırıması amili, tədris prosesinin informasiya kanallarının tutumluğunu yüksəldən vizual obraz və modellərin qurulması;

1.4. Tələbə fəaliyyətinin alqoritmləşdirilməsi və şüurda fəaliyyətə daxili motivlərin formalaşdırılması kimi İKT-dən istifadənin əhəmiyyətli funksiyalarının həyata keçirilməsi (Q.A. Bordovski, İ.B. Qorbunova, A.C. Kondratyev).

*2. İnformasiya-təhsil mühitləri məzmununun və layihələndirmə texnologiyalarının metodoloji əsaslandırılması.* Tədqiqatlarda tələbənin inkişaf sərbəstliyinin təmin edilməsində informasiya mühitinin rolu göstərilmiş, idarə edən subyektlə (müəllim) qarşılıqlı təsir dərəcəsinə görə proqram-pedaqoji vasitələrin təsnifatı (idarəedici və öyrədici proqramlar, məşq materialları, imitasiya modelləri, "vizual reallığın mikrodünyaları") verilmişdir [6].

*3. Ənənəvi pedaqoji və İT layihələrini bir araya gətirməklə şəxsiyyətyönlü təlimin təşkili.* Bu, vahid interaktiv təhsil və informasiya məkanının yaradılması ilə əlaqələndirilir (Y.S. Polat, V.A. Smirnov) [7].

*4. İnteraktiv texnologiya vasitələri əsasında tələbələrin müstəqilliyinin inkişaf etdirilməsi.* Bu ideya təhsildə İKT-nin inkişafına əhəmiyyətli töhfələr verən bir qrup alim tərəfindən (akademik V.V. Laptev, M.V. Dodonov, A.A. Laktionov, N.Y. Korolyov, S.L. Svetliskiy və b.) verilmişdir. M.V. Dodonov imitasiya modelləşdirilməsinin səmərəlik şərtlərinə dair nəticələr əldə etmişdir: sınaqların real obyektlər üzərində həyata keçirilməsi mümkün olmadıqda, eksperimentlərin keçirilməsi, riyazi modellər üzərində əməliyyat aparılması, mürəkkəb proseslərin cərəyan etmə dinamikasının nümayişi v.s.

Tələbələrin sərbəst fəaliyyət sisteminin inkişafı daha çox təhsil mühitində İKT vasitələrindən kompleks istifadədən asılıdır. V.A. İzvozçikov təhsilin informasiyalaşdırılması modellərinin layihələndirilməsi prinsiplərini belə ifadə etmişdir: sistem yanaşma, inkişafda dövrülük, pedaqoqlarla şagirdlərin qarşılıqlı təsirlərinin optimallaşdırılması, tələbələrin müstəqilliyinin və özünütəşkilinin inkişaf etdirilməsi, bu proseslərin universitet İKT mərkəzi səviyyəsində əlaqələndirməsi.

**Problemin aktuallığı.** Məqalə təhsilin informatlaşması kimi aktual bir problemə həsr edilmişdir. Məqalədə İKT-nin təsiri ilə təhsil paradiqmasının dəyişməsi məsələlərinə toxunulur.

**Problemin elmi yeniliyi.** Məqalə cəmiyyətin rəqəmsallaşdırılması dövründə təhsil paradiqmasının dəyişməsinə həsr edilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə təhsilin informatlaşması, rəqəmsallaşması problemləri ilə məşğul olan tədqiqatçılar və pedaqoqlar üçün maraq kəsb edir.

**Ədəbiyyat:**

1. Əhmədov İ. B. İnformasiya Cəmiyyəti. Təhsil. İnnovasiya // Dirçəliş-XXI əsr, 2007, № – 108-109.
2. Əhmədov İ. B. Təhsil. İnsan kapitalı. Davamlı inkişaf // Dirçəliş-XXI əsr, N126-127 / 2008).
3. Əhmədov İ. B. Təhsilin Qloballaşması və Milli Universitetlər. ("Dirçəliş-XXI əsr" jurnalı, N 130-131 / 2009).
4. Əhmədov İ. B. Elektron tədris vəsaitləri. İdarəetmə və Optimallaşmanın Sənaye Tətbiqi 2-ci Beynəlxalq Konfrans. Konfransın materialları. Bölmə" Təhsildə İKT". Tətbiqi Riyaziyyat İnstitutu. BDU, iyun 2-4, 2008, Bakı-Azərbaycan. – S. 42-53
5. Əhmədov İ.B. Azərbaycan Respublikasında Vahid Distant təhsil sisteminin yaradılması və inkişafının konseptual məsələləri. Pedaqoji Universitetin xəbərləri, – Bakı: ADPU, 2005, № 2
6. Башмаков А.И., Башмаков И.А. Разработка компьютерных учебников и обучающих систем. — М.: Информационно-издательский дом Филинъ, 2003. – 616 с.
7. Полат, Е.С. Новые педагогические и информационные технологии в системе образования / Е.С. Полат, М.Ю. Бухаркина. – М.: Академия, 2001. – 268 с.
8. Кузьминов Я.И. Ярослав Кузьминов о цифровом будущем университетов. 2015. [Электронный ресурс, 5.03.2018]. URL: http://www.edutainme.ru/post/Kuzminov-interview/
9. Концепция развития единой информационной образовательной среды в российской федерации. 2013. [Электронный ресурс, 5.03.2018]. URL: http://docplayer.ru/30132939- Koncepciya-razvitiya-edinoy-informacionnoy-obrazovatelnoy-sredy-v-rossiyskoy-federaciivvedenie.htm
10. Уваров А.Ю. Образование в мире цифровых технологий: на пути к цифровой трансформации – Изд. дом ГУ-ВШЭ, – М.: 2018. – 168 с
11. Высшее образование для XXI века: Цифровая трансформация общества: новые возможности и новые вызовы: XVI Международная научная конференция, МосГУ, 18-19 ноября 2020 г.: доклады и материалы: в 2 ч. Ч. 1. / под общ. ред. И. М. Ильинского. – М.: Изд-во Моск. гуманит. ун-та, 2020. – 685 с. Режим доступа: http://publications.mosgu.ru/index.php/main/catalog/book/23

**E-mail:** riyaziyyat.m@yandex.com

**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **İ.B. Əhmədov,**
*fiz.riy.ü.fəls.dok., dos.* **Ə.Ə. Aslanov**
**Redaksiyaya daxil olub:** 25.04.2023

UOT 37

**Lalə Kamal qızı Rəhimova**
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Gəncə Dövlət Universiteti*
*https://orcid.org/0000-0002-7731-9728*

# GƏLƏCƏK MÜƏLLİMLƏRİN İKT SƏRİŞTƏLƏRİ

**Лала Камал гызы Рагимова**
*докторант по программе доктора философии*
*Гянджинский Государственный Университет*

# ИКТ КОМПЕТЕНЦИИ БУДУЩИХ УЧИТЕЛЕЙ

**Lala Kamal Rahimova**
*doctorial student in the program of doctor of philosophy*
*Ganja State University*

# ICT COMPETENCIES OF FUTURE TEACHERS

**Xülasə.** İnformasiya cəmiyyətinə keçid cəmiyyətin bütün üzvlərinin informasiya mədəniyyətinin inkişaf etdirilməsini tələb edir. Bu, ilk növbədə, məktəb müəllimləri üçün zəruri bir tələbdir. Müəllim kadrlarının informasiya mədəniyyətinin formalaşdırılması və inkişaf etdirilməsi ixtisasından asılı olmayaraq, bütün fənn müəllimləri üçün zəruridir. Bu işə onların ali təhsil aldığı müddətdən başlamaq lazımdır. Hal-hazırda tələbələrin İKT – səriştəliliyi onların peşəkarlığının vacib tərkib hissəsidir. Fasiləsiz təhsil sistemində səriştəlilik "savad – səriştə – mədəniyyət – mentalitet" zəncirində təhsilin yekun nəticələrindən biri olmalıdır.

***Açar sözlər:*** *təhsil, müəllim, səriştə, informasiya mədəniyyəti, İKT, informasiya cəmiyyəti*

**Резюме.** Переход к информационному обществу требует развития информационной культуры всех членов общества. Это в первую очередь необходимо школьным учителям. Формирование и развитие информационной культуры необходимо для всех учителей предметников, независимо от их специальностей. Эту работу следует начинать в процессе обучения в высшей школе. В настоящее время ИКТ-компетентность студентов является важной составляющей их профессионализма. В системе непрерывного образования компетентность должна быть одной из важных конечных результатов образования, в цепочке «грамотность – компетентность – культура – менталитет».

***Ключевые слова:*** *образование, педагог, компетентность, информационная культура, ИКТ, информационное общество*

**Summary.** The transition to an information society requires the development of an information culture of all members of society. This is especially important for school teachers. The formation and development of an information culture is necessary for all subject teachers, regardless of their specialties. This work should begin in the process of teaching higher education. Currently, the ICT competence of students is an important component of their professionalism. In the system of continuous education, competence should be one of the important end results of education, in the chain "literacy – competence – culture – mentality".

***Key words:*** *education, teacher, competence, information culture, ICT, information society*

İnformasiya cəmiyyətinə keçid cəmiyyətin bütün üzvlərinin informasiya mədəniyyətinin inkişaf etdirilməsini tələb edir. Bu ilk növbədə məktəb müəllimləri üçün zəruri bir tələbdir. Müəllim kadrlarının informasiya mədəniyyətinin formalaşdırılması və inkişaf etdirilməsi ixtisasından asılı olmayaraq, bütün fənn müəllimləri üçün zəruridir. Bu işə onların ali təhsil aldığı müddətdən başlamaq lazımdır. Hal hazırda tələbələrin İKT səriştəliliyi onların peşəkarlığının vacib tərkib hissəsidir. Fasiləsiz təhsil sistemində səriştəlilik "savad– səriştə –

mədəniyyət – mentalitet" zəncirində təhsilin yekun nəticələrindən biri olmalıdır.

Tələbələrin İKT-dən istifadəyə hazır olması, onlarda bu bacarıqların formalaşdırılması, müəllimlərin bu sahədə kompetensiyaları bir sıra tədqiqatçılar tərəfindən tədqiq edilmişdir (Q.Y. Boqdan, L.V. Qalıgina, O. N. İonova, A.A. Kuznetsov və.s.).

L.A. Şevtsova müəllimlərin peşə fəaliyyətində informasiya texnologiyalarından istifadəyə hazır olması problemini tədqiq edir. S.V. Çeçenina regional ixtisasartırma sistemi şəraitində ümumtəhsil məktəbləri müəllimlərinin informasiya hazırlığı problemini tədqiq edir.

O.V. Ursova öz tədqiqatlarında müəllimin İKT səriştəliliyi anlayışını izah edir, onun formalaşdırılması üsullarını təklif edir. Müəllif müəllimin informasiya hazırlığı dedikdə, təhsil prosesində informasiya fəaliyyəti, təlim prosesi iştirakçıları arasında İKT bazasında fəaliyyət, interfəal vasitələrlə qarşılıqlı informasiya əlaqəsinin təmin edilməsi, informatika və İKT sahəsində hazırlığı nəzərdə tutur. Müəllif ixtisasartırma təhsili sistemində ümumtəhsil məktəbi müəllimlərinin informasiya hazırlığının "informasiya-idrak, təşkilati-fəaliyyət və şəbəkə" üç səviyyəli modelini işləyib hazırlamışdır.

L.A. Şevtsova "peşə fəaliyyətində İKT-dən istifadəyə hazırlığın səviyyələrini belə müəyyən edir: "kompüter savadlılığı", "İKT-səriştəsi" və "İnformasiya mədəniyyəti". Qeyd olunan hazırlığın formalaşdırılması üçün o, müəllimlərin pedaqoji fəaliyyətində kompüter texnologiyalarından istifadəyə hazırlığın formalaşdırılmasının pedaqoji şərtlərini, dəstəkləyici tədris sistemini təklif edir. Bu sistem, məktəbin informasiya-təhsil mühitinin inkişafı, müəllimin texnoloji və pedaqoji inkişafının dəstəklənməsinin metodik təminatından ibarətdir.

S.N. Mayorova öz tədqiqatında informasiya texnologiyaları sahəsində müəllim hazırlığında pedaqoji və informasiya istiqamətlərinin inteqrasiyası, informasiya texnologiyaları sahəsində gələcək müəllimlərin informasiya, layihələndirmə, idraki səriştələr sisteminin formalaşdırılması modelini təklif etmişdir. [30, s.139]. Son illərin tədqiqatlar göstərir ki, tələbələrin informasiya mədəniyyətinin inkişaf etdirilməsi bütün fənn müəllimlərinin əsas işi olmalıdır.

Y.M. Razinkinanın tədqiqatında qarşılıqlı əlaqədə olan 3 komponentdən bəhs edilir:

a) peşə fəaliyyətində informasiya texnologiyalarının istifadəsi üzrə biliklərə əsaslanan məzmun komponenti;

b) peşə fəaliyyətində informasiya texnologiyalarından istifadə bacarıqları, bu bacarıqların əsaslandığı fəaliyyət növləri;

c) gələcək müəllimin informasiya texnologiyalarından istifadə etməklə peşə fəaliyyətinə hazırlanması, bunun təşkilati forma, metod və vasitələri sistemi, tələbənin gələcək peşə fəaliyyətində informasiya texnologiyalarının istifadəyə hazırlığının formalaşdırılması.

Q.Y. Boqdan öz tədqiqatında "peşə fəaliyyətində yeni informasiya texnologiyalarının istifadəsi sahəsində tələbələrin səriştəliliyinin formalaşdırılması üçün üç mərhələ təklif edir:

1) baza nəzəri-pedaqoji hazırlıq (kompüter texnologiyalarının təlim vasitəsi kimi istifadəsi);

2) əlavə təhsil (kompüter texnologiyalarının tədris fənni kimi öyrənilməsi);

3) peşəkar-pedaqoji hazırlıq (kompüter texnologiyalarından peşə fəaliyyətində istifadəsi).

Bu mərhələlərin hər biri peşə hazırlığına xidmət edir. Bütünlükdə isə bu kompleks əsas məsələnin – tələbələrin peşə fəaliyyətində informasiya texnologiyalarından istifadəyə hazırlığının formalaşdırılmasına dəstək verir.

Tədqiqatlar göstərir ki, informasiya cəmiyyətində ali pedaqoji təhsil müəssisəsi tələbələrinin İKT səriştəliliyi xüsusi rol oynayır. L.A. Şevtsova iddia edir ki, "İKT-dən istifadənin ümumtəhsil əhəmiyyəti və texnoloji bacarıqları kompüter texnologiyalarının tədris prosesində tətbiqi üzrə psixoloji-pedaqoji bacarıqlarla sıx əlaqəlidir. Bu keyfiyyət tələbələrin gələcək peşə fəaliyyətinə əsaslanmaqla formalaşdırılmalıdır". O.V. Ursova qeyd edir ki, "İKT-səriştəliliyinin inkişafı prosesi çoxpilləli xarakter daşımalı, inkişaf pillələri pedaqoji fəaliyyətin yenidən qurulması (transformasiyası) prosesi ilə əlaqələndirilməlidir."

Tədqiqatçılar tələbələrin İKT səriştəliliyinin formalaşdırılması mərhələləri və səviyyələrinə müxtəlif yanaşmalar təklif edirlər. M. Lebedeva və O.N. Şilova "tələbələrin İKT səriştəliliyinin formalaşdırılmasının üç mərhələsini nəzərdən keçirir: baza, ümumi və peşə fəaliyyəti mərhələsi. Baza İKT səriştəliliyi – ümumi İKT

səriştəliliyinin formalaşdırılması üçün əsasdır, bu isə öz növbəsində, İKT səriştəliliyi gələcəkdə daha yüksək səviyyədə formalaşdırılması üçün zəruri bazadır.

Müəlliflərin fikrinə görə, ümumi İKT səriştəliliyinin baza İKT səriştəliliyindən fərqi tətbiqi proqramların daha geniş istifadəsi ilə əlaqədardır. Bu zaman müəlliflər İKT səriştəliliyində bu elementləri qeyd edirlər:

İnternet-resurslardan istifadə etməklə tədrisyönlü yeni informasiyanın axtarışı, seçilməsi, müxtəlif İKT vasitələrindən istifadə etməklə təhsil informasiyasının təqdim edilməsi;

1) öz peşə səviyyəsinin artırılması məqsədi ilə müəllimlərin şəbəkə birliklərinin işində, internet-konfranslarda iştirak;

2) kompüter tədris proqramlarının yaradılması, standart tətbiqlərdən və instrumental sistemlərdən istifadə etməklə tədris informasiyasının təqdim edilməsi;

3) standart tətbiqlərdən və ixtisaslaşdırılmış proqramlardan istifadə etməklə tədris təyinatlı məlumat bazalarının yaradılması;

4) html-redaktorlardan, standart tətbiqlərdən və instrumental sistemlərdən istifadə etməklə elektron daşıyıcılarda tədris vəsaitlərinin və materiallarının işlənib hazırlanması, təlim-tərbiyə məqsədi ilə hazır multimedia layihələrdən istifadə;

5) standart tətbiqlərdən və ixtisaslaşdırılmış proqramlardan istifadə etməklə təlim-tərbiyə prosesinin idarə edilməsi.

M. B. Lebedeva və O. N. Şilova "İKT-səriştəliyi formalaşmasının üç səviyyəsini müəyyən edir:

1) anlama (əsas anlayışlara yiyələnmə);

2) nümunə üzrə istifadə (məsələlərin nümunə üzrə yerinə yetirilməsi);

3) yaradıcı istifadə (qeyri-standart həllin nümayiş etdirilməsini tələb edən tapşırıqların yerinə yetirilməsi)".

L.N. Qorbunova və A.M. Semibratov "İKT-səriştəliliyinin səviyyələrini ali təhsil müəssisələri arasında nizamlama, paylaşma, bölüşdürmə ilə əlaqələndirmə"yi təklif edir. Bu istiqamətdə 3 səviyyə təklif edilir:

1) Minimal İKT-savadlılığı;

2) Orta İKT bacarıqlılığı və ya medial səriştəliyik;

3) Tam İKT səriştəliliyi.

O.N. İonovanın fikrinə görə "informasiya İKT səriştəliliyinin formalaşdırılması prosesinə informasiya texnologiyalarının öyrənilməsinin daxili və xarici motivləri təsir göstərir: xarici – maddi stimullar (regionun əmək bazarında rəqabət qabiliyyətinin yüksəlməsi, əmək haqqının artması, dərəcənin artması və s.), daxili – peşəkar inkişafın şəxsi özünüreallaşdırma motivləri".

A.A. Yelizarov "müəllimin İKT səriştəliliyinin müxtəlif səviyyələrini qeyd edir: baza və fənnyönlü. Baza səviyyəsi dedikdə, müəllimə pedaqoji həllər üçün lazım olan bilik, bacarıq və təcrübəsinin səviyyəsi başa düşülür. Fənnyönlü səviyyə isə bu və ya digər tədris fənninin məzmununa dair tələblərə uyğun olaraq işlənib hazırlanmış müxtəlif resursların və ixtisaslaşdırılmış texnologiyaların mənimsənilməsi və təhsil fəaliyyətinə tətbiqini nəzərdə tutur".

Tələbələr üçün İKT-səriştəliliyi tələbləri yaradılmasının öz spesifikası var. Müasir həyat informasiya cəmiyyətinə keçidi diktə etdiyi üçün tələbələri bu yeni cəmiyyətdə səmərəli fəaliyyətə hazır mütəxəssis kimi formalaşdırmaq zəruridir. Müəllimlər fənlərin tədrisində İKT-nin şüurlu, metodiki baxımdan savadlı istifadəsinə hazır olmaları üçün dərin İKT səriştəliliyinə malik olmalıdırlar.

Məlum olduğu kimi, istənilən peşə fəaliyyəti peşəyə istiqamətlənmiş "xüsusi fənlər"in tədrisini tələb edir. Pedaqoji mənbələrdə "xüsusi fənlər" anlayışına tez-tez rast gəlinir. Dövlət təhsil standartının təhlili əsasında bu terminin tərifi belə verilib: Xüsusi fənlər – konkret ixtisas çərçivəsində peşə fəaliyyətinin növünə görə bilik, bacarıq və vərdişləri formalaşdıran fənlərdir. Buna görə də informasiya texnologiyalarından aktiv istifadə gələcək mütəxəssislərin hazırlığı səmərəsini artırmağa, tələbələrə gələcək peşə fəaliyyətlərində elmi-texniki tərəqqinin ən yeni nailiyyətlərini istifadə etməyi öyrətməyə imkan verir.

Peşəyönlü tədris, nəzarət proqramları, peşəkar tətbiqi proqramlar çox olmadığı üçün xüsusi fənn müəllimləri tədris prosesində İKT-nin istifadəsində çətinlik çəkir. Tələbələr peşə fəaliyyətinə hazır olmaq üçün İKT-ni bilməlidir.

Bu məsələlərin həll edilməsi üçün ali peşə təhsili sistemində iş bir neçə istiqamətdə aparılır:

a) ixtisasartırma kursları;

b) tələbə konfranslarında iştiraka hazırlanması, çıxışların multimedia təqdimatları ilə müşayiət edilməsi;

c) dərslərə hazırlıq zamanı İnternet-resurslardan istifadə, dərslərdə hazır elektron vəsaitlərdən istifadə".

Təhsil fəaliyyətində pedaqoji prosesin bütün komponentləri arasında qarşılıqlı əlaqələr nəzərə alınmaqla, onun informasiya modellərinin layihələndirilməsi əhəmiyyəti yüksəlir, daim imkanları artan pedaqoji və informasiya texnologiyaları spektrinin öyrənilməsi və istifadəsi zərurəti güclənir. S.N. Mayorovanın tədqiqatlarında fənlərin tədrisində yeni informasiya texnologiyalarının istifadə problemi, həmçinin tələbələrin informasiya mədəniyyətinin formalaşdırılması məsələləri nəzərdən keçirilir.

Təcrübə göstərir ki, fənlərin tədrisi sahəsində informasiya texnologiyalarının tətbiqi üzrə konfranslarda birbaşa şəxslərarası təcrübə mübadiləsi əhəmiyyətli təsirə malikdir. Diqqətəlayiqdir ki, bu cür konfranslar və ya onların bölmələri müəllimlərə təkcə məruzələrin məzmunu ilə yaxından tanış olmağa yox, həm də elektron təhsil resurslarının qabaqcıl layihələrini görməyə, təhsilin informasiyalaşması vasitələrinin yaradılması və tətbiqi üzrə müxtəlif üsulların müqayisəsini aparmağa imkan verir.

Xarici ölkələrin innovasiya təcrübəsi pedaqoji ictimaiyyətin diqqətini ali təhsildə müasir informasiyalaşma vasitələrinin işlənib hazırlanması və tətbiqi problemlərinə yönəldir. Bu müəllimlərin bu sahəyə olan marağının artırılması üçün nəzərdə tutulan ixtisaslaşdırılmış nəşrlərin əhəmiyyətini sübut edir. Belə nəşrlər geniş mütəxəssis çevrəsinə – müəllimlərə, təhsil sisteminin inzibatçılarına, metodistlərə, informatikanın müxtəlif sahələrinin mütəxəssislərinə, psixoloqlara, iqtisadçılara və s. yönəldilməlidir.

Müasir dövr ali təhsil sistemində tələbələrin İKT səriştəliliyinin formalaşdırılması üçün müvafiq şəraitin yaradılması zəruridir. Hələ də ayrı-ayrı fənlərin tədrisi prosesində İKT-dən sistemli istifadəni təmin edəcək, elmi cəhətdən əsaslandırılmış və təcrübi sınaqdan çıxarılmış texnoloji-metodiki yanaşma mövcud deyil. İxtisas fənlərinin tədrisində müasir İKT xüsusiyyətlərini və üstünlüklərini maksimum nəzərə alan tədris fəaliyyətinin forma və metodları kompleksinin işlənib hazırlanması zəruridir.

Tələbələrin İKT səriştəliliyinin formalaşdırılması hazırda ali təhsil sisteminin ən vacib vəzifələrindəndir. Ali məktəb tələbələrinin İKT səriştəliliyinin formalaşdırılması – şübhəsiz ki, ali peşə təhsili sisteminin tədris-tərbiyə prosesinin informasiyalaşmasının mühüm şərtidir.

Müasir reallıqlar tələbələrin sürətlə inkişaf edən rəqəmsal texnologiyalara uyğun İKT səriştəliyinin formalaşdırılmasına yeni yanaşmaları tələb edir. Yuxarıda şərh olunanları ümumiləşdirərək, qeyd etmək istərdik ki, universitetlərdə tələbələrin İKT səriştəliliyinin formalaşdırılması prosesi aşağıdakıları nəzərdə tutur:

1) təkcə baza İKT bacarıqları deyil, həm də peşəyönlü tətbiqi proqramlar paketi haqqında biliklərin, bacarıqların və onlarla iş vərdişlərinin əldə olunması;

2) inkişaf edən informasiya cəmiyyətinin əmək bazarında mütəxəssisə verilən tələblər nəzərə alınmaqla dərslərə hazırlıq və dərslərin keçirilməsi zamanı İKT-dən istifadə;

3) nəticələrin proqnozlaşdırılması – müvafiq hazırlıq səviyyəsi olan, informasiya cəmiyyətinin tələblərinə cavab verən yüksək ixtisaslı mütəxəssisin hazırlanması.

Aparılan təhlil cəmiyyətin informasiyalaşması tempi ilə ali peşə təhsilinin mövcud informasiyalaşma praktikası; tələbələrin İKT səriştəliliyinin formalaşdırılması zərurəti ilə ali peşə təhsili sahəsində müvafiq sistemin yoxluğu arasındakı ziddiyyətləri üzə çıxarmağa imkan vermişdir.

Təlim-tərbiyə prosesində İKT-nin tətbiqi ilə müasir müəllim özünün peşəkar və yaradıcı inkişafı üçün güclü stimul alır. Müəllimlər informasiya texnologiyalarını bilməklə, informasiya cəmiyyəti şəraitində işləyəcək mütəxəssislərin hazırlanması prosesində ondan səmərəli istifadə etməli, təhsilin keyfiyyətini, mütəxəssislərin hazırlıq səviyyəsini yüksəltməli, eyni zamanda öz peşə ustalığını artırmalıdır.

Hal hazırda ali peşə təhsili sisteminin mühüm vəzifəsi tələbələrin sürətlə inkişaf edən rəqəmsal texnologiyalara uyğun İKT əriştəliliyinin formalaşdırılmasıdır.

**Problemin aktuallığı.** Məqalədə gələcək müəllimlərin peşə səriştəliliyinin əsas elementlərindən biri olan İKT səriştəliliyinin formalaşdırılması məsələlərinə toxunulur.

**Problemin elmi yeniliyi.** Məqalədə gələcək müəllimlərin İKT səriştəliliyinin formalaşdırılması forma və metodları şərh edilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gələcək müəllimlərin İKT səriştəliliyinin formalaşdırılması ilə məşğul olan pedaqojiyönlü ali təhsil müəssisələri üçün maraq kəsb edir.

**Ədəbiyyat:**


1. A. Həsrət. Təhsildə İKT və informasiya mədəniyyəti. – Bakı, 2016.
2. İlham Əhmədov. Təhsil mürəkkəb dinamik sistemdir. https://www.mektebgushesi.az/2019/11/18/__trashed/.
3. Гаврилюк, В.В. Функциональная неграмотность в условиях перехода к информационному обществу. / В.В. Гаврилюк, Г.Г. Сорокин, Ш.Ф. Фарахутдинов. – Тюмень: Тюменский государственный нефтегазовый университет, 2009. – 244 с.
4. Елизаров А.А. Базовая ИКТ компетенция как основа интернет-образования учителя // RELARN. 2004. URL: http://www.relarn.ru/conf/conf2004/section3/3_11.html
5. Зимняя И.А. Ключевые компетентности как результативно-целевая основа компетентностного подхода в образовании. – М.: Исследовательский центр проблем качества подготовки специалистов, 2006. – 40 с.
6. Зимняя И.А. Компетенция и компетентность в образовании // Эйдос. 2014. № 4. – С. 18-28.
7. Каракозов С.Д., Уваров А.Ю. Успешная информатизация = трансформация учебного процесса в цифровой образовательной среде // Проблемы современного образования. 2016. № 2. – С. 7-19.


**E-mail:** rahimova.lala@yandex.ru

**Rəyçilər:** *ped.ü.fəls.dok., dos*. **İ.B. Əhmədov,**
*fiz.riy.ü.fəls.dok., dos*. **Ə.Ə. Aslanov**
**Redaksiyaya daxil olub:** 25.04.2023

# *TƏHSİLDƏ MONİTORİNQ VƏ QİYMƏTLƏNDİRMƏ*
# *МОНИТОРИНГ И ОЦЕНИВАНИЕ В ОБРАЗОВАНИИ*
# *MONITORING AND EVALUATION IN EDUCATION*

*UOT 37*

***İlhamə Məmməd qızı Əsədova***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*böyük elmi işçisi*
*https://orcid.org/0000-0003-1570-0192*

## MONİTORİNQ VƏ QİYMƏTLƏNDİRMƏ TƏHSİLİN KEYFİYYƏTİNİN STATİSTİK GÖSTƏRİCİSİ KİMİ

***Ильхама Мамед гызы Асадова,***
*старший научный сотрудник*
*Института Образования Азербайджанской Республики*

## МОНИТОРИНГ И ОЦЕНИВАНИЕ КАК СТАТИСТИЧЕСКИЙ ПОКАЗАТЕЛЬ КАЧЕСТВА ОБРАЗОВАНИЯ

***Ilhama Mammad Asadova***
*senior researcher at the*
*Institute of Education of the Republic of Azerbaijan*

## MONITORING AND EVALUATION AS A STATISTICAL INDICATOR OF THE QUALITY OF EDUCATION

**Xülasə.** Məqalədə təhsil müəssisələrində keyfiyyətin monitorinqi və qiymətləndirmə sistemlərinin məqsəd və mahiyyəti açıqlanır, onların müqayisəli təhlili verilir. Qiymətləndirmə və monitorinqlərin təşkili mərhələləri və şərtləri göstərilir. Qabaqcıl dünya ölkələrində tətbiq olunan müxtəlif qiymətləndirmə sistemləri haqqında yığcam məlumat verilir. Monitorinq və qiymətləndirmə eyni məqsədlərə xidmət edən və biri digərini şərtləndirən inteqrativ proseslər kimi təqdim olunur.
***Açar sözlər:*** *monitorinq, şagird nailiyyəti, qiymətləndirmə sistemi, qiymətləndirmə şkalası, keyfiyyət göstəriciləri*

**Резюме.** В статье разъясняются назначение и сущность механизмов контроля и оценивания качества в образовательных учреждениях, дается их сравнительный анализ. Указаны этапы и условия организации оценивания и мониторинга. Дана краткая информация о системе оценивания и различных механизмах шкалы, применяемых в странах мира. Обсуждается исторический путь процесса оценивания достижений учащихся.
***Ключевые слова:*** *мониторинг, достижения учащихся, система оценивания, шкала оценивания, показатели качества*

**Summary.** The purpose and essence of quality monitoring and evaluation mechanisms in educational institutions are explained in the article, and their comparative analysis is given. The stages and conditions of organization of assessment and monitoring are indicated. Brief information is given about the evaluation system and different scale mechanisms applied in the countries of the world. The historical path of student achievement assessment process is discussed.
***Key words:*** *monitoring, student achievement, assessment mechanism, assessment scale, quality indicators*

Təhsil sahəsində aparılan islahatların, görülən tədbirlərin, tətbiq olunan layihələrin məqsədi təhsil keyfiyyətinin yüksəldilməsinə nail olmaqdır. Təhsilin keyfiyyətinin yüksəldilməsi üçün, ilk növbədə, nailiyyətlərin müəyyən edilməsi, geriliyin aşkarlanması və vaxtında aradan qaldırılması, həmçinin baş verə biləcək uğursuzluğun və uyğunsuzluqların qarşısının alınması üçün qabaqlayıcı tədbirlərin görülməsi məqsədli tədbirlərin həyata keçirilməsidir. Bu məqsədlə təhsilin keyfiyyətinin monitorinq və qiymətləndirmə prosesləri tətbiq olunur. Fərqli ölkələrdə fərqli sistemlərlə tətbiq olunan monitorinq və qiymətləndirmə sistemləri eyni məqsədlərə xidmət edir və biri digərini şərtləndirən inteqrativ proseslərdir.

***Monitorinq.*** "Monitorinq müəyyən prosesin dinamikasını öyrənmək, real və uyğun vəziyyətin uyğunluğunu müəyyənləşdirmək məqsədi ilə daim müşahidə aparmaq və ya insan fəaliyyəti ilə əlaqədar ətraf mühitdəki dəyişikliklərin müşahidəsi, qiymətləndirilməsi və proqnozlaşdırılması sistemidir" (İ. Cavadov, 2008) Təhsil sahəsində monitorinq – tədris prosesinin və onun nəticələrinin standartlaşdırılmış müşahidəsidir. Bu müşahidə tədris prosesinin nəticələrini müəyyən etməyə və proqnozlaşdırmağa, həmçinin mövcud vəziyyəti qiymətləndirməyə imkan verir. Çoxsaylı funksiyaları yerinə yetirən monitorinq mövcud vəziyyətin dəyişməsi dinamikasının izlənməsinin təmin edilıməsi, alınan nəticəyə əsaslanan informasiyaların toplanması, təhlil edilməsi proseslərini təmin edən, təhsilin keyfiyyətinin ən əhəmiyyətli xüsusiyyətlərini özündə cəmləyən, informasiyaların davamlı olaraq toplanması, təhlili və şərhi mexanizmidir. Təhsil proseslərinin və nəticələrinin normativ tələblərə uyğunluğu, baş verən dəyişikliklər və proqnozlaşdırılan tendensiyalar haqqında məlumat verir. Pedaqoji monitorinq mexanizminin yaradılmasında aparıcı məqsəd təhsilin keyfiyyətinin yüksəldilməsidir. Monitorinqin digər aparıcı funksiyaları informasiya toplamaq, diaqnostika, müqayisəli proqnozdur.

Təhsil sahəsində aparılan monitorinqlərin iştirakçıları təhsilalanlar, təhsilverənlər, təhsili idarə edənlər, valideynlər və ya onları əvəz edən qəyyumlardan ibarət olur. Monitorinq göstəricilərinin məcmusu həmişə hökumət və təhsil orqanları tərəfindən hazırlanmış tendensiyalarına uyğundur və iştirakçılara görə dəyişir. Monitorinq nəticəsində əldə olunan məlumatların toplanması, statistik göstəriciləri təkcə təhsil sahəsi üçün vacib deyil, həm də siyasi məna daşıyır. Təhsil sisteminin vəziyyətini təsvir edən statistik məlumatlar təhsil islahatlarına ehtiyacı nümayiş etdirmək, dövlətdə həyata keçirilən islahatların faydalarını göstərmək üçün istifadə edilə bilər. Təhsil mühiti dinamik və dəyişkən xarakterli olmaqla hər dövrün tələbinə və ölkənin şəraitinə uyğun təşkil olunur. Bu baxımdan təhsil sisteminin qiymətləndirilməsi yalnız ölkə miqyaslı sosial-iqtisadı tələblərə cavab verən sistemlərin deyil, həm də qlobal dünyanın rəqabətinə cavab verən sistemlərə uyğun təşkil olunmalıdır. Əks halda, məktəbin yetirmələri beynəlxalq əmək və təhsil bazarına uyğun olan məzun ola bilməzlər.

***Qiymətləndirmə.*** Qiymətləndirmə proqnozlaşdırmaya təsir edən, təlim prosesinin dəyərləndirilməsi, mövcud vəziyyətin təhlili və tədris prosesinin nəticələrini müəyyən etməyə imkan verən, təhsilin keyfiyyətinə və qiymətləndirilən obyektə (insana, hədəfə) təsir edən sistemli prosesdir. Qiymətləndirmə də monitorinq kimi, mövcud vəziyyəti aşkarlayan göstərici olub, statistik xarakter daşıyır. Təhsildə monitorinq və qiymətləndirmə mexanizmi paralel proses olub, biri digərini tənzimləyir. Qiymətləndirmənin strukturu tədris fənlərinin məzmun standartları, həmin məzmunun mənimsənilməsini təmin edən təlim strategiyaları və qoyulan məqsədlə əldə olunan nəticənin göstəricisi olan qiymətləndirmə standartlarından ibarətdir. Təhsildə qiymətləndirmə, əsasən, məktəbdaxili, ölkəmiqyaslı və beynəlxalq olmaqla üç səviyyədə tətbiq olunur.

Məktəbdaxili monitorinq və qiymətləndirmə məktəbin şagird nailiyyətlərini müəyyənləşdirmək, nəzarətdə saxlamaq, təlim-tərbiyə işlərinin məzmun, forma, vasitə və metodlarını təkmilləşdirmək yolu ilə təhsilin keyfiyyətini əsaslı surətdə yaxşılaşdırmağa, həm müəllimlərin, həm də şagirdlərin yaradıcılığını artırmağa və təhsilin keyfiyyətinin bütünlüklə müasir dövrün tələbləri səviyyəsinə yüksəldilməsinə xidmət edir. Şagird nailiyyətlərinə nəzarət, monitorinq və qiymətləndirmənin aparılmasının təşkili zamanı hər bir ölkənin təhsil sistemində qüvvədə olan mövcud sənədə əsaslanır. Həmin sənəddə monitorinq və qiymətləndirmə sisteminin vəzi-

fələri, əsas xüsusiyyətləri, əsas qiymətləndirmə növləri, qiymətləndirmə standartları və vasitələri və s. məsələlər əks olunur.

Beynəlxalq təcrübə göstərir ki, bir çox dövlətlərdə təhsilin idarə olunmasında, əsasən, monitorinq və qiymətləndirmə prosesində sosial mədəni vəziyyət müvafiq inkişaf səviyyəsində formalaşdırır, monitorinq və qiymətləndirmə daha münasib, modern formada həyata keçirilir. Məktəbdaxili nəzarət, idarəetmə, təşkiletmə məsələləri sürətli inkişafın tələblərinə cavab verməlidir. Bu mənada nəzarətin elektron variantı aktuallığı ilə diqqət mərkəzindədir. Qiymətləndirmə və monitorinq üçün tərtib olunan suallar şagirdlərə elektron variantda təqdim oluna bilər. Həmçinin şagirdlərə verilən tapşırıqların icrasını elektron variantda təqdim etmək imkanları yaradıla bilər. Başqa tərəfdən, onların qiymət cədvəllərinin izlənilməsinin elektron qaydada təşkili də təqdirəlayiq haldır.

Tədqiqat əsərlərinə əsaslanaraq belə bir qənaətə gəlmək olar ki, qədim dövrlərdə təlim çalışmalarında zəif nəticə göstərən və ya xoşagəlməz davranışa görə təhsilalanlar üçün fiziki cəza tədbirləri tətbiq edilir, müvəffəqiyyət qazananlar şifahi tərifləniIirdi. Xüsusən, qədim Yunanıstanda cismani cəza ilə uşaq tərbiyə etmək ənənə halını almışdı. XVI-XVII əsrlərdə humanist meylli addımlar atıldı. Uşaqların biliyi mənimsəmə bacarıqlarına görə fiziki cəza sözlə ifadə olunan qiymətləndirmə ilə əvəz olundu: "ən yaxşı", "orta" və "ən pis" olmaqla ən sərt rejimi olan yezuit məktəblərində də biliyin ballarla qiymətləndirilməsi qaydaları tətbiq olunmağa başlandı (M. Богуславский, 2003).

Tədqiqatlar göstərir ki, təhsilalanların nailiyyətinin qiymətləndirmə formaları hazırda rəqəmsal, sözlə, hərflərlə, rəqəm və söz birlikdə (məsələn, smayklarla ifadə olunmuşdur). Smayklarla qiymətləndirmə rəsmi dövlət sənədlərinə qeyd olunmayıb, şagirdlərin təlimə marağını artırmaq məqsədi ilə ibtidai sinif şagirdlərinin tapşırıq dəftərlərində və şagirdlərə smayklar paylanması hallarına çox rast gəlinir. Məsələn, Rusiya Federasiyasında 1837-ci ildən başlayaraq "5" ballıq qiymət şkalası tətbiq edilmişdir (M. Mərdanov, 2009). Bu gün də beş ballıq qiymətləndirmə sistemi saxlanılmış, hazırda qüvvədə olan təhsil sənədləri əsasında aparılır. Qazaxıstan, Qırğızıstan, Rusiya və Estoniyada təhsil haqqında normativ – hüquqi sənədlərdə 5 bal şkalasının tətbiq olunması göstərilir, lakin vaxtaşırı keçirilən elmi-pedaqoji, elmi-praktik konfranslarda, o cümlədən pedaqoji mətbuatda, ədəbiyyatlarda 12 və 10 ballıq qiymətləndirmə çağırışlar səsləndirildiyi müşahidə olunur. Hətta Rusiyanın bir sıra regionlarında 10 bal sistemi tətbiq edən məktəblər haqqında məlumatlara rast gəlinir. Şagird nailiyyətinin qiymətləndirilməsi Qazaxıstan, Macarıstan, Rusiya, Estoniya, Türkiyə 5, Moldova, Belarusiya, Ukrayna, Gürcüstan, Albaniya, Rumıniya, İslandiya, Latviya, Litva, Finlandiya 10, Bolqarıstan, Almaniya, Norveç, İsveç, 6, Danimarka 13, Fransa 20, İsrail, Avstriya 100 bal şkalalarla aparılır. Almaniya Federasiyasında şagird biliyinin qiymətləndirilməsi 6 ballıq sistemlə aparılır və digər ölkələrin tam əksi istiqamətində ifadə olunur ("1" ən yüksək bal hesab olunur). Qabaqcıl ölkələrdə tətbiq olunan qiymətləndirmə sistemlərini təhlil edərkən və ümumiləşdirdikdə, bu qiymətləndirmə sistemlərinin yekun nəticələri tapşırıqların müəyyən edilmiş faiz göstəriciləri əsasında rəqəmsal, sözlə (əla, zəif) ifadə olunur. Bəzi ölkələrdə isə səviyyələrə bölünməklə (I səviyyə, II səviyyə və s.), bəzilərində isə hərflərlə (A, B) ifadə olunur. Bütün bunların müqayisəli təhlilini apararkən 5, 6, 7 bal sistemlərinin modelinə uyğun qiymətləndirmə sistemi müşahidə olunur, ancaq ən yüksək qiymət (məsələn, Fransada 20-19, Almaniyada 1, İsraildə 100 bal və s.) istedad, yaradıcı fəaliyyət nümayiş etdirən, standartlardan daha yuxarı nəticə göstərən şagirdlərə verilir. Bu həm də ali məktəblərin Bolonya sisteminə uyğundur və nəticə faizinin hərflərlə ifadə olunmasında oxşarlıq vardır. Məsələn, Fransada qiymətləndirilmə 20 ballıq şkala ilə tətbiq olunsa da, sözlə ifadə edilərkən şagird nailiyyətləri 6 səviyyə ( parlaq, əla, çox yaxşı, yaxşı, qənaətbəxş, qeyri-qənaətbəxş və s. kimi) üzrə qruplaşdırılır. Bu da 6 ballıq qiymət şkalası tətbiq edən ölkələrin qiymətləndirmə sisteminə uyğundur. 7 baldan aşağı nəticə qeyri-qənaətbəxş hesab olunur. Yaxud 100 ballıq qiymətləndirmə sisteminin 7 bal şkalasına uyğunluğunu müşahidə etmək olur. Məsələn, 100 bal sistemi ilə: 95-100 bal arası əla, 85-94 çox yaxşı, 75-84 yaxşı, 65-74 demək olar ki, yaxşı, 55-64 qənaətbəxş, 41-54 demək olar ki, qənaətbəxş, 40 baldan aşağı zəif, yaxud uğursuz kimi ifadə olunur.

O zaman nə üçün çoxballıq qiymətləndirmə tərəfdarları çoxdur? Ona görə ki, çoxballıq qiymətləndirmə şagirdin izlənməsinə imkan verir, məsələn, 40 bal və ondan aşağı nəticə göstərən təhsilalanın 20 dən 40 -a doğru irəlilədiyini görmək olur.

**Problemin aktuallığı.** Qloballaşan dünyanın təhsil və əmək bazarında rəqabətə davamlı vətəndaş yetişdirmək, digər tərəfdən dövlətin, millətin inkişafının sürətlənməsinə təkan vermək məqsədi qabaqcıl ölkələrin təhsil sahəsində olan təcrübələrinin öyrənilməsini aktuallaşdırır.

**Problemin elmi yeniliyi.** Beynəlxalq təhsil şirkətlərinin apardıqları uşaqların bilik və bacarıqlarının qiymətləndirilməsi prosesinə ölkə məktəblilərinin də cəlb olunması, xarici ölkələrdə təhsil alan gənclərin sayının artması qiymətləndirmə sistemini qabaqcıl ölkələrin təhsil sisteminə uyğunlaşdırılması məqsədini ortaya qoyur.

**Problemin praktik əhəmiyyəti**. Təhsilin keyfiyyətinin yüksəldilməsi üçün təhsilin keyfiyyətin monitorinq və qiymətləndirmə proseslərini beynəlxalq sınanılmış və qabaqcıl ölkələrin qiymətləndirmə sistemi nə uyğun tətbiq olunması məqsədəuyğundur.

**Ədəbiyyat:**


1. Bəylərov, E. Şagird nailiyyətinin qiymətləndirilmsindı yeni yanaşmalara dair // – Bakı: Kurikulum, 2011. № 2, – s. 50-59.
2. Cavadov, İ.A. Təhsildə monitorinq sisteminə dair // – Bakı: Kurikulum, 2008, № 3, – s. 17-20.
3. Mərdanov, M., Ağamalıyev R., Qardaşovla T. Təhsil sistemində monitorinq və qiymətləndirmə. – Bakı: Çaşıoglu, 2003, – 410 s.
4. Mərdanov M. Qiymətləndirmə. https://edu.gov.az/upload/file/M-Merdanov-Qiymetlendirme.pdf
5. Богуслав, М.Б. Очерки истории отечественного образования XIX-XX веков. М.: Изд-во Московского Культурологического лицея, 2002. – 96 с.
6. Казакова, И.А. Система оценивания знаний в историческом аспекте // Страницы истории. Высшее образование в России, 2011, № 6, – с. 153-159.
7. Система оценивания знаний. https://ru.wikipedia.org/wiki
8. Пискунова, – История педагогики и образования. От зарождения воспитания в первобытном обществе до конца XX в.: Учебное пособие для педагогических учебных заведений. / Под ред. АМ., 2001, – 512 с.
9. Wolfgang Bцttcher/Jan Hense. Schule und evaluation. DDS – Die Deutsche Schule, Jahrgang 2016, Heft 2, – S. 117-135, © 2016 Waxmann.


**E-mail:** i.esedova@arti.edu.az

**Rəyçilər:** *ped.elm.dok.* **İ.H. Cəbrayılov,**
*ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva**
**Redaksiyaya daxil olub:** 14.04.2023

# *FİZİKİ TƏRBİYƏNİN, İDMAN TƏLİMİNİN NƏZƏRİYYƏSİ VƏ METODİKASI*
# *ТЕОРИЯ И МЕТОДИКА ФИЗИЧЕСКОГО ВОСПИТАНИЯ, СПОРТИВНОЙ ПОДГОТОВКИ*
# *THEORY AND METHODOLOGY OF PHYSICAL EDUCATION, SPORTS TRAINING*

*UOT 372.861.3*

***Həsən Arif oğlu İbrahimli***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası*
*https://orcid.org/0009-0004-6867-1131*

## TƏLİMƏ MƏSULİYYƏTLİ MÜNASİBƏT TƏRBİYƏSİNİN MAHİYYƏTİ

***Гасан Ариф оглы Ибрагимли***
*докторант по программе доктора философии*
*Азербайджанская Государственная Академия Физического Воспитания и Спорта*

## СУТЬ ВОСПИТАНИЯ ОТВЕТСТВЕННОГО ОТНОШЕНИЯ К ОБУЧЕНИЮ

***Hasan Arif Ibrahimli***
*doctorial student in the program of doctor of philosophy*
*Azerbaijan State Academy of Physical Education and Sports*

## THE ESSENCE OF UPBRİNGİNG OF A RESPONSIBLE ATTITUDE TO LEARNING

**Xülasə.** Təlimin səmərəliliyinə nail olmaq üçün, ilk növbədə, şagirdlərdə təlimə maraq oyadılmalıdır. İkincisi, eyni zamanda, təlimə məsuliyyətli münasibət formalaşdırmaq lazımdır. Məsuliyyət hissinə malik olan şəxs təlimdə uğurlar qazanır. Məqalədə şagirdlərdə təlimə məsuliyyətli münasibətin formalaşdırılması barədə danışılır. “Münasibət”, “məsuliyyət»” və “təlimə məsuliyyətli münasibət” anlayışlarına tərif verilir.
***Açar sözlər:*** *təlim, münasibət, məsuliyyət, təlimə məsuliyyətli münasibət, şagirdlər*

**Резюме.** Для достижения эффективности обучения, в первую очередь, ученики должны быть заинтересованы в обучении. Во-вторых, при этом необходимо формировать ответственное отношение к обучению. Преуспевает в обучении лишь человек, обладающий чувством ответственности. В статье говорится о формировании у учащихся ответственного отношения к учебе. Определены понятия «отношение», «ответственность» и «ответственное отношение к обучению».
***Ключевые слова:*** *обучение, отношение, ответственность, ответственное отношение к обучению, учащиеся*

**Summary.** To achieve effective learning, first of all, students must be interested in learning. Secondly, it is necessary to form a responsible attitude to learning. A person who has a sense of responsibility succeeds in learning. The article talks about the formation of students' responsible attitude to learning. The concepts of "attitude", "responsibility" and "responsible attitude to learning" are defined.
***Key words:*** *learning, attitude, responsibility, responsible attitude to learning, students*

"Münasibət", "məsuliyyət" və "təlimə məsuliyyətli münasibət" nədir və bu mürəkkəb anlayışlar necə formalaşır? Bu kimi suallara cavab vermək üçün əvvəlcə öyrənmə (təlim) prosesinin fəal idrak prosesi olduğunu aydınlaşdırmaq vacibdir. Təlim prosesi də elə belə asanlıqla rəvan şəkildə getmir. Öyrənmə prosesində tələbələr biliklərə yiyələnir, onlarda bacarıq və vərdişlər formalaşır. Burada tələbənin fəallığı, müstəqilliyi, çalışqanlığı və şüurluluğu zəruridir. Bu prosesin əsasını isə idrak prosesi təşkil edir. İdrak prosesi isə insan beyninin real gerçəkliyi inikas etdirmə qabiliyyətidir. Başqa sözlə, təlim prosesi idrak prosesinin qanunauyğunluqlarına və qanunlarına istinad edir, müəllim və tələbənin qarşılıqlı fəaliyyətinin məqsədyönlü fəaliyyəti kimi özünü göstərir ki, bu zaman təhsil, tərbiyə və inkişaf həyata keçir.

İnsan yarandığı gündən yaşamaq uğrunda mübarizədə digər canlılardan fərqli olaraq, yalnız ətraf mühitə uyğunlaşmaqla kifayətlənməyib, həm də ətraf aləmi anlamağa, təbiətdə baş verən hadisələrin mahiyyətini bilməyə, təbiəti özünə ram etməyə çalışmışdır. Xarici aləmi, onun intəhasız hadisələrinin başvermə səbəb və nəticələrini öyrənməyə can atan insan min illər ərzində təbiətin kortəbii qüvvələrinə qarşı mübarizə aparmış və həyat şəraitini yaxşılaşdırmağa səy göstərmişdir. Başqa sözlə, təbiətin dərk edilməsi insanın ən mühüm həyati tələbatı, mövcud olub yaşamaq və nəsil artırmaq vasitəsinə çevrilmişdir. İnsanın təbiəti, daha sonralar isə ictimai prosesləri dərk etməsi üzvi şəkildə onun praktik əmək fəaliyyəti ilə birləşmiş, nəticədə ictimai təcrübə idrak prosesinin ən mühüm stimulu və meyarı olmuşdur. Bu praktika prosesində insanlar müşahidələrini ümumiləşdirməklə yanaşı, həm onları dərinləşdirmiş və təkmilləşdirmiş, eyni zamanda, formalaşmış təcrübəni mühafizə edib saxlamışlar. Onlar yalnız baş verən hadisələr haqqında öz təsəvvürlərini zənginləşdirməklə kifayətlənməmiş, tədricən hadisələrin mahiyyətinə, səbəblərinə və nəticələrinə də bələd olmuşlar. Beləliklə, nəzəri biliklər yaranmış və elm formalaşmışdır.

Çox uzun bir keşməkeşli yol keçən insanlar idrak prosesinin komponentlərini (canlı müşahidə, mücərrəd təfəkkür, eksperiment-təcrübə) müəyyənləşdirmişlər. Alman filosofu Hegelin qənaətlərinə əsasən, elmdə idrak prosesinin fəlsəfi mahiyyəti aşağıdakı şəkildə ifadə olunmuşdur: canlı seyrdən mücərrəd təfəkkürə, oradan da praktikaya, həqiqəti, obyektiv gerçəkliyi dərk etməyin dialektik yolu belədir.

Deməli, öyrənmə prosesində idrak nəzəriyyəsi böyük əhəmiyyət daşıyır. Öyrənmə prosesində də duyğular, qavrayış, təsəvvür, təfəkkür və praktika mühüm rol oynayır.

Akad. M.M. Mehdizadə "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" adlı monoqrafiyasında yazırdı: "…mənimsəmə prosesi həm canlı müşahidədən, … həm də geniş ölçüdə müəllimin canlı sözündən başlanır, həm empirik materialın öyrənilməsindən, empirik təfəkkürdən, həm də rasional təfəkkürə istinad etməklə başlanır. Unuda bilmərik ki, bu rasional təfəkkürə istinadən alınan biliklərin də kökü canlı müşahidədədir" [ 1, s. 50] .

Ümumtəhsil məktəbi şagirdləri öyrənmə (təlim) prosesində bəşəriyyətə məlum olan bilikləri özləri üçün "kəşf" edirlər. Öyrənmə prosesi idrakın xüsusi tərkib hissəsidir və müəllimin rəhbərliyi altında həyata keçirilir. Məktəblilərin tələbatları, həyata baxışları, düşüncələri, sualları, xoşbəxtlik, xoş güzəran barədə təsəvvürləri, həyat haqqındakı mühakimələri, təlimə məsuliyyətli münasibəti və s. öyrənmə prosesində səmərəli şəkildə formalaşır.

A.Ü. Məmmədov öyrənmənin mahiyyətindən danışarkən aşağıdakı məsələləri diqqət mərkəzinə gətirir: "İnsanların öyrənmə prosesində fiziki ( bədənin müxtəlif hərəkətləri və vəziyyətləri) və psixi (təfəkkür, hafizə və s.) amillər mühüm rol oynayır. Öyrənmə insanın xarici (fiziki) və daxili (psixi) aləmində baş verən məqsədəuyğun dəyişməsinin nəticəsidir. Lakin insanın (bizim tədqiqatda şagirdin – H.İ.) hər cür hərəkəti öyrənmə ilə nəticələnir… Yorğunluq, aclıq, ağrı, susuzluq bəzi təsadüfi hərəkətlərdə öyrənmənin nəticəsi hesab edilə bilməz. Öyrənmə səciyyəsi daşıması üçün məqsədəuyğun fəaliyyətin orqanizmin anadangəlmə xüsusiyyətləri ilə deyil, həyatda qazanılmış xüsusiyyətləri ilə, gələcək fəaliyyəti ilə əlaqədar olması zəruridir" [2, s.40-41].

Öyrənmə prosesi təlimə məsuliyyətli münasibətlə sıx surətdə bağlıdır. Məhz belə məsuliyyətli münasibət olduqda öyrənmə müvəffəqiyyətlə nəticələnir.

Professor Ə.Ə. Ağayev öyrənmə və öyrənməyə münasibətini bildirərkən göstərirdi: "Təlim – öyrənmə və öyrətmə bilik, bacarıq və vərdişlərə yiyələnmə və yiyələndirmədən ibarət min illər boyu mövcud olan tarixi-dialektik prosesdir" [3, s.50].

Məsuliyyət, münasibət və s. kimi anlayışlar, həm də təlim prosesində təşəkkül tapır. Deməli, bilik, bacarıq və vərdişlərə yiyələnməkdə təlim prosesinin rolu böyükdür.

Şagirdlərin hər biri öz hərəkət və davranışına, tapşırılan işə müvafiq münasibət bildirir, onu müəyyən baxımdan qiymətləndirir. Tapşırılan işi məsuliyyətlə yerinə yetirmişsə, bundan xoşlanır, razı qalır. Şagirdin mənəvi zənginliyi onun həqiqi münasibətlərinin xarakterindən xeyli dərəcədə asılıdır.

Məsuliyyət anlayışının mahiyyətini iki əsas əlamətlə aydınlaşdırmaq olar: birinci, məktəbli nəyə məsul olur? Buraya şagirdin öz üzərinə götürdüyü təlim işi, hərəkət və davranışı üçün məsuliyyət daşıması daxildir. Tapşırılan iş üçün məsuliyyət hissi məktəblinin nə etdiyini, nə üçün başqa şəkildə deyil, məhz belə etdiyinin mənasını yaxşı başa düşməlidir. İkincisi, məsuliyyət tələbənin valideyni, müəllimləri, xalqı və Vətəni qarşısında öz işinə görə cavabdeh olması tələbatını yaradır.

Həmişə olduğu kimi, hazırda da cəmiyyətin hər bir şəxsdən, o cümlədən şagirdlərdən məsuliyyət tələb olunur. Müasir mərhələdə dövlətimiz həyatımızın bütün sahələrində islahatların aparılması, dünyanın qabaqcıl ölkələrinin səviyyəsinə yüksəlmək kimi mühüm vəzifələr irəli sürmüşdür. Bu vəzifələrin öhdəsindən yalnız yerinə yetirməli olduğumuz işə məsuliyyətlə yanaşmaqla gəlmək mümkündür. Cəmiyyətimizdə, yaşından asılı olmayaraq, hər bir şəxsdə məsuliyyət hissi tərbiyə olunmalı və hər bir insan da özünə bu keyfiyyəti aşılamalıdır. Hazırda hər bir Azərbaycan vətəndaşının fəaliyyəti sosial əhəmiyyətli olur. Əksinə, bu və ya digər şəxsin ölkəmizdə gedən dinc quruculuq işlərindən, yenidənqurma, təkmilləşdirmə proseslərindən kənarda qalması, bu istiqamətdə fəal və şüurlu iştirak etməməsi cəmiyyət üçün iqtisadi və sosial itkidir. Odur ki, inkişafımızın başlıca vəzifələrindən biri cəmiyyət qarşısında öz məsuliyyətini anlayan fəal şəxsiyyətlər formalaşdırmaqdan ibarətdir. Bizim hər birimizdə sosial məsuliyyət şüurunun və hisslərinin tərbiyəsi günün aktual problemi olmalıdır.

Şəxsiyyət və cəmiyyət arasında əlaqə yaradan həlqə rolunu kollektiv oynayır. Deməli, kollektiv şəxsə görə məsuliyyət daşımalıdır. Eyni zamanda, şəxsiyyət (tələbə) kollektiv qarşısında məsuliyyətini dərk etməlidir.

"Məsuliyyət" sözü dilimizdə, mövcud pedaqoji, psixoloji, elmi-kütləvi, etik və hüquqi, iqtisadi, tarixi, politoloji və s. ədəbiyyatda ən işlək anlayışlardandır. "Məsuliyyət" termini son dərəcə müxtəlif mənalarda işlənir. "Gələcək qarşısında məsuliyyət", "Mənəvi (əxlaqi) məsuliyyət", "valideynin məsuliyyəti", "ailənin məsuliyyəti", "Şagirdin (tələbənin, uşağın) məsuliyyəti", "təbiət məsuliyyətli münasibət tələb edir" və s kimi ifadələrə tez-tez rast gəlirik.

Bu anlayış heç də yalnız çox müxtəlif mənalılığı ilə deyil, həm də müstəsna dərəcədə aktual olduğu üçün diqqəti cəlb edir.

Belə bir təbii sual meydana çıxır: məsuliyyət anlayışı nə üçün bu qədər diqqət mərkəzindədir?

Professor A.N. Abbasov yazır: "Məsuliyyət bir tərəfdən əxlaqi anlayış, digər tərəfdən həm etik, həm də hüquqi kateqoriyadır… Məsuliyyət insanın cəmiyyətə mənəvi borcunu və hüquqi normaların həyata keçirilməsi ilə səciyyələnən, xüsusi sosial və əxlaqi-hüquqi münasibətlərini əks etdirir. Əgər insanın ictimai borcu mənəvi tələbləri dərk etmək, konkret hadisəyə tətbiq etmək və bu tələbləri praktik şəkildə həyata keçirməkdən ibarətdirsə, bu vəzifənin hansı halda yerinə yetiriləcəyinə və onun yerinə yetirilməsində insanın hansı dərəcədə günahkar olmasına aid məsələ artıq şəxsi məsuliyyət haqqında məsələdir" [4, s.124]

"Azərbaycan dilinin izahlı lüğəti"ndə "məsuliyyət" sözünə "məsuliyyət – məsul olma, cavabdehlik" [5, c. 3, s. 353], "məsuliyyət daşımaq" ifadəsinə "cavabdeh olmaq // öz hərəkətindən, işindən doğa biləcək hər hansı bir pis nəticəni nəzərə alıb ona cavabdeh olmaq, məsul olma" [5, c.3, s.354] kimi aydınlıq gətirilir. "…. Lüğət"də, eyni zamanda, "məsuliyyətsiz" və "məsuliyyətsizlik" sözlərinin mahiyyəti də açılır. Diqqət edək: "məsuliyyətsiz – məsuliyyət hiss etməyən, öz hərəkətlərinə fikir verməyən, cavabdehlik bilməyən" [5, c.3, s.354]; "məsuliyyətsizlik – məsuliyyətin olmadığı hal" [5, c.3, s.354].

Münasibət nədir? Münasibət ümumi şəkildə obyektlərin və onların xassələrinin qarşılıqlı vəziyyətlərini göstərir.

Münasibət ümumi və xüsusi olub insanların bir-birinə olan yanaşmalarını, ünsiyyətin necəliyini əks etdirir. Fəlsəfi kateqoriya kimi münasibətlər şəxsiyyətin ətraf mühitlə əlaqəsinin dialektikasını ifadə edir (subyektin obyektə münasibəti). Etikanın kateqoriyası kimi münasibətlər adamlar arasında əxlaqi əlaqələr halında xeyir, şər, ədalətlilik mövqeyindən əxlaqi qiymətlər halında özünü göstərir. Psixoloji kateqoriya kimi münasibətlər şəxsiyyətin ən ümumi mövqeyi kimi izah olunur. "Azərbaycan dilinin izahlı lüğəti"ndə "münasibət" anlayışının mahiyyəti aydınlaşdırılır. Oxuyuruq: "Münasibət – əlaqə, yaxınlıq, rabitə, münasibət – iki şey arasındakı nisbət, uyğunluq, müvafiqlik" [5, c.3, s.422].

Şagirdlərdə təlimə məsuliyyətli münasibət yaratmaq üçün, ilk növbədə, bu problemin mahiyyətini, məzmununu və quruluşunu bilmək lazımdır. Apardığımız tədqiqatdan, müşahidə və sorğulardan görünür ki, təlimə məsuliyyətli münasibətin tərbiyəsi üzrə işin mahiyyətini aydın təsəvvür etməmək çox vaxt bu istiqamətdə səmərəli fəaliyyət göstərməyə maneçilik törədir.

Mövcud ədəbiyyatla tanışlıqdan görünür ki, "məsuliyyət" problemi daha çox filosofların tədqiqat obyekti olmuşdur. Homerdən başlayaraq müasir filosofların əksəriyyəti də daxil olmaqla alimlər məsuliyyət anlayışına diqqət yetirmişlər. Hələ qədim Yunanıstanda, o cümlədən Platonun əsərlərində insanın hansı dərəcədə şüurlu olması və könüllü olaraq öz hərəkətlərinin yaradıcısı olması, beləliklə, onlara görə hansı dərəcədə məsuliyyət daşıması kimi mühüm məsələ əhatə olunmuşdur. Platona görə, insan azad seçim imkanına malikdir və eyni zamanda, öz hərəkətlərinə görə məsuldur.

Alimlər həm daxili, həm də zahiri məsuliyyət üzərində dayanırlar. Belə ki, A.Q. Spirkin daxili məsuliyyəti "şəxsiyyətin öz davranışına, düşüncələrinə görə məsuliyyət, yəni özünənəzarət, özünüqiytmətləndirmə, özünüidarə" [6, s.295] kimi nəzərdən keçirir.

Mənfi oxşarlıq (eyniyyət) şəraitində daxili məsuliyyət (mühafizəkar) mürtəce formada çıxış edir. (dishormoniya, təzyiq, zorakılıq) özünü göstərir. Xarici məsuliyyətlə yanaşı daxili məsuliyyət, yəni özünə yönəlmiş məsuliyyət də mövcuddur. Müsbət məsuliyyət özünü ifadə deməkdir: daimi təhsil, özünütərbiyə, özünütəkmilləşdirmə. Mənfi daxili məsuliyyət özünü dağıdıcı formada çıxış edir: simasızlaşma, məsuliyyətsizlik, xoşagəlməz (qüsurlu) hərəkətlərə meyl, narkomaniya, intihar" [7, s.16-103].

Pedaqoji ədəbiyyatda məsuliyyətin bu cəhəti şəxsiyyətin istiqaməti ilə , iradə problemi ilə bağlı işlənib hazırlanır. İradi məsuliyyətli davranışın əsasını təşkil edən istiqamət fikri əməliyyatın, təsəvvürə gətirilən vəziyyətin və əsas tələbatlara, maraqlara aid düşüncələrin yaradılması nəticəsində meydana gəlir. Bu zaman məqsəd insanın fəallığının nəticəsi olur və odur ki, iradi məsuliyyətli davranış həmişə özünüfəallıq və özünəməsuliyyət kimi çıxış edir və yaşanır. Məqsəd özü isə bu halda "fəallığa və məsuliyyətə hazır olmağın" [8, s.192] göstəricisi kimi özünü göstərir.

K. Muzdabayev məsuliyyətin təkamülünə diqqət yetirərək, nəzarətin daxili mexanizminin meydana gəlməsini bu prosesin mərkəzi qayəsi hesab edir. Şəxsiyyət öz inkişafında sadə icraçıdan fəal subyektə doğru səmt almalıdır. "Bunun nəticəsi odur ki, subyektin qarşısında hesabat verməli olduğu instansiyanı xarici səviyyədən daxili səviyyəyə keçirməkdən ibarətdir. Əvvəllər belə instansiya rolunda yalnız cəmiyyət, müxtəlif təsisatlar çıxış edirdi. Hazırda insan fəaliyyətinin fəal subyekti olub, ilk növbədə öz hərəkətinə görə özü qarşısında cavab verir" [9, s.15]. Əlbəttə, daxili məsuliyyətin formalaşdırılması sosial məsuliyyətlə sıx surətdə bağlıdır. Çünki şəxsiyyət sosial fəaliyyətdə müəyyən nəticələrə nail olaraq, öz imkanlarını səfərbərliyə alır. Əgər bu fəaliyyətin istiqaməti sosial inkişafın obyektiv tələbləri ilə üst-üstə düşürsə, təbii ki, şəxsiyyətin öz daxili imkanlarını nə qədər fəal və həqiqi şəkildə səfərbərliyə almağından asılı olaraq onun məsuliyyəti bir o qədər yüksək olur.

Fərdin məsuliyyətinin dərk edilməsi cəmiyyətin, müvafiq kollektivin, yaxud yaranmış vəziyyətin ona verdiyi xarici tələblər kimi formalaşır. Lakin onlar fərd tərəfindən qəbul edilərək onun məsuliyyətli davranışının və fəaliyyətinin motivasiyasının daxili əsasən çevrilməlidir. İnsan müxtəlif sosial rolları bu və ya digər məsuliyyət dərəcəsi ilə yerinə yetirə bilər. Belə ki, əmək fəaliyyəti prosesində o hər hansı işi görə bilər, lakin bu iş ondan öz yaradıcı imkanlarını səfərbərliyə almağı tələb etməyə bilər. İşin

nəticələri onlara rəhbərlik, kollektiv tərəfindən irəli sürülmüş tələblərə cavab verəcək, lakin insanın özü bilir ki, onun imkanlarının həyata keçirilməsi səviyyəsi aşağı idi. Bu zaman şəxsiyyət onun üçün heç də məcburi olmayan fəaliyyət nümunəsi göstərə bilər və buna görə heç kim onu mühakimə etməyəcək, lakin daxili məsuliyyət onu bu işi necə gəldi görməyə qoymur.

Daxili məsuliyyət özünütəkmülləşdirmə ilə də sıx surətdə bağlıdır.

Təlimə məsuliyyətli münasibət tərbiyəsinin mahiyyətinə aydınlıq gətirərkən psixoloq və pedaqoqların insanın psixi fəaliyyətinin xarici aləmlə şərtlənməsi müddəasına əsaslanmaq vacibdir.

Münasibət psixoloji fəaliyyətin bir ünsürü olduğu üçün elə hesab etmək olar ki, ümumiyyətlə, sanki münasibət mövcud deyildir. Münasibət yalnız obyektlə əlaqə nəticəsində yaranır. Buna görə də təlimə məsuliyyətli münasibət tərbiyəsinin mahiyyətini öyrənmə prosesi təsəvvürləri əsasında müəyyənləşdirmək mümkündür. Hər bir fəaliyyətdə olduğu kimi, öyrənmə də məqsəd və məzmunla səciyyələnir, mənəvi-iradi qüvvələrin gərginliyini tələb edir. Həmin fəaliyyətdə iştirak edən tələbələr arasındakı münasibətlərə uyğun gələn təhlil və qiymətin nəticələrini tələb edir. Təlimə münasibət bütövlükdə həmin fəaliyyətin müxtəlif istiqamətlərinə münasibətin vahid və qarşılıqlı əlaqəsində əks olunur. Lakin təlimə məsuliyyətli münasibətin mahiyyətini müəyyənləşdirməkdə bu da kifayət etmir. Çünki hər hansı münasibət insan münasibətidir. İşin əsas mahiyyəti şəxsiyyətin (tələbənin) mövqeyi, onun fəaliyyətinin istiqaməti, nəyə və necə xidmət göstərməsiylə müəyyən olunur. Odur ki, tələbənin təlimə münasibəti onun öyrənmənin ictimai və şəxsi motivlərini nə dərəcədə dərk etməsindən asılı olaraq məsuliyyətli və məsuliyyətsiz olur.

Tələbələrin təhsilə, təlimə məsuliyyətsiz münasibətini bir sıra səbəblərlə (xəstəliklə, oxumaq və öyrənmək qabiliyyətinin məhdud olması ilə, stress vəziyyətlə, ailədə normal şəraitin olmaması ilə, tələbənin öz gücünə inamsızlığı ilə, maddi çətinliklə, hər hansı bir xoşagəlməz işə uyması ilə və s.) aydınlaşdırmaq mümkündür. Bu kimi səbəblər üzündən tələbələrdə idrak fəaliyyətinə tələbat, həvəs, maraq formalaşır.

Təlimə məsuliyyətli münasibət tələbənin dünyagörüşü, mənəvi inamı, ideya istiqaməti sayəsində təşəkkül tapır. Məhz belə bir zəmində təlimə məsuliyyətli münasibət ideya istiqaməti, mənəvi məzmun kəsb edir, tələbənin öyrənmə fəaliyyətinin fəal tənzimləyicisinə çevrilir. Təlimə məsuliyyətli münasibət tərbiyəsinin başlıca funksiyaları idraki, tərbiyəvi təsirlərdir. Buna görə də təlimə məsuliyyətli münasibət tərbiyəsi üzrə işdə, ilk növbədə, tələbələrin idrak maraqlarını inkişaf etdirmək lazımdır. İdrak marağı olmadan tələbələrdə təlimə, öyrənməyə həvəs yaratmaq çətindir. İdrak marağı təlimə məsuliyyətli münasibətin psixoloji-pedaqoji mühərrikidir, idrak fəaliyyətini gücləndirən qüdrətli vasitədir. İdrak marağı müəllimə təlim prosesini cəlbedici etməyə imkan verir, tələbələri fəallaşdırmağa şərait yaradır, onları yeni-yeni biliklərə yiyələnməyə, daha faydalı işlər görməyə ruhlandırır.

**Problemin aktuallığı**. Təlimə məsuliyyətli münasibətin yaradılması həmişə aktuallıq daşıyıb. Bu mövzuda tədqiqatın aparılması özü də aktuallıq daşıyır.

**Problemin elmi yeniliyi**. Təlimə məsuliyyətli münasibətin formalaşdırılması üzrə işin mahiyyətinə aydınlıq gətirilir.

**Problemin praktik əhəmiyyəti**. Məqalə gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**


1. Mehdizadə, M.M. Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları / M.M. Mehdizadə. – Bakı: Maarif, -1982. – 384 s.
2. Məmmədov, A.Ü. Təlimin psixoloji əsasları / A.Ü. Məmmədov. – Bakı: Maarif, 1993. – 296 s.
3. Ağayev, Ə.Ə. Təlim prosesi: ənənə və müasirlik / Ə.Ə. Ağayev – Bakı: Adiloğlu, 2006. – 138 s.
4. Abbasov, A.N. Milli əxlaq və ailə etikası: orta ixtisas məktəbləri üçün dərslik / A.N. Abbasov. – Bakı: Mütərcim, 2008. – 296 s.
5. Azərbaycan dilinin izahlı lüğəti" Azərbaycan dilinin izahlı lüğəti [4 cilddə] – Bakı: Şərq-Qərb, c. 3. - 2006. – 672 s.
6. Спиркин, А.Г. Сознание и самосознание. / А.Г. Спиркин. - М.осква, -2002. – 368 с.

7. Энгельгардт, В.П. Век науки и ответственности ученого // вопросы философии, 1984, № 1. –с. 96-103.
8. Прангишвили, А.С. Исследования по психологии установки / А.С. Прангишвили. – Тбилиси, 1967. – 123 с.
9. Муздыбаев, К. Психология ответственности / К. Муздыбаев. – Л., 1983. – с. 8-23

**E-mail:** hasan.ibrahimli@sport.edu.az
**Rəyçilər:** *ped.elm.dok., prof.* **A.N. Abbasov,**
*ped..ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 25.04.2023

# *MÜƏLLİMİN KOMMUNİKATİV MƏDƏNİYYƏTİ*
# *КОММУНИКАТИВНАЯ КУЛЬТУРА УЧИТЕЛЯ*
# *THE TEACHER'S COMMUNICATIVE CULTURE*

*UOT 37*

***Сабина Рафик гызы Гаджиева***
*доктор философии по педагогике, старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*
*https://orcid.org/0009-0000-6602-4441*

## КОММУНИКАТИВНАЯ КУЛЬТУРА УЧИТЕЛЯ КАК ВАЖНОЕ УСЛОВИЕ В ВОСПИТАНИИ УЧАЩИХСЯ

***Səbinə Rafiq qızı Hacıyeva***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Ümumi pedaqogika kafedrasının baş müəllimi*

## MÜƏLLİMİN KOMMUNİKATİV MƏDƏNİYYƏTİ ŞAGİRDLƏRİN TƏRBİYƏSİNDƏ MÜHÜM ŞƏRT KİMİ

***Sabina Rafig Hajiyeva***
*doctor of philosophy in pedagogy,*
*senior lecturer at Azerbaijan State Pedagogical University*

## THE ROLE OF THE TEACHER`S COMMUNICATIVE CULTURE IN THE EDUCATIONAL PROCESS OF STUDENTS

**Резюме.** Коммуникативная культура педагога играет очень важную роль в процессе воспитания и обучения школьников. Педагог в процессе своей работы общается со своими учениками; их родителями; с коллегами по работе. Его речь должна быть понятная, внушительная и грамотная. От коммуникативной культуры педагога зависит весь результат педагогического процесса, который он осуществляет.

***Ключевые слова:*** *коммуникативная культура, педагогический процесс, педагог*

**Xülasə.** Məktəblilərin təlim-tərbiyəsi prosesində müəllimin kommunikativ mədəniyyəti çox mühüm rol oynayır. Müəllim öz iş prosesində şagirdlərlə, onların valideynləri ilə, iş yoldaşları ilə ünsiyyət qurur. Onun nitqi aydın, səlis və savadlı olmalıdır. Bütün təlim-tərbiyə prosesinin nəticəsi müəllimin kommunikativ mədəniyyətindən asılıdır.

***Açar sözlər:*** *kommunikativ mədəniyyət, pedaqoji proses, pedaqoq*

**Summary.** The communicative culture of the teacher plays a very important role in the process of educating schoolchildren. The teacher in the process of his work communicates with his students; their parents; with colleagues at work. His speech should be clear, impressire and competent. The whole result of the pedagogical process that he carries out depends on the communicative culture of the teachers.

***Key words:*** *communicative culture, pedagogical process, teachers*

Коммуникативная культура педагога – это совокупность специальных коммуникативных знаний, навыков и умений, с помощью которых педагог предотвращает возникновение психологических трудностей и прогнозирует результативность межличност-

ного и делового профессионального взаимодействия.

Профессия педагога – одна из важнейших в современном мире. От его усилий зависит будущее человеческой цивилизации. Профессиональный педагог – это единственный человек, который большую часть своего времени занимается воспитанием и обучением детей.

Педагогу для успешной работы необходимы не только предметные и психолого-педагогические знания, но и особое умение – это умение общаться. Все люди начинают овладевать навыками общения с малых лет, но не все повзрослев, в достаточной мере умеют общаться. Профессия педагога наилучшая из всех и относится к типу профессий «человек – человек» и поэтому умение общаться является для педагога ведущим, профессионально важным качеством. Общение – основа педагогической деятельности. От того, как педагог общается с учащимися, зависит степень их познавательного интереса к предмету, а значит, и учебная мотивация. Стиль педагогического общения в значительной мере определяет результативность овладения учащимися предметными знаниями и умениями, влияет на культуру межличностных отношений, создаёт соответствующий морально – психологический климат учебного процесса. Общение является самым важным условием социализации личности.

Педагогическое общение – это процесс взаимодействия педагогов и воспитанников, содержанием которого является обмен информацией (в основном учебной), познание личности партнёра по педагогическому общению, а также организация совместной деятельности. При этом информация передаётся как вербальными (речевыми), так и невербальными средствами. Речевое общение – это общение посредством слова.

Великий педагог А.С. Макаренко отмечал, что педагогом – мастером учитель может стать лишь тогда, когда научится произносить даже самые простые слова и фразы с 15-20 интонационными оттенками.

Умение пользоваться словом, эмоционально выражать свои мысли – важная сторона коммуникации. Но для учителя не менее значима и другая сторона – умения слушать. Психологи утверждают, что лучший собеседник – не тот, кто умеет хорошо говорить, а том, кто умеет хорошо слушать. Данная функция общения позволяет педагогу не только понимать ученика, но и чувствовать его состояние, настроение, отношение к учебному процессу в целом.

Коммуникативная культура педагога – это культура его профессионально-педагогического общения с другими субъектами учебно-воспитательного процесса. Необходимым уровнем коммуникативной культуры следует признать такой, который позволяет педагогу позитивно воспринимать своих воспитанников и коллег и обеспечивает безусловное достижение целей воспитания и обучения.

Ведущее профессиональное качество учителя-общительность, умение слушать, быть внимательным, понимать состояние говорящего, уважать личность своего воспитанника.

Педагогическая культура проявляется, когда есть интерес к внутреннему миру ученика, потребность в общении с ним на духовном уровне.

Педагогическая культура подразумевает такие качества личности, которые не обходимы в общении: справедливость, открытость, искренность, терпимость, выдержка, самообладание, требовательность, тактичность.

При общении с учащимися педагог должен быть интеллигентным, тактичным, деликатным, вежливым. Педагогический такт проявляется в формах обращения педагога; в умении разговаривать, не задевая самолюбия учеников; организовать их деятельность и контролировать её исполнение; в умении педагога «держать себя в руках» при любых обстоятельствах; в оценивании учащихся; в поощрении и в наказании.

Педагогический такт подсказывает педагогу выбор места для общения с учащимися, в присутствии класса или один на один; в учебном заведении или по дороге домой; позволяет определить время общения; найти нужный тон разговора; быть внимательным, сдержанным, терпеливым и т.д. Деликатность также помогает педагогу решить

самые сложные задачи построения личных взаимоотношений с учащимися.

Восприятие и понимание речи педагога учащимися связаны с процессом учебного слушания. Поэтому качество освоения учебного материала зависит от совершенства речи педагога. Обучаемые очень чутки к речевым особенностям учителя. Речь должна быть не только грамотной и выразительной, но и должна обладать силой необходимого звучания.

Кроме этих качеств надо обратить внимание на такие детали: правильность речи; ясность речи; точность речи; чистота речи; выразительность речи; богатство речи; эмоциональность речи и т.д.

От уровня коммуникативной культуры педагога зависит возможность ученика адаптироваться в учебном процессе, в обществе;

**Невербальное общение** – это неречевая форма, которая передаёт образное и эмоциональное содержание и включает в себя жесты, мимику, позы, визуальный контакт и прикосновения. Невербальные средства так же важны, как и вербальные. Исследования говорят о том, что в беседе 45% информации передаётся словами, а 55% невербальными средствами.

Особая роль в передаче информации отводится мимике – движениям мышц лица. Мимика выражает проживаемые состояния, отношения. Исследования показами, что если лицо говорящего неподвижно – то теряется до 10-15% информации.

Исследования показали, что все люди, независимо от национальности культуры, в которой они выросли, с достаточной точностью и согласованностью интерпретируют мимические конфигурации как выражение соответствующих эмоций. Интересно отметить, что основную информативную нагрузку несут брови и область вокруг рта (губы). Кроме лица, которое является главным источником информации о психологическом состоянии педагога, телодвижение ещё больше выдаёт эмоции, которые педагог хочет скрыть. Учащиеся легко прочитывают по пластике телодвижений истинные чувства педагога. Пластика – общий рисунок жестов и движений, производимых человеком. Она оказывает столь же сильное влияние, как и звучание голоса и мимика.

В процессе обучения и воспитания учеников педагог использует разные **стили педагогического общения.** Например – «Сократ», это учитель с репутацией любителя споров и дискуссий, которые он проводит на своих уроках.

«Руководить групповой дискуссией» – это установление сотрудничества между учащимися и учителями, где роль учителя в поиске демократического согласия между ними.

«Мастер» – учитель выступает как образец для подражания, учащиеся стремятся подражать ему, копировать его.

«Генерал» – учитель требователен, жестокого добивается послушания, учеников во всём.

«Менеджер» – учитель направляет своих учеников быть на уроке более самостоятельными в принятии какого-либо решения и проявлять больше инициативы в чём-либо.

«Тренер» – учитель создаёт в классе атмосферу свободы в общении. Класс – одна команда. Вместе они могут многое. Учитель является их путеводителем – тренером.

«Гид» – учитель образ ходячей энциклопедии; лаконичен, точен, сдержан. Ответы на все вопросы ему известны заранее, как и сами вопросы.

Все эти стили педагогического общения педагог должен умело использовать на своих уроках по мере надобности. Каждый педагог выбирает для себя стиль сходный с его натурой, характером и методикой преподавания.

Коммуникативная культура педагога является одним из важнейших компонентов педагогической культуры. Необходимость её формирования обусловлена тем, что учитель постоянно включён в процесс общения, с теми, кто становится партнёром по контакту: с учениками, их родителями, коллегами. Эти отношения возникают и развиваются в процессе совместной деятельности, важнейшим условием осуществления которой является общение.

Эффективности процесса обучения и воспитания учащихся является коммуникативная грамотность педагога, умение реализовать принципы партнёрства в учебном и не в учебном взаимодействии. Педагог должен ориентироваться на интересы ученика и перспективы его развития.

**Актуальность проблемы** в том, что коммуникативная культура педагога формирует развитие этой культуры у его воспитанников.

**Научная новизна проблемы** заключается в том, что профессиональный педагог обладает наивысшей коммуникативной культурой, которая помогает ему успешно проводить воспитательную работу среди своих учеников.

**Практическое значение проблемы** в том, что велика роль коммуникативной культурой педагога в оказании помощи своему воспитаннику осознать себя, найти своё место в обществе; умение выслушивать и слушать; умение самому излагать грамотно свои мысли.

**Литература:**

1. Аульбекова Г.Д. Педагогическая культура и техника учителя. – Алматы, 2015 г.
2. Гойхман О.Я. Речевая коммуникация педагога. – М.: ИНФРА-М, 2011.
3. Грущевицкая, Т.Г. Основы межкультурной коммуникации: Учебник для вузов. / Т.Г. Грущевицкая. – М.: ЮНИТИ-ДАНА, 2012.
4. Пастюк, О.В. Психология и педагогика: Учебное пособие. / О.В. Пастюк – М.: НИЦ ИНФРА-М, 2013.
5. Филипова, О.В. Профессиональная речь учителя: Учебное пособие. / О.В. Филипова – М., 2016.
6. Щербина, Ю.В. Педагогический дискурс: мыслить-говорить-действовать: Учебное пособие. – М., 2019.

**E-mail:** hajievasabina@gmail.com

**Рецензенты:** *док.филос.по пед., доц.* **Э.Р. Гусейнова,**
*док.филос.по пед., доц***. Г.А. Джафаров**
**Redaksiyaya daxil olub:** 11.04.2023

# *AİLƏDƏ TƏRBİYƏ PROBLEMLƏRİ*
# *ПРОБЛЕМЫ ВОСПИТАНИЯ В СЕМЬЕ*
# *UPBRİNGİNG PROBLEMS IN THE FAMILY*

*UOT 37*

***Gülarə Məhəmməd qızı Qocayeva***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*
*https://orcid.org/0000-0002-0780-4082*

## AİLƏNİN PEDAQOJİ MAHİYYƏTİ VƏ FUNKSİYALARI

***Гюлара Мухаммед гызы Годжаева***
*доктор философии по педагогике, старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

## ПЕДАГОГИЧЕСКАЯ СУЩНОСТЬ И ФУНКЦИИ СЕМЬИ

***Gulara Muhammed Gojayeva***
*doctor of philosophy in pedagogy, senior lecturer at*
*Azerbaijan State Pedagogical University*

## PEDAGOGİCAL NATURE AND FUNCTİONS OF THE FAMİLY

**Xülasə.** Elmi məqalədə ailə, onun mahiyyətinə ilkin olaraq aydınlıq gətirilmişdir. Daha sonra isə ailənin funksiyaları açıqlanmışdır. Ailə tərbiyəsinin dayanıqlı stereotipləri: uşağın mənafeyindən və mövqeyindən çıxış etməyə, peşəkarlığa və praqmatik yanaşmaya münasibət bildirilmişdir.
***Açar sözlər:*** *ailə, məqsəd, məzmun, funksiya, peşəkarlıq, tərbiyə*

**Резюме.** В научной статье изначально выяснена семья, ее сущность. Далее были пояснены функции семьи. Выявлены устойчивые стереотипы семейного воспитания: важность действовать из интересов и позиции ребенка, профессионализм и прагматичный подход.
***Ключевые слова:*** *семья, цель, содержание, функция, профессионализм, воспитание*

**Summary.** In the scientific article, the family, its essence has been initially clarified. Later, the functions of the family were explained. Persistent stereotypes of family education: acting from the interests and position of the child, professionalism and pragmatic approach have been clarified.
***Key words:*** *family, purpose, content, function, professionalism, upbringing*

Hər adamın öz həyat məkanı vardır – bu, digər insanlarla – qohum, dost, qonşularla olan münasibətləridir. Onlardan ən yaxınları ilə münasibət artıq bilavasitə belə düzülür: "ev", "ailə" – bu, insanların yaşadıqları yerdir, yalnız burada onlar özlərini yaxşı hiss edirlər. Ailə, şübhəsiz, müasir dövrdə, istər ayrılıqda götürülmüş şəxsiyyət, istərsə də bütövlükdə cəmiyyət üçün əhəmiyyəti artmaqda olan ümumbəşəri dəyər, mədəni irsin, əxlaqi norma və qaydaların ötürücüsü rolunu oynayır. Ailə, necə deyərlər, cəmiyyətin kiçik modelidir və ailələrin sabitliyi özlüyündə cəmiyyətin sabitliyi deməkdir. Ümumi şəkildə R. Hüseynzadə və M. İsmayılova ailənin vəzifələrini aşağıdakı şəkildə vermişlər:

1. Uşağın inkişafı və böyüməsi üçün maksimal şəraitin yaradılması;
2. Uşağın sosial-iqtisadi və psixoloji müdafiəsinin təşkil olunması;
3. Ailənin yaradılması və qorunub saxlanması təcrübəsini uşaqlara vermək, ötürmək bacarığı;

4. Uşaqları tətbiqi vərdiş və bacarıqlara, yaxınlarına köməyə istiqamətlənmiş, özünəxidmətə öyrətmə bacarığı;

5. Uşaqlarda "mən" dəyərini, ləyaqət hissini tərbiyəetmə [4, s.345].

Ailə tərbiyəsinin məzmunu bütün istiqamətləri özündə əhatə edir. Ailədə fiziki, estetik, əmək, əqli və uşaqların mənəvi tərbiyəsi həyata keçirilir və yaş artdıqca onun özü də dəyişir. İmkan daxilində ailələr və ailəyə yaxın olanlar uşaqlara təbiət, cəmiyyət, texnika haqqında biliklər verir, onlarda yaradıcılıq fəaliyyəti, təcrübəsi formalaşdırır, bəzi intellektual vərdişlər, nəhayət, onlarda həyata, dünyaya, insanlara, peşəyə münasibət tərbiyə edirlər. Ailə tərbiyəsində əsas yeri mənəvi tərbiyə tutur. Deməli, ailə tərbiyəsinin məqsədi şəxsiyyətdə müsbət keyfiyyətlər formalaşdırmaqdır ki, onlar uşağın inkişafında yaranan çətinlikləri vaxtında dəf etməyə imkan yaradır.

Ailənin özünəməxsus funksiyaları vardır. Funksiya (*funtio* – latın sözüdür) mənası icra, fəaliyyət deməkdir. Ailənin funksiyaları dedikdə onun həyat fəaliyyətinin başlıca istiqamətləri nəzərdə tutulur. Bu baxımdan onun aşağıdakı funksiyalarını fərqləndirmək olar: reproduktiv və ya demoqrafik, təsərrüfat-iqtisadi, tərbiyə və bərpaedici funksiyaları fərqləndirirlər.

Ailənin funksiyaları qarşılıqlı əlaqədədir. Onlar, hər şeydən əvvəl, ailənin sosial mahiyyətini əks etdirir. Ailə cəmiyyətin sosial əsasıdır. O, öz üzvlərinin müxtəlif tələbatı (şəxsi və ümumailə, yəni qrup) ilə yanaşı cəmiyyətin bir sıra mühüm tələbatını – əhali artımı tələbatını yerinə yetirir. Bu isə ictimai tələbatdır. Ailənin funksiyaları məhz buradan irəli gəlir. Ailənin funksiyaları ictimai-tarixi xarakter daşıyır. Ailənin reproduktiv funksiyası onun həyatının mühüm bir sahəsini – uşaqların doğulması sahəsini əhatə edir. Valideynlər neçə uşaq istəyirlər? Onlar ailənin inkişafını necə planlaşdırırlar? Bu suallar ilk baxışda nə qədər sadə görünsə də, ailənin reproduktiv funksiyasının məzmununu əsasən aydın ifadə edir. Ailədə uşaqların sayı onun həyat tərzinin mühüm göstəricisidir. Ailənin inkişafı da uşaqların dünyaya gəlməsi ilə bilavasitə bağlıdır. Ailənin reproduktiv funksiyası fiziki baxımdan əhalinin təkrar istehsalını nəzərdə tutur. Ənənəvi ailədə doğum tənzim edilmirdi. Müasir ailədə isə doğum səmərəli surətdə planlaşdırılır. Bu baxımdan ailənin planlaşdırılması və uşaqların səmərəli tərbiyəsi kimi iki yeni anlayış meydana gəlib. Birinci anlayış ailənin – qadının sağlamlığı üçün təhlükəli olan süni yollarla deyil, təbabətin səmərəli nailiyyətləri əsasında planlaşdırılmasını, ikinci anlayış isə uşaqların tibbi-psixoloji və pedaqoji tövsiyələr əsasında tərbiyə olunmasını nəzərdə tutur. Hər iki məsələ bu gün xüsusilə aktual səslənir. Ailənin planlaşdırılması anlayışı təbabətdə, uşaqların səmərəli tərbiyəsi anlayışı isə demoqrafiya elmində formalaşsa da, onların digər elmlər, xüsusilə psixologiya və pedaqogika üçün əhəmiyyəti böyükdür.

Ailənin planlaşdırılması ər-arvadın psixoloji yetkinliyi və hazırlıq səviyyəsi ilə bağlıdır. Bir çox hallarda qadınlar özlərinin ailə rollarını peşə fəaliyyətləri ilə sadəcə olaraq əlaqələndirməkdə çətinlik çəkirlər. Bu sosial-psixoloji amillər istər-istəməz ailənin planlaşdırılmasına da öz təsirini göstərir.

Ailənin planlaşdırılmasında və uşaqların ərsəyə çatmasında atanın da rolu böyükdür. O, uşaq qayğılarını ana ilə bilavasitə bölüşdükdə, ailədə öz-özünə yaxşı mənəvi-psixoloji iqlim yaranır.

Ailənin digər funksiyası təsərrüfat – iqtisadi funksiyadır**.** Bu funksiya ailənin mövcud olması üçün maddi şəraitin təmin edilməsi, ailə üzvlərinin maddi və bir çox başqa tələbatlarının ödənilməsi, ev təsərrüfatı ilə məşğul olmaq, ailə büdcəsinin qaydaya salınması, ailənin idarə olunması, ailə üzvlərinin sağlam və gümrah olmalarına qarşılıqlı köməyin göstərilməsi kimi əsas cəhətləri özündə birləşdirir.

Ailə hər bir insan üçün sağlamlaşdırıcı, psixoterapevtik mühitdir. Ailənin bərpaedici funksiyası bu cəhəti nəzərə alır. Ailədə onun hər bir üzvü – istər ata, istər ana və ata uşaqların ünsiyyətinə, onların istirahəti üçün mənəvi-psixoloji şəraitin yaradılmasına, asudə vaxtın səmərəli təşkilinə xüsusi diqqət yetirməlidir. Ailə cəmiyyətə və insana münasibət baxımından çox mühüm, ictimai əhəmiyyətli funksiyaları yerinə yetirir. Cəmiyyətdə münasibətdə ailənin əsas funksiyaları aşağıdakılardır:

– fiziki baxımdan əhalinin təkrar istehsalı: nəsillərin əvəzlənməsi üçün müəyyən dövlət çərçivəsində müvafiq sayda uşağın olması;

– tərbiyəedici funksiya: yeni nəslə biliklərin, bacarıq və vərdişlərin, norma və dəyərlərin, mənəvi sərvətlərin ötürülməsini əks etdirir;

– istehsalat-təsərrüfat funksiyası: ailənin əmək və məişət təsərrüfat həyatını əks etdirir;

– asudə vaxtın təşkili və reproduktiv funksiya: ailənin vaxt büdcəsinin əhəmiyyətli hissəsi işdənkənar sahələrə – ailə ünsiyyəti, istirahət və gəzintiyə sərf olunur.

Ailənin tərbiyəvi funksiyası olduqca mühümdür. Ailədə həm yaşlılar, həm də uşaqlar tərbiyə olunurlar. Ailənin gənc nəslin tərbiyəsinə təsiri xüsusilə böyük rola malikdir. Ona görə də ailənin tərbiyəvi funksiyası üç cəhətlə bağlıdır: a) tərbiyənin ailənin yaşlı üzvlərinə verilməsi; b) ailə kollektivinin özünün ailənin hər bir üzvünə uzunmüddətli, məqsədyönlü, sistemli və müntəzəm tərbiyəvi təsiri; c) uşaqların öz valideynlərinə daimi təsiri.

N. Çələbiyev və Ü. Əfəndiyeva belə hesab edirlər ki, “Ailənin tərbiyə funksiyası yeni nəsillərə biliklərin, bacarıq və vərdişlərin, norma və dəyərlərin, mənəvi sərvətlərin ötürülməsini və uşaqların sosiallaşmasını əks etdirir” [3, s.152].

Ailənin tərbiyə funksiyası çoxcəhətlidir: ailədə əxlaq tərbiyəsi, estetik tərbiyə, əqli tərbiyə, fiziki tərbiyə, siyasi tərbiyə, əmək tərbiyəsi və s.. Burada cəmiyyətin mədəniyyətinin bir nəsildən digərinə keçirilməsində müvafiq cəmiyyətin üzvü olan uşaqların rəftar davranışını təmin edən proses nəzərdə tutulur. Ailənin məhz bu funksiyası da bu baxımdan prioritet istiqamətlidir. Məlum məsələdir ki, tərbiyə tarixən çətin və lazımlı proses olmuşdur. Bu mənada o, təkcə ailənin deyil, eyni zamanda, cəmiyyətin funksiyasına çevrilmişdir. Bu mürəkkəb prosesdə tədqiqatçılar ailəni əsas tərbiyə ocağı hesab etdikləri üçün ağırlıq onun üzərinə düşür. Uşağın gələcək kişi və qadın kimi formalaşmasının əsasları da ailədə qoyulur. Ailədə oğlan və qız uşaqlarını tərbiyə edərkən milli adət və ənənələr nəzərə alınır. Hər bir kişi və ya qadının valideynlik hisslərinin və mövqeyinin də formalaşmasında cəmiyyətdə bərqərar olmuş adət-ənənələrin, həyat tərzinin, keçmiş nəsillərin təcrübəsi və s. təsirli amillər hesab olunur. Əsasən də, ailədə qadının (arvadın) rolu xüsusi vurğulanır. N. Çələbiyev və Ü. Əfəndiyeva belə hesab edirlər ki, “Ana uşaq aləminin affektiv mərkəzidir. Uşağın xarici aləmlə bütün münasibətləri ana vasitəsilə reallaşır. Bu münasibətlər sistemində tədricən ata, bacı, qardaş və s. daxil olur. Uşağın yaşı artdıqca onun psixi inkişafında atanın rolu artır. Onun münasibətlər sistemi şaxələnir və daha da mürəkkəbləşir.” [3, s.419].

Sosioloqlar və psixoloqlar ailə tərbiyəsinin bir neçə dayanıqlı stereotipini müəyyən edirlər:

1) uşağın mənafeyindən və mövqeyindən çıxış etmə;

2) peşəkarlıq;

3) praqmatik yanaşma.

Birinci halda uşağın davranışına və şıltaqlığına ifrat aludəçilik özünü göstərir. Ailədə hər kəs uşağın nazı ilə oynayır, səhvlərinə, elədiyi hərəkətlərə görə onu heç kəs məzəmmət etmir. Belə uşaqlarda çox vaxt davranış və əməllərə görə fərdi məsuliyyət, qadağalara və valideynlər qarşısında cavabdehlik hissi tərbiyə edilmir. Onlara ailənin yaşlı üzvləri müstəsna xidmət göstərir, hər bir kiçik arzusu dərhal yerinə yetirilir. Uşağın hər bir tələbini dərhal ödəmək, daim əzizləmək, pulla, bahalı hədiyyələrlə şirnikləndirmək və s. onun tərbiyəsinə zərər vurur, xarakterində ərköyünlük əlamətlərinin kök salmasına səbəb olur. Çox vaxt belə uşaqlar ata-ananın yeganə övladı olur və ya nənələri və babaları tərəfindən tərbiyə edilir.

İkinci halda öz övladlarının tərbiyəsinə peşəkarlıq təmayülü baxımından yanaşan valideynlər uşaqlara qarşı liberal mövqedə durur, bilavasitə uşağın tərbiyəsi ilə məşğul olmaqdan imtina edirlər. Uşağın tərbiyəsi kiçik yaşlarından dayələrə, bağça tərbiyəçilərinə tapşırılır. O, tədricən böyüdükdə isə tərbiyəçi vəzifəsini məktəbdə müəllimlər, pedaqoqlar, peşəkar tərbiyəçilər əvəz edirlər. Ailənin maddi təminatına xüsusi əhəmiyyət verilir, bu, hər şeydən önəmli sayılır. Belə valideynlərin özünəməxsus tərbiyə üsulu vardır. Onlar övladların tərbiyəsinə o zaman xüsusi diqqət yetirirlər ki, uşaqlar hansısa xoşagəlməz hərəkətə yol vermişlər və ya ata-anasının nəzərində əl-ayağa dolaşırlar. Belə valideynlərin tərbiyə üsulu öz məhdudluğu və çox zaman sərt davranış formalarının seçilməsi ilə fərqlənir. Bu da valideynlərlə uşaqların bir-birini anlamasını çətinləşdirir. Uşağın bir çox hallarda yerli-yersiz sərt şəkildə cəzalandırılması, ailədə zəruri qayğının, mehribançılığın olmaması uşaqda daxili narazılıq, inciklik hissini gücləndirir. Belə vəziyyət qorxu, inamsızlıq hissini gücləndirir, uşağın mühitə uyğunlaşmasında ciddi problemlər yaradır.

Üçüncü halda uşaqların tərbiyəsinə praqmatik yanaşan valideynlər onlarda gündəlik həyat qayğılarının həlli üçün zəruri olan praktik vərdişləri tərbiyə etməyə çalışır, onlara öz problemlərini sadə və asan şəkildə həll etməyi öyrədirlər. Belə tərbiyə üsulu çox vaxt yeni nəsli, uşaqları həyatın mürəkkəb, dəyişən, yeniləşən yollarına, həyatın sərt üzünə hazırlamaq məqsədi güdür.

**Problemin aktuallığı.** Ailə müasir dövrdə, istər ayrılıqda götürülmüş şəxsiyyət, istərsə də bütövlükdə cəmiyyət üçün əhəmiyyəti artmaqda olan ümumbəşəri dəyər, əxlaqi normaların ötürücüsü rolunu oynayır. Ailə, necə deyərlər, cəmiyyətin kiçik modelidir və ailələrin sabitliyi özlüyündə cəmiyyətin sabitliyi deməkdir.

**Problemin elmi yeniliyi.** Ailə və onun dayanıqlı stereotipləri: uşağın mənafeyindən və mövqeyindən çıxış etmə, peşəkarlıq və praqmatik yanaşma anlayışları ortaya çıxarılaraq onların mahiyyətinə aydınlıq gətirilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Ali təhsil müəssisələrində magistratura səviyyəsində dərsliklərin yazılmasında, elmi konfrans və simpoziumlarda istifadə üçün dəyərli mənbədir. Hər bir kəs ailədə bu funksiyaları bilməlidir.

**Ədəbiyyat:**


1. Abbasov, A.N. Milli əxlaq və ailə etikası. Orta ixtisas məktəbləri üçün dərslik / A.N. Abbasov. – Bakı: Mütərcim, 2010. – 320 s.
2. Allahverdiyeva, L.Z. Ailədaxili münasibətlərin uşaq şəxsiyyətinin formalaşmasına təsiri // – Bakı: Dil və ədəbiyyat. Beynəlxalq elmi- nəzəri jurnal, 2014. № 70, – s.303-305.
3. Çələbiyev, N.Z. Ailə və gender psixologiyası. Dərs vəsaiti. / N.Z. Çələbiyev, Ü.A. Əfəndiyeva. – Bakı: ADPU, 2021. – 520 s.
4. Hüseynzadə, R. Tərbiyə işi və onun metodikası. Dərs vəsaiti. / R. Hüseynzadə, M. İsmayılova. – Bakı: 2012. – 442 s.



**E-mail:** q.gulare@bk.ru



**Rəyçilər:** *ped.ü.fəls.dok.* **K.R. Quliyeva,**
*ped.ü.fəls.dok., dos.* **Ə.İ. İsmayılxanova**
**Redaksiyaya daxil olub:** 25.04.2023

# *MƏKTƏB VƏ PEDAQOJİ FİKİR TARİXİ*
# *ИСТОРИЯ ШКОЛЫ И ПЕДАГОГИЧЕСКОЙ МЫСЛИ*
# *HISTORY OF SCHOOL AND PEDAGOGICAL THOUGHT*

*UOT 37*

***Dilşad Səlim qızı Dadaşova***
*Bakı şəhəri Xətai rayonu 72 nömrəli körpələr evi – uşaq bağçasının müdiri*
*https://orcid.org/0000-0003-2288-9886*

## İNNOVATİV İŞ ÜSULLARI TƏRBİYƏÇİ-MÜƏLLİMLƏRİN UĞURLU PEŞƏKAR SƏRİŞTƏLİLİYİNİN AMİLİ KİMİ

***Дильшад Салим гызы Дадашова***
*заведующий яслями-детским садом №72 Хатаинского района города Баку*

## ИННОВАЦИОННЫЕ МЕТОДЫ РАБОТЫ КАК ФАКТОР УСПЕШНОЙ ПРОФЕССИОНАЛЬНОЙ КОМПЕТЕНТНОСТИ УЧИТЕЛЕЙ-ВОСПИТАТЕЛЕЙ

***Dilshad Salim Dadashova***
*head of the kindergarten No.72 of Khatai district of Baku city*

## INNOVATİVE METHODS OF WORK AS A FACTOR OF SUCCESSFUL PROFESSİONAL COMPETENCE OF TEACHERS

**Xülasə.** Məqalədə məktəbəqədər təhsil müəssisələrində innovativ fəaliyyətin təşkilində pedaqoji işçilərin fəaliyyətinə yeni yanaşmalardan istifadə məsələlərindən bəhs edilir. Metodiki işin məzmununun tərbiyəçi-müəllimlərin işinin nəticələri ilə daimi əlaqəsi hər bir pedaqoqun peşəkar bacarıqlarının artırılması prosesinin davamlı olmasını təmin edir. Eyni zamanda, metodik iş irəliləyici, fəal xarakter daşıyır və pedaqoji və psixologiya elminin yeni nailiyyətlərinə uyğun olaraq uşaqlarla aparılan bütün işlərin inkişafı və təkmilləşdirilməsinə cavabdehdir. Müasir yaradıcı, kreativ rəhbərlər məktəbəqədər təhsil müəssisəsində istənilən müsbət nəticəni əldə etmək üçün müxtəlif yanaşmalardan istifadə edirlər.
***Açar sözlər:*** *məktəbəqədər təhsil, yeni yanaşmalar, innovativ fəaliyyət, metodiki işin təşkili, təlimin keyfiyyəti*

**Резюме.** В статье рассматриваются вопросы использования новых подходов к деятельности педагогических работников при организации инновационной деятельности в дошкольных образовательных учреждениях. Постоянная связь содержания методической работы с результатами труда воспитателей обеспечивает непрерывный процесс повышения профессионального мастерства каждого воспитателя. В то же время методическая работа носит поступательный, активный характер и отвечает за развитие и совершенствование всей работы с детьми в соответствии с новыми достижениями педагогической и психологической науки. Современные творческие, креативные руководители используют разные подходы для достижения желаемого положительного результата в дошкольном образовательном учреждении.
***Ключевые слова:*** *дошкольное образование, новые подходы, инновационная деятельность, организация методической работы, качество обучения*

**Summary.** The article deals with the use of new approaches to the activities of teachers in the organization of innovative activities in preschool educational institutions. The constant connection of the content of methodological work with the results of the work of educators ensures a continuous process of improving the professional skills of each educator. At the same time, methodological work has a progressive,

Hər bir yeniyetmə gec və ya tez – müəyyən bir peşənin seçilməsi ilə bağlı seçim qarşısında qalır. Bu, onun həyatında çox mühüm və vacib hadisələrdən biri hesab olunur. Yeniyetmədə öz mövcud imkanlarının reallaşdırılması, həyatda öz yerini tapması, ilk növbədə, onun gələcək peşəsinin düzgün seçilməsindən əhəmiyyətli şəkildə asılıdır.

Qeyd edək ki, peşələr aləmi genişdir. O, özündə minlərlə müxtəlif və maraqlı ixtisasları əks etdirir. Bütün bu rəngarəng ixtisaslar içərisində öz potensialına uyğun olanla bağlı olaraq düzgün seçim etmək olduqca çətindir. Müasir dövrdə yeniyetmə və gəncləri daha çox hüquqşünas, iqtisadçı, menecer kimi ixtisas sahələri özünə cəlb edir, digər sahələrə o qədər də maraq göstərmirlər [10, s.22].

Qeyd edək ki, insan tərəfindən gələcək peşənin seçilməsi lap erkən uşaqlıq dövründən başlayır. Kiçik məktəblilər öz valideynlərini və müəllimlərini təqlid etməklə bu istiqamətdə ilk addımlarını atır. Kiçik məktəblilər öz imkanlarını təlim və əmək fəaliyyətlərində reallaşdırırlar. Erkən gənclik dövrü məntiqi təfəkkürün, aktivliyin, cəsarətin, sürətlə artması, eləcə də, əxlaqi-emosional inkişafın vacib dövrü hesab olunur. Yuxarı siniflərdə uşaqlar peşəkar özünütəyinə xüsusi diqqət yetirirlər. Yuxarı sinif şagirdləri müxtəlif peşələrə istiqamətlənir, onlar haqqında məlumat toplamağa çalışırlar. Bu prosesdə əsas amil rolunda onların şəxsi təcrübələri deyil, daha çox başqa insanların təcrübələrindən alınmış məlumatlar çıxış edir. Belə məlumat mənbəyi rolunda valideynlər, dostlar, tanışlar, kitab və ya bu istiqamətdə hazırlanmış verilişlər ola bilər. Bu cür təcrübə isə adətən mücərrəd xarakter daşıyır və uşaq tərəfindən yoxlanmamış olur. Bütün bunlarla yanaşı, həm də yuxarı sinif şagirdlərinin öz imkanlarını düzgün qiymətləndirməsi lazımdır. Bura təlim hazırlığının səviyyəsi, ailənin maddi imkanları və ən başlıcası onların qabiliyyətləri və meylləri aiddir.

Yuxarı siniflərdə təhsil alan şagirdlərin məktəbdən sonra öz həyati planlarını qurması zəruridir. Bu zaman onlar, ilk növbədə, gələcəkdə kim və nəçi olmaq problemini həll etməlidirlər. Onlar təkcə öz gəlcəklərini ümumi şəkildə təsvir etməməli, eyni zamanda, qarşıya qoyulmuş məqsədlərə çatmaqla bağlı konkret yol və vasitələri dərk etməlidirlər. Xüsusilə 9-11-ci siniflərdə oxuyan bir çox şagirdlər peşə seçimi ilə bağlı qərar qəbulu zamanı stress vəziyyətinə düşürlər. Bu, ona görə baş verir ki, bir tərəfdən şagirdə öz davranışına görə məsuliyyəti öz üzərinə götürmək qorxulu gəlir, digər tərəfdən isə müəyyən məsələ ilə bağlı onun maraqları və məqsədləri üst-üstə düşən qərarı necə verəcəyini bilmir. Məhz bu dövrdə uşaqlara kömək etmək lazımdır ki, onlar seçimdə səhvə yol verməsinlər və gələcəkdə bundan peşmançılıq hissi keçirməsinlər.

Valideynlərin uşaqların peşə seçiminə təsiri olduqca böyükdür. O, təkcə özünü hər hansı bir göstəriş və ya məsləhət şəkilində göstərmir. Bu, eyni zamanda, şagirdlə qarşılıqlı münasibət zamanı deyilən müəyyən bir fikir, şəxsi peşəkar misal və s. ola bilər [4, s.223].

Həyatımızda heç bir seçim tamamilə müstəqil, heç kəsdən asılı olmadan baş vermir. Biz təcrid olunmuş məkanda deyil, cəmiyyətdə yaşayırıq. İstənilən qərarı qəbul edərkən biz kiminləsə məsləhətləşir, yaxınlarımızın, tanışlarımızın təcrübəsini, onların oxşar situasiyada davranışını yada salır, imkanlarımızı, həyatımızda baş verən vəziyyətləri təhlil edirik. Bu baxımdan peşə seçimi də istisna deyil. Bu prosesə çoxlu sayda amillər təsir edir. Buna görə də müəyyən bir peşəni seçən şəxsin başlıca vəzifəsi şəraiti diqqətlə təhlil etmək və savadlı, müstəqil qərar qəbul etməkdir. Bu amillər içərisində valideynlərin, ailənin fikri xüsusilə önəmli yer tutur.

Faktlar göstərir ki, çox vaxt yaxın insanlar yuxarı sinif şagirdlərinin peşə seçimində fəal şəkildə iştirak etməyə çalışırlar. Məsələn, öz həyatını təbabətə həsr etmiş bir neçə nəsil olan ailədə valideynlərin arzusu öz oğlunu və ya qızını ağ xalatda görməkdir. Yaşlı nəsildən olan insanların fikrinə və onların təcrübəsinə etinasız yanaşmaq olmaz, lakin, eyni zamanda, bu, yeganə seçim amili deyil. Bu prosesdə mühüm olan ondan ibarətdir ki, valideynlər yalnız uşaqların necə oxumaqlarına diqqət yetirməməlidirlər. Onlar, eyni zamanda, şagirdlərin maraqları, qabiliyyətləri və əxlaqi keyfiyyətləri ilə də məşğul olmalıdırlar. Valideynlər öz uşaqlarında ictimai borca qarşı müsbət münasibət formalaşdırmalı, uşağın meyl və bacarıqlarını reallaşdırmasına töhfə verməli və əməyə öyrətməlidir. Əməyə qarşı sevgini uşaqda öz ayaqları üzərində durmağa

başlayandan aşılamaq zəruridir. Bu baxımdan ailə uşağa şəxsi və ictimai maraqları birləşdirmək, əməyə qarşı tələbat yaratmaq qabiliyyətinə malikdir [86, s.159].

Valideynlərin həmişə uşaqla birgə hər hansı bir faydalı işlə məşğul olması onda əməklə məşğul olmağa vərdiş yaradır və bu, onda məsuliyyətlilik, səliqəlilik, digər insanların zəhmətinə hörmət etmək kimi şəxsiyyət keyfiyyətlərinin inkişafına səbəb olur. Bunun təsiri nəticəsində isə sonrakı əmək fəaliyyətində bacarıq və vərdişlər formalaşır.

Ailədə əmək tərbiyəsi uşaqların gələcək həyatlarının əsasını qoyur. Əmək tərbiyəsi, eyni zamanda, insanın əmək keyfiyyətlərinin tərbiyəsi – bu, təkcə gələcək yaxşı və ya pis vətəndaşın hazırlanması və ya tərbiyəsi prosesi deyil, həm də gələcək həyat səviyyəsinin və rifahının tərbiyəsidir [7, s. 223].

Məlumdur ki, ailə üçün şagirdlərin peşəkar özünütəyini mühüm əhəmiyyət kəsb edir və struktur baxımından onun sonrakı inkişafına təsir göstərir. Böyüklər şagirdlərin peşəkar özünütəyininə müxtəlif mövqelərdən yanaşa bilərlər. Bura bu prosesə tamamilə laqeyd münasibət bəsləməkdən uşaqlara tam sərbəstlik verməyə qədər olan məsələləri daxil etmək olar. Bu baxımdan onları şərti olaraq dörd qrupa bölmək mümkündür:

1. Öz uşaqlarının peşə seçiminə aktiv şəkildə təsir göstərən və ona peşəkar məsləhət verən valideynlər;
2. Bu məsələyə passiv yanaşan valideynlər;
3. Uşaqlara öz talelərini özlərinin həll etməsinə imkan verən valideynlər;
4. Öz iradələrini uşaqlara qəbul etdirən valideynlər [49, s.207].

Birinci qrupa bu prosesdə daha çox düzgün mövqe tutan valideynləri aid etmək mümkündür. Onlar qərar qəbul prosesində aktiv şəkildə iştirak etsələr də, avtoritarlıq göstərmirlər. Onlar bu prosesdə müəyyən bir fikir bildirməmişdən öncə, uşağın dediklərini diqqətlə dinləyir, uşağın qabiliyyətlərini və meyllərini qiymətləndirməyə çalışır, eyni zamanda, onun maraqlarını və motivlərini aydınlaşdırmaq istəyir. Burada valideyn və uşaqların peşə seçimi ilə bağlı məsələyə münasibəti qarşılıqlı inam və hörmətə əsaslanır və qarşılıqlı əməkdaşlıq şəklində özünü göstərir.

İkinci və üçüncü qrup valideynlərin mövqeyi uşaqlara mane olmamaq prinsipinə əsaslanır. Bu cür valideynlər ya məsləhət verməkdən qorxurlar və belə hesab edirlər ki, bununla bağlı onlarda kifayət qədər bacarıq yoxdur, ya da ki, natamam ailələrdən olan laqeyd valideynlərdir. Bu cür mövqeyin səbəbi kimi valideynlərlə yeniyetmələr arasındakı qarşılıqlı münasibətlərdə özünü göstərən gərginliyi, ailə üzvləri arasındakı emosional yadlaşmanı və şəxsiyyətlərarası ixtilafları qeyd etmək mümkündür. Uşaqlar özbaşına buraxılıb, onlarda peşə ilə bağlı dəqiq və tam məlumat yoxdur və özlərinin peşəkar gələcəkləri haqqında düşünmürlər.

Dördüncü qrupa, avtoritar tərbiyə üslubuna üstünlük verən aktiv valideynləri aid etmək mümkündür. Onlar uşağın təşəbbüskarlıq göstərməsinə qarşı çıxır. Belə hesab edirlər ki, uşaqların həyat təcrübəsi azdır və bu baxımdan peşə ilə bağlı mürəkkəb və məsuliyyətli qərarı vermək bacarığına malik deyillər. Əksər hallarda belə valideynlər uşaqlarının qabiliyyətlərinə, imkanlarına diqqət yetirmədən çalışırlar ki, onların uşaqları hansı yolla olursa-olsun, ali təhsil alsınlar. Həqiqətən də ailə peşə seçiminin uğurlu olmasına təsir göstərir. Eyni zamanda, bir məsələni də daima diqqət mərkəzində saxlamaq lazımdır ki, ailə həm də aktiv şəkildə uğurlu peşə seçiminin həyata keçirilməsinin əksinə çıxa bilər. Bu məsələləri təhlil edən E. Klimov peşə seçimində özünü göstərən bir sıra valideyn münasibətlərini qeyd edir. Onları aşağıdakı şəkildə qruplaşdıra bilərik:

1. Valideynlər şagirdlərə seçimlə bağlı tam sərbəstlik verir, onun qərarlarında düzəliş etmirlər ( liberal valideyn mövqeyi);
2. Valideynlər yeniyetmələrin gələcəyi ilə bağlı məsələlərə çox ciddi yanaşır. Onun seçimi ilə razılaşsalar da, həddindən artıq ona qəyyumluq göstərirlər. Bu prosesdə onlara hərtərəfli şəkildə dəstək olmağa çalışırlar (informasiyaları özləri əldə edir, qəbul şöbələrinə özləri yaxınlaşır və s.);
3. Valideynlər övladlarının istədikləri peşəni seçmələrinə imkan vermirlər, onların diqqətini başqa peşəyə yönəldirlər. Övladları ilə avtoritar qarşılıqlı əlaqələr quraraq onları sevmədikləri peşəyə istiqamətləndirirlər.

4. Valideynlər peşə seçimi ilə bağlı yeniyetmələrə yanlış məlumat verirlər, onları qeyri-adekvat istiqamətə yönəldirlər.

5. Valideynlərin, ümumiyyətlə, peşə haqqında məlumatları yoxdur, lakin cəmiyyətdə nüfuzu olduğu üçün övladlarını həmin peşəyə istiqamətləndirməyə çalışırlar.

6. Valideynlər yeniyetmələrin peşə yolunu seçməsini məhdudlaşdımırlar. Lakin ali təhsil almağı əsas şərt kimi onların qarşısına qoyurlar [54, s.102].

Məlumdur ki, yuxarıda qeyd edilən bütün valideyn münasibətləri uşağın peşə seçiminə adekvat şəkildə təsir göstərmir. Həqiqətən də ailələrlə aparılan praktik işlərin nəticələri göstərir ki, yuxarı sinif şagirdlərinin peşə seçimi ilə bağlı valideynlərin tutduqları mövqelər müxtəlifdir. Bir çox valideynlər bu prosesdə aktiv şəkildə iştirak edərək şagirdlərin qabiliyyətlərini və imkanlarını qiymətləndirərək onlara öz məsləhətlərini verməyə çalışırlar. Valideynlərin bir qismi şagirdlərə məsləhət verərkən onların xüsusiyyətlərini və yaradıcı keyfiyyətlərini nəzərə almırlar.

Bu məsələləri öyrənməyə çalışan T.D. Zelenkina nöqteyi-nəzərindən valideyn mövqeyinin peşə seçimi ilə bağlı dörd tipini fərqləndirir:

1. Birvariantlı mövqe. Nəsildə mövcud olan ənənələri nəzərə alaraq, övladlarına "ailə" peşəsini seçmək tövsiyə olunur (ənənəvi həkim, müəllim, hərbçi peşələri);

2. Polivariantlı mövqe. Bu zaman ailənin hər bir üzvü öz təcrübəsindən çıxış edərək bu və ya digər peşəni seçməyi məsləhət görür;

3. Neytral mövqe. Valideynlər peşənin seçilməsi ilə bağlı heç bir fikir bildirmirlər və övladlarına müstəqil qərar verməsini tövsiyə edirlər (yəni, problemi özün həll edir);

4. Neqativ mövqe. Ailə uşağın imkanlarına neqativ yanaşır (onsuzda səndən heç nə olmayacaq).

Peşə seçimi probleminin əhəmiyyəti, eyni zamanda onun şagirdlərdə inkişaf etdirilməsi yolları da ailələr tərəfindən eyni cür dərk olunmur. Çox zaman problemin həll olunması ilə bağlı ailələr əvvəllər əldə olunmuş təcrübəyə istinad edirlər [6, s.7-18].

Ailənin bu prosesdə oynadığı aparıcı rolu qəbul edərək , eyni zamanda onu da qeyd etmək lazımdır ki, valideynlərin mövqeyi gələcək peşənin seçilməsinə müxtəlif cür təsir göstərə bilər. Bu məsələləri təhlil edən A.A. Vaysburqun fikrincə, şəxsiyyətin sosial-peşəkar baxımdan formalaşması prosesi ailədən başlayır və insanın həyat fəaliyyətinin bütün mərhələlərindən keçir. Bu baxımdan peşə seçimində ailənin rolu mühüm əhəmiyyət kəsb edir [36, s.128].

Ailə işə, peşə fəaliyyətinə münasibətin formalaşdığı məkandır. Bizim, böyüklərin hər birimizin iş haqqında öz təsəvvürümüz vardır. Bu təsəvvürləri isə bəzən özümüz də hiss etmədən övladımıza ötürürük. Əgər valideynlər işə şəxsi həyatlarının əhəmiyyətli hissəsi kimi münasibət bəsləyirlərsə, onu özünügerçəkləşdirmə və özünüifadə vasitəsi kimi nəzərdən keçirirlərsə, o zaman uşaq erkən uşaqlıqdan həyatdan məmnunluğun birbaşa işlə bağlı və ya əksinə olduğunu dərk edir.

Yuxarı sinif şagirdinin indi etdiyi seçimin qəti olmadığını başa düşməsi çox vacibdir. Heç kim bilmir ki, 10 ildən sonra bizim həyatımızın necə dəyişəcək, əmək bazarında vəziyyət necə olacaq. Ola bilər ki, hazırda kifayət qədər yüksək hesab olunan, nüfuza malik peşələr tamamilə belə olmayacaq və ya əksinə. Bizdən çoxumuz müxtəlif səbəblərə görə həyatımız boyu peşəmizi dəyişirik. Bəzi insanlar bütün həyatları ərzində seçdikləri peşəyə sadiq qalırlar, digərləri isə özlərini peşə fəaliyyətinin müxtəlif sahələrində sınayırlar.

Nə bu, nə də digər yol yeganə düzgün yol deyil və övladlarımızın hansı yol ilə gedəcəyini əvvəlcədən demək mümkün deyil. Onların bu mərhələdə edəcəkləri seçim onların indiki maraqlarını və tələbatlarını əks etdirir.

Ola bilər ki, onların seçdiyi təlim profili və ya peşə həmişə onlara maraqlı olacaq, bəlkə də bir qədər müddətdən sonra onların seçimləri dəyişəcək. İstənilən halda nəyi isə dəyişmək və ya yenidən başlamaq imkanı həmişə qalır. Bu, peşə seçiminin uğursuz edilməsindən deyil, əksinə, insanın peşə fəaliyyətində öz imkanlarını daha tam şəkildə həyata keçirmək cəhdindən xəbər verir.

Beləliklə, aydın oldu ki, valideynlərin övladlarının peşə seçimində rolu böyükdür və məktəbdə peşəyönümü ilə bağlı təkcə uşaqlarla yox, eyni zamanda, valideynlərlə də söhbət aparmaq lazımdır. Müasir dövrdə uşaqların öz valideynlərinin timsalında onların əmək fəaliyyəti ilə tanış olmaq imkanları azdır. İndi həm kənddə, həm də şəhərdə uşaqlar ancaq valideynlərinin işə necə

getdiklərini və gəldiklərini görə bilirlər. Lakin onlar öz valideynlərinin əməyini müşahidə edə bilmir və onun necə sona çatacağını proqnozlaşdırmaq qabiliyyətinə malik deyillər. [52, s.39].

Ona görə də valideynlər övladlarına yalnız gələcək peşənin seçilməsi ilə bağlı köməklik göstərməməlidir, eyni zamanda, onlara peşə haqqında danışmaları və istehsalat sahələrinə ekskursiyalara aparmaları zəruridir.

Bütün valideynlər arzu edirlər ki, öz övladlarının rifah halını təmin etsinlər. Ona görə də çalışırlar ki, övladları etibarlı, nüfuzlu, yüksək əmək haqqı olan peşəyə yiyələnsinlər. Lakin burada ən vacib məsələlərdən biri valideynlər tərəfindən övladının qabiliyyətlərinin və imkanlarının adekvat qiymətləndirilməsi ilə bağlıdır. Fikrimizcə, valideynlər uşaqlarına öz qabiliyyətlərini, meyllərini, imkanlarını başa düşmələrinə və qiymətləndirmələrinə kömək etməlidirlər. Bütün bunların həyata keçirilməsi peşə seçiminin düzgün aparılmasına və şagirdlərin bundan məmnun qalmasına səbəb olur.

Bəzən uşaq öz valideynlərinin peşəsini seçir, bu istiqamətdə müvəffəqiyyət qazanmağa çalışır. Bu zaman ən vacib məsələ ondan ibarətdir ki, bu seçim dərk olunmuş şəkildə həyata keçirilib, yoxsa, sadəcə olaraq valideynlərin iradəsi bu prosesdə əsas rol oynayıb. Bir ailənin bir neçə nəsli bir peşədə işlədiyi zaman onlar çox vaxt əmək sülalələri nümunələri yaratmaqla qohumların peşələrinə yönəlirlər və kimsə nə zamansa “anası kimi həkim” və ya “atası kimi sürücü” olur.

Bir tərəfdən, ailə ənənəsi ehtimal edilən seçimi məhdudlaşdıra bilər. Yeniyetmə sanki cazibə qüvvəsi ilə valideynlərin peşəsini seçir, lakin həmin peşənin onun şəxsi maraqlarına və meyllərinə həqiqətən uyğun olub-olmamasını başa düşməyə belə çalışmır.

Digər tərəfdən, o bu peşəni çox yaxşı təsəvvür edir və onun üçün hansı keyfiyyətlərin tələb olunduğu barədə özünə hesabat verir. Məsələn, həkimlərin uşaqları çox yaxşı bilirlər ki, tibbi peşə təcili çağırışlar və normadan artıq iş, habelə tanışlar və qohumlar tərəfindən kömək haqqında xahiş deməkdir, müəllimlərin uşaqları isə bilirlər ki, dərslərə hazırlaşmaq və tapşırıqları yoxlamaq zəruridir.

Valideynin uşaqda öz peşəsinə sevgi aşılaması yalnız şəxsi nümunə əsasında həyata keçirilə bilər. Əgər uşaq valideynlərinin öz peşəsinə olan yaxşı münasibətini görürsə və hiss edirsə ki, o, öz işindən məmnundur, onda onun peşəyə qarşı müsbət münasibəti formalaşacaq. Bu baxımdan gələcək peşənin seçilməsi əmək bazarının tələbləri nəzərə alınmaqla dərk olunmuş xarakter daşımalı və şagirdin qabiliyyətləri və maraqları ilə üst-üstə düşməlidir. Əgər uşaqda peşə seçimi ilə bağlı güclü şübhələr özünü göstərirsə, deməli, seçim düzgün edilməyib. İnsan öz yolunu tapdıqda heç bir şübhə qalmır, onun yerini inam və ilham tutur. Bu zaman mənfəətə diqqət yetirməyə lüzum yoxdur. Əlbəttə ki, perspektivi qiymətləndirmək lazımdır, lakin əgər insan “öz” işi ilə məşğuldursa, o, heç zaman pulsuz qalmayacaq.

**Problemin elmi yeniliyi.** Yuxarı sinif şagirdlərində peşə haqqında təsəvvürlərin adekvat istiqamətdə qurulmasında özünüdərk, özünüqiymətləndirmənin adekvatlığı ilə yanaşı, valideynlər əhəmiyyətli rola malikdirlər.

**Problemin praktik əhəmiyyəti**. Yuxarı sinif şagirdlərində peşə haqqında təsəvvürlərin formalaşmasının psixoloji xüsusiyyətlərinin araşdırılması və yeni faktların əldə olunması təlimlə və peşə seçimi ilə bağlı konseptual planların və praktik tövsiyələrin yaradılmasına imkan verə bilər.

**Ədəbiyyat:**

1. Bayramov, Ə.S. Psixologiya. .Dərslik. / Ə.S. Bayramov, Ə.Ə. Əlizadə. – Bakı: Poliqraf korporasiysı, 2003. – 540 s.
2. Bayramov, Ə.S. Sosial psixologiya. / Ə.S. Bayramov, Ə.Ə. Əlizadə. – Bakı: Poliqraf korporasiysı, 2003. – 365 s.
3. Абдуллина, О.А. Общепедагогическая подготовка учителя в системе высшего педагогического образования / Для пед. спец. высш. учеб. / О.А. Абдуллина. – М.: Просвещение, 1990. – 141 с.
4. Адушинова, А.Г. Выбор профессии: Мотивационный аспект анализа // – Вестник ИРГТУ – 2009. -№ 1, – с.225
5. Захаров, Н.Н. Профессиональная ориентация школьников: учебное пособие для студентов / Н.Н. Захаров. – Москва: Просвещение, 1988. – 272 с.

6. Зеер ,Э.Ф. Психология профессий // Э.Ф. Зеер. – Екатеринбург, – «Изд-во Инж. пед. ин-та», 1997. – 149 с.
7. Исаев, Е.И. Проблема проектирования психологического образования педагога // -Москва: -Вопросы психологии, 1997. -№ 6, – с.81-89.
8. Игошев, К.Е., Миньковский Г.М. // К. Е. Игошев, Г. М. Миньковский. – Москва: Юрид. лит., 1989. – 444, с.
9. Климов, Е.А. Как выбирать профессию. / Е.А. Климов. – М.: Просвещение, 1990. – 159 с.
10. Моренков, А.Б. Методика формирования у школьников навыков самоопределения // А.Б. Моренков. – Екатирнабург: 2003. – 200 с.
11. Мальцева, Л. В. Профдиагностика и профконсультирование в работе психолога: учебное пособие. // Л. В. Мальцева. – Курган: Изд-во Курганского гос. ун-та, 2018. – 120 с.

**E-mail:** chinara.huseynli@mail.ru
**Rəyçilər:** *psixol.elm.dok.* **R.V. Cabbarov,**
*psixol.ü.fəls.dok.* **M.H. Mustafayev**
**Redaksiyaya daxil olub:** 11.04.2023

## *MÜNDƏRİCAT*
## *ОГЛАВЛЕНИЕ*
## *CONTENTS*

### *ÜMÜMMİLLİ LİDER HEYDƏR ƏLİYEV – 100*
### *ОБЩЕНАЦИОНАЛЬНЫЙ ЛИДЕР ГЕЙДАР АЛИЕВ – 100*
### *NATIONAL LEADER HEYDAR ALIYEV – 100*

***AKADEMİK ZƏRİFƏ ƏZİZ QIZI ƏLİYEVA – 100***
***АКАДЕМИК ЗАРИФА АЗИЗ ГЫЗЫ АЛИЕВА – 100***
***ACADEMICIAN ZARIFA AZIZ ALIYEVA – 100***



***ÜMUMPEDAQOJİ PROBLEMLƏR***
***ОБЩЕПЕДАГОГИЧЕСКИЕ ПРОБЛЕМЫ***
***GENERAL PEDAGOGICAL PROBLEMS***



***PSİXOLOGİYA, YAŞ FİZİOLOGİYASI VƏ İNKLÜZİV TƏHSİL MƏSƏLƏLƏRİ***
***ПСИХОЛОГИЯ, ВОЗРАСТНАЯ ФИЗИОЛОГИЯ***
***И ВОПРОСЫ ИНКЛЮЗИВНОГО ОБРАЗОВАНИЯ***
***ISSUES OF PSYCHOLOGY, AGE PHYSIOLOGY AND INCLUSIVE EDUCATION***

## *TƏLİM TEXNOLOGİYALARI*
## *ОБУЧАЮЩИЕ ТЕХНОЛОГИИ*
## *LEARNING TECHNOLOGIES*

*FİZİKANIN TƏDRİSİ METODİKASI*
*МЕТОДИКА ПРЕПОДАВАНИЯ ФИЗИКИ*
*METHODS OF TEACHING PHYSICS*



*KİMYANIN TƏDRİSİ METODİKASI*
*МЕТОДИКА ПРЕПОДАВАНИЯ ХИМИИ*
*METHODS OF TEACHING CHEMISTRY*



*BİOLOGİYANIN TƏDRİSİ METODİKASI*
*МЕТОДИКА ПРЕПОДАВАНИЯ БИОЛОГИИ*
*METHODS OF TEACHING BİOLOGY*

***MÜƏLLİMİN KOMMUNİKATİV MƏDƏNİYYƏTİ***
***КОММУНИКАТИВНАЯ КУЛЬТУРА УЧИТЕЛЯ***
***THE TEACHER'S COMMUNICATIVE CULTURE***



***AİLƏDƏ TƏRBİYƏ PROBLEMLƏRİ***
***ПРОБЛЕМЫ ВОСПИТАНИЯ В СЕМЬЕ***
***UPBRİNGİNG PROBLEMS IN THE FAMILY***



***MƏKTƏB VƏ PEDAQOJİ FİKİR TARİXİ***
***ИСТОРИЯ ШКОЛЫ И ПЕДАГОГИЧЕСКОЙ МЫСЛИ***
***HISTORY OF SCHOOL AND PEDAGOGICAL THOUGHT***



***ƏMƏK TƏRBİYƏSİ VƏ PEŞƏYÖNÜMÜ MƏSƏLƏLƏRİ***
***ВОПРОСЫ ТРУДОВОГО ОБРАЗОВАНИЯ И ПРОФОРИЕНТАЦИИ***
***ISSUES OF LABOR UPBRİNGİNG AND VOCATIONAL GUIDANCE***

## İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYATIN BİBLİOQRAFİK TƏSVİRİ
## БИБЛИОГРАФИЧЕСКОЕ ОПИСАНИЕ ИСПОЛЬЗОВАННОЙ ЛИТЕРАТУРЫ
## BİBLİOGRAPHİC DESCRİPTİON OF USED LİTERATURE

Jurnalımızın son səhifələrində azərbaycanca, rusca və ingilis dilində "Məqalələrin yazılışına verilən tələbləri" əks etdirmişik. Bəzi müəlliflər həmin tələbləri ciddi şəkildə nəzərə aldıqları halda digər müəlliflər mövcud qaydaları gözləmədən redaksiyaya məqalə gətirir, yaxud elektron poçtla göndərirlər. Bu isə, o deməkdir ki, təqdim olunan məqalə işlənmək üçün geri qaytarılmalı, yaxud da redaksiya tərəfindən redaktə edilməlidir. Belə məqalələr, adətən zəif olur, özündə elmi ideya əks etdirmir, təsviri xarakter daşıyır, məqalənin sonunda verilən ədəbiyyat siyahısı da necə gəldi formalaşdırılır.

2019-cu ildə Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının yeni Əsasnaməsi təsdiq olunmuş, dissertasiyaların, avtoreferatların, ədəbiyyat siyahısının tərtibinə yeni tələblər verilmişdir. Ölkəmizdə dissertasiyaların əsas nəticələrinin dərc olunması tövsiyə edilən elmi nəşrlərdə öz məqalələrini görmək istəyən alimlər, gənc tədqiqatçılar – doktorantlar və dissertantlar "İstifadə edilmiş ədəbiyyatın biblioqrafik təsviri və nümunələr"i ilə tanış olmalı, həm dissertasiyalarında, həm məqalələrində, həm də konfrans materiallarında mövcud tələbləri nəzərə almalıdırlar.

"İstifadə edilmiş ədəbiyyatın biblioqrafik təsviri və nümunələr"i aşağıdakı bölmələrə ayrılır: nəşrin növü; biblioqrafik təsvirin forması; nümunələr.

**Tələblərə** diqqət yetirək: Çoxcildli nəşrlər belə yazılır: 1. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir: [46 cilddə] / H. Əliyev. – Bakı: Azərnəşr, – c. 45. 2013. – 384 s. 2. Azərbaycan Milli Ensiklopediyası / Red. hey. sədri İ.H. Əliyev. – Bakı: Azərbaycan Milli Ensiklopediyası Elmi Mərkəzi, – c. 8: Enollar – Fedin. – 2018. – 598 s. Müəllifi göstərilməyən nəşrlər: Azərbaycan bayatıları / tərt. ed. B.Abdulla – Bakı: XXI Yeni nəşrlər evi, – 2004. – 304 s.

**Müəllifi dörd nəfərədək olan nəşrlər**, o cümlədən bir müəllifli nəşrlər: Əlizadə, Ə.Ə. Qadın psixologiyası: Fəlsəfi-psixoloji esselər / Ə.Ə. Əlizadə. – Bakı: Təhsil, – 2015. – 416 s.

Ахмедов, Г.Г. Человеческий ресурс Азербайджанского образования: Монография / Г.Г. Ахмедов. – Москва: МПСИ, 2007. 140 с.

**İki və üç müəllifli nəşrlər**: Abbasov, A.N. Pedaqogika: Müntəxəbat. Dərs vəsaiti. / A.N. Abbasov, R.R. Məmmədzadə, L.A. Məmmədli. – Bakı: Mütərcim, – 2021. – 608 s.

**Müəllifi dörd və daha çox olan nəşrlər**. Dörd və beş müəllifli nəşrlər: Pedaqogika: Ali məktəblər üçün dərs vəsaiti / Y.R. Talıbov, Ə.Ə. Ağayev, A.İ. Eminov [və b.] – Bakı: Adiloğlu, – 2003. – s. 48

**Beşdən çox müəllifli nəşrlər**: Kurikulum bələdçisi: İzahlar və tətbiqlər / Ə.M. Abbasov [və b.] – Bakı: Elm və təhsil, – 2019. – 320 s.

**Jurnal məqalələri**: Məmmədli L.A. Şagirdlərin milli qəhrəmanların nümunəsində tərbiyə olunması // – Bakı: Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, – 2020. № 6, – s. 59-62.

Ahmadov, H.H. Education funding system in Azerbaijan as one of the main directions of the state strategy for the development of education // Revista Universidad y Sociedad, *-2022. Vol.14 № 6, - p.p.* 333-339.

**Müəllifi üçdən çox olan jurnal məqalələri**: Rüstəmov, Q.Ə. Vibrasiyalı kəsmə prosesində müqavimət momenti dəyişməsinin tədqiqi / Q.Ə. Rüstəmov, İ.A. Yolçuyev, Ə.T. Həzərxanov [və b.] // Milli Aviasiya Akademiyasının Elmi əsərləri, – Bakı: – 2005. №1, – s. 80-86.

**Konfrans materialları**: Аббасов, А.Н. Подготовка подростков и молодежи к семейной жизни // Материалы 66-й Международной научно-практической конференции на тему: «Актуальные вопросы науки», Москва: Спутник: -10 августа 2020, с. 33-37 Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, Cild 89 , № 6, 2022, № 5

**Dissertasiyalar**: Əliyeva, L.X. Təhsilin demokratikləşdirilməsi pedaqoji kadrların hazırlanmasının mühüm prinsipi kimi: ali pedaqoji məktəblərin bakalavr pilləsinin materialları əsasında: / pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyası) / – Bakı, 2012. – 147 s.

**Dissertasiyanın avtoreferatı**: Əliyev, R.S. Yeniyetmələrin yenidəntərbiyəsi üzrə işin sistemi: / pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyasının avtoreferatı) / – Bakı, 2003. – 29 s.;

**Elektron resurslar**: Меликов, А. Легенда о любви [Звукозапись] / – Баку, 1994. – CDROM. Azərbaycan etnik musiqisi: [Elektron resurs] / tərt. ed. T. Məmmədov və b.; Azərbaycan Respublikası Mədəniyyət və Turizm Nazirliyi. – Bakı, 2006. – DVD+; 13 sm

**Normativ-hüquqi sənədlər**: Azərbaycan Respublikasının Konstitusiyası // 12 noyabr 1995-ci ildə qəbul edilmişdir (24 avqust 2002-ci il tarixdə olan dəyişiklik və əlavələr). – Bakı: Qanun, – 2002, – 48 s.

**Qəzet məqalələri**: Abbasov, A.N. Pedaqoji internatura // Azərbaycan müəllimi. -2020, 22 avqust. – s. 6

**Arxiv materialları**: Xarici İşlər naziri Məhəmməd Həsən Hacınskinin məruzəsi (Gəncə: 15 iyul 1918-ci il) // Azərbaycan Respublikası Dövlət Arxivi, Fond № 1061, siyahı №1, iş № 95, vərəq –1.

Azərbaycan Respublikasının Təhsil İnstitutunun “Elmi əsərlər”inə pedaqogikanın, təhsil, təlim və tərbiyənin, didaktikanın, təhsilin idarə olunmasının müxtəlif məsələləri ilə bağlı məqalə yazan alimlərə, gənc tədqiqatçılara xahişimiz budur ki, istifadə edilmiş ədəbiyyatın siyahısını hazırlayarkən yuxarıda göstərilən qaydalara əməl etsinlər.

## TƏQDİM OLUNAN MƏQALƏLƏRƏ TƏLƏBLƏR

1. Digər redaksiyalara təqdim olunmamış məqalələr qəbul edilir.
2. Məqalələr son tədqiqatların nəticələrini əks etdirməli, yeni ideyalarla zəngin olmalı, elmi məqalələrin yazılışına qoyulan tələblər gözlənilməlidir.
3. Məqalənin mətni təxminən 6-8 səhifə olmalıdır. Azərbaycan, rus və ingilis dillərində məqaləyə aid açar sözlər verilir.
4. Məqalənin mətni Azərbaycan dilində latın əlifbası (Times New Roman), rus dilində krill əlifbası və ingilis dilində ingilis (ABŞ) əlifbası ilə Times New Roman – 14 şrift ilə 1,5 intervalla yığılmalı, elektron variantı ilə birlikdə (disklə) təqdim olunmalıdır.
5. Məqalələr üç dildən – Azərbaycan, rus və ingilis dillərindən birində çap olunur. 3 dildə (Azərbaycan, rus və ingilis) məqalənin xülasəsi təqdim edilir. Xülasədə irəli sürülən başlıca elmi müddəalar, tədqiqatdan alınan nəticələr, problemin nəzəri və praktik əhəmiyyəti öz əksini tapmalıdır.
6. Məqalə aşağıdakı ardıcıllıqla yazılır: birinci sətirdə müəllif(lər)in adı, atasının adı və soyadı; ikinci sətirdə elmi dərəcəsi və elmi adı (yaxud doktorant də dissertant olması və s.); üçüncü sətirdə iş yeri, vəzifəsi; dördüncü sətirdə böyük hərflərlə məqalənin adı. Daha sonra bu qaydada həmin məlumatlar rus və ingilis dillərində təkrar edilir.
7. Həmmüəlliflərin üç nəfərdən artıq olması məqsədəuyğun deyildir.
8. Redaksiya məqalədə zəruri dəyişiklər və ixtisarlar, redaktə aparrmaq hüququna malikdir. 9. Məqalələrə iki mütəxəssisin rəyi, şöbə və ya kafedranın, həmçinin ali məktəbin Elmi Şurasının və ümumtəhsil, yaxud orta ixtisas təhsili müəssisəsinin pedaqoji şurasının iclas protokollarından çıxarışlar əlavə olunur.
10. Məqalədəki faktların, məlumatların dürüstlüyünə müəlliflər cavabdehdir. İrəli sürülən elmi müddəalar müəllifin özünə məxsus olmalı, istifadə edilmiş nəzəri fikirlərin mənbəyi göstərilməlidir.
11. Məqalədə son 5-10 ildə çap olunan əsərlərə istinadlara üstünlük verilməlidir. Məqalənin sonunda verilən ədəbiyyat siyahısı əlifba ardıcıllığı ilə deyil, istinad olunan ədəbiyyatların mətndə rast gəlindiyi ardıcıllıqla nömrələnməli və məsələn, (1) və ya (1, s.119) kimi işarə olunmalıdır. Eyni ədəbiyyata mətndə başqa bir yerdə təkrar istinad olunarsa, onda istinad olunan həmin ədəbiyyat əvvəlki nömrə ilə göstərilməlidir.
12. Jurnal öz profilinə uyğun məqalələri dərc edir.
13. Elmi məqalələrin sonunda elm sahəsinin və məqalənin xarakterinə uyğun olaraq aktuallıq əsaslandırılmalı, elmi yeniliyi, tətbiqi əhəmiyyəti, iqtisadi səmərəsi və s. aydın şəkildə verilməlidir.
14. Daha sonra istinad olunmuş ədəbiyyatın siyahısı verilir.
15. Plagiatlıq faktları aşkar edildikdə həmin məqalənin nəşri dayandırılır.
16. Məqalə müəlliflərinin hüquqları qorunur.
17. Jurnalda "ardı növbəti nömrədə" adı altında seriya məqalələr dərc olunmur.
18. Məqalələrin müxtəlif dillərdə olan xülasələri bir-birinin eyni olmalı və məqalənin məzmununa uyğun gəlməlidir.
19. Məqalənin sonunda rəyçilərin adı, atasının adı və soy adı, elmi dərəcəsi və elmi adı; sonrakı sətirdə məqalə müəllifinin elektron ünvanı (E-mail) göstərilməlidir.
20. Məqaləyə müəllif haqqında aşağıdakı məlumatlar əlavə olunur: məqalə müəllif(lər)inin adı, atasının adı soyadı, işlədiyi müəssisə (hansı müəssisədə doktorant və dissertant olması) və müəssisənin ünvanı, müəllif(lər)in vəzifəsi, elmi dərəcəsi və adı, iş və ev telefonları, ev ünvanı, elektron poçt ünvanı (Email).

## ТРЕБОВАНИЯ К ПРЕДСТАВЛЕННЫМ СТАТЬЯМ

1. Принимаются статьи, не представленные в других редакциях.
2. Статьи должны отражать результаты последних исследований, быть богатыми новыми идеями, в них должны быть соблюдены требования, предъявляемые написанию научных статей.
3. Текст статьи должен составлять около 6-8 страниц. Ключевые слова для статьи должны быть представлены на трех языках: азербайджанском, русском и английском.
4. Текст статьи должен быть представлен на диске вместе с электронным вариантом, с интервалом 1,5; шрифтом 14 Times New Roman – латинского алфавита на азербайджанском языке, кириллицы на русском языке, и английским алфавитом (США) на английском языке.
5. Статьи публикуются на одном из трех языков – азербайджанском, русском и английском. Резюме статьи предоставлено на 3 языках (азербайджанском, русском и английском). В статье должны быть отражены основные научные положения, изложенные в резюме, выводы, сделанные из исследования, должна быть представлена теоретическая и практическая значимость проблемы.
6. Статья должна быть написана в следующем порядке: на первой строке имя, фамилия и отчество автора (авторов); вторая строка содержит ученую степень и ученое звание (диссертант или докторант и т. д.); третья строка указывает место работы, должность; на четвертой строке представлено название статьи прописными буквами. Затем эта же информация повторяется на русском и английском языках.
7. Нежелательно иметь более трех соавторов.
8. Редакция имеет право вносить изменения и сокращения в статью.
9. Вместе со статьей должно быть предоставлено два отзыва специалистов: заведующих кафедрой или отделом, а также выписка из протокола Ученого совета вузов и педагогического совета общеобразовательного или среднего специального образования.
10. Авторы статьи несут ответственность за достоверность приведенных в статье фактов и информации. Предлагаемые научные положения должны принадлежать автору и должен быть указан источник используемых теоретических идей.
11. Ссылки следует давать на работы, опубликованные за последние 5-10 лет. Список литературы, приведенный в конце статьи, должен быть пронумерован не в алфавитном порядке, а в том порядке, в котором указанная литература появляется в тексте, например (1) или (1, стр. 119). Если та же самая литература повторяется в другом месте в тексте, то эта же литература должна быть указана под предыдущим номером.
12. Журнал публикует статьи, имеющие отношение к его профилю.
13. В конце научной статьи должна быть обоснована актуальность в соответствии с характером статьи и областью науки, четко указана научная новизна, важность ее применения, экономическая эффективность и т.д.
14. Затем предоставляется список использованной литературы.
15. При обнаружении фактов плагиата публикация статьи прекращается.
16. Права авторов статьи защищены.
17. Журнал не публикует серии статей под заголовком «продолжение в следующем номере».
18. Резюме статей на разных языках должны быть одинаковыми и соответствовать содержанию статьи.
19. В конце статьи должно быть указано имя, отчество и фамилия рецензентов, их ученая степень и ученое звание; следующая строка должна содержать адрес электронной почты автора статьи.
20. В статью добавляется следующая информация об авторе: имя, фамилия, отчество автора (авторов), учреждение, где он работает (докторантом или диссертантом которого является) адрес учреждения, должность, ученая степень и звание автора(ов), домашний и рабочий телефоны, домашний адрес, электронная почта (E-mail).

## REQUIREMENTS FOR SUBMITTED ARTICLES

1. Submitted articles should not be published or accepted for publication in other editions.
2. Articles should reflect the results of recent research, be rich in new ideas and they must comply with the requirements for writing scientific articles.
3. The text of the article should be about 6-8 pages. Keywords for the article should be presented in three languages: Azerbaijani, Russian and English.
4. The text of the article should be presented on the disk together with the electronic version, with an interval of 1.5; 14 point Times New Roman font – Latin alphabet in Azerbaijani, Cyrillic in Russian, and English alphabet (USA) in English.
5. Articles are published in one of three languages – Azerbaijani, Russian and English. A summary of the article is provided in 3 languages (Azerbaijani, Russian and English). The article should reflect the main scientific provisions presented in the summary, the conclusions drawn from the study, the theoretical and practical significance of the problem should be presented.
6. The article is written in the following order: on the first line the name, surname and patronymic of the author (s); the second line contains the academic degree and academic title (doctoral student or candidate for a degree, etc.); the third line indicates the place of work, position; the fourth line represents the title of the article in capital letters. Then in this order the same information is repeated in Russian and English.
7. It is undesirable to have more than three co-authors.
8. The Editorial Board has the right to make changes and reductions in the article.
9. Two expert reviews should be provided together with the article: heads of department or chair, as well as extract from the protocol of Academic Council of the higher school and the Pedagogical Council of general or secondary special education institutions.
10. The authors of the article are responsible for the accuracy of the facts and information provided in the article. The proposed scientific provisions should belong to the author and the source of used theoretical ideas must be indicated.
11. The articles should refer to works published in the last 5-10 years. The list of references given at the end of the article should not be numbered in alphabetical order, but in the order in which the indicated literature appears in the text, for example (1) or (1, p.119). If the same literature is repeated elsewhere in the text, then the same literature should be indicated under the previous number.
12. The journal publishes articles related to its profile.
13. At the end of a scientific article, the relevance should be justified according to the nature of the article and the area of science, scientific novelty, importance of its application, economic efficiency, etc. should be clearly indicated.
14. Then a list of references is provided.
15. When the facts of plagiarism are discovered, the publication of the article is stopped.
16. The rights of the authors of the article are protected.
17. The journal does not publish a series of articles under the heading “continued in the next issue”.
18. Summary of articles in different languages should be the same and consistent with the content of the article.
19. At the end of the article the name, patronymic and last name of the reviewers, their academic degree and academic title should be indicated; the next line should contain the email address of the author of the article.
20. The following information about the author is added to the article: name, surname, patronymic of the author (authors), the institution where he works (doctoral student or candidate for a degree), address of the institution, position, academic degree and the title of the author (s), home and work phones, home address, email address.

